# MÜQƏDDİMƏ

## Allahın adı ilə

Bu kitabın birinci cildində qeyd etdiyimiz kimi irfan elmi bir məfhumdur ki, bəşər zehni onu onun mənəvi və ali dəyərləri arasından dərk etmişdir. İrfan məbdə və məaddan tutmuş bütün kamillik və mərifət ideyalarını özündə birləşdirir. Ona tərəf hərəkət etməyi qarşısına məqsəd qoymuşdur. Hicri qəməri üçüncü əsrdən başlayaraq irfan ədəbiyyatı özünün pik nöqtəsinə çatdı və nəticədə bunu İbn Fariz, Hafiz Şirazi, Cəlaləddin Mövləvi və Nizami Gəncəvinin əsərlərində müşahidə etmək olar. Hicri onuncu əsrdə Əhli-Beyt (ə) məktəbinə arxalanaraq hakimiyyətə gələn Səfəvilər dövründə irfan üçün geniş imkanlar açıldı və Əhli-Beytin (ə) buyurduğu həqiqətlər və mərifətlərin bəyan edilməsi üçün münasib zəmin yarandı. Şübhəsiz Qafqaz xalqlarının, xüsusilə Azərbaycan xalqının sevdiyi Məhəmməd Füzuli Səfəvilər dövrünü ilk yüzilliyinin ən parlaq simalarından biri idi.

Alimlər və tədqiqatçıların dediyinə uyğun olaraq və Məhəmməd Füzulinin əsərlərinə əsasən bu böyük şair haqqında aşağıdakıları söyləmək olar:

1. *Məhəmməd Füzuli din alimi olmuşdur və kəlam, fəlsəfə, irfan, fiqh, üsul, hədis və təfsir elmlərini çox yaxşı bilirdi.*
2. *O, əqli və nəqli elmləri çox yaxşı bilirdi.*
3. *O, kamil bir ədib və şair idi. Ərəb, fars və azərbaycan dillərində olmaqla üç dildə şer demiş və bununla fəxr etmişdir. Füzuli fars dilini şer və ədəbiyyat dili hesab edirdi. Onun farsca olan divanı azərbaycanca olan divanından iki dəfə böyük idi. Lakin onun azərbaycan dilində olan əsərləri ədəbi, məna və məzmun etibarı ilə çox dəyərli əsərlərdir. Bəzi alimlərin fikrincə Füzulinin azərbaycan dilində olan yazıları yeni bir üslub meydana gətirmişdir.*
4. *Füzuli böyük bir arifdir ki, seyr, süluk, şühud, zövq və həqiqət, vəhdət-vücud kimi irfan ünsürlərini zərif şəkildə ədəbiyyat dilində bəyan etmişdir.*

5. *Füzulinin mühüm xüsusiyyəti onun Quran və Əhli-Beyt (ə) tərəfdarı olmasıdır və o, şiənin əsas prinsipləri ilə çox yaxından tanış idi. Xüsusilə qeyd etmək lazımdır ki, o, Əli (ə) və Hüseyn (ə) aşiqi idi və heç vaxt bundan dönməyib.*

Füzulinin elmi-mənəvi şəxsiyyəti ərəb, fars və azərbaycan müsəlmanları arasında böyük şöhrət qazanmışdı, lakin məlum səbəblərə görə azərbaycanlılar arasında daha çox məşhurlaşmışdır. Müasir dövrdə də bu həqiqəti təbliğ etməkdə çalışmalı və hər kəs belə əsərləri şərh edə bilməz.

Allaha şükürlər olsun ki, indi bu məcmuə dəyərli Azərbaycan oxucularına təqdim olunur. Bu mübarək əsərin dəyərli şərhçisi cənab ustad Hacı Əsgər Şahi ustad Murtəza Mütəhhərinin qeyd etdiyi iki yüksək xüsusiyyətə malikdir. Birincisi Ustad Şahi uzun illərdir ədəbiyyat və fəlsəfə sahəsində tədqiqat və araşdırmalar aparıb və böyük İslam ariflərinin əsərlərini nəzərdən keçirib. Həmçinin o, bu sahədə ali məktəblərdə tədris etməklə yanaşı İslam dünyasının ən məşhur və böyük arifi olan Hafiz Şirazinin şerləri haqqında böyük bir tədqiqat aparmış və hal-hazırda onun "Ta qafe əndişe" adlı Hafizin divanına yazdığı təfsiri bu sahədə olan şərhlər arasında ən mötəbər əsərlərdən biri sayılır. İkinci cəhət isə budur ki, o, şer və ədəbiyyat sahəsində də başdan-başa sənət və zövq əhli olan İranın parlaq ulduzlarından biridir. Şübhəsiz Ustad Şahi azərbaycan və fars dillərində yazan müasir şairlər arasında ən məşhur şairlərdən biridir və onun şerləri çox dərin mənaya, bənzərsiz gözəlliyə və zərifliyə malikdir. Ustad Şahinin məqamı o dərəcədədir ki, şer və şairşünas İslami İranın ədib və müdrik rəhbəri Həzrət Ayətulla əl-üzma Xamneyinin xüsusi hörmətini qazanmışdır.

İran İslam Respublikasının Azərbaycandakı səfirliyinin Mədəniyyət Mərkəzi Ustad Şahinin bütün bu xüsusiyyətlərini nəzərə alaraq ona Molla Məhəmməd Füzulinin azərbaycan dilində olan divanına şərh yazmaq xahişi ilə müraciət etdi və o, böyük məmnuniyyətlə bu ağır və mühüm işi öhdəsinə götürdü. Təklifimizi qəbul etdiyinə görə Ustad Şahiyə dərin təşəkkürümüzü və minnətdarlığımızı bildirir və möhtərəm

müəllimlərə, oxuculara və bu əsərlə maraqlanan bütün insanlara yaxın gələcəkdə üçüncü cildin çap olunması müjdəsini veririk.

Həmçinin bu əsərin birinci cildinin ərsəyə gəlməsində zəhmətləri olan Seyid Əliəkbər Ocaqnejad cənablarına dərin təşəkkürümüzü bildiririk. İİR-ın Azərbaycandakı Səfirliyinin Mədəniyyət Mərkəzi böyük şair Məhəmməd Füzulinin iki ölkənin ədəbi və mədəni həyatında oynadığı mühüm rolu, həmçinin Azərbaycan Respublikasında kitabın birinci cildinin böyük maraqla qarşılandığını nəzərə alaraq əsərin ikinci və üçüncü cildlərinin hazırlanmasını sürətləndirdi.

Mədəniyyət Mərkəzi inanır ki, bu çalışmalar iki ölkə arasında münasibətlərin, xüsusilə mədəniyyət sahəsində olan əlaqələrin daha da möhkəmlənməsinə səbəb olar və bu zəmində Mədəniyyət Mərkəzi Azərbaycan Respublikasının bütün universitet müəllimlərinin, nəzər sahiblərinin və alimlərinin əlini sıxır və həmişəki kimi bu sahədə əməkdaşlığa hazır olduğunu elan edir.

**İbrahim Nuri**
*İİR-ın Azərbaycandakı*
*Səfirliyinin Mədəniyyət Mərkəzi*

## Q Ə Z Ə L 101

(1) Hər kitabə kim ləbi-ləlin hədisin yazələr,
Rişteyi-can birlə eşq əhli onu şirazələr.

(2) Bu nə sirdir sirri-eşqin demədin bir kimsəyə,
Şəhrə düşmüş mən səni sevdim deyə avazələr.

(3) Şeyxlər meyxanədən üz döndərirlər məscidə,
Bitəriqətlər gərək kim, doğru yoldan azələr.

(4) Çaklər köksümdə sanman kim açıbdır tiği-eşq,
Könlümün şəhrinə mehrin girməgə dərvazələr.

(5) Ey Füzuli, yar əgər cövr etsə ondan incimə,
Yar cövrü aşiqə hər dəm məhəbbət tazələr.

Beyt 1: **Hər kitabə kim ləbi-ləlin hədisin yazələr,**
**Rişteyi-can birlə eşq əhli onu şirazələr.**

Sözlük: Hədis – söz = xəbər = rəvayət, Şirazələmək – səhifə bağlamaq.

**Nişanə** 1: “Kitab” – bu beytdə ilahi elm əks etdirmiş bəşəri vücuda işarə edən nişanə.

**Nişanə** 2: “Ləbi-ləlin” – ləbi-ləl yoxu var edən ilahi ilham və intibahlar bətni.

**Nişanə** 3: “Hədis” – mənəvi mərtəbələrdən xəbər verən rəvayətlər nişanəsi.

**Nişanə** 4: “Şirazələmək” –

A: şirazələmək – mühafizə etmək deməkdir;

B: şirazələmək – istiqbal etmək deməkdir.

**Anlam: Eşqdən xəbərdar şəxslər, ilahi intibahlar əks etdirmiş mərtəbəni qorumağa və onu qarşılamağa fədakarcasına hazırlaşmışlar.**

Beyt 2: **Bu nə sirdir sirri-eşqin demədin bir kimsəyə,**
**Şəhrə düşmüş mən səni sevdim deyə avazələr.**

Sözlük: Avazə – səs = səs-səda

**Nişanə 1:** “Sirr”: A: Sirr – daxili vücudda izlənmiş ruhdan daha lətif ilahi müşahidə mərkəzidir.

B: Sirr – aşiq ilə məşuq arasındakı elmə - idraka sığmaz özəl bir əlamətdir.

**Anlam: Sədi demişkən[1] eşq sirrini ürəkdə pünhan saxlamaq, odu ipək dəsmalda gizlətmək kimi qeyri-mümkündür.**

**Qeyd:** *Füzuli digər qəzəllərdə də bu sirrə işarələr etmişdir. O cümlədən:*

**Sən hali-dilin söyləməsən nola, Füzuli,**
**El fəhm qılır çaki-gəribanını görkəc.[2]**

Beyt 3: **Şeyxlər meyxanədən üz döndərirlər məscidə,**
**Bitəriqətlər gərək kim, doğru yoldan azələr.**

---

[1] در سوخته پنهان نتوان داشتن آتش      ما هیچ نگفتیم و حکایت بدر افتاد

[2] Qəzəl 53, Beyt 7

Sözlük: Şeyx – alim = qocalmış kişi = din rəhbəri = mürşüd, Bitəriqət – yolsuz = təriqətsiz = daxili aləmdən xəbərsiz.

**Nişanə** 1: Şeyx:

A: Şeyx bu beytdə özünü dünyaşünas ağıl məhdudluğunda həbs etmiş zahid.

B: Dini hökmlər zahirinə məşğul olmağı qənaətbəxş bilib batindən xəbərsiz qalmış zahid.[1]

**Nişanə** 2: "Meyxanə" : A: Meyxanə, uca Allah eşqinə məğlub olmuş səfalı – birüzlü dostlar məclisidir.[2]

B: Meyxanə, mənliyi ilahiliyə çevirən şərait.

**Nişanə** 3: "Məscid" : Məscid bu beytdə dini adab məbdudluğunda batini mərifətlərdən məhrum olmaq nişanəsidir.

**Qeyd:** *Öz dini əməllərini, nəhayət özünü arada görmək, ariflər nəzərincə "Sənəviyyət" ünvanlı ikiliyə, yaxud istər-istəməz vəhdət ilə müxəlifətə girifdar olmaqdan, ya da məğrurluq vəziyyətindən bir nişanədir*.

**Qeyd:** *Öz ibadət itaətindən razı olmaq, o ibadət itaətini yararlı bilmək, nəhayət, gizli bir mənəmlik iddiasından ibarətdir. Bunun üçün də arif şairlər namaza , məscidə və digər müqəddəs kəlmələrə gah üstü örtülü, gah da aşkarca irad – etiraz etmişlər*.

**Nişanə** 4: "Bitəriqətlər" : Bitəriqətlər, ibadət – itaətin çöl üzünü (adabını) kafi bilib, iç üzündən qafil olan şəxslərdən ibarətdir.[3]

**Anlam: İlahi ibadətlər-zahirini qənaətbəxş bilən şəxslərin batini feyzlərdən məhrum olduqları aydındır.**

Beyt 4: **Çaklər köksümdə sanman kim açıbdır tiği-eşq,**
**Könlümün şəhrinə mehrin girməgə dərvazələr.**

Sözlük: Çak – yarıq = çat, Mehr – məhəbbət = əhd = günəş = uca Allah ilə bəndə arasındakı vasitə.

**Nişanə** 1: "Çak": görünməz mərtəbələri göstərən, yaxud şühud məqamına nail edən ülvi aləmə açılmış ürək pəncərəsidir.[4]

**Nişanə** 2: "Könül şəhri": Könül şəhri, "mələkut" aləmi ünvanlı gözə

---

[1] Qəzəl 99, beyt 5
[2] Qəzəl 91, beyt 1
[3] Qəzəl 99, beyt 5
[4] Qəzəl 60, bey 6

görünməz təcrid aləmindən, yaxud ilahi əzəmətdən nişanədir.

**Nişanə** 3: “Mehr”: Mehr, ilahi cazibə yaradan vasitədən ibarətdir.[1]

**Anlam: Ürək çatını təcrid aləminə açılmış bir pəncərə kimi ilahi vasitələrdən feyziyab edən səbəbdən ibarətdir.**

Beyt 5: **Ey Füzuli, yar əgər cövr etsə ondan incimə,**
**Yar cövri aşiqə hər dəm məhəbbət tazələr.**

Sözlük: Tazələr = təzələşdirər

**Anlam: Ey Füzuli, həkimi-məhbubun (Allahın)* etdiyi cəfalar həqiqi yetkinlik səbəbi olduğuna görə daha sevməli və hörmətlidirlər.**

[1] Qəzəl 23, beyt 8

* Qeyd: Kitabda “həkimi-məhbub”, “mütəal-məbud”, “mütəal-məhbub” və s. kimi deyimlər Allah, Yaradan, Pərvərdigar, Rəbb deməkdir.

## Q Ə Z Ə L  102

**(1) Seyr qıl, gör kim gülüstanın nə abü tabı var,**
**Hər tərəf min sərvi - sərsəbzü güli - sirabı var.**

**(2) Pənceyi - bərgi - çinar etmiş mühəyya şanələr,**
**Anlamış guya ki,  sünbül kakilinin tabı var.**

**(3) Rahət içün fərş salmış səbzeyi-tər gülşənə**
**Nərgizin görmüş gözün məxmur, sanmış xabı var.**

**(4) Bulunur hər dərdə istərsən gülüstanda dəva**
**Hoqqəsində qönçənin san kim, şəfa cüllabı var.**

**(5) Qalib olmuş xəlqə zövqi – seyri- gülşən, ğalibən**
**Çəkməgə xəlqi bənövşə zülfünün qullabı var.**

**(6) Güldü gül, açıldı nərgis, lalə doldu jalədən,**
**Ey xoş ol kim işrətü eyş etməgə əsbabı var.**

**(7) Gər Füzuli meyli gülzar etsə fəsli-gül , nola**
**Eyş üçün xunabeyi-dildən şərabi - nabı var.**

Beyt 1: **Seyr qıl, gör kim gülüstanın nə abü tabı var**
**Hər tərəf min sərvi- sərsəbzü güli-sirabı var.**

Sözlük: Abü tab = təravət = lətafət = səfa = parıltı

Sərsəbz – təravətli = şad = təzə; Sirab = sular = sudan doymuş

**Nişanə** 1: "Gülüstan" : Gülüstan bu beytdə irfani "bəst" mərtəbəsinə eyham edən, məcazi ürək açan təravətdən ibarətdir.

**Nişanə** 2 : "Abü tab" : Abü tab, anlama – idraka yerləşmiş ancaq sözdə - bəyanda sığmayan dəqiq və lətif bir əmrə işarə edən məcazi vəsiyyətdən ibarətdir.

**Nişanə** 3 : "Sərvi – sərsəbz": İlahi lütflər davamına işarə edən məcazi səfalardan ibarətdir.

**Nişanə** 4 : "Güli sirab": Ölməz həyat mənşəli bəst məqamına işarə edən məcazi ürəkaçan vəziyyətlərin müvəqqəti həyat bağışlamasıdır.

**Anlam : Təbii gözəlliklər seyrinə, mənəvi gözəlliklər tanışlığına, həm də idrakına müqəddimə yaradan mərhələdir.**

**Qeyd** : *Ariflər baxımıyla qeyri maddi ölməz aləm rəsulundan, "ruhani bir əmri bütün kainatda nüfuz etdirən[1]" təbiətdən ibarətdir. Dağ – dərə, yaz – yay, gül – tikan və ... , zahirdə fərqli, hətta təzadlı olsalar da, batini dil, yaxud zəbanla bir hədəf və bir məqsədə istiqamətlərindən vəzifəli amildirlər:*

***Müxalifdir əgərçi nəğmələr, avaz vahiddir,***
***Nə qədri pərdələr çox saylıdırsa saz vahiddir.[2]***

*Beləliklə, öz daxili vücudunu ülvi aləm ilə əlaqələndirmiş şairlər, gah dağdan, dənizdən, meşədən münacat dinləməklə,[3]* " يسبح لله ما فى السماوات و ما فى العرض الملک القدوس العزيز الحکيم "[4] *(Göylərdə və yerdə olan hər şey müqəddəs, izzət və hikmət sahibi olan Allaha sitayiş edir) ayəsindən əməli surətdə bəhrələnirlər, gah* " الذى جعل لکم من الشجر الاخضارنار فاذا انتم توقيدون "[5] *(O kəs ki, sizin üçün yaşıl ağacdan od əmələ gətirdi və indi siz ondan od alışdırırsınız) ayəsinin narınc ağacında təzahür etməyini müşahidə edərək ilahi vədələr qətiliyinə həqiqətən iman gətirirlə, gah da digər təbii yöndəmlərdə irfani mənalar idrakına nail olurlar. Burada fəlsəfə isə irfan kimi təbii gözəlliklər tanışlığını mənəvi*

---

[1] Doktor Seyyid Cəfəri Səccadi, Fərhəngi-lüğat və istilahat və təbirati-irfani
[2] نغمه ها گرچه مخالف بود اواز يکيست      پرده هر چند که بسيار شود ساز يکيست "صائب تبريزى"
[3] کوه و دريا و درختان همه در تسبيحند      نه همه مستمعى فهم کنند اين اسرار "سعدى"
[4] Quran, "Cümə" surəsi, ayə 1
[5] Quran, "Yasin" surəsi, ayə 80

*gözəlliklər nailiyyətinə zəruri bir müqəddimə bilmişlər.*[1]

Beyt 2 və 3: **Pənceyi - bərgi - çinar etmiş mühəyya şanələr,**
**Anlamış guya ki, sünbül kakilinin tabı var.**
**Rahət içün fərş salmış səbzeyi-tər gülşənə**
**Nərgizin görmüş gözün məxmur, sanmış xabı var.**

**Anlam: Bu iki beytdə mətlə beytini izah etmək məqsədilə şair çinarı sünbülün və səbzəni nərgisin xidmətçisi kimi təqdim edərək, gözəllik aləminin müvazinətləşmiş bir dünya və ixtilafsız bir aləm olduğunu təlqin etmək istəyir.**

**Qeyd:** *İxtilaf, "kəsrət" məhsulu olduğuna görə gözəllik dünyası, xüsusilə, mənəvi camal cilvələrilə təravətlənmiş bir aləm, kəsrətin vəhdətə çevrilməsi və ya maddi vücudların mənəvi tədavül – təcəssümlərini həm aydın həm də məntiqi göstərmək istəyir.*

Beyt 4 : **Bulunur hər dərdə istərsən gülüstanda dəva**
**Hoqqəsində qönçənin san kim, şəfa cüllabı var.**

Sözlük: Hoqqə – cəvahir mücrüsü, cüllab = gülab

**Nişanə** 1: "Qönçə": "bəst istedadı" ünvanlı gizli ürfani mərtəbəyə işarə edən nişanədən ibarətdir.

**Nişanə** 2: "Şəfa": A : Dünyəvi ilgilər qızdırmasında, daxili vücudunu xəstələndirib, mənəvi zövqlər tamından məhrum olmuş insana dübarə irfani ilgiləri dadızdıran ilahi ehsan mərhələsindən ibarətdir.

B : "Mələkut" ünvanlı qeyri maddi aləm cəlalarından bəhrələnməklə maddi ilgilər kədərini qəlbdən silib – təmizləməyə işarə edən nişanədən ibarətdir.

**Anlam: Bu beyt, mətlə beytində qeyd olunmuş "Gülüstan" vəziyyətinin şəfabəxş olduğunu təkid edərək, təbii ürəkaçan vəziyyətdən düzgün bəhrələnməyin, mənəvi ürək açıqlığına körpü və müqəddimə olduğunu bəyan etmək istəyir.**

Beyt 5 : **Qalib olmuş xəlqə zövqi – seyri- gülşən, ğalibən**
**Çəkməgə xəlqi bənövşə zülfünün qullabı var.**

Sözlük: Qüllab – çəngal = caynaq

---

[1] Dovreyi-asari-Əflatun, tərcümə: Məhəmməd Əli Lutfi, cild 1, s.434, 436

**Anlam: Beyt, dünyəvi gülüstan vəziyyətinin vəcdə gətirən cazibəsini mənəvi cazibələr müqəddiməsi bilmişdir.**

**Qeyd:** *Qüllab" iki not arasında işə yarayan musiqi vəsiləsi olduğuna görə, tanrıya qovuşmaq istəyən insanın "Feyz vasitəsi" və ya "maqnitizm" və ya "Piri-muğan" və ya "Vəli" və ya "İmam" ünvanlı cazibə vasitəsinə möhtac olmağına da eyham edir.*[1]

Beyt 6 : **Güldü gül, açıldı nərgis, lalə doldu jalədən,**
**Ey xoş ol kim işrətü eyş etməgə əsbabı var.**

Sözlük: Nərgis = nərgiz, əsbab = səbəblər = vəsilələr

**Nişanə** 1: "Birinci misra": Təbii naqis gözəlliyin, mənəvi kamil gözəlliklə nisbətini bildirmək istəyir.

**Nişanə** 2: "Eyş və işrət" : Eyş və işrət, zahiri nigarançılıqdan xilas edən, batini ləzzətlər isinişməyinə, yaxud dünyəvilikdə əks etdirilmiş mənəviliyə işarə edən nişanədən ibarətdir.

**Nişanə** 3 : "Əsbab": Mənəvi əhvaldan – idraka lazım olan sərmayədən, yaxud hər bir şərtdən kənar, təkcə ulu tanrı eşqilə əlaqədar xalis ibadət – itaətləri və şəri hökmləri gözləmələrdən[2] , həm də daxili ətəşlər – atəşlərdən ibarətdir.

**Anlam: "Gülüstan" vəziyyətində əks etdirilmiş cilvələrdən istifadə etməklə bəsitlik aləminə yol açmaq, mənəvi sərvət hazırlamaqla şərtlənir.**

Beyt 7 : **Gər Füzuli meyli gülzar etsə fəsli-gül, nola**
**Eyş üçün xunabeyi-dildən şərabi - nabı var.**

Sözlük : Xunabə – qan yaş , nab – xalis

**Nişanə** 1: "Xunabə": Əngəl mənliyi batil etməklə daxili vücudu paka çıxaran nişanədir.

**Nişanə** 2: "Şərabi – nab": Uca Allah eşqinə mütləq məğlub olmaqdan nişanədir.

**Anlam: Füzuli "Xunabə" və "Şərabi – nab" ünvanlı sərmayə hazırlamaqla gülüstan mövqeyyətini tələb etmək istəyir.**

---

[1] Qəzəl 23, beyt 8
[2] Qəzəl 3 , beyt 3

## Q Ə Z Ə L 103

**(1) Sərvi – azad qədinlə mana yeksan görünür,**
**Nəyə sərgəştə olan baxsa, xuraman görünür.**

**(2) Can görünməz desələr təndə inanman, necə kim,**
**Lütfdən hər necə baxsam təninə, can görünür.**

**(3) Derəm əhvalımı cananə qılam ərz, vəli,**
**Görə bilmən özümü onda ki, canan görünür.**

**(4) Ey deyən: səbr qıl, ah eyləmə yari görcək,**
**Mənə düşvardır ol, gər sənə asan görünür.**

**(5) Sordum əhvalımı eşqində münəccimlərdən,**
**Baxdılar tale evinə, dedilər: qan görünür.**

**(6) Nə kəmandarsan, ey məh, ki, atıb qəmzə oxun,**
**Yıxdığın seyddə nə zəxm, nə peykan görünür.**

**(7) Bir sənəm zülfünə guya ki, veribdir könlün**
**Ki, Füzulinin iyin halı pərişan görünür.**

Beyt 1: **Sərvi – azad qədinilə mana yeksan görünür,**
**Nəyə sərgəştə olan baxsa, xuraman görünür.**

Sözlük: Yeksan – bərabər = bir cür = tən, sərgəstə = sərgərdan = avara = heyran, xuraman – qəmzəsatan = nazlanan

**Nişanə** 1: "Sərvi – azad: Bu beytdə dünyəvi vücuddan təzahür etdirilmiş mənəvi hüsnlər uzantısından ibarətdir.

**Nişanə** 2: "Qəd": Bu beytdə ilahi pərəstişlərin davamından ibarətdir.

**Nişanə** 3: "Xuraman": Bu beytdə qəbz ardınca hasil olmuş bəstdən ibarətdir.

**Anlam: Maddi vücudda mənəvi cəlalar əks etdirmək ərdəmi, yaxud qəbzləri bəstlərə çevrilmək feyzi ilahi pərəstişlərin davamına bağlıdır.**

Beyt 2: **Can görünməz desələr təndə inanman, necə kim,**
**Lütfdən hər necə baxsam təninə, can görünür.**

**Nişanə** 1: "Can": Bəşəri vücudun irfani əhvalatı idrak edən, həqiqi ölməz hissəsindən ibarətdir.

**Nişanə** 2: "Tən": İkinci misrada maddi vücudun mənəvi cilvələr əks etdirən "güzgü" və ya "məzhəriyyət" ünvanlı irfani mərtəbəyə nail olmasından, ya da daxili vücud ilə istiqamətlənmiş xarici vücuddan ibarətdir.

**Qeyd**: *Üzüntülü axşambaşılar, ürək açan şəfəqlər, hündür dağlar, allı – güllü bağlar, habelə, təbii səhnələr, axıcı nəğmələr, zahiri görüşlər, dünyəvi görünüşlər, hətta ictimai müaşirətlər və fiziki məlumatlar, hər bir insanın daxili vücudunu müsbət və ya mənfi şəkildə təsirləndirən kimi, məfkurələr, məramlar, fikirlər – xəyallar, kinlər – məhəbbətlər, zövqlər – vəcdlər, mərifətlər – mənəviyyətlər, nəhayət, daxili əhval-ruhiyyələr də xarici vücudda təsiredici olmalı və təzahür etməlidirlər. Dəmək, "mənalı anlamın, daxili aləmlə xarici aləm tərkibindən hasil olduğu*[1] *zahir ilə batinin ətraflı əlaqədarlığını aydın və məntiqi sübut edir. Bunun üçün də "təkcə mənəvi və ya dünyəvi seyri saliklər" haqqında qənaətbəxş bilməyiblər və onları "tam seyr"ünvanlı daxili və xarici seyr tərkibinə*[2] *həvalə etmişlər. Demək ariflərin "nur, günəş və aydınlıq"la isinişməyi diqqətlə belə bir [tərkibə] nail olmaq*

[1] Doktor Əbdülkərim Süruş, "Bəsti-təcrübeyi-nəbəvi" müəssiseyi Sirat, s. 223
[2] Doktor Cavad Nurbəxş, "Sufi kist", çapi Firdovsi, s.11

*üçündür. Hər bir insan bir çox xarici elementlər nişanəsini öz daxili vücudunda tapmaqla onlara ürək bağlamışdır. Bizim ürfani ədəbiyyatda hüsn və gözəlliyı bir belə siaytiş olunmasına yeganə səbəb ariflərin daxili aləmində parlıayan gözəllik nümunələrinin mövcudluğudur. Onların nəzərində xarici hüsnlərə məna bağışlayan və ya onları gözəlliklər kəşfinə nail edən mənəvi hüsnlərin daxili nişanələridir.[1]"*

*Bebəliklə, "tən" adlı zahiri vücudun, "can" ünvanlı batini vücud ilə hənahəng və həmcins olması, yaxud maddi cismin mənəvi təbdil – təcəssümü ilahi cəlaləri bəşəri vücudda əks etdirən, yaxud dünyəviliyi mənəviliklə birləşdirən "məzhəriyyət"[2] ünvanlı irfani mərtəbədir.*

*"Mövləvi atəşdəki rəngin pörtüb pul kimi qızarmış dəmirin zəban halilə səssiz – səmirsiz "mən atəşəm" dediyini təmsil və təsdiq edərək, mənəvi eşq atəşində iç vücudu alovlanmış bəşərin ilahi obrazlaşmasını, yaxud Mənsur Həllac kimi "Ənəlhəqq" dediyini məzhəriyyət mərhələsində maddi vücudun mənəvi tədavül – təcəssümü və ya cismin canla həmcins olması bilib buyurmuşdur[3]:*

***Məhv edər atəşdə öz rəngin, dəmir***
***Dəm vurar oddan, vəli yox səs – səmir***

***Çox qızardı odda yox hacət dilə***
***"Mən odam" söylər, zəbani-halilə[4]***

**Nişanə** 3: "Lütf": Lütf, zahiri batin ilə müvaziləşdirən ilahi tərbiyədən ibarətdir.[5]

**Anlam: Mürşüdün və ya hər ilahi vasitənin zahiri də batini kimi nurani və hidayət edicidir.**

Beyt 3: **Derəm əhvalımı cananə qılam ərz, vəli,**
**Görə bilmən özümü onda ki, canan görünür.**

**Nişanə** 1: "Əhval": Bu misrada tələb və ətəş atəşindən nişanədir.

**Nişanə** 2: "Özüm": Bu beytdə vəhdətdən başqa müstəqil bir vücuddan, nəhayət, kəsrət mənşəyi qoşalıqdan nişanədir.

---

[1] Doktor Əbdülkərim  Süruş, "Qəbz və bəst teorike şəriət", müəssiseyi Sirat, s.99

[2] Məzhəriyyət – zühur etdirmək imkanı = əks etdirmək ya da güzgü şəraiti

[3] رنگ آهن محور رنگ آتش است        زاتشی می لافدو خامش وش است
چون بسرخی گشت همچون زرکان        پس انا النارست لافش بی زبان

[4] Tərcümə müəllifindir

[5] Qəzəl 3, beyt 1 və qəzəl 80 beyt 8

**Anlam: Uca Allah cəmalindən parlayan cilvələr, yaxud bəşəri simada təzahür etdirilmiş ilahi cəlalər, heyranlıq və məhvlik ərəfəsində aşiqi hacət diləməkdən və ya fəraq dərdini və şövq döyüntüsünü bəyan etməkdən aciz etmişdir.**

**Qeyd** 1: *Canan görünməsi, ilahi nur görünməsindən ibarətdir.*

**Qeyd** 2: *Nur hazır olan yerdə zülmət qayib və məhv olmalıdır.*

**Qeyd** 3: *Maddə qaratəhər olduğuna görə maddi vücudun nur məqamında hazır olması mümkünsüzdür.*

Nəticə 1: “Canan görünür” məqamında, “görə bilməm özümü” , yaxud nur hüzurunda küdurət və zülmət qayibliyi, təbii bir hadisədən ibarətdir.

Nəticə 2: Özü yox olmuş bir şəxsin tələbi, ətəşi və digər hacətləri də yox olmalıdır.

Beyt 4: **Ey deyən: səbr qıl, ah eyləmə yari görcək,**
**Mənə düşvardır ol, gər sənə asan görünür.**

Sözlük: Düşvar = çətin

**Nişanə** 1: “Səbr qılmaq”: Bu beytdə canan bərabərində özünü idrak etmək və ya vahid məbud müqabilində başqa bir vücuda müddəi çıxmaq günahını, xatırlamaq istəyir.

**Nişanə** 2: “Ah etmək”: Bu beytdə ilahi nur hərarətində pörtüb yanmaqla maddi vücudu zərrə - zərrə mənəvi təbdilə – təcəssümə hazırlayan batini şəraitdən ibarətdir.

**Anlam: Mənəvi cəlalar müqabilində dünyəvi vücudu fəda etməmək mümkünsüz bir təsəvvürdür.**

**Qeyd** : *Nur bərabərində zülmət mühafizəsi mümkünsüz olduğuna görə, canan hüzurunda səbrini ya həqiqətən özünü hifz etmiş aşiq özündən xəbərdar olmaqla canandan xəbərsiz olmağını sübuta yetirir.*

Beyt 5: **Sordum əhvalımı eşqində münəccimlərdən,**
**Baxdılar tale evinə, dedilər : qan görünür.**

**Nişanə** 1: “Münəccimlər” : Münəccim nişanəsi, ölməz ulu aləmdən xəbərdar olmuş mürşidlərə işarədir.

**Nişanə** 2: “Tale”: İlahi parlamaların tənəzzül mərtəbəsinə, yaxud dünyəvi təzahür etməyinə işarədir.

**Nişanə** 3: “Qan görünür”: Qurbanlıq və ya məhvlik ərəfəsinə hazırlaşmaq ləyaqətinə işarədir.

**Anlam: Alın yazısından xəbərdar şəxslər və ya ulu aləm ilə əlaqədar mürşidlər mənim əhvalatımı (ah etmək, özünü görməmək) qurbanlıq məqamına nail olmağın müqəddiməsi bilmişlər.**

Beyt 6: **Nə kəmandarsan, ey məh, ki, atıb qəmzə oxun**
**Yıxdığın seyddə nə zəxm nə peykan görünür.**

Sözlük: Kəmandar = yaylı (ox atan) , seyd – ov = şikar, zəxm = yara, peykan = ox ucu

**Nişanə** 1: “Kəmandar”: Kəmandar, qurbanlıq məqamına nail edən ilahi vasitələr cilvəsindən və ya mütəal məbudun vasitəsiz cəlalərindən ibarətdir.

**Nişanə** 2: “Məh”: Qaramtıl maddədə və ya dünyəvi zülmətdə mənəvi cəlalər təzahür etdirmiş nişanədir.

**Nişanə** 3: “Qəmzə oxu”: Ürək laxladan ilahi cazibələri gah lütf, gah da qəhr ilə dünyəvi mənəm mənəmlikdən ayıran tərbiyəsizdən ibarətdir.

**Nişanə** 4: “Seyd”: Qurbanlıq məqamına hazır olmaqdan nişanədir.

**Nişanə** 5: “İkinci misra”: İkinci misra, ilahi eşqin elmə - əqlə, anlama – idraka, nəhayət dünyəvi ölçülərə sığmazlığına işarədir.

**Anlam: Beyt Düzgün aşiqin mütəal məşuq iradəsilə dünyəvi mərifətlərdən üstün çevrilişini, ya ikinci beytdə qeyd olunmuş ilahi obrazlaşmasını təkid etmək istəyir.**

Beyt 7: **Bir sənəm zülfünə guya ki, veribdir könlün**
**Ki, Füzulinin iyin halı pərişan görünür.**

**Nişanə** 1: “Sənəm”: Əlif : Mürşid həzrətindən və ya digər kamil insandan, yaxud hər bir ilahi vasitədən nişanədir.

B: Sənəm, ikinci beytdə izah etdiyimiz “məzhəriyyət” mərtəbəsinə hidayət edən dilbərdən nişanədir.

**Nişanə** 2: “Zülf”: Bu beytdə aşiq qəlbini müxtəlif sınaqlarla tərbiyə edən mənəvi mübhəm cazibələrdən ibarətdir.[1]

**Nişanə** 3: “İyin hal pərişanlığı”: Bu beytdə məcazi əngəl vücudu bürümüş məhvlik görüntüsündən ibarətdir.

**Anlam: Füzulinin pozğun vücudu, ilahi cazibələr qələbəsindən hekayət edir.**

---

[1] Qəzəl 12, beyt 2

## Q Ə Z Ə L 104

**(1) Süluki – fəqr ətvarım, məzaqi – eşq halımdır,**
**Təcərrüd aləmi seyrində aləm payimalımdır.**

**(2) Xəyalımda budur kim, bulmuşam aləmdə bir xilqət,**
**Nə aləm, qansı xilqət, sandığım batil xəyalımdır.**

**(3) Cünun feyzilə azad olmuşam qeydi - əlayiqdən,**
**Kəmalü fəzl tərki, rütbeyi – fəzlü kəmalımdır.**

**(4) Mənəm şəmi – vüsalə yandıran pərvanəvəş varın,**
**Fənayi – mütləqim canan ilə bəzmi-vüsalımdır.**

**(5) Təbiba, qılmışam təşxis, dərdi – eşqdir dərdim,**
**Əlamət ahi – sərdü ruyi – zərdü əşki – alımdır.**

**(6) Həvadən mövcə gəlmiş bəhri – dərdəm, şahidi - halım**
**Dili – poriztirabü naleyi – bietidalımdır.**

**(7) Füzuli, aləmi – fəqrü fənadə mün`imi – vəqtəm,**
**Diyari – məskənət, nəqdi – qənaət mülkü malımdır.**

Beyt 1: **Süluki – fəqr ətvarım, məzaqi – eşq halımdır,**
**Təcərrüd aləmi seyrində aləm payimalımdır.**

Sözlük: Süluk – rəftar = məxsus bir yol tutmaq = saliki "fəna" məmzilinə çatdıran məxsus mərtəbələr seyri; Fəqr – fağırlıq = yoxsulluq= ən yüksək irfani mərtəbə; Ətvar – yollar= təriqətlər (tövrlər) = rəftarlar =necəliklər; Təcərrüd – üryanlıq = təklik = tənhalıq= təcrid olmaq

**Nişanə** 1: "Süluk". A: Tövbə, mücahidət, xəlvət, tənhalıq, pəhrizkarlıq və digər məxsusi mənzil – mərtəbələr seyri ilə fəna və vüsal məqamına nail olmaqdır.[1]

B: Saliki, ən yüksək ürfani məqama nail edən daxili və xarici seyr tərkibindən ibarətdir.[2]

C: Bəşər zatında gizlədilmiş əxlaq – sifətlər, süluk mərtəbələrində təmamilə zahir olmaqla salik kiçik aləm seyrini başa çatdıraraq böyük aləm seyrinə daxil olmağa nail olur. O, bu aləmdə ilahi xilafət məqamına yüksəlməklə "Əzəm ism təcəllisi"[3] ünvanlı mərtəbədə öz sözünü uca Allah sözü ilə tənləşdirməyə müvəffəq olur.[4]

D: Salik bəşəri varlıqdan boşalmış daxili vücudunu ilahi varlıq ünvanlı həqiqi həyatla doldurularaq "ila ilah"[5] adlı məxsus sülukunu nəhayətə çatdırmağa nail olur.

E: Salikin əhval – ruhiyyəsi "fi Allah"[6] ünvanlı nəhayətsiz sülukda[7] elmə, bəyana sığmaz bir həqiqətdən ibarətdir.[8]

**Nişanə** 2: "Fəqr": Bütün dünyəvi etibarlara, hətta batini istedadlara uca Allahı həqiqi malik bilməkdən, nəhayət məmlüklük ünvanlı bəndəliyi etiraf etməkdən, beləliklə, bütün ixtiyarını və iradəsini eşqə təhvil vermiş ixtiyarsız aşiq vəziyyətindən ibarətdir.[9]

**Nişanə** 3: "Ətvar". A: Nazik pərdələr arxasından uca Allahın ətrini saçan mərtəbələrdən ibarətdir.

---

[1] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی
[2] Qəzəl 103, beyt 2, qeyd
[3] Ən əzəmətli ad cilvəsi, mütəal Allahın ən böyük adı
[4] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی
[5] Tanrıya sarı
[6] Tanrıda
[7] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی
[8] Qəzəl 1, beyt 1, nişanə Salik
[9] Qəzəl 2, beyt 1, (anlam, qeyd), qəzəl 44, beyt 4

B: İlahi cilvələr ilə mənəvi genişlik tapmış sinədən ibarətdir.[1]

C : Yeddi mərhələli daxili aləm seyrindən ibarətdir.[2]

**Nişanə** 4: “Məzaqi-eşq”: İlahi kəşflər önündə məğlubiyyət ləzzətini idrak edən batini qüvvədən ibarətdir.

**Nişanə** 5: “Hal”. A: Ürək aləminə gizli daxil olan mənəvi hədiyyələrdən ibarətdir.[3]

B: Bəst mərtəbəsinin ürəkaçan səmərəsidir.

C: Qəbz mərhələsinin tərbiyəedici mərhələsidir.

D: Əqli heyran, elmi aciz edən və nitqi qurudan ilahi özəl hədiyyədir. Buna görədə arfilər demişlər: “Hal, bəyan tədbirlərini unutmuş dil sakitliyindən ibarətdir.”[4]

E: Ruh cismi zinətləndirdiyi kimi, arifin vaxtını zinətləndirən gizli bir ruhiyyədə “hal” ünvanlı mərtəbədən ibarətdir.[5]

**Nişanə** 6: “Təcərrüd”: Təcərrüd və ya “cəridə” dünyəvi etibarsız malikiyyətləri, ilgiləri, habelə ümum ürəyə yatan şeyləri unutmaqdan, Füzuli buyurduğu kimi “hər təəllüqdən ola xurşid tək aləmdə fərd” məqamına nail olmaqdan ibarətdir.[6]

**Qeyd** 1: *Xarici vücudunu məcazi ilgilərdən üryan etmiş salik, batinini mehriban Allahın özəl rəhmətilə dünyəvi istəklərdən üryan edib saflaşdırarkən müşahidə (şühud) məqamına nail olur.*

**Qeyd** 2: *Sadiq aşiq, təcərrüd ətri ilə dünyanı tərk etmək müqabilində mehriban Tanrıdan dünyada bir əvəz və axirətdə mükafat tələb etməyib, yalnız şühudun davamını xahiş edir.*[7]

**Qeyd** 3: *Özünü fəqr mərtəbəsinə qaldırmış bir salikin “təcərrüd” məqamına nail olması qəti bir nəticədir, demək “fəqr”, cəridə məqamının gərəkli müqəddiməsindən ibarətdir.*

**Anlam: Təcərrüd aləmini seyr edən çağda, məcazi dünyanı bütün nemətləri ilə daha həqir və möhtac dərk edirəm (həqiqi mərifət).**

---

[1] Doktor Seyyid Cəfəri Səccadi, Fərhəngi-lüğat və islahat və təbirate-irfani
[2] Qəzəl 13, beyt 1
[3] Qəzəl 1, haşiyə
[4] الحال سکوت اللسان فی فنون البیان، "کشف المحجوب"، ص 472
[5] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی
[6] Qəzəl 64, beyt 5
[7] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

Beyt 2: **Xəyalımda budur kim, bulmuşam aləmdə bir xilqət,**
**Nə aləm, qansı xilqət, sandığım batil xəyalımdır.**

**Nişanə** 1. “Xəyal”: Bu beytdə güzgüdən görünmüş bir şey kimi həqiqətsiz surətdən ibarətdir.

**Qeyd** 1: *Bəşəri hissi ilə üzbəüz olmuş bir şeyin surəti, zehndə peyda olan zaman “idrak” doğulur.*

**Qeyd** 2: *Bəşəri hissi ilə üzbəüz olmayan bir şeyin surəti, zehndə peyda olan zaman “Xəyal” canlanır.*[1]

**Nişanə** 2. *“Xilqət”, Bu beytdə zahiri varlıq və təbii gözəllikdən ibarətdir.*

**Anlam: Ötən beyti izah etmək məqsədilə təbii aləmi təcərrüd aləmi ilə müqayisədə şair xəyalı etibarsız bir aləm, yaxud həqiqətsiz bir surət kimi təmsil etmək istəyir.**

**Qeyd** : *“Xəyal” və “Xilqət” nişanələri, yaxud ikinci beyt irfani baxımla:*

*A: Aləmdə həqiqi bir xilqətlə tanış olmağı, yaxud təbii aləmi həqiqi etibarlı sanmağ, batil bir xəyal kimi təlqin etmək istəyir.*

*B: Təcərrüd ünvanlı, yəni bir xilqət tanışlığını, heç olmazsa məcazi vücud həbsində hər bir mərifət və idrakdan üstün olduğuna görə batil bir xəyal kimi bəyan etmək istəyir.*

Beyt 3: **Cünun feyzilə azad olmuşam qeydi - əlayiqdən,**
**Kəmalü fəzl tərki, rütbeyi – fəzlü kəmalımdır.**

Sözlük: Cünun – məcnunluq = divanəlik; qeyd – həbs = bənd; əlayiq – əlaqələr = bağlılıqlar = istəklər; fəzl – üstünlük = ehsan = mərifət = hikmət

**Nişanə** 1. “Cünun”: Dünyaşünas məhdud əqldən üstün mərifətlər məhsulundan ibarətdir.[2]

**Nişanə** 2. “Feyz”: İlahi ilham ehsanından ibarətdir.

**Nişanə** 3. “Əlayiq qeydindən azad olmaq”: Fərdlik və ya bəsitlik məqamına nail olmaqdan ibarətdir.[3]

**Nişanə** 4. “Kəmal və fəzl”: A: Birinci, kəmal və fəzl mənəvi mərtəbələr tanışlığından məhrum edən dünyəvi imtiyaz – etibar məşğulluğun-

---

[1] Doktor Məhəmməd Moin, Fərhəngi-Moin.
[2] Qəzəl 64, beyt 3 və Qəzəl 93, beyt 7.
[3] Qəzəl 64, beyt 5.

dan ibarətdir.

B: İkinci, fəzl və kəmal, üryanlıq, fərdlik və bəsitlik şəraitində qazanılmış ülvi mərifətlərdən ibarətdir.

**Qeyd** 1: *Aşiq hər bir mənəvi mərtəbə tanışlığı ilə, bir və ya bir neçə dünyəvi məqam və mərifətə etinasız olaraq dünyəvi fəzlləri tədricən tərk etməklə mənəvi fəzllər önündə baş qaldıran maneələrdən xilas olmaq imkanını tapmalıdır. Demək, dünyəvi kamalları bir sərmayə kimi mənəvi kamallar qazanmaq üçün sərf etmək salik aşiq üçün gərəkli bir təklifdir. Bunun üçün də Hafiz buyurmuşdur:*

تا فضل و علم بینی بی معرفت نشینی
یک نکته ات بگویم خود رت مبین که رستی[1]

**Qeyd** : *"Əzvac" və "əzdad" baxımı[2] və ya "baş - ayaq" ünvanlı devrilməklər bəhsi (tərsə məqamlar), mənəvi imtiyazlar yaxınlığını dünyəvi imtiyazlar uzaqlığı ilə şərtləndirmişdir.*

**Anlam: Əl – ayağa dolaşan dünyəvi imtiyazları unutmaqla, maddi aləmdən üstün mərtəbəyə, yaxud təbii təfəkkürdən yüksək atmosferə qaldıran mənəvi imtiyazlar tanışlığına nail olmuşam.**

**Qeyd** 1: *Əl – ayağa dolaşmaq, qanad açmağa, nəhayət seyr səmasını dolanmağa ciddi bir maneədir.*

**Qeyd** 2: *Dünyalığa arxa çevirmək, yaxud mal – dövlətdən əl çəkmək mal-dövlət sevənlərin nəzərincə aydın bir divanəlikdir. Lakin bu nəzər batindən xəbərsiz zahiri bir anlaşmadan hasil olmuş yersiz bir nəzərdir.*

Beyt 4: **Mənəm şəmi – vüsalə yandıran pərvanəvəş varın,**
**Fənayi – mütləqim canan ilə bəzmi-vüsalımdır.**

Sözlük: Pərvanəvəş – pərvanə kimi; Bəzm – ziyafət məclisi = əncümən = isinmək məclisi = xeymə

**Nişanə** 1. "Şəmi – vüsal": İlahi sirlər nurunu parladan hüzur məqamından ibarətdir.

**Nişanə** 2. "Pərvanə": "Nuri"[3] və "Nari"[4] məhəbbət ünvanlı devriliş mərhələsində maddi aləm həbsindən xaric olaraq mənəvi aləm ərəfəsinə qədəm basmış aşiqdir.

---

[1] Müəllif bu beyti "Ta Qafe-əndişe" kitabının 4-cü cildində şərh etmişdir.
[2] Qəzəl 3, beyt 2
[3] Qəzəl 54, beyt 7
[4] Qəzəl 54, beyt 7

**Nişanə** 3. “Yandırılmış var”: Yandırılmış var, mətlə beytində qeyd olunmuş “fəqr”, yaxud təcrid qabiliyyətini təkid edən tərkibdən ibarətdir.

**Nişanə** 4. “Fənayi-mütləq”: Vücudun bəşəri hissəsini, yaxud cismin ixtiyar – iradəsini ilahi eşq qələbəsində fani etməklə mənəvi seyri nəhayətə çatdırmaq nişanəsidir. Deməк, mütləq fəna, ilahi zühurlar qələbə etmiş daxili vücudda bəşəri şüuru məhv edən mərhələdən ibarətdir.

**Nişanə** 5. “Bəzmü-vüsal”: İlahi əlaqələr uzantısından ibarətdir.

**Anlam: Məhəbbət atəşində paklanmış batinim, təcərrüd aləmindən xəbərdar olaraq ilahi hüzur nemətindən bəhrələnmişdir.**

Beyt 5: **Təbiba, qılmışam təşxis, dərdi – eşqdir dərdim,**
**Əlamət ahi – sərdü ruyi – zərdü əşki – alımdır.**

Sözlük: Ahi – sərd = soyuq ah; Ruyi zərd – saralıb -solmuş surət; Əşki – al = qanlı göz yaşı

**Nişanə** 1. “Təbib”: A: Təbib islamın ulu peyğəmbərindən nişanədir.

B: Təbib – ülvü aləmə qaldıran kamalları, həm də onların afətlərini tanımış mürşüd həzrətindən nişanədir.

C: Təbib – dünyəvi tanınmış etibarları qənaətbəxş bilib, onları qorumağı rica edən nəsihətçidir.

**Nişanə** 2. “Dərdi-eşq”: Bu beytdə aşiqi məcazi mənliyə qarşı qoyan nifrətləndirən tükənməz iztirabdan nişanədir.

**Nişanə** 3. “İkinci misra”: Dünyəvi əngəlin, yəni iqtidar – etibarın silinib atılmasıdır.

**Anlam: A: Ey islamın ulu peyğəmbəri və ya mürşüd, sonsuz iztiraba düşmüş batinim sənin tərbiyəedici hidayətindən hekayət edir.**

**B: Ey dünyəvi asudəlikləri təbliğ etməklə eşq dərdinə təqdir göstərən nəsihətçi, ahi-sərd və ruyi-zərd və əşgi-al (ikinci misra) hər bir nəsihətin təsirsiz olmasına dəlalət edir.**

Beyt 6: **Həvadən mövcə gəlmiş bəhri – dərdəm, şahidi - halım**
**Dili – poriztirabü naleyi – bietidalımdır.**

Sözlük: Bəhr – dəniz; Şahid – şahid; Poriztirab = iztirabın çoxluğu; Bietidal – tən gəlməyən = tən olmayan = bərabərsiz

**Nişanə** 1. “Həvadən mövcə gəlmək” : A : Həvadən mövcə gəlmək,

mənəvi həvəslər daşqınlığından ibarətdir.

B : Həvadən mövcə gəlmək, dünyəvi ilgilərdən, nəhayət mənəm – mənəmlikdən bir köpük kimi xali olmuş aşiqdən nişanədir.

**Nişanə** 2 “Bəhri-dərd”: A: Dünyəvi bağlantılara giriftar edən təbii hissi – təmayülatı tamamilə silib – aparan, nəhayət, Tanrıdan başqalarını aşiq nəzərindən salan, nemət dənizindən qopmuş müsibət dalğalarından ibarətdir.[1]

B: Tükənməz iztiraba düşmüş batindən ibarətdir.

**Nişanə** 3. “Deli-poristirab”: Batini vücudun üzünü səmaya tutmasına şərait yaradan ürək döyüntüsündən ibarətdir.

**Nişanə** 4. “Nalə”: A: Daxili vücud münacatından ibarətdir. (Özəl münacat)

B: Məmlüklüyü - möhtaclığı (bəndəliyi) etiraf etməkdən nişanədir.

**Qeyd** : *Nalə, həm hicranda, həm də vüsalda ürəkdən qopan özəl nərədən ibarətdir.*[2]

**Anlam: Nemət qulpundan asılı müsibətlərlə döyünən ürək məcazi əngəl mənliyindən xali olaraq bir köpük kimi mənəvi atmosfer havası ilə dolmuşdur.**

Beyt 7: **Füzuli, aləmi – fəqrü fənadə mün`imi – vəqtəm,**
**Diyari – məskənət, nəqdi – qənaət mülkü malımdır.**

Sözlük: Fəqr – fağırlıq = yoxsulluq; mün`im = ehsan edən = başqalarını ehsandan bəhrələndirən = nemət bağışlayan; məskənət – miskinlik = fağırlıq

**Nişanə** 1. “Fərq və məskənət”: Bu beytdə yalnız mütəal Məhbub eşqinə məşğul olmaqla dünya və axirət nemətlərini nəzərdən salan mərhələdən nişanədir.

**Qeyd** : *Sadiq aşiq nəzərində, axirət nemətləri də ürəyi neçəliyə, yaxud kəsrətə məşğul etməklə vəhdət nailiyyətinə maneə yaradan və vahid məhbub ərəfəsində xətakarlıq sayılan məşğulluqdan ibarətdir.*

**Nişanə** 2. “Fəna” : Bax 4-cü beytə.

**Nişanə** 3. “Mün`əm”: Öz nəfsindən xaric və şühud aləminə daxil olmuş aşiqdir.

**Nişanə** 4. “Mün`əm”: İlahi seyr tələb etmiş aşiqi hidayət nemətin-

---

[1] Qəzəl 37, beyt 1

[2] Müəllif bu barədə, xüsusilə, vüsal naləsi şərhində “Ta Qafe-əndişe” kitabının I cildində 181 və 182-ci səhifədə məlumat vermişdir.

dən bəhrələndirən mürşüddür.

**Nişanə** 5. “Qənaət”: A: Yalnız ulu Tanrıdan hacət diləməkdən nişanədir, elə buna görə də Əbu Turan Nəxşəbi “القناعه اخذ القوه من الله” buyurmuşdur.[1]

B : Qənaət, xalqın əlində olanı tərk edib, öz əlində olanı bəxş etməkdən ibarətdir.[2]

**Anlam: Füzuli fəqr və fəna dövlətinə nail olmaqla, özünü mün`əmlik və mən`imlik məqamına qaldırmağa müvəffəq etdi.**

---

[1] Qənaət yalnız ulu Tanrıdan qüvvət almaqdan ibarətdir .(Təbəqati-sufiyyə, səh. 151)

[2] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

## Q Ə Z Ə L  105

**(1) Şəfayi – vəsl qədrin hicr ilə bimar olandan sor,**
**Zülali – zövq şövqün təşneyi – didar olandan sor.**

**(2) Ləbin sirrin gəlib göftarə, məndən özgədən sorma,**
**Bu pünhan nüktəni bir vaqifi - əsrar olandan sor.**

**(3) Gözü yaşlıların halın nə bilsin mərdümi – qafil,**
**Kəvakib seyrini şəb ta səhər bidar olandan sor.**

**(4) Xəbərsiz olma fəttan gözlərin cövrün çəkənlərdən,**
**Xəbərsiz məstlər bidadını hüşyar olandan sor.**

**(5) Qəmindən şəm tək yandım, səbadən sorma əhvalım,**
**Bu əhvalı şəbi – hicran mənimlə yar olandan sor.**

**(6) Xərabi – cami – eşqəm, nərgisi – məstin bilir halım,**
**Xərabat əhlinin əhvalını xummar olandan sor.**

**(7) Məhəbbət ləzzətindən bixəbərdir zahidi – qafil,**
**Füzuli, eşq zövqün, zövqi – eşqi var olandan sor.**

Beyt 1: **Şəfayi – vəsl qədrin hicr ilə bimar olandan sor,**
**Zülali – zövq şövqün təşneyi – didar olandan sor.**

Sözlük: Vəsl – vüsal = vəslət; hicr – hicran; didar – görüş

**Nişanə** 1. “Şəfa”: Bu beytdə aşiq qəlbini müxtəlif qəbzlər caynağından nicat verən mələkuti cəlalər qeyzidir.

**Nişanə** 2. “Vəsl”. A: Aşiq ilə məşuq arasındakı məcazi fasiləni yox dərəcəsinə çatdıran şühud davamıdır.

B: Uca Allah fikrindən başqa fikrin – xəyalın, şühud nurunda məhvlik mərhələsindən ibarətdir.

**Nişanə** 3. “Hicr”: Şühud məhrumluğundan ibarətdir.

**Nişanə** 4. “Bimar”. A: Cismi duyğularını və ya fiziki mahiyyətini süqut mərhələsinə çatdıqmaqla, özünü batini həyat nailiyyətinə hazırlaşdıran aşiqdən ibarətdir.

B: Tanrıya qovuşmaq məqsədilə bəşəri varlığını yox etmiş aşiqdir.[1]

**Nişanə** 5. “Zülai-zövq”: Şühud mərtəbəsinin ilk dərəcəsində dünyəvi qəlizliklərdən təmizlənmiş daxili vücud ruhiyyəsindən ibarətdir.

**Nişanə** 6. “Şövq”: Zövqdən sonra törənmiş davamlı şühud tələbindən ibarətdir.

**Nişanə** 7. “Təşneyi-didar”: Cismi vücud təşnəliyini su tələbatından, yaxud ömür boyu sudan bəhrələnməklə enerji saxlanmasından, boy atmadan və həyat sürməkdən hekayət edən kimi şühud təşnəliyi də zamansız mənəvi aləmdə, yaxud Allah hüzurunda “İlahi keçmiş” ünvanlı yaşamaqdan və ya “Ənəallah”[2] sabiqəsindən hekayə edir. Demək, didar təşnəliyi mənəvi tanışlığın, “mərifət” adlı aydın əlamətindən ibarətdir.

Quran təfsirçiləri “يخرج الحی من المیت”[3] ayəsinə istinad edərək ölümü həyata çevirən cilvənin ürfani adına gah “su”, gah “mərifət” demişlər. Onlar “و الله انزل من السماء ماءً فاحیا بهِ الارض بعد موتها انَّ فی ذالک لایه لقوم یسمعون”[4] ayəsində qeyd olunmuş suyu da mərifət və həyatdan istiarə bilmişlər.[5]

---

[1] Qəzəl 81, beyt 4

[2] Quran, “Bəqərə” surədi, 156-cı ayədən bir qismət: “انا الله و انا الیه راجعون”, (Biz Allaha aidik və əlbəttə ona tərəf qayıdacağıq)

[3] Quran, Ənam surəsi, ayə 95: ان الله فالق الحب و النوی یخرج الحی من المیت و مخرج المیت من الحی ذالکم الله فانّی توفکون. (Allah şübhəsiz ki, toxumdan çərdəyi yarıb çıxarandır, və diridən ölü çıxarandır, dirini ölüdən çıxardır, və diridən ölü çıxarandır. Budur Allah! Axı Ondan necə üz döndərirsiniz?)

[4] Quran, əl Nəhl surəsi, 65 ci ayə : (Və Allah göydən bir su göndərdi, onunla yer üzünü öləndən sonra diriltdi, həqiqətən eşidən kimsələr üçün bunda böyük bir ayət vardır.)

[5] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

**Anlam: Təşnəlik atəşində alovlanmış bir insan, suyun əzəmətini idrak edən kimi hicran caynağıyla dünyəvi əngəl ilgilərini, yaxud fiziki mahiyyətini soyunub, dünyəvilik dərəsindən çıxarar (təcrid) mənəvi keçmişindən xəbərdar olmuş aşiq isə vüsal qədrini idrak edər (mərifət)**

Beyt 2: **Ləbin sirrin gəlib göftarə, məndən özgədən sorma,**
**Bu pünhan nüktəni bir vaqifi - əsrar olandan sor.**

Sözlük: Göftar – danışıq; Nüktə – nöqtə = dəqiq bir məsələ = nazik bir məzmun; əsrar – sirlər = rəmzlər

**Nişanə** 1. “Ləb”: Bu beytdə feyz məqamından nişanədir.
**Nişanə** 2. “Əsrar”: Tam vüsal cəlaları ilə əhatələnməkdən ibarətdir.[1]

**Anlam: Feyz məqamından xəbərdar olmaq imkanı, bütün vücudun ilahi cilvələrdə həll olmasına bağlıdır.**

Beyt 3: **Gözü yaşlıların halın nə bilsin mərdümi – qafil,**
**Kəvakib seyrini şəb ta səhər bidar olandan sor.**

Sözlük: Kəvakib – kövkəblər = ulduzlar; Şəb – gecə; Bidar = oyaq

**Nişanə** 1. “Gözü yaşlı”: Mənəm – mənəmliyini və ya fiziki mahiyyətini bir ləkə kimi silib – atmağa özünü hazırlaşdırmış biqərar aşiqdir.
**Nişanə** 2. “Hal”: Bu beytdə daxili vücuda, məxsus ruh verən ilahi hədiyyədən ibarətdir.
**Nişanə** 3. “Kəvakib seyri”: Maddi dünyadan üstün parlamalar idrakından ibarətdir.
**Nişanə** 4. “Bidar”: İbadət məşğulluğunda, bəndəlik məqamına nail olmuş arifdən nişanədir.

**Anlam: Öz mənəm - mənəmliyini selə - suya verməyən bir şəxs daxili həyat bağışlayan ilahi parlamalardan, beləliklə də bidarlıq məqamından xəbərdar ola bilməz.**

Beyt 4: **Xəbərsiz olma fəttan gözlərin cövrün çəkənlərdən,**
**Xəbərsiz məstlər bidadını hüşyar olandan sor.**

Sözlük: Fəttan – fitnəkar = fitnəçi = daha gözəl = dilbər, hüşyar = huşlu;

[1] Göstəriləm kitab

**Nişanə** 1. "Fəttan": Bu beytdə ürək aləmini və ya daxili vücudu müxtəlif sınaqlar atəşində paka çıxarıb tərbiyə edərək, onu ilahi məqsəd nailiyyətinə istiqamətləndirən uca Allahın məxsusi sifətindən ibarətdir.

**Nişanə** 2. "Göz": Bu beytdə ilahi camaldan parlayan müşahidə və ya şühud vəziyyətini təlqin edən nişanədir.

**Qeyd:** *İrfan panteist baxımıyla bəyan olunmuş terminlər, maddi elmlər terminləri kimi sabit deyil..., o cümlədən müşahidə mövzusunda cürbəcür təbirlər gözə çarpır. Bunun üçün də biz, mövzunu sonda müxtəlifcür şərh etməyi qənaətbəxş bilirik,.... Təhlükəli qaranlıq yollardan, zolaqlardan, uçurumlardan və dərə - təpədən sovuşub, birdən-birə gözü parlaq günəşə düşmüş, nura adətsiz bir müsafir dəhşətlənməyi, qamaşığı, göz yummaması, üz gizlətməsi, beləliklə asta – asta nura adət etməyi kimin, məxsus sərgərdanlığa – heyranlığa giriftar olmuş bir salikdə, üzü ilahi nura tərəf addım ataraq tədricən mənəvi cəlalar ilə isinişib, ürək gözü ilə ilahi camal müşahidəsinə naliyyət imkanı tapmalıdır.*[1]

**Nişanə** 3. "Cövr çəkmək": Müxtəlif qəbzlər ilə sınanıb tərbiyələnməkdən nişanədir.

**Nişanə** 4. "Xəbərsiz məstlər": Bəşəri camalda ilahi hüsnlər əks etdirməklə dünyəvi hacətlərdən xilas olmuş gözəllərdən və ya ilahi vasitələrdən, ya da ulu məqamlı mürşüdlərdən ibarətdir.

**Nişanə** 5. "Bidad": Birinci misrada bəyan olunmuş "cövr" mərhələsini təkrar edən nişanədən ibarətdir.

**Nişanə** 6. "Huşyar": Bu beytdə "mərifət" ünvanlı mənaşünas qüvvəyə malik olmuş salikdən ibarətdir.

**Qeyd:** *Ariflər nəzərincə: Vücudun özündə olmayan bir şeyə mərifət tapmağın mümkünsüz olduğu qəti bir məsələdir. Demək, bu müqəddimə hər bir şeyin idrak şərtini onunla həmcins olmaqdan nəticə alır, nəhayət, uca Allah mərifətinə nail olmaq və aləm seyrlərini düşünmək şərti həmin mərifətin və həmin seyrlərin insanın öz vücudunda olmasından ibarətdir.*[2] *Beləliklə huşyar şəxs, öz daxili vücudunda mənəvi örnəklər tapmış salikdən ibarətdir.*[3]

**Anlam: İlahi qəbzlər nəticəsindən xəbərdar olmayan bir insan, məşuq rəva bildiyi cövr və cəfa ləzzətini idrak etməkdən acizdir.**

---

[1] دکتر قاسم غنی ، "تاریخ تصوف اسلام"جلد 2، چاپ 7، سال 1357، ص 364
[2] Göstərilən kitab, cild 2, səh 425
[3] Qəzəl 10, beyt

Beyt 5: **Qəmindən şəm tək yandım, səbadən sorma əhvalım,**
**Bu əhvalı şəbi – hicran mənimlə yar olandan sor.**

Sözlük: Şəbi-hicran = hicran gecəsi

**Nişanə** 1. "Qəm": Bu beytdə "hal qürbəti" ünvanlı qəriblikdir.[1]

**Nişanə** 2. "Səba": Bu beytdə dünyəvilik səddindən həmişəlik xilas olmaqla mütəal məhbub hüzurunda maneəsiz feyzyab olmuş arifdir.

**Nişanə** 3. "Şəbi-hicran": Bu beytdə hal qürbətindən istiarədir.

**Anlam: Mənəvi görünməz aləmdən kənar düşmək dərdimi yalnız hal qürbətinə giriftar olmuş bir qərib aşiq idrak edə bilər.**

Beyt 6: **Xərabi – cami – eşqəm, nərgisi – məstin bilir halım,**
**Xərabat əhlinin əhvalını xummar olandan sor.**

Sözlük: Nərgis – nərgiz; Xərabat – xarabalar= viranələr; Xummar – şərabçı = mürşüd = kamil rəhbər

**Nişanə** 1. "Xərab": Vücudun bəşəri yönünü xərab etməklə (unutmaq) ilahi vücud tanışlığına[2], yaxud düzgün mərifətə nail olmaq sifətindən ibarətdir.

**Nişanə** 2. "Cami-eşq": Salik arifin və ya kamil mürşüdün mənəvi əhvalat ilə dolu ürəyindən nişanədir.

**Nişanə** 3. "Nərgisi-məst": Bu beytdə ilahi camal qələbələrindən və ya fiziki mahiyyəti məğlub etmiş şühud nurundan nişanədir.

**Nişanə** 4. "Xərabat": Xərabat, aşiqi cismani vücud əlaqələrindən və ya bəşəri sifətlər məhdudluğundan azad edən vəziyyətdən ibarətdir.

**Qeyd:** *İxtiyarsız – iradəsiz bir vücuddan ilahi maarif sadir olması, xərabat mərtəbəsinə nail olmaq nişanəsidir.*

**Nişanə** 5. "Xümmar": Eşq atəşində alovlanmış ürəklər əhvalından və ya bir çox daxili vücudlar sirrindən xəbərdar olan kamil mürşüddən ibarətdir.

**Anlam: Daxili vücudumu alovlandırmış eşq atəşindən yalnız mürşüd həzrətləri xəbərdardır.**

---

[1] Qəzəl 34, beyt 3
[2] Qəzəl 87, beyt 4

Beyt 7: **Məhəbbət ləzzətindən bixəbərdir zahidi – qafil,**
**Füzuli, eşq zövqün, zövqi – eşqi var olandan sor.**

**Nişanə** 1. "Məhəbbət". A: Ürək coşğunluğunda, gizli mahiyyətli məhsuldan ibarətdir.[1]

B: Camal aləminə mail olmuş daxili vücud halıdır.

**Qeyd** 1: *Umumi məhəbbət, camal sifətlərini mütaliə etmiş qəlb meylindən ibarətdir.*

**Qeyd** 2 : *Xüsusi məhəbbət – həqiqət camalını müşahidə etmiş ruhani meyldən ibarətdir.*[2]

**Qeyd** 3: *Umumi məhəbbət – vücudu zinətləndirən nurdan ibarətdir.*[3]

**Qeyd** 4: *Xüsusi məhəbbət – vücudu paka çıxaran qeyri-maddi atəşdən ibarətdir.*[4]

**Nişanə** 2. "Zahid". A: Etdiyi ibadət kafiliyinə qapılmış şəxsdən ibarətdir.[5]

B: Ürfan panteist baxımından: "Bəşəri fikirdən baş vermiş şəri əməllərin – ibadətlərin qəbulluğu, yaxud həqiqi bəhrə verməyi təkcə uca Tanrını o ibadət – itaətə bais bilən özünü - əməlini arada görməyən insanda mümkün olmalıdır."[6] Beləliklə zahid öz dünyaşünas ağlını – elmini kafi bilməklə həqiqətən özünü təsdiq etmişdir. Aydındır ki, belə bir təsdiq ikiliyi təsdiq etmək (bir öz elmi – ağlı - əməli, bir də ulu Tanrı) yaxud vəhdətlə müxalif olmaqdan nişanədir, bunun üçün də arif şairlər məscidi[7], namazı[8] və bir para müqəddəs kəlmələri tənqid etmişlər.

**Nişanə** 3. "Eşq zövqü": Bax birinci beyt, beşinci nişanə

**Anlam: Öz məhdud ağlını – elmini kifayətbəxş bilmiş bir şəxs, mənəvi hallar tanışlığından, həm də şühud ləzzətindən xəbərsiz və məhrum olmalıdır.**

---

[1] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی
[2] Göstərilən kitab
[3] Göstərilən kitab
[4] Qəzəl 87, beyt 4
[5] Qəzəl 9, beyt
[6] دکتر قاسم غنی ، "تاریخ تصوف اسلام"جلد 2، ص 417
[7] Qəzəl 24, beyt 7 və Qəzəl 101, beyt 3
[8] Qəzəl 13, beyt 2

## Q Ə Z Ə L 106

**(1) Xəm açıldıqca zülfündən, bəlavü möhnətim artar,**
**Bihəmdillah ki, ömrüm uzanar, cəmiyyyətim artar.**

**(2) Məni tədric ilə kəm tutmanız yaqut olan daşdan,**
**Boyandıqca cigər qanilə, qədrü qiymətim artar.**

**(3) Tuta gör göz yolun, ey əşk, kim, təmkinim əksikdir,**
**Bu surətxanənin gördükcə nəqşin heyrətim artar.**

**(4) Mərizi – dərdi – eşqəm, tərki – aləmdir muradım kim,**
**Bu naxoş mülkdə əyləndigimcə zəhmətim artar.**

**(5) Büküldü qamətim həsrət yükündən, vəh ki, aləmdə**
**Ümidim əksilib hər ləhzə yüz min, həsrətim artar.**

**(6) Nə şərbətdur qəmin kim, içdigimcə əksilir səbrim,**
**Nə sehr eylər ruxun kim, baxdığımca rəğbətim artar.**

**(7) Çox olduqca qəmü dərdim rəhi – eşq içrə xoşhaləm,**
**Füzuli, şad olub şükr etməyimmi, nemətim artar.**

Beyt 1: **Xəm açıldıqca zülfündən, bəlavü möhnətim artar,**
**Bihəmdillah ki, ömrüm uzanar, cəmiyyyətim artar.**

Sözlük: Xəm – buruq = qıvrım; Bihəmdillah = şükür Allaha

**Nişanə** 1. "Xəm". A: Bir para ilahi sirlərin aşkarlanmasıdır.

B: Bütün yaranmışlarda yaradıcı məhbub cilvəsini əks etdirmiş "bəsirət" ünvanlı ürfani mərtəbə nailiyyətindən ibarətdir.

**Nişanə** 2. "Bəla və möhnət". A: Canı dünyəvi əlaqələrdən xilas etməklə mənəvi mərtəbələr naliyyətinə həmcinslik yaradan sınaqlardan ibarətdir.[1]

B: Bəla və möhnəti kəsrət bağlantılarından xilas etməklə vəhdət mülkünə istiqamətləndirən imtahan edici sıxıntılardan ibarətdir.[2]

**Nişanə** 3. "Ömür": Bu beytdə daxili həyat ünvanlı həqiqi varlıqdan ibarətdir.

**Nişanə** 4. "Cəmiyyət": Uca Allahdan qeyri kiminləsə əlaqələnmək fikrini başdan – qəlbdən xaric edərək, yalnız yeganə Tanrı xəyalilə ürək məşğulluğu yaradan himmət toplanışından ibarətdir.[3]

**Anlam: İlahi rəmzlər cilvəsi, yaxud mənəvi mərifətlər nailiyyəti, dünyəvi bağlantılarımı qırıb – qurtarmaqla heç də barışa bilmir. Şükür Allaha ki, belə bir rəhmsizlik, həqiqi həyatımı üzə çıxarıb atmaqla ilahi məqsədə istiqamətlənmək himmətini əlavə edir.**

Beyt 2: **Məni tədric ilə kəm tutmanız yaqut olan daşdan,**
**Boyandıqca cigər qanilə, qədrü qiymətim artar.**

Sözlük: Tədric – dərəcələmək = dərəcə = dərəcəyə ucalmaq = rütbə müəyyən etmək

**Nişanə** 1. "Tədric": Bu beyutdə eşq və ya mənəviyyat rütbəsini müəyyən etməkdən nişanədir, ancaq kəm tutmaq mənasını da ifadə edir.

**Nişanə** 2. "Yaqut". A: Yaqut, xüsusilə, bu beytdə dünyəvi, həm də mənəvi dəyərlər nümunəsindən ibarətdir.

B: Əqlə - elmə sığmaz mənəvi rütbəni dünyəviləşdirib idraka sığışdıran istiarədən ibarətdir.

C: Cismi – fiziki mahiyyətə qatqı, "Kulli nəfs" ünvanlı qaranlığa

---

[1] Qəzəl 81, beyt 5, "bəla"
[2] Qəzəl 94, beyt 5, "möhnət"
[3] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

eyham edən mərhələdən ibarətdir.

**Nişanə** 3. “Cigər qani”. A: Təbii mənliyi asta – asta həqiqi ilahi mənliyə çevirən əhvaldan ibarətdir.

B: 4-cü beytdə qeyd olunmuş qurbanlıq məqamına hazırlayan “məriz” ünvanlı aşiq mərtəbəsindən ibarətdir.

**Anlam: Təbii mahiyyətimi yavaş-yavaş məğlub etməklə həqiqi və ya daxili vücudumu dəyərləndirməyə nailiyyət imkanı tapıram.**

Beyt 3 : **Tuta gör göz yolun, ey əşk, kim, təmkinim əksikdir,**
**Bu surətxanənin gördükcə nəqşin heyrətim artar.**

Sözlük: Tuta gör – gör rəvadı tuta? = tutulmuş gör = tezliklə tutmalıdır; Əşk – göz yaşı; Surətxanə = təsvirxana = şəkillər, naxışlar toplanan məxsus məhəllə

**Nişanə** 1. “Göz”: İlahi camal müşahidəsinə və ya şühud məqamına nail edən istedaddan ibarətdir.

**Qeyd**: *A: Göz, başqalarını görüb özünü görməməklə müşahidə mərtəbəsinə istiarə olmuşdur.*

*B: Göz , əşk ilə yuyulub saflanmış vücudu ilahi cəlalər əsk etdirən güzgüyə çevirmək münasibətilə şühud məqamına nişanədir.*

*C: Yuyucu göz neməti, yaxud müşahidə nailiyyəti ariflərin məxsus behiştindən ibarətdir.*

**Qeyd** : *Cazibə, şövq, müşahidə və ilahi cəlalər içrə məhvlik sözü məntiqi araşdırmalarda, və ya elmi istilahlarda sığmaz mübhəm bir məsələ olduğuna görə sözdən – söhbətdən üstün “Hal” ünvanlı məqamda, yaxud yalnız ariflər kəlamında axtarılmalıdır. “Səri seqti” adlı salikin bu mövzu ilə bağlı münacat məzmunu belədir : “Ey ulu Tanrı, müxtəlif əzabverici tənbehlərindən yox, bəlkə yalnız müşahidə məhrumluğundan qorxuram. Demək, müşahidə halında hər bir cövr və cəfaya tab gətirmək mümkündür, əksinə, müşahidə məhrumluğunda hər bir ehsan və yaxşılıq da mənimçün zəhmli bir işgəncədir. Ən əzabverici cəhənnəm cəzası müşahidə məhrumluğundan ibarətdir. Demək, cəhənnəm cəzasına giriftar olmuş günahkar şəxsin gözünə müşahidə nuru görsənsə heç bir günahkar behişt arzusunda olmaz, çünki ilahi camal müşahidəsilə şadlanmış daxili vücud xarici vücudun əzab çəkməyini , yaxud yanmağını yaddan çıxarıb təsirsiz edər.*[1] *”*

---

[1] دکتر قاسم غنی ، "تاريخ تصوف اسلام"جلد 2، ص368

**Nişanə** 2. “Təmkin”. A: Hicran fasiləsini yox dərəcəsinə çatdırmış şəraitdən yaxud vasil olmuş ariflər halından ibarətdir”.

B: “Təmkin”, seyr yolunu nəhayətə çatdırıb həqiqətə yetişmiş ariflər ərdəmindən və “məqam”, seyr yolunda addım-addım hərəkətə gəlmiş tələbələr mənzilindən ibarətdir. (Ürfani məqamlar seyr yolunun mənzilgahlarından ibarətdir lakin təmkin, bu yolun nəhayətindən və ya ilahi ərəfədə qərar tutmaqdan nişanədir.)

C: “Təmkin” vücudun bəşəri yönünü “fəqr və fəna” ünvanlı mərhələdə xarablaşdıran mərtəbədən ibarətdir”.

D: “İslamın ulu peyğəmbəri təmkin sahibi olduğuna görə merac gecəsi[1] ilahi mərtəbələr və əcaib seyrlər önündə heçdə özündən çıxmayıb həmin meraca getdiyi halda mənzilinə qayıtdı”.

E: “Uca Allah, həzrəti Musanı təmkin mərtəbəsinə qaldırmaq məqsədilə “[2]فاخلع نعليک”buyurmuşdur”.[3]

Ə: “Bir çox ariflərin “şəth”[4] demək səbəbi onların təmkinsizliyindən ibarətdir”.

**Nişanə** 3. “Surətxana”: “Vəch” ünvanlı ilahi parlaq camal[5] cəlalarını əks etdirən ürəkdən və ya müşahidə edən gözdən ibarətdir.

**Nişanə** 4. “Nəqş”: Vəch ünvanlı ilahi surətdən ibarətdir.

**Nişanə** 5. “Heyrət”: Uzun-uzadı müxtəlif ürfani mübahisələr ünvanından ibarətdir, ancaq biz bu şərhin uzanmamasından ötrü aşağıdakıları deməyi qənaətbəxş bilirik:

A: Heyrət – seyr dayanmasından ibarətdir.

**Qeyd:** *Seyr dayanması münkər kafirləri tənbeh edən mənfi sərgərdanlıqdan ibarətdir.*

B: Heyrət – mərifət dayanmasından ibarətdir.

**Qeyd:** *İlahi əzəmət idrakından aciz qalmış elm və sübutlar, heyrət ehtivasında karsız bir halda qalmağa məhkumdur. Belə bir məhkumluq elm və dəlillərin qüvvəsilə mərifət axtaran şəxsləri tənbih edən məhkumluqdur.*

C: Heyrət – fikirləşməyin dayanmasından ibarətdir.

---

[1] Qəzəl 5, beyt 4 və qəzəl 93 beyt 4

[2] انی انا ربُّکَ فاخلع نعليک انک بالوادی المقدس طوی Hə! Mənəm, Mən, Sənin Rəbbin! Öz ayaqqabılarını çıxar ki, sən [dönə-dönə müqəddəs sayılan] mübarək “Tuva” vadisindəsən: Taha surəsi, ayə 12. **Qeyd:** Yeganə Yaradandan başqalarından yaxud büsbütün dünyəvi vücudlar, məqamlar, hallar, bağlantılar və varlıqlardan nişanədir.

[3] دکتر سيد جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبيرات عرفانی

[4] Qəzəl 11, beyt 1

[5] Qəzəl 99, beyt 3

**Qeyd:** *Uca Allahın əzəməti əqldən-anlamdan üstün olduğuna görə, O,fikirləşmək və tədbir görməklə idrak olunmaz. Bunun üçün də təfəkkür ilə yaxud məhdud məlumatla ilahi əzəmətləri düşünmək qəsdi və ya intəhasız həqiqəti təcrübə etmək fikri aşiqi yoldan çıxarmasa da, onu hicab ünvanlı maneə torunda giriftar etməlidir. Fikri dayandıran heyrət, bəşəri əql və idrak acizliyini sübut etmək səbəilə müsbət və bilinmiş heyrət tanınmışdır.*

D: Heyrət – mənəvi mərifət nəticəsindən, yaxud ilahi xüsusi bəxşişdən ibarətdir. (müsbət heyrət)

**Qeyd:** *Məcazi ilgi - əlaqələri, təbii istəkləri, nəhayət, mənəm-mənəmliyi bərbad etmək muzdu, dünyəvi və mənəvi təcrübələr-mərifətlər acizliyini sübut edən ilahi* xüsusi *cilvədən ibarətdir. Aşiq bu cilvə önündə ilahi əzəmətin dünyəvi və mənəvi mərifətdən üstün olduğunu yəqin edərək, vücudunu təmamilə "məhz təslim" ünvanlı bilinmiş heyrətə və ya "istehlak" ünvanlı qəhrdən-qəbzdən asudə bir vəziyyətə təslim etməlidir.*[1]

**Anlam: A: Ey əşk, mənfi heyrət giriftarlığında əskilmiş təmkinimə görə, göz yolunun tutulmasıyla cəzalanmağım gərəklidir.**

B: Ey əşk, göz yolum və ya müşahidə pəncərəm bağlansa da heyrətlə qazandığım təmkin əskilməz (müsbət heyrət).

C: Ey əşk, göz yolumu tutmağa kimdə iqtidar var?

E: Ey əşk, göz yolumu tutmaqla təmkinimi əskiltməyə kimdə iqtidar var?

Beyt 4 : **Mərizi – dərdi – eşqəm, tərki – aləmdir muradım kim,**
**Bu naxoş mülkdə əyləndigimcə zəhmətim artar.**

Sözlük: Məriz – xəstə; Naxoş – pərişan = qəmgin = xəstə = pis

**Nişanə** 1 "Məriz". A: Mərizlik qurbanlıq müqəddiməsindən ibarətdir.[2]

B: Mərizlik – Tanrı və təbiət ünvanlı iki başlanğıcdan mürəkkəb insanı Tanrıya qovuşdurmaq məqsədilə təbiətdən ayırmağa hazırlayan mərhələdən ibarətdir.[3]

**Nişanə** 2. "Dərdi-eşq": Yarı vücudu göydə saxlanılmış insanın[4] yer

---

[1] "Ta Qafe-əndişe", cild 2, qəzəl 193, beyt 1 (müəllifdən)
[2] Qəzəl 7, beyt 2
[3] Qəzəl 81, beyt 6
[4] Qəzəl 80, beyt 5

sakinliyində, yaxud dünyəvi həyat hissəsində toxtaqlıq tapmayan acı-şirin qərarsızlığından ibarətdir.[1]

**Nişanə** 3. “Tərki-aləm”: Cismi qəliz bağlantıları və ya təbii əngəl ilgiləri qat-qat soyub tökməklə daxili vücudu “üryanlıq” və ya “mücərrədlik” məqamına hazırlaşdıran mərtəbədən ibarətdir.[2]

**Nişanə** 4. “Naxoş mülk”: Məcazi dünyadan ibarətdir.

**Qeyd:** *Mütəal məhbub ərəfəsinə yaxınlıq imkanı yaradan göy obrazını tapmış bir insanın nəzərincə yer kürəsinin çirkinliyi, beləlikləda mal, dövlət, iqtidar, hökmranlıq və digər dünyəvi etibarlar həqirliyi aydın bir məsələdir.*[3]

**Anlam: Maddi dünyada, yaxud yer kürəsində ömür sürmək, səmavi sabiqə xəbərsizliyini davam etdirmiş şərayitdə çirkin bir həyat və əzabverici bir ömürdür.**

Beyt 5: **Büküldü qamətim həsrət yükündən, vəh ki, aləmdə**
**Ümidim əksilib hər ləhzə yüz min, həsrətim artar.**

Sözlük: Vəh – əcəb = əcəba = paho!...

**Nişanə** 1. “Həsrət”: Bu beytdə seyr yolunda geri qalmış salikin əzab edici təəssüflənməsidir.

**Anlam: Dünyəvi həyat hissəsində qəbzsiz bəst və ya tətilsiz müşahidə həsrətindən ümidim kəsilən kimi belim də bükülübdür.**

Beyt 6: **Nə şərbətdur qəmin kim, içdigimcə əksilir səbrim,**
**Nə sehr eylər rüxün kim, baxdığımca rəğbətim artar.**

Sözlük: Rüx – üz = camal = surət

**Nişanə** 1. “Şərbət”: A: Şirinlik ünvanlı tamamlanmaq və kamilləşmək nişanəsidir.

B: Şirinlik, dərkdə-zehində ap-aydın hazır olaraq sözə-söhbətə sığmaz sevimli –rövnəqli bir haldan ibarətdir.

**Nişanə** 2. “Qəm”: Uca Allah tələbində çalışqanlıq etməkdən nişanədir.

**Nişanə** 3. “Səbr”. A: Şühud arzusuyla çırpınan ürək taqətsizliyindən

---

[1] Qəzəl 37, beyt 1
[2] Qəzəl 12, beyt 1
[3] Qəzəl 7, beyt 2, qeyd 1

ibarətdir.

B: Məhrumluq caynağına, nemət qucağı tək razılıq vermiş aşiq halından ibarətdir.

**Qeyd** 1: *Əbülhəsən Nuri Taziyanə zərbələrinə taqət gətirən qocaman zəifləmiş bir abdalın can acısından sordu, o dedi: Can acısına ağır cəmdəklə yox, ağır himmətlə səbr etmək mümkündür. Yenidən səbrdən eşitmək istədi, dedi: Səbr – bəlaya giriftar olan zamanla bəladan xilas olmuş çağı fərq etməz aşiqin məxsus halından ibarətdir.*[1]

**Qeyd** 2: *Yuxarıda xatırladığımız səbir baxımıyla üçüncü beyt mənfi heyrətlə cəzalanmak mənasını təlqin etmək istəyir.*

**Nişanə** 4. "Sehr": Bu beytdə hiyləbazlıqla hasil olmayan heyrətəngiz bir incəlik cazibəsindən ibarətdir.[2]

**Nişanə** 5. "Rux": Bu beytdə ilahi hüsnlər törənişindən ibarətdir.

**Nişanə** 6. "Rəğbət": Məhəbbətdən hasil olmuş neçə cür meyl göstərmək və diqqət yetirməkdən nişanədir:

1 – Nəfs rəğbəti-savab qazanmaq meylindən ibarətdir.

2 – Qəlb rəğbəti-qəlb rəğbəti həqiqətə çatmaq meylindən ibarətdir.[3]

**Anlam: Eşq qəmi əlavə olduqca taqətsiz edən arzular artan kimi, ilahi hüsnlər zühur etdikcə ürək meyli də artır.**

Beyt 7 : **Çox olduqca qəmü dərdim rəhi – eşq içrə xoşhaləm,**
**Füzuli, şad olub şükr etməyimmi, nemətim artar.**

Sözlük: Rəhi eşq – eşq yolu

**Nişanə** 1. "Qəmü dərd": Qəm və dərd xarici vücud ilgilərini yaddan çıxaran məşəqqətli mərhələdən ibarətdir.

**Nişanə** 2. "Xoşhal": Xoşhallıq və şadlıq, qəbzlər arxasınca hasil olmuş bəstlərdən nişanədir.

**Qeyd:** *Şadlıqlar anası və ya tükənməz xəzinə mənşəyi, tüğyan etmiş qəmlərdən və ya tapdalanmış arzulardan ibarətdir.*[4]

**Nişanə** 3. "Şükür": Mehriban məbud nemətini həm dildə, həm də qəlbdə etiraf etməkdən nişanədir.

**Qeyd:** *Şükr etmək ilahi bir nemət olduğuna görə şükrün özünə də başqa bir şükür gərəkdir.*

---

[1] دکتر قاسم غنی ، "تاریخ تصوف اسلام"جلد 2، ص286

[2] دکتر محمد معین، فرهنگ معین

[3] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

[4] Göstərilən kitab

**Nişanə** 4. “Nemət”. A: Zahiri nemət: İnsanları düz yola yönlədən müqəddəs dinlərdən ibarətdir.

B: Batini nemət: Əzəməti əqlə sığmaz batini nemət, insanı nəfs caynağından xaric etməklə onu ilahi keçmişindən xəbərdar edən nemətdən ibarətdir. Şərif ayə bu neməti yada salmaq məqsədilə buyurmuşdur:

“یا بنی اسرائیل اذکرو نعمتی التی انعمت علیکم و انی فضَّلتکم علی العالمین[1]” (Ey İsrail övladı, sizə verdiyim nemətlərimi və sizi aləmlər [dəkilər]dən üstün tutduğumu yad edin).

**Qeyd** 1: *İnsanı nəfs caynağından xilas edən nemət “şühud” nemətindən ibarətdir.*

**Qeyd** 2: *A: Bütün qəzəblənmələr və şəhvətpərəstliklər qüvvələrini toplayan və ya tamam çirkin sifətlərin əsas mənbəyi olan şeytani nəfsədən ibarətdir. Ariflər, şeytani nəfs ilə mübarizə aparmağı “əkbər cihad” (ən böyük cihad) ünvanıyla vacib cihad bilmişlər.*

*B: İnsanın həqiqətini və ya zatını canlandıran ilahi lütf onun rəhmani nəfsinə bağlıdır.[2]*

**Anlam: Eşq ilə əlaqədar müsibətləri mənəvi nemətlər mənbəi bilmək və şükr etmək vacibdir.**

---

[1] Quran, Bəqərə surəsi, ayə 47

[2] دکتر قاسم غنی ، "تاریخ تصوف اسلام"جلد 2، ص412

## Q Ə Z Ə L 107

**(1) Nola gər rəşki – rüxsarinlə bağrı xubların qandır,**
**Daşı təsir ilə ləl eyləyən xurşidi- rəxşandır.**

**(2) Müjən gər səngdillər könlünü alsa əcəb olmaz,**
**Onun tək abnus ox layiqi – fulad peykandır.**

**(3) Pərivəşlər dili – səxtinə düşmüş mehri – rüxsarın,**
**Sənin əksin alan fulad güzgulər firavandır.**

**(4) Dəhanın dürci kim, qeydin çəkərlər hurpeykərlər,**
**Pərilər taətiçün xatəmi – hökmi – Süleymandır.**

**(5) Sənin yolunda xublar sürsələr üz nola əmrinlə,**
**Mələk xeyli sücudi – Adəm etmək nəssi – Qurandır.**

**(6) Qanı könlünə bağrı daşların düşmüş qəmi – eşqin,**
**Bir oddur eşqi – dilsuzun ki, daşlar içrə pünhandır.**

**(7) Gəzər kuyində hər yan çox giribançak gülrüxlər,**
**Bu rəng ilə Füzuli, ol səri – ku bir gülüstandır.**

Beyt 1 : **Nola gər rəşki – rüxsarinlə bağrı xubların qandır,**
**Daşı təsir ilə ləl eyləyən xurşidi- rəxşandır.**

Sözlük: Rəşk – qibtə = qeyrət = qələbə = həmiyyət; Ruxsar – surət = üz; Xub = gözəl = yaxşı = qəşəng; Xurşidi-rəxşan = parlaq günəş

**Nişanə** 1. "Rəşk": Bu beytdə daxili vücud məğlubiyyətindən ibarətdir.

**Qeyd 1:** *İnsanın boynunu zəncirləməklə, onun zahiri vücuduna qələbə çalmaqla daxili vücudunu məğlub etmək və ya düşmənliyini dostluğa çevirmək fikri mümkünsüz təsəvvür və batil bir xəyaldan başqa bir şey ola bilməz.*

**Qeyd 2:** *İçəri vücudu məğlub etmək, beləliklə acığı sevgiyə çevirmək yalnız rəşk mərtəbəsinə nail olmaqla şərtlənmiş özəl bir həqiqətdir. Belə bir nailiyyətlə Şəhrbanu xanım, Həzrəti İmam Hüseyn (ə) evini və Mədinə torpağını öz evi və öz ölkəsiylə eyni, bəlkə də üstün müşahidə etdi*[1]

**Nişanə** 2. "Rüxsar": İlahi hüsnlər törənişindən ibarətdir.

**Nişanə** 3. "Bağrı qan": A: Bağrı qan olmaq maddi əngəl vücud təmayülatını batil edən müqəddimə nailiyyətindən ibarətdir.

B: Bağrı qan olmaq, bəşəri ixtiyar – iradəni həkim Allaha tapşırmaq müqəddiməsinə, yaxud "təslim"[2] məqamının ərəfəsinə nail olmaqdan ibarətdir.

**Qeyd:** *A: Təslim nazil olunmuş bəlaları alqışlamaq halından ibarətdir.*

*B: Təslim nazil olunmuş bəlalar qarşısında zahir ilə batinin təğyirsiz halından ibarətdir.*[3]

*C: Təslim nazil olunmuş bəlalar qarşısında dözüm göstərmiş aşiq halından ibarətdir.*

**Nişanə** 4. "Xub": A:İlahi eşq aləminə yönəldən mürşüddir.

B: Xub, bəşəri simada ilahi hüsnlər əks etdirmiş dilbərdir.

C: Xub, gözəllik tənasüblərini idrak etmiş aşiqdir.

E: Xub, yalnız mütəal məbud razılığını nəzərdə tutub, ilahi niyyətlə

---

[1] Məşhur rəvayət, həm də "Yəqubi" kimi tarixçilər Şəhrbanu xanımı Sasani sülaləsinin üçüncü Yəzdigerd adlı sonuncu soltanının qızlarından biri bilmişlər. O qız (əsir olandan sonra) Həzrəti İmam Hüseyn (ə) ilə nikah etməyi qəbul etdi və Həzrəti Zeynəlabdin (ə) o xanımdan doğuldu. Beləliklə doqquz imam nisbəti ana tərəfdən İran ümmətinə çatmışdır. Müasir araşdırmaçılar bu rəvayətin şübhəli olduğunu bildirmişlər. (Doktor Məhəmməd Moin, Fərhənge Moin, Əlam)

[2] Qəzəl 106, beyt 2

[3] شیخ فرید الدین عطار نیشابوری، "اسرار نامه"، دکتر سید صادق گوهرین ص 202

xeyir iş bitirən şəxsdir.

**Qeyd** 1: *Yaxşı əməllərin qəbul olunmuş illəti, yalnız uca Allah eşqindən ibarətdir.*

**Qeyd** 2: *Hər bir yaxşı – yaman fikirdə olmaq və ya hər bir müsbət – mənfi işə əməl etmək müəyyən bir niyyətə bağlı olduğundan hər əmələ - sözə yaxşı diqqət etmək və qiymətləndirmək, gərəkdir.*

**Qeyd** 3: *Hər bir əməlin dəyər ölçüsü, niyyətdən ibarətdir.*

**Qeyd** 4: *Bəzi xeyir əməl şər niyyətə bağlı olduğundan daha çirkin və batildir.*

**Nişanə** 5. "Daş": A: Öz bəşəri iradə - ixtiyarını tədbirli bilmiş insan qəlbidir.

B: Öz fiziki tərkibində məhdud qalmış ürəkdir.

C: Özünü həqiqətşünas təsəvvür etmiş əqldir.

**Nişanə** 6. "Ləl": A: Zavala məruz qalmış maddi vücudun mənəvi çevrilişindən [1], yaxud yenidən zavalsız obrazını əldə etməyindən nişanədir.[2]

B: Mənəvi qüvvələr qələbəsindən nişanədir.

C: İlahi mərifətlər mənbəi olmuş ürəkdir.

**Nişanə** 7. "Xurşid":A: Həqiqi ölməz həyat bağışlayan qüvvədən ibarətdir.[3]

B: Can bağışlayan həqiqi elmdir.

**Qeyd** 1: *Mövlana Cəlaləddin Rumi hər bir insanın can miqdarını onun elm miqdarı ilə bərabər göstərmək məqsədilə buyurmuşdur:*

جان نباشد جز خبر در آزمون　　هرکه را افزون خبر جانش فزون[4]

**Qeyd** 2: *"Sokrat", bir çox filosofların, o cümlədən Əflatunun nəzərincə, insanın başqa yaranmışlardan üstünlüyünə yeganə səbəb, onun dərin elmə bağlı ərdəmindən ibarət bilmişdir.*[5]

**Qeyd** 3: *Şərif ayə "و علم آدم الاسما*[6]*" buyurmaqla, elmin ilahi özəl ehsan olduğunu, beləliklə Həzrəti Adəmin, yaxud bütün insanların şərafətini təlqin etmək istəyir.*

**Qeyd** 4: *Can sağlığı, gözəllik, böyüklük, ədalət, şücaət və digər yaxşı nemətlər nailiyyətilə həqiqi xoşbəxtlik imkanını tapmaq yalnız o*

---

[1] Qəzəl 36, beyt 3

[2] Qəzəl 103, beyt 2 qeyd

[3] İmam Xomeyninin "Şerlər divanı", İstilahlar, (xeyir = elm)

[4] Mövləvi, Məsnəvilər, 2- ci dəftər? beyt 3378

[5] دوره آثار افلاطون، ترجمه: محمد حسن لطفی، جلد 1، ص 14

[6] Quran, Bəqərə surəsi, 31-ci ayədən bir qismət, (və [Allah] Adəmə bütün adları (elmləri) öyrətdi.)

*nemətlərdən elmi bəhrələnmək şərtilə mümkündür. Qurani Kərim çox neməti bədbəxtliyin vəsiləsi etmiş insanlar hekayətini dönə - dönə bəyan etməklə elmsizlik zərər – ziyanını təlqin etmək istəyibdir.*[1]

**Qeyd** 5: *Fəlsəfə, maddi vücudu mənəviləşdirməklə insanı həqiqi xoşbəxtliyə nail edən mərifəti, "elm" ünvanıyla nəzərdə tutub*[2] *demişdir:*

*"..., ruh içində maddi vücuda daxil olmuş elm ya mərifət insana mübhəm bir bilik təsəvvürünü yaratmaqla onu xarici təcrübələrdən müstəqil dini heysiyyət qazanmış özəl elm ardınca daim dolandırır. Bu elm bir tərəfdən riyazi elmə bağlı dünyəvi nuru, digər tərəfdən ülvi ölməz elmə bağlı mənəvi nuru*[3] *bəşəri həyata ehsan edir.*[4]

**Qeyd** 6: *Elm və mərifət, ruh qidası olduğundan bədən qidasından tam başqa və daha üstün olmalı və ləzzət almalıdır. Bu sözü qüvvətləndirmək məqsədilə aşağıda qeyd etdiyimiz fəlsəfi mükaliməyə diqqət yetirməyi gərəkli görürük:*

*– Aya, aclıq, susuzluq, və onlar kimi digər [dərd verici] duyumlar, bir növ bədən boşluğu ilə əlaqədardır?*

*– Əlbəttə.*

*– Aya, insan bir elm əldə edib bir xörək məsrəf edəndə boşluğunu doldurur?*

*– Yəqinən.*

*– Aya, boşluğun dolmaq imkanı, zavala məruz qalmış məcazi bir şeylə həqiqətən mümkündür? Ya zavalsız həqiqi bir şeylə?*

*– Əlbəttə, zavalsız həqiqi bir şeylə.*

*– Bu iki növ boşluq dolduran şeydən hansı həqiqi varlıqdan bəhrələnmişdir? Çörək, su və digər cismani yemək, içmək ya düzgün anlam, elm, əql və başqa ruhi ərdəmlər?*

*– Əlbəttə, ikinci şeylər.*

*– Aya, dəyişilən fani şeylər əbədi həqiqət və ölməz varlıqdan artıq bəhrələnmişdir, ya elm?*

*– Əlbəttə, elm.*

*– Aya, həqiqətdən az bəhrələnmiş şeylər, həqiqi - əbədi vücuddan da az faydalanmışlar?*

*– Əlbəttə.*

*Beləliklə, bu barədə aşağıdakı külli hökmləri təsdiq etməli və*

---

[1] Qurani-Kərim, İsra surəsi, (Bəni-İsrail hekayəsinin təfsirinə müraciət olunsun)
[2] دوره آثار اقلاطون، ترجمه: محمد حسن لطفی، جلد 2، ص 785
[3] Qəzəl 1, beyt 1 (ənar)
[4] Verneriger, "Paydya", cild 2, səh. 806

*aydındır :*

*A: Cismi qidalandırmağa sərf edilən şeylərin, düzgün varlıqdan, yaxud həqiqətdən bəhrələnmələri ruhu qidalandıran şeylərdən, əlbəttə, azdır.*

*– Aya, sən də bu hökmü qəbul edərsən?*

*– Əlbəttə.* [1]

*Susuz bi şəxs, sudan boş olduğu halını əzabverici bildiyi kimi, sudan dolmaq intizarını da ləzzətli bilir. Beləliklə, məcazi mənada əzabsız ləzzət aparmağın mümüknsüz olduğu, ləzzətin əzaba bağlı olduğunu sübut edir. Lakin, az adamlara nəsib olmuş elmi ləzzət, dərd ilə bağlı olmadığından əzabsız həqiqi ləzzətdən ibarətdir.*[2]

**Anlam: Ruhu qidalandıran xurşid ünvanlı əbədiyyət mənşəli elm, bəşəri iradəni ilahi iradəyə çevirməklə:**

A: “Daş” ünvanlı fiziki – fani qəlbdən “Ləl” adlı mənəvi ölməz qəlb becərməyə qadirdir.

**Qeyd:** *Ləl mərtəbəsinə nail edən sərmayə bağrı qan olmaq (birinci misra) şəraitindən ibarətdir.*

B: Məhdud əqli iqtidarlı eşq tabeliyilə intəhasızlıqdan bəhrələndirməyə qadirdir.

Beyt 2: **Müjən gər səngdillər könlünü alsa əcəb olmaz,**
**Onun tək abnus ox layiqi – fulad peykandır.**

Sözlük: Müjə – kirpik; səngdil – daş ürəkli = ürəyi bərk; Fulad – polad; peykan – ox ucu = süngü

**Nişanə** 1. “Müjə”: Fədakarlıq yolunda küt hərəkət etmiş aşiq qəlbini tənbeh - tərbiyə məqsədilə parça – parça edən naz və qəmzə oxundan nişanədir.

**Nişanə** 2. “Səngdil”: Bax: birinci beytin beşinci nişanəsinə.

**Nişanə** 3. “Abnus ox”: Müjə iqtidarını təkid etmiş tərkibdən ibarətdir.

**Nişanə** 4. “Fulad peykan”: Abnus oxun şiddətli təsirindən nişanədir.

**Qeyd:** *Peykan ağır polad olduğundan təhkimli ağaca (abnus) bərkidilməlidir.*

---

[1] Döreyi asare Əflatun, cild 2, s. 806

[2] Göstərilən kitab, s. 1685

**Anlam: Dəyərsiz daşı qiymətli ləl məqamına qaldıran uca Allah, gah müjə ünvanlı sinə sökən naz qəmzələrlə, gah da xurşid rüxlər mərtəbəsində etdiyi ehsanla bəşəri fani vücudu, ilahi ölməz vücuda çüvirmək istəyir (müxtəlif yollarla aşiqi tərbiyə edir).**

Beyt 3: **Pərivəşlər dili – səxtinə düşmüş mehri – rüxsarın,**
**Sənin əksin alan fulad güzgulər firavandır.**

Sözlük: Pərivəş – pəri çöhrə = pəri surət; dili-səxt – bərk ürək = daş ürək; mehr – məhəbbət = günəş; rüxsar – üz = surət

**Nişanə** 1. “Pərivəş”: Bax: birinci beyt, “xub” nişanəsinə (B)

**Nişanə** 2. “Mehri-rüxsar”: A: İlahi hüsnlər nurundan nişanədir.

B: İlahi hüsnlərə bağlı məhəbbətdən nişanədir.

**Nişanə** 3. “Əks”: İlahi cəlalər təzahüründən ibarətdir.

**Nişanə** 4. “Fulad güzgü”: Yaxud dili səxt birinci beytdə “daş” nişanəsilə bəyan olunmuş bərk ürəkdən ibarətdir.

**Qeyd:** *Beyt, keçmişdə filizlərin parladılmağı düzəldilmiş güzgüyə də iıarə edir.*

**Anlam: Ey uca Allah, sənin möcüzəli hüsnün: A: Aşiqlər halına rəhm etməz daş qəlbli məşuqları rəhmdil etməklə onları cəzalandırmışdır.**

B: Bütün qalibləri məğlub etmişdir.

Beyt 4: **Dəhanın dürci kim, qeydin çəkərlər hurpeykərlər,**
**Pərilər taətiçün xatəmi – hökmi – Süleymandır.**

Sözlük: Dəhən – ağız; Dürc – sandıqça = cəvahir və ətir sandıqçası; Hurpeykər – gözəl = behişt gözəlinə oxşar = hurqamət; Xatəm – üzük = üzük qaşı.

**Nişanə** 1. “Dəhən dürci”: İlahi işarələr mənbəyindən istiarədir.

**Nişanə** 2. “Hurpeykərlər”: Birinci beytdə qeyd olunmuş “xub”lardan ibarətdir.(Bəşəri simada ilahi hüsnlər əks etdirmiş gözəllər)

**Nişanə** 3. “Pərilər”: Pərilər, bu beytdə məlaikəyə oxşar gözəl cinlərdən ibarətdir.

**Qeyd:** *Şərif ayə "...والتبعو ما تقتلو الشياطين على ملک سليمان"[1] buyurmaqla Süleyman peyğəmbərin insanlara, həm də cinlərə sultanlıq etməyini aydın bəyan etmişdir. Demək, o, peyğəmbərin insanlara, cinlərə hökmran olmağı, onun xatəm adlı üzüyünün qaşına yazılmış uca Allah adlarıylə, xüsusilə, "İsmi əzəm" ünvanlı özəl ilahi adla şərtlənmişdir. Rəvayət bunu da söyləmişdir: Bir günü həzrət Süleyman dəstəmaz almaq məqsədilə üzüyünü barmağından çığarıb onu xidmətçiyə tapşırır, həman dəm Süleyman cildinə girmiş, ya da üzünü Süleymana bənzətmiş bir div peyda olub, üzüyü xidmətçidən alıb öz barmağına taxmaqla hökmranlıq təxtinə əyləşir, Süleyman adılə cəmaətə hökmfərma olur. Beləliklə, həzrət Süleyman "Mən həqiqi hökmranam" deyə bilmədən çöllərə üz tutur, nəhayət, bir dəniz kənarında günü yarım sikkə muzd bərabərində balıq tutanların muzdurluğunu qəbul edir. O, bir ay fəqiranə həyat sürür, ancaq gecələr ibadət etməkdən qalmır, qırx gün bu vəziyyətlə həyatını sovuşdurandan sonra Həzrət Süleymanın "Asəf" adlı naziri onun cildinə girmiş div elmlərindən şübhələnir və camaatı da şübhələndirir. Nəhayət, div qorxusundan üzüyü dənizə atır , gözdən itir. Həman gün bir balıq üzüyü udaraq tora ilişir, qəzadan həzrət Süleyman o balığı ovçudan alır, qarnını yarır və həman üzüyü tapır, beləliklə, yenidən hökmranlığına başlayır.[2]*

**Nişanə** 4. "Xatəmi-hökmi-Süleyman": Bu beytdə saliki mükəmməl yetişkənliyə nail edən "tam seyr" mərtəbəsindən nişanədir.

**Anlam: A: Bütün xublar ilahi intibahlar bərabərində baş endirib, taət etməlidirlər.**

B: Saliki tam seyr və ya həqiqi yetişkənliyə nail edən yalnız ilahi ilham, inibahdan ibarətdir.

Beyt 5: **Sənin yolunda xublar sürsələr üz nola əmrinlə,**
**Mələk xeyli sücudi – Adəm etmək nəssi – Qurandır.**

Sözlük: Sücud – səcdəyə düşmək; Nəss – aydın hökm = eyhamsız vahid mənalı söz = şərhə - təfsirə hacəti olmayan söz

**Nişanə** 1. "Sürsələr üz": Üz sürmək, öz qul olmağına və ya mümükünlüyünü[3] etiraf etmək məqsədilə səcdəyə düşməkdən ibarətdir.

---

[1] Quran, Bəqərə surəsi, 102- ci ayədən bir qismət ("[yəhudilər] Süleymanın səltənətiə dair şeytanların oxuduqlarına uydular")
[2] شیخ فرید الدین عطار نیشابوری، "اسرار نامه"، دکتر سید صادق گوهرین ص 354 و 355
[3] Qəzəl 1 , bey 6 "hərfi vücud"

**Nişanə** 2. “İkinci misra”: “Bəqərə” surəsində 30, 31, 32, 33 – cü, “Taha” surəsində 116 – cı , “İsra” surəsində 61- ci , “Hicr” surəsində 30 – cu, “Sad” surəsində 73 – cü və “Əraf” surəsində 11 – ci ayəyə əsaslanaraq insanın bütün yaranmışlardan üstünlüyünə qarşı məlaikənin səcdəyə düşməsini təlqin etmək istəyir.

**Qeyd:** *Məlaikənin Adəm qarşısında səcdəyə düşməyi onun həqiqi vücudunun ülvi – ilahi olduğunu etiraf etmək nişanəsidir.*[1]

**Anlam: Eşq aləmindən xəbərdar insanların Qurani-Kərimin hökm etdiyi məlaikə kimi Mütəal Məhbub qarşısında səcdəyə düşməkləri təbii və eyni halda vacibdir.**

**Qeyd** 1: *Məlaikə seyrindən üstün insani seyrə nail olmağın ilk şərti səcdəyə düşməkdən ibarətdir.*

**Qeyd** 2: *Bu beyt səcdədən söz açmaqla namazın əzəmətini bildirir.*

Beyt 6: **Qanı könlünə bağrı daşların düşmüş qəmi – eşqin,**
**Bir oddur eşqi – dilsuzun ki, daşlar içrə pünhandır.**

Sözlük: Dilsuz – ürək yandıran

**Nişanə** 1. “Qanı düşmək”: Saf ürəyin həqiqi xasiyyətindən yəni rəhmsiz eşq bəlalarına düşməsindən ibarətdir.

**Nişanə** 2. “Bağrı daşlar”: İkinci beytdə qeyd olunmuş səng dillərdən ibarətdirlər.

**Nişanə** 3. “İkinci misra”: Eşq atəşinin mütləq qələbəsini təlqin edən nişanədən ibarətdir.

**Anlam: A: Daş qəlbli insanlar da mütəal məhbub hüsnünü etiraf etmişlər.**

B: Daş qəlbli insanlar da mütəal məhbub hüsnünə giriftar olmuşlar.

**Qeyd** 1: *Məcazi əhval və mənfi təmayülata giriftar olmuş şəxslərin də fitrəti ilahi ğözəlliyə maildir.*

**Qeyd** 2: *Mənəvi iqtidarlı mürşüdlər də ilahi təcəllilər qarşısında acizdirlər.*

Beyt 7: **Gəzər kuyində hər yan çox giribançak gülrüxlər,**
**Bu rəng ilə Füzuli, ol səri – ku bir gülüstandır.**

---

[1] Qəzəl 10, beyt 2 “həqiqi mən”

Sözlük: Giribançak – yaxasını açmış = hay-küy salmış = vay – şivən qoparmış; Gülrux – gül üzlü; Səri-ku – küçə başı

**Nişanə** 1. "Kuy": "Übudiyyət" məqamı ünvanlı xüsusi əbədiyyət vəziyyətindən nişanədir.

**Qeyd:** *A: Übudiyyət qul olmağı etiraf etdiyi halda bəşəri ixtiyar – iradəni uca Allaha təslim etmək mərtəbəsindən ibarətdir.*[1]

*B: Kuy – əhdinə vəfa etmiş aşiqin ilahi əmr tabeliyində əldə olan nemətə razılıq göstərib, əldə olmayana səbr etmək mərtəbəsindən ibarətdir.*[2]

**Nişanə** 2. "Giribançak": Eşq atəşində mənliyini kül etmiş aşiqin əhval – ruhiyyəsindən ibarətdir.

**Nişanə** 3. "Gülruxlər": Bəşəri surətdə ilahi hüsnlər təzahür etdirmiş gözəldən, mürşiddən və ya digər mənəvi vasitədən nişanədir.

**Nişanə** 4. "Rəng": Bu beytdə ürək açan rövnəqdən ibarətdir. (Bəst)

**Nişanə** 5. "Səri-ku": Ülvi aləm ərəfəsindən və ya "übudiyyət" nailiyyətindən ibarətdir.

**Nişanə** 6. "Gülüstan": İlahi mərifətlər ilə dolu ürək açan şəraitdən ibarətdir:

**Göstər üzün ki, bağü-gülüstan gəzir könül**
**Aç bir dodaq ki, qəndi-firavan gəzir könül**[3]

**Anlam: İlahi hüsnlü gözəllər, mürşüdlər və vasitələr, məmlüklük və bəndəlik məqamının zahirində onun batini kimi ürək açan səfalarla gözəllənmişlər.**

---

[1] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی
[2] دکنر محمد معین، فرهنگ معین
[3] بنمای رخ که باغ و گلستانم آرزوست      بگشای لب که قند فراوانم آرزوست
مولوی، "دیوان شمس"(ترجمه مولف)

## Q Ə Z Ə L 108

**(1) Səbrim alıb fələk, mənə yüz min bəla verir,**
**Az olsa bir məta, ona el çox bəha verir.**

**(2) Düşdüm bəlayi-eşqə, xirədməndi-əsr ikən,**
**El indi məndən aldığı pəndi mana verir.**

**(3) Sanman əcəb, rütəb yerinə versə ləli-tər**
**Nəxli ki, qan yaşım ona nəşvü nəma verir.**

**(4) Xaki-dərindir ol ki, dünü gün səvab üçün,**
**Həm ayə sürmə, həm günəşə tutiya verir.**

**(5) Qılmaz qəbul surəti-iqbal bunca kim,**
**Ayineyi-vücuduma cövrün cila verir.**

**(6) Ney kimi cismim oldu oxundan dəlik-dəlik,**
**Dəm urduğumda yerli-yerindən səda verir.**

**(7) Hər dərdsizdən umma, Füzuli, dəvayi-dərd,**
**Səbr eylə, kim ki dərd veribdir, dəva verir.**

Beyt 1: **Səbrim alıb fələk, mənə yüz min bəla verir,**
**Az olsa bir məta, ona el çox bəha verir.**

**Nişanə** 1. “Səbr”: Bu beytdə məcazi vücud təzahüratını xüsusilə şikayətlənmək sifətini tamamilə tərk etməkdən nişanədir.

**Nişanə** 2. “Fələk”: Bu beytdə cismi sifətləri, yaxud dünyəvi etibarsız qüdrətləri məğlub etməklə mənəvi yüksəkliyə zəminə yaradan ülvi iqtidardan nişanədir.

**Nişanə** 3. “Bəla”: Bu beytdə maddi bədəni müxtəlif sınaqlar ilə tərbiyə edən cürbəcür xəstəliklər və əzablardan nişanədir.

**Qeyd:** *Bəla qələbəsi əlavə olduqca “qürub” ünvanlı mənəvi yaxınlıq da əlavə olmalıdır.*[1]

**Anlam: Nə qədər cismi təzahüratım, yaxud dünyəvi duyğularım əskilir, bir o qədər də bəla ünvanlı acılıqdan asılı şirin nemətlərim çoxalır.**

**Qeyd** 1: *İkinci misra bir təmsil kimi birinci misrada qeyd olunmuş qeyri-hissi anlamı hissiləşdirmək istəyir.*

**Qeyd** 2: *Maddi dünya bütövlüyündə, həm də təfərrüatında “müamilə” ünvanlı alqı – satqı qanun tabeliyində öz həyatını davam etdirdiyi kimi, insan da həmin qanun ehtivasında daim bir vəziyyəti digər vəziyyətə nəqd pul kimi xərcləməklə dünyəvi və mənəvi varlığını davam etdirir.*[2] *Belə bir cahanşümul qanuna işarə etmək məqsədilə Həzrət Əmirəlmöminin Əli (ə) buyurmuşdur ki: “İnsan bir neməti məxaric etməsə digər nemətə nailiyyət imkanı tapa bilməz”.*[3]

Beyt 2: **Düşdüm bəlayi – eşqə, xirədməndi - əsr ikən,**
**El indi məndən aldığı pəndi mana verir.**

Sözlük: Xirədmənd – ağıllı; Pənd – öyüd = nəsihət

**Nişanə** 1. “Bəlayi-eşq”: “Nari-məhəbbət” ünvanlı[4] ürəyi saflaşdıran batini atəş əzəmətini aşiqə tanıtdırarkən onu Allah dostlarının cərgəsinə daxil edən müxtəlif məşəqqətlərdən ibarətdir.

**Qeyd:** *“Nemətsizlik əlindən hay – küy salmış dünyapərəstlər kimi bəlayi-eşq əhli isə bəlasızlık anlarında fəryad qoparmışlar.”*[5]

---

[1] دکتر قاسم غنی ، "تاریخ تصوف اسلام"جلد 2، ص640
[2] Qəzəl 3, beyt 3
[3] جرج جرداق، "صدای عدالت انسانی" جلد4 ، ص 460
[4] Qəzəl 9, beyt 3
[5] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

**Nişanə** 2. “Xirədmənd”: A: Xirədmənd başda yerlışmiş “əqli-məaş” adlı dünyaşünas əql sahibindən ibarətdir.

B: Xirədmənd ürək içində yerləşmiş “əqli-məad” adlı həqiqətşünas əql sahibindən ibarətdir.[1] Bu həqiqi əqli təsdiq etmək məqsədilə Hafiz Şirazi buyurmuşdur:

حاشا که من به موسم گل ترک می کنم

من لاف عقل می زنم این کار کی کنم [2]

**Qeyd** 1: *“Məad əqli” yaxud həqiqi əql, yeddi mərtəbəli ürəyin “qəlb” ünvanlı ikinci mərtəbəsində yerləşmiş mərifətdən ibarətdir.[3] Bu eşq adıyla məşhur olmuş əqli yaxud bu düzgün mərifəti tanıtdırmaq məqsədilə şərif ayə “*کتب فی قلوبهم الایمان[4]*” və ya “*فتکون لهم قلوب یعقلون بها*” buyurmuşdur.[5]*

**Anlam: A: Məaş əqlindən sərki – danlağından xəbərdar olub məad əqlinə müştəri oldum.**

B: Dünyəvi mərtəbələrdən üstün atmosferdə qanad açdım.

**Qeyd:** *Hafiz idrakdan üstün mərtəbəyə çatdıran “meykədə” ünvanlı yolu digər ürfani yollardan daha əzəmətli, eyni halda ağır, təhlükəli təqdim etmək məqsədilə buyurmuşdur:*

زراه میکده یاران عنان بگردانید

چرا که حافظ از این راه رفت و مفلس شد[6]

Beyt 3: **Sanmın əcəb, rütəb yerinə versə ləli – tər**
**Nəxli ki, qan yaşım ona nəşvü nəma verir.**

Sözlük: Rütəb – təzə xurma; Nəxl – xurma ağacı = ağac = mumdan, kağızdan, parçadan və ya başqa şeylərdən düzəlmiş güllü, qol-budaqlı və meyvəli kiçik ağac; Nəşvü-nüma – boy atmaq = göyərmək = zahir olmaq

**Nişanə** 1. “Rütəb”: Zavala məruz qalmış dünyəvi şirinliklərdən nişanədir.

**Nişanə** 2. “Ləli-tər”: Bu beytdə qeyri hissi-əbədi şirinliyə işarə edən nişanədən ibarətdir.

---

[1] "اسرار قلوب"، شرح گلشن راز، ص 4
[2] Müəllif bu beyti “Ta Qafe-əndişe” kitabının 3-cü cildində izah etmişdir. (Qəzəl 313)
[3] Qəzəl 13, beyt 1
[4] Quran, Mücadilə surəsi, 22-ci ayədən bir hissə: “[Allah] onların qəlblərinə iman yazıbdır”.
[5] Quran, Həcc surəsi, 46 – cı ayə: “Məgər onlar yer üzündə gəzib dolanmırlar ki, düşünən qəlbləri, eşidən qulaqları olsun? Əslində gözlər kor olmaz, sinədə olan qəlblər kor olar”.
[6] Müəllif bu beyti “Ta Qafe-əndişe” kitabının 3-cü cildində izah etmişdir (Qəzəl 243).

**Nişanə** 3. "Nəxl". A: Bu beytdə şirin, xoş vəziyyətlər uzantısından nişanədir.

B: Mənəviləşmək vəziyyətində qərar tapmış maddi vücuddan nişanədir.

**Nişanə** 4. "Qan-yaş": Batini vücud seyrinə maneə törətmiş, zahiri vücud ləkələrini yuyub batil etməklə zahiri batin ilə həmcinsləşdirən nişanədən ibarətdir.

**Anlam: İki ötən beytlərdə qeyd olunmuş bəlalər bərəkətindən maddi vücudumun mənəvi təbdil – təcəssüm tapması heç də qəribə deyil.**[1]

Beyt 4: **Xaki – dərindir ol ki, dünü gün səvab üçün,**
**Həm ayə sürmə, həm günəşə tutiya verir.**

Sözlük: Xak – torpaq; Dər – qapı

**Nişanə** 1. "Ay – günəş": Həm ay, həm də günəş bu beytdə dünyəvi etibarsız parlamalardan nişanədir.

**Nişanə** 2. "Sürmə, tutiya": Sürmə və tutiya bu beytdə məcazi üstünlüklərə mənəvi rəng – rayihə bağışlayan nişanələrdən ibarətdir.

**Anlam: Ay və günəş kimi yüksəkdə durmuş mövcudlara zəngin imtiyaz bağışlayan yalnız Mütəal Məhbub ərəfəsindən, yaxud eşq astanasından ucalmış rayihələrdən ibarətdir.**

**Qeyd:** *Bütün yaranmışların varlığı uca Allahın ehsan nuruna bağlı olduğundan şərif ayə "كل يوم هو فئ شان"[2] buyurmuşdur.*[3]

Beyt 5: **Qılmaz qəbul surəti – iqbal bunca kim,**
**Ayineyi – vücuduma cövrün cila verər.**

Sözlük: Surəti-iqbal = iqbal surəti = iqbal zahiri = bəxt üzü;

Ayineyi-vücud – vücud aynası

**Nişanə** 1. "İqbal": Mübarizə etmədən ilahi cazibələrə nail olmaqdan nişanədir.

**Nişanə** 2. "Ayineyi-vücud": Bu beytdə mənəvi cilaləri əks etdirməyə hazırlaşmış maddi vücuddan ibarətdir.

---

[1] Qəzəl 103 , beyt 2
[2] Quran, Ərrəhman surəsi, 29- cu ayədən bir qismət : ( "O hər gün [kainatda] bir işdədir")
[3] Bu kitabın birinci cildi, qəzəl 4, s.55

**Nişanə** 3. “Cövr”: Bu beytdə aşiqin zahiri vücudunu maddi küdurətlərdən saflandırmaqla onu “cila” ünvanlı mənəvi cilvələr əks etdirməyə hazırlayan tənbeh - tərbiyədən ibarətdir.

**Anlam: Mübarizə etmədən ilahi cazibələr nailiyyətinə layiq olmadığımdan bir belə cövrlər sınağında məşəqqətli məşqlər ilə ömür sürürəm.**

Beyt 6: **Ney kimi cismim oldu oxundan dəlik – dəlik,**
**Dəm urduğumda yerli – yerindən səda verər.**

**Nişanə** 1. “Ney”: Ötən beytdə qeyd olunmuş surəti iqbalı qəbula keçməyən vücudun cövrlər sınağında qəbul olmaq vəziyyətinə hazırlaşmasından nişanədir.

**Nişanə** 2. “ Ox”: Ötən beytdə qeyd olunmuş “cövr” nişanəsinin səbəblərindən ibarətdir.

**Nişanə** 3. “Dəlik – dəlik”: Dəlik – dəlik olmaq məcazi vücudu dünyəvi həyat ilgilərindən boşaltmaqla onu “şonya” ünvanlı irfani mərtəbəyə yüksəlməyə hazırlayan “cövr” və ya “ox” səmərəsindən ibarətdir.[1]

**Qeyd:** *Vücud dəlik – dəlik olmasa onun içindəki hava – həvəslərin xaric olması mümükünsüz olar.*

**Nişanə** 4. “Səda”: Daxili vücud münacatından ibarətdir.

**Anlam: Yuxarıda xatırlanan bəla, qan-yaş və digər hikmət mənşəli məşəqqətlər maddi vücudumu mənəvi əhval – ruhiyyədən bəhrələnməyə nail etdi.**

**Qeyd:** *Bəla, Cəfa, qan, ya qan-yaş birinci beytdə qeyd etmiyimiz “müamilə” ünvanlı ümumi qanun tabeliyində sərf edilən məxaricdən ibarətdirlər.*

Beyt 7: **Hər dərdsizdən umma, Füzuli, dəvayi – dərd,**
**Səbr eylə, kim ki, dərd veribdir, dəva verər.**

**Nişanə** 1 “Dərdsiz”: Maddi aləm qaranlığında mənəvi ölməz həyat ziyasından, yaxud ilahi vüsal ətəşindən xəbərsiz qalarkən dünyəvi həyat məhdudluğuna razılıq vermiş zahiddən və ya əql əhlindən nişanədir.

**Nişanə** 2. “Dəva”: Dünyəvi ömür möhlətində həzrət mürşüdün özəl təlimatından, yaxud ürək güzgüsündə əks etdirtilmiş ilahi cilalərdən ya

---

[1] Bu kitabın birinci cildi, “Ney” nişanəsi, qəzəl 65, beyt 1,s.381

da  mənəvi müşahidə maraqlarından ibarətdir.

**Anlam: Ey Füzuli, hicran atəşilə alovlanmış ürəyi vüsal rayihəsilə bir gülüstan kimi güllləndirən iqtidar, yalnız uca Allahın eşqinə bağlıdır. Demək belə bir çevrilişi eşqdən xəbərsiz zahiddən ummaq yersiz intizar və imkan dairəsindən xaric bir işdir.**

## Q Ə Z Ə L 109

**(1) Buldu kuyindən dəva dərdi-dili-bimarımız,**
**Sən ağasan, biz quluz, kuyindədir timarımız.**

**(2) Zahida, gör çaki-sinə şöləsin, bizdən saqın,**
**Bir ocağız biz ki, suzandır dərü divarımız.**

**(3) Nola gər olduysa fani Kuhkən, mən baqiyəm,**
**Eşqə bizdəndir bəqa, yoxdur yox olmaq varımız.**

**(4) Gülşəni-qəm nəxliyüz, pərvərdə abi-didədən,**
**Dağlər bərg, ahi-atəşbarımızdır barımız.**

**(5) Əhlin-tərkin quluyuz, oldur bizə candan əziz,**
**Yusif isə xudfüruş, onunla yox bazarımız.**

**(6) Əşkimiz girdabı ali, ömrümüz bünyadı pəst,**
**Gör nə alçaq dirlikilə çizginir pərgarımız.**

**(7) Ey Füzuli, cövri-yarü təneyi-əğyardən**
**Var yüz min qəm, bu həm bir qəm ki, yox qəmxarımız.**

Beyt 1: **Buldu kuyindən dəva dərdi-dili-bimarımız,**
**Sən ağasan, biz quluz, kuyindədir timarımız.**

Sözlük: Timar – bimarın çarəsi = öhdəçilik = qayğı

**Nişanə** 1. “Kuy”: Uca Allahı, bütün bəşəri vücuda hətta bəşəri iradə - ixtiyara mütləq malik tanıtdıran “bəndəlik”, yaxud “məmlüklük”[1] ünvanlı məqamdan nişanədir.

**Nişanə** 2. “Dəva”: Uca Allahın hüzurundan nazil olmuş, ürəyi lətafələndirən rayihədən ibarətdir.

**Qeyd:** *Dəva dövlətinə nail olmuş ürək, “hal”[2] məqamına çatmış ürəkdən daha şəffaf və daha səfalıdır.*[3]

**Nişanə** 3. “Bimar”: “təcrid” yaxud “bəstlik” şəraitində, “qurbanlıq”[4] məqamına hazırlaşmış aşiqdir.

**Nişanə** 4. “Ağa”: A: Uca Allahın mütləq malik olmasından nişanədir.

B: Ağa, bəşəri sifətdə zahir olmuş eşq rəhbərindən ibarətdir.

**Qeyd:** *Eşq rəhbəri, ilahi təlimat ilə salik mərtəbəli aşiqin bəşəri sifətlərini silib*[5] *onu ilahi sifətlərə nail etməklə “məzhəriyyət” yaxud “ayətullah”*[6] *ünvanlı irfani məqama qaldıran mürşiddir.*

**Nişanə** 5. “Qul”: Öz bəndəliyini[7] duyub – düşünüb etiraf etmiş aşiqdir.

**Nişanə** 6. “Timar”: Timar, mehriban məbudun “rəhimi-sifət”[8] ünvanlı özəl lütfündən nişanədir.

**Qeyd:** *Timar ünvanlı ilahi lütfündən bəhrələnməyin mühüm şərti aşiqin saliklik dövlətinə nail olmağıdır.*

**Anlam: Ey mehriban məbud, ya ey həzrəti-mürşüd, iradə - ixtiyarsız aşiqə yenidən ixtiyar – iradə bağışlayan, yaxud onun bəşəri vücudunu ilahiləşdirən iqtidar yalnız sənin lütfünə bağlıdır.**

Beyt 2: **Zahida, gör çaki sinə şöləsin, bizdən saqın,**
**Bir ocağız biz ki, suzandır dərü divarımız.**

---

[1] Qəzəl 107, beyt 7
[2] Qəzəl 42, beyt 7
[3] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی
[4] Qəzəl 7, beyt 2
[5] Qəzəl 1, beyt 2, nişanə “ney”
[6] Qəzə 46, beyt 5
[7] Qəzəl 1, beyt 6, nişanə hərf vücud
[8] Qəzəl 1, beyt 1, nişanə salik

Sözlük: Çaki-sinə – sinə çakı; Suzan – yanan = yandırıcı; Dər – qapı

**Nişanə** 1. “Zahid”: Zahid barədə bu kitabın birinci cildində, xüsusilə, 9-cu qəzəldə lazımınca diqqətəlayiq araşdırmalardan örnəklər göstərmişik, ancaq bu nişanənin daha önəmli olduğuna görə aşağıdakı izahların əlavə olmasını gərəkli görürük:

A: Qəlbini dünya tamahından və əlini dünya mülkündən xali etmiş şəxs aşağı dərəcəli zahiddən ibarətdir.

B: Hər cür ləzzət kökünü öz ürəyindən qoparıb atmış bir şəxs orta dərəcədə qərar tutmuş zahiddən ibarətdir.

**Qeyd:** *Zahidlik, yaxud pəhrizkarlıq cəmaətin hörmət göstərməyinə səbəb olduğundan ürək aramlığına, nəhayət, batini ləzzət aparmağa bais olaraq, zəiflənmiş mənliyin yenidən canlanmasına zəminə yaradan bir mərtəbədir. Bunun üçün də həqiqi zahidə hər cür ləzzətdən çəkinmək mənəvi bir təklif kimi vacib olur.*[1]

C: Heyrət dənizində qərq olaraq, var – yoxunu, hətta pəhrizkarlığını yaddan çıxarmış bir aşiq yüksək dərəcəli, yaxud həqiqi zahiddən ibarətdir.

**Qeyd:** *Bu beytdə qeyd olunmuş “zahid”:*

*A: Dil ucu pəhrizkarlıq edən zahiddən ibarətdir.*

*B: Üzdə bir cür arxada başqa cür əməl etmiş “mütəzəhhid” ünvanlı riyakar insandan ibarətdir.*

**Nişanə** 2. Çaki-sinə şöləsi: Xarici vücudda təzahür etmiş daxili atəşdən, yaxud “nari-məhəbbət” dən ibarətdir.

**Nişanə** 3. Ocaq: Ağıldan, idrakdan üstün ülvi səhnələrdən xəbərdar müqəddəs insanlar əncümənindən ibarətdir.

**Nişanə** 4. Suzan: Xüsusi bəndəlik yanğısından ibarətdir.

**Nişanə** 5. Dərü divar: Eşq dairəsinin mühitindən ibarətdir.

**Anlam: Ey zahid, nə qədər ki, dünya tamahını, camaat hörmətini, hətta ibadət ləzzətini eşq dənizində qərq etməyibsən, aşiqlər qəbiləsinə yaxın düşməyin xətərnak və ziyanlıdır.**

Beyt 3: **Nola gər olduysa fani Kuhkən, mən baqiyəm,**
**Eşqə bizdəndir bəqa, yoxdur yox olmaq varımız.**

Sözlük: Kuhkən – dağqoparan = dağyaran = Fərhadın ləqəbi;

---

[1] دکتر قاسم غنی ، "تاریخ تصوف اسلام" ، ص274

Baqi – zavalsız = daimi; Bəqa – daimi varlıq = əbədiləşmək =
= diri qalmaq

**Nişanə** 1. “Kuhkən”: Kuhkən və ya Fərhad, məcazi eşq güsgüsündə mənəvi parlamalar müşahidə etmiş, yaxud bəşəri camalda ilahi hüsnlər idrakına nail olmuş aşiqə təşbihdir.

**Qeyd** 1: *Elm və idrakı maddi aləm tanışlığında məhdud olmaq xətərindən nicat vermək məqsədilə, yaxud maddi təcrübələri kamal təhsilinə kifayətedici tanımaq ziyanından qorumaq fikirilə maddəni və dünyanı təhqir və məzəmmət etmişlər.*

**Qeyd** 2: *Hər bir şey, o cümlədən, maddə, vəhdət mərkəzindən yarandığından, mənəvi bir vücud kimi qürurlu və hörmətlidir. Deməк, fəlsəfə baxımilə heçdən yaranma sözünün mümkünsüz və batil olması hər bir yaranmışın, o cümlədən, maddənin hörmətini təlqin etmək istəyir.*[1]

**Qeyd** 3: *Hər bir maddi vücudun qeyri maddi ilahi aləm ilə “nisbət” bağlılığı onun əziz və hörmətli olduğunu təlqin etmək istəyir.*[2]

**Nişanə** 2. “Baqi”: Öz məcazi vücudunu bəşəri sifətlərdən boşaldıb mənəvi sifətlər ilə doldurmaqla yarı yer şəxsiyyətini yarı göy şəxsiyyətinə qatmış arifdən ibarətdir.

**Qeyd** 1: *Baqi nailiyyətinin ilk şərti bəşəri əhval – ruhiyyəni fani etməkdən ibarətdir.*

**Qeyd** 2: *Hər bir arif öz qabiliyyəti qədər, yaxud fani etdiyi bəşəri sifətləri qədər ilahi sifətlərdən bəhrələnməlidir. Bəzi ariflər bir, iki və bəziləri bir çox ilahi sifətlərdən bəhrələnmişlər. Ancaq təmamilə ilahi sifətlərə sahib olmuş şəxs, yalnız islamın ulu peyğəmbəridir.*

**Nişanə** 3. “Bəqa”: Bəqa, mənəvi seyrin, yaxud ilahi eşq aləminin başlanışından ibarətdir.

**Qeyd:** *Bəşəri sifətlərin təmamilə yox olması, bəqa dövlətinin axır dərəcəsindən nişanədir.*

**Nişanə** 4. “Yoxdur yox olmaq varımız”: Yox olmaz var – bəqa mərhələsində əbədiləşmiş zavalsız vardan ibarətdir.

**Qeyd:** *Heçdən, yaxud yoxdan var olmaq imkansız olduğu kimi, vardan da yox olmaq mümkünsüzdür. Beləliklə ölüm, yoxluq yox, bəlkə də ölümsüzlük aləminə və ya ülvi - əbədi aləmə, ya da uca Allah hüzuruna köçən mərhələdir.*[3]

---

[1] پرویز بابایی، مکتب های فلسفی، ص 297

[2] Qəzəl 40, beyt 5

[3] Qəzəl 2, beyt 7, qeyd

**Anlam: Silsiləvi aşiqlərin bir birinə bağlılığı[1], Fərhadın dünyanı dəyişməsilə eşqin bitməsinin mümkünsüz olduğunu sübut edir. Beləliklə, dünən eşq rəhbərliyi Fərhadın öhdəsində idisə bu gün mənim zəmanətimdədir. Elə buna görə də Mövlana Füzuli buyurmuş ki:**

**Sordu Məcnun növbəsin indi mənəm rüsvayi-eşq,**
**Doğru derlər, hər zaman bir aşiqin dövranıdır.**

Beyt 4: **Gülşəni-qəm nəxliyüz, pərvərdə abi-didədən,**
**Dağlər bərg, ahi-atəşbarımızdır barımız.**

Sözlük: Nəxl – ağac = xurma ağacı; Pərvərdə – tərbiyələnmiş = pərvəriş tapmış = nöqsansız = kamil = tədbirli; Abi-dide – göz yaşı; Bərg – yarpaq = vərəq = əsbab = dəstgah = məişət vəsiləsi = nəğmə = ahəng; Ah atəşbar – od yağdıran ah

**Nişanə** 1. “Gülşəni-qəm”: “Qəbz” vəziyyətində giriftar olmuş ürəyi “bəst” rayihəsilə fərəhləndirən ümüd və haldan ibarətdir.

**Nişanə** 2. “Nəxl”: Bu beytdə acı hallardan şirin səmərələr görmək məqsədilə tərbiyələnmiş batini vücuddan nişanədir.

**Nişanə** 3. “Abi-dide”: Bu beytdə zahiri vücud ləkələrini yuyub – təmizləməklə batini vücuda mərifət və iqtidar bağışlayan vasitədən nişanədir.[2]

**Nişanə** 4. “Dağ”: “Qəbz”lər sınağından tərbiyələnmiş qəlbə vurulmuş, ilahi özəl nişandan ibarətdir.

**Nişanə** 5. “Ahi-atəşbar”: Bu beytdə ürəyi müşahidə mərtəbəsindən məhrum etmiş maddi maneələri, “nari-məhəbbət” mərhələsində yandırarkən onu “nuri-məhəbbət”, yaxud “şühud” nailiyyətinə hazırlayan vasitədən ibarətdir.[3]

**Anlam: Qəhrlər və qəbzlər sınaqlarında tərbiyələnmək bərəkətindən qəmləri məişət vəsiləsi, qüssələri həyat vasitəsi dərd və bəlanı dirilik ahəngi etmiş şəxslər, biz aşiqlərdən ibarətdirlər.**

Beyt 5: **Əhlin – tərkin quluyuz, oldur bizə candan əziz,**
**Yusif isə xudfüruş, onunla yox bazarımız.**

---

[1] Qəzəl 98, beyt 2
[2] Qəzəl 25, beyt 1
[3] Qəzəl 83, beyt 1

Sözlük: Xudfüruş – xudpəsənd = məğrur

**Nişanə** 1. “Əhli-tərk”: Mehriban məbuddan başqalarını, hətta öz fikrini və iradə - ixtiyarını, “üryanlıq” və “mücərrədlik” ünvanlı irfani mərhələdə yaddan çıxarmaqla, “şühud” məqamına hazırlaşmış arifdir.[1]

**Nişanə** 2. “Qul”: Bax birinci beytə.

**Nişanə** 3. “Yusif”: A: Öz şərif ruhunu, bədən qaranlığında parlaq və salamat saxlamaq yolunu kamil bilmiş insandır.

B: Şərif ruhunu, şəxsi bir matah etmiş insandır.

**Nişanə** 4. “Xudfuruş”: Bu beytdə öz ilahi hüsnündən razi olmaqla özündən xəbərdar olmağını sübut etmiş, yaxud ikilik ünvanlı (bir hüsn verən, bir hüsn alan) kəsrətə giriftar olmuş şəxsdir.

**Nişanə** 5. “Bazar”: Bu beytdə nəzər yetirmək və əlaqələnmək vəziyyətindən nişanədir.

**Anlam: Özlüyündən xəbərdar, yaxud mənliyini tərk etməyən şəxs, ülvi hüsnlər sahibi olsa da, bizim nəzər diqqətimizi cəlb etməkdən acizdir. Çünki bizim qəlbimizdə yerləşən yalnız üryanlıq məqamına çatmış, yaxud mənliyini silib atmış aşiqdir.**

Beyt 6: **Əşkimiz girdabı – ali, ömrümüz bünyadi-pəst,**
**Gör nə alçaq dirlikilə çizginir pərgarımız.**

Sözlük: Girdab – burulğan; Pəst – alçaq

**Nişanə** 1. “Əşk girdabı”: Əşk girdabının ali olması bu beytdə ömür binasının üstünü almış fəna dalğalarına istiarədir.

**Nişanə** 2. “Çizginir pərgarımız”: Pərgar dolanma, həyat sürmə məcburiyyətindən nişanədir.

**Anlam: Bəlalar dənizindən qovzanmış iqtidarlı dalğalar önündə həqiranə həyat sürmək, dünyəvi möhlətlər etibarsızlığından açıq bir nişanədir.**

**Qeyd:** *Mənəvi həyatdan, yaxud ali yaşayışdan xəbərdar bir insanın nəzərincə məcazi dünyada həyat sürmək həqirlik və başı aşağılığa bərabərdir. Buna görə də, o, dünyəvi həyatı təhqir etməklə mənəvi həyatı əzizləndirmək və canlandırmaq istəyir.*

---

[1] Qəzəl 106, beyt 4, nişanə 3

Beyt 7: **Ey Füzuli, cövri – yarü təneyi - əğyardən**
**Var yüz min qəm, bu həm bir qəm ki, yox qəmxarımız.**

Sözlük: Qəmxar = qəmə ortaq olmaq

**Nişanə** 1. “Tənə”: Tənə, eşq prinsiplərindən xəbərsiz camaatın danlağından ibarətdir.

**Qeyd** 1: *Tənə salikin dünyəvi xarakterini təhqir edən vasitədən ibarətdir.*

**Qeyd** 2: *Tənə aşiqin təhqir olunmuş xarakterini öz nəzərindən salan vasitədən ibarətdir.*

**Nişanə** 2. “Əğyar”: Eşq və irfan nemətindən bəhrəsiz camaatdan ibarətdir.

**Nişanə** 3. “Qəm”: Bu beytdə yaşayış mühitini, hətta şəxsi vücudu yaddan çıxarmağa yardımçılıq etməklə saliki kəsrət maneələrindən azad olmağa hazırlayan vasitədən nişanədir.

**Nişanə** 4. “Qəmxar”: Qəmxarlıq bu beytdə əql əhlinin yardımından ibarətdir.

**Anlam: Sərki vuran əğyar həm də, mənə diqqət yetirməyən camaat heç özü də bilmədən ictimai yaşayış və mənlik təəssübünü, ürəyimdən silməklə ilahi məqsədə yaxınlaşmağıma yardımçılıq edir.**

## Q Ə Z Ə L  110

**(1) Xəm qədilə ağlaram ol türeyyi – tərrarsız,**
**Gərçi derlər çəngdən çıxmaz tərənnüm tarsız.**

**(2) Sineyi – çakimdən əksik etmə tiri – qəmzəni,**
**Ey güli – rəna, bilirsən kim, gül olmaz xarsız.**

**(3) Saxlamazdım navəkin dildə, bəlasın çəkmədən,**
**Bəsləməzdim su verib ol nəxlkami  barsız?**

**(4) Yol azarsan zülməti – heyrətdə, ey dil, vaqif ol,**
**Zinihar ol kuyə varma ahi – atəşbarsız.**

**(5) Giryeyi – zar ilə xoşhaləm ki, bəhri – eşqdə,**
**Əşksiz göz bir sədəfdir, lölöi – şəhvarsız.**

**(6) Canə azari – xədəngin xoş gəlir, ey qaşı yay,**
**Bir sifariş qıl ki, bizdən ötməsin azarsız.**

**(7) Zöhddən keçməz Füzuli, eyləməz tərki – riya,**
**Pənd çox verdim, eşitməz arsızdır, arsız.**

Beyt 1: **Xəm qədilə ağlaram ol türeyyi – tərrarsız,**
**Gərçi derlər çəngdən çıxmaz tərənnüm tarsız.**

Sözlük: Xəm qədd – bükülmüş qamət; Türrə – alın üstünü örtən zülf = zülfü tərrar = oğru; Tar – nazik uzun ip = sim

**Nişanə** 1. "Xəm qədd": A: Vəhdət nöqtəsindən başlanmış dairəvi hərəkətdən, yenidən həmin nöqtəyə qayıdan seyrdən ibarətdir. B: Xəm qədd - eşq ərəfəsində təvazökarlıq və hörmət göstərməkdən nişanədir.

**Nişanə** 2. "Ağlaram": Ağlamaq, mənəm - mənəmliyi yuyub bəstlik mərtəbəsinə hazırlayan nişanədən ibarətdir.

**Nişanə** 3. "Türreyi-tərrar": Bu beytdə ilahi camal cilalarının iztiraba salan doğu – batını nişan verir.

**Nişanə** 4. "Çəng": Süqut həddinə qədər zəifləmiş maddi vücuda eyham edən nişanədən ibarətdir.

**Nişanə** 5. "Tarsız": Cismi əngəl vücudun, qırılmış ip kimi karsız olmasından nişanədir.

**Anlam: Göz yaşıyla qat – qat incəlmiş maddi vücudun**[1]**, simsiz çəng kimi işdən düşməklə, mənəvi vücudumun canlanmasına müqəddimə olmasına işarədir.**

Beyt 2: **Sineyi – çakimdən əksik etmə tiri – qəmzəni,**
**Ey güli – rəna, bilirsən kim, gül olmaz xarsız.**

Sözlük: Çak – yarıq = çat

**Nişanə** 1. "Sineyi-çak": Bu beytdə maddi vücud örpəyini parçalamaqla mənəvi vücud cilvələrinə, yaxud batini vücudda təzahür etdirilmiş camala tamaşa yolu açmaqdan nişanədir.

**Nişanə** 2. "Tiri-qəmzə": Bu beytdə aşiqin fiziki əngəl mahiyyətinə sədəmə vuran ilahi iltifatların bitməsinə işarədir.

**Nişanə** 3. "Güli-rəna": "Bəst" ünvanlı ürək açan anları davamlandıran dilbərdən istiarədir.

**Nişanə** 4. "Xar": "Qəbz" ünvanlı ürək sıxan anları davamlandıran mərhələdən nişanədir.

**Anlam: Ey həkim, məhbub ürək sıxan qəbzlərin isə alqışa layiqdir çünki:**

A: Qəbzlər hikmət hökmünə bağlıdırlar.

---

[1] Qəzəl 12, beyt 1

B: Bəstlər qəbzlərdən asılıdırlar.
C: Ürək tərbiyəsi qəbzlərə bağlıdır.

Beyt 3: **Saxlamazdım navəkin dildə, bəlasın çəkmədən,**
**Bəsləməzdim su verib ol nəxlkami barsız?**

Sözlük: Navək – sürətli kiçik ox = ox; Nəxli-kam = kam ağacı

**Nişanə** 1. "Navək": Aşiqin özəl münacat ünvanlı fəryadını artıran məşuq qəmzələrindən və ya ikinci beytdə qeyd olunmuş oxdan – qəmzədən ibarətdir.

**Nişanə** 2. "Dildə navək saxlamaq": Dildə navək saxlamaq eşq səmasından yağdırılan bəlaları əzizləmək və qorumaq nişanəsidir.

**Nişanə** 3. "Su verib": Su vermək, bu beytdə eşq yolu üstə dikəlmiş maneələri o cümlədən maddi əngəl vücudu bir ləkə kimi göz yaşıyla yuyub təmizləmək nişanəsidir.

**Nişanə** 4. "Nəxli-kam": Batini arzular uğurundan yaxud ilahi hədəfə çatdıran vasitədən nişanədir.

**Nişanə** 5. "Bar": Mənəvi hədəfdən nişanədir.

**Anlam: A: Eşq sahəsində çalışqanlığımın səmərəsizliyindən yaxud hakim olan məhbubun son söz qəhrindən xəbərdar olsaydım bir belə cəhdlər edib bəlalara dözməzdim.**

**Qeyd:** *Bu məna, uca Allahın diqqətsizliyini yox, bəlkə aşiqin nalayiq olduğunu təlqin etmək istəyir.*

*B: Kam ağacının səmərəli olduğuna, yaxud hikmətli məhbubun qəhrdən asılı lütfünə əmin olmasaydım bir belə bəlaları alqışlamağa cəhd etməzdim.*

**Qeyd:** *İkinci məna irfan baxımıyla münasib nəzərə gəlir.*

Beyt 4: **Yol azarsan zülməti – heyrətdə, ey dil, vaqif ol,**
**Zinihar, ol kuyə varma ahi – atəşbarsız.**

Sözlük: Zinhar – saqın = aman = ayıq ol; Ahi-atəşbar – alovlu ah

**Nişanə** 1. "Zülməti-heyrət": Bu beytdə mərifətin dayanmasından nişanədir.[1]

**Nişanə** 2. "Vaqif": Bu beytdə mənəvi dilkəlmək dayanmasına işarə edərək düzgün mərifət nailiyyətini nişan vermək istəyir.

---

[1] Qəzəl 106, beyt 3

**Nişanə** 3. “Kuy”: İlahi eşq ərəfəsindən, yaxud bəndəlik məqamından nişanədir.[1]

**Nişanə** 4. “Ahi-atəşbar”: Ahi atəşbar bu beytdə şəxsi fikir acizliyini sübut etməklə bəşəri iqtidar və himməti batil edən nişanədən kinayədir.

**Anlam: Şəxsi elm və əndişəni batil bilmək bəndəlik məqamının başlanış şərti olduğundan qul olduğunu etiraf etməkdən əvvəl məhbub ərəfəsinə yaxın düşməkdən çəkinmək ilahi bir təklif kimi vacibdir.**

Beyt 5: **Giryeyi – zar ilə xoşhaəam ki, bəhri – eşqdə,**
**Əşksiz göz bir sədəfdir, lölöi – şəhvarsız.**

Sözlük: Giryeyi–zar = zar-zar ağlamaq; Bəhri eşq = eşq dənizi; Əşk =göz yaşı; Lölöi şəhvar = layiqli gövhər

**Nişanə** 1. “Giryeyi-zar”: Bu beytdə batini müsibətləri zahiri vücudda əks etdirən nişanədən ibarətdir.

**Nişanə** 2. “Bəhri-eşq”: Bəhri eşq bu beytdə kəsrət dalğalarını əks etdirmiş vəhdət məqamından nişanədir.[2]

**Anlam: Müsibətsiz bir qəlb boş sədəf kimi dəyərsiz olduğundan, ürək dolu qüssələrimi təzahür və təsdiq etdirmiş göz yaşıma daha məmnuniyyət bildirməliyəm.**[3]

**Qeyd:** *Göz yaşı bu beytdə qəmsizlik töhmətindən azad edən vasitə olduğuna görə təşəkkürə layiqdir.*

Beyt 6: **Canə azari – xədəngin xoş gəlir, ey qaşı yay,**
**Bir sifariş qıl ki, bizdən ötməsin azarsız.**

Sözlük: Xədəng = ox ucu = hədəfə düz dəyən ox

**Nişanə** 1. “Can”: İnsanın irfani “hallar”[4] nailiyyətinə layiq ölməz həqiqətindən ibarətdir.

**Nişanə** 2. “Azari-xədəng”: Bu beytdə aşiq qəlbini həsrət atəşində tərbiyələndirən “istiğna” məqamlı məhbubun hər dəm bir tənbeh etmək nişanəsidir.

**Nişanə** 3. “Qaşı yay”: Bu beytdə həkim məhbubun qəhr sifətindən

---

[1] Qəzəl 109, beyt 1

[2] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

[3] Qəzəl 23, beyt 1, nişanə “bəla”

[4] Qəzəl 42, beyt 7

nişanədir.

**Anlam: Ey həkim məhbub, həqiqi vücud eşq tənbehlərini tərbiyəvi və uğurlu tanımaqla onları müqəddəs bir ehsan kimi alqışlayır.**

Beyt 7: **Zöhddən keçməz Füzuli, eyləməz tərki – riya,**
**Pənd çox verdim, eşitməz arsızdır, arsız.**

Sözlük: Zöhd – pərhizkarlıq = dünyadan əl çəkmək; pənd – öyüd = nəsihət

**Nişanə** 1. “Zöhd”: Bu beytdə bəzi ictimai adab mülahizəsilə, camaat məlamətindən çəkindirən məişətşünas əqlin başda qalmış xiltindən nişanədir.

**Nişanə** 2. “Riya”: Niyyət xalisliyinə sədəmə vuran, şəxsi mülahizələrlə baş tutmuş elmdən nişanədir.

**Anlam: Füzuli mənəvi mərtəbələri dünyəvi mülahizələr ilə yanaşdırmaqla öz riyakar və üzlü olduğunu bildirir.**

**Qeyd:** *Beyt kinayəli söz atmaq, yaxud Füzuli adıyla riyakar zahidi məlamət edir.*

## Q Ə Z Ə L 111

**(1) Təriqi – fəqr tutsam təb tabe, nəfs ram olmaz,**
**Qina qılsam tələb, əsbabi – cəmiyyət təmam olmaz.**

**(2) Dəhanından əsər görməm, miyanından nişan, vəh kimi**
**Məni-nakamə ömrümdən müyəssər hiç kam olmaz.**

**(3) Müqimi – kuyi – dərd eylər məni ahi – cigərsuzim,**
**Bu ahəngi – məlaləfzayə bundan yey məqam olmaz.**

**(4) Müridi – saqiyəm kim lütfi əhli – zövqə daimdir,**
**Nə hasil əhli – zöhdün şəfqətindən kim, müdam olmaz.**

**(5) Dedim: üşşaqə cövr etmə!Dedi ol xublər şahi:**
**Siyasət olmayınca eşq mülkündə nizam olmaz!**

**(6) Ləbindən qətrə - qətrə qan içər könlüm kərahətsiz,**
**Şəkərdən olacaq mey qətrəsi guya həram olmaz.**

**(7) Füzulini məlamət eyləyən bidərd bilməzmi**
**Ki, bazari – cünun rüsvalarında nəngü nam olmaz.**

Beyt 1: **Təriqi – fəqr tutsam təb tabe, nəfs ram olmaz,**
**Qina qılsam tələb, əsbabi – cəmiyyət təmam olmaz.**

Sözlük: Təriqi-fəqr – fağırlıq yolu = yoxsulluq rəsmi; Qina = dövlətlilik = ehtiyacsız olmaq

**Nişanə** 1. “Fəqr”: Dünya və axirət nemətlərinə etinasızlıq etməkdən nişanədir.

**Qeyd** 1: *“Bəndə istiğna”sı, yaxud ikinci istiğna ünvanlı mərtəbədə mənəvi mərifətlər əldə etmiş aşiqlər dünyəvi nemətlər həqirliyini aydın görərək, onlara rəğbətsizlik nişan vermişlər.*[1]

**Qeyd** 2: *“Rəhman behişti” ünvanlı ilahi hüzurdan*[2] *, yaxud Tanrıya qovuşmaq nemətindən xəbərdar bir aşiqin “* الهی من ذالذی ذاق حلاوة محبتك فرام منک بدلا*”*[3] *zikr etməyi, onun “Rizvan behişti” adlı axirət nemətinə etinasızlığını aydın surətdə dəlilləşdirə bilir.*

**Nişanə** 2. “Təb, nəfs”. Maddi bədəndə əmanət qoyulmuş qeyri maddi bir lətafətdən ibarətdir.[4]

**Qeyd:** *Yararlı əxlaq mənşəyi olmuş ruh kimi, yaramaz sifətlər mənşəyində təb ya nəfsdən ibarətdir.*

**Nişanə** 3. “Qina”: A: Dünyəvi var – dövlət təlqin edən nişanədən ibarətdir.

B: Qina – Allah bəndəsini dünya nemətlərindən ehtiyacsız edən ürək dövlətindən nişanədir.

**Nişanə** 4. “Əsbab-cəmiyyət”. A: Əsbab Dünyəvi var – dövlət kamilliyinə çatdıran vasitədən ibarətdir.

B: Əsbab cəmiyyət – yalnız mütəal məbuda üz tutaraq daxili himmətlərin cəmləşməyindən nişanədir.

**Anlam: A: Dünya nemətlərinə tam qapılmaq, yaxud dünyadan tamamilə əl üzmək mümkünsüz bir fikirdir.**

B: Dünyəvi əhvali – ruhiyyə xisləti, mənəvi nailiyyətləri bulandırdığı kimi, mənəvi əhval – ruhiyyə də dünyəvi istəkləri təhqir etməlidir.

C: İkinci istiğna, yaxud bəndəlik istiğnasına ya da fəqr dövlətinə çatdıran himmətləri cəmləşdirməkdən hələlik acizəm.

---

[1] Qəzəl 21, qəzəl 25, beyt 5
[2] Qəzəl 80, beyt 6
[3] Əllamə Məhəmməd Baqir Məclisi, Biharul - ənvar, cild 94, s. 148
[4] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

Beyt 2: **Dəhanından əsər görməm, miyanından nişan, vəh kimi**
**Məni-nakamə ömrümdən müyəssər hiç kam olmaz.**

Sözlük: Dəhan = ağız, vəh = ba! , nakam = kamsız , müyəssər = mümkün

**Nişanə** 1: “Dəhan”: Dəhan, bəşəri fəhmdə - vəhmdə sığmaz, mütəal məbudun “mütəkəllim” ünvanlı özəl sifətindən, həm də görünməz aləm görünüşündən nişanədir.

**Nişanə** 2: “Miyan”: Miyan, aşiq ilə məşğul arasındakı yoxluğu – varlığı idrak olmaz fasilədən nişanədir.[1]

**Anlam: Daxili vücud cilvələrindən, həm də səmavi cazibələr nemətindən məhrumluqla ömür sürməyim, dəhan və miyan ünvanlı ilahi lütflər dayanmasından nişanədir.**

Beyt 3: **Müqimi – kuyi – dərd eylər məni ahi – cigərsuzim,**
**Bu ahəngi – məlaləfzayə bundan yey məqam olmaz.**

Sözlük: Müqim – daimi məskən etmiş = sabit məskən tutmuş; Cigərsuz – cigər yandıran; Məlaləfza – hüznlü = hüzn artıran

**Nişanə** 1. “Kuyi – dərd”: Heç bir dünyəvi səbəb ilə rəf olmaz ətəş mövqeiyyətindən ibarətdir.

**Qeyd** 1: *Ətəş, mənəvi nailiyyətlər hərisliyindən, yaxud ilahi görüşlər çalışqanlığından ibarətdir.*

**Qeyd** 2: *İrfani tədqiqatçılar ətəş mərtəbəsini üç dərəcədə izah etmişlər:*

*A: Mürid ətəşi: Yaxud uca Allahın görüşünə istiqamətləndirən ətəş.*

*B: Salik ətəşi: Yaxud, ilahi diqqət məşğulluğundan məhrum edən dünyapərəst nəfsə qələbə çalmaq ətəşi.*

*C: Cilvə ətəşi: Cilvə ətəşi, yaxud uca Allahın camalını maddi örpəksiz müşahidə etmək ətəşi.*[2]

**Nişanə** 2. “Ahi-cigərsuz”: Daxili vücudda yerləşmiş “nari-məhəbbət”, yaxud ətəş artıran hərarətdən ibarətdir.

**Nişanə** 3. “Ahəngi – məlaləfza”: Maddi qərib ölkədə mənəvi əl çatmaz vətəni xatırlayan hüzn ünvanlı mərtəbədən nişanədir.[3] Hafiz Şirazi dünyanı dəyişmə zamanı, xatırladığımız vətən müraciəti bilib

---

[1] Qəzəl 49 , beyt 2
[2] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی
[3] Qəzəl 52, beyt 7, anlam

buyurmuşdur:

خرم آن روزكزيم منزل ويران بروم
راحت جان طلبم وزپی جانان بروم[1]

**Qeyd** 1: *Qəbz və hicr ilə bağlı qəmlər bir çox yol şadlığından asılıdırlar, ancaq hüzn ünvanlı qəm həmişəlik şadlığa bağlıdır. Elə buna görə də müəllif bir qəzəlinin mətləində demişdir ki:*

**Gəl ürək sağrını hüzn ilə doldur, hala bax,**
**Acı xuldan asılı, can kimi şirin bala bax.**

**Qeyd** 2: *Vəhdət nöqtəsindən hərəkətini başlamış insan adlı mövcudun, lahut, mələkut, xəbrut və habelə digər ülvi aləmlərdə həyat sürməsi, sonda "hadisə" ünvanlı fəlsəfi mərhələdə, yaxud Qurani-Kərim buyurduğu: [2]هبوط" (hubut )məcburiyyətində yer sakinliyini ixtiyar etməsi, onun dünya həyatından əvvəl yaşayış növbələrini aydın sübut edir. Beləliklə, onu dünya üzərində yaşayışı, yoxdan var olmuş bir mövcud kimi bilməyi, dəlilsiz bir töhmət və hədər bir fikirdir.[3] Çünki yoxda varlıq qabiliyyəti yoxdur. Elə buna görə də fəlsəfə "bir şeyin heçdən yaranmasını" mümkünsüz bilmişdir.[4] Nəhayət, dünyəvi alçaq həyat, yaxud "hadisə" və "هبوط"(hubut) qəmi, ülvi ölməz yaşayışa müraciət etmək şadlığı ilə həmişə bağlıdır.*

**Qeyd** 3: *"Bəst" mərtəbələrində "badə" ünvanlı ilahi cilvələr bağışlayan ümidlər və sərxoşluqlar olmasa, yer sakinliyində hicran şəraitinə, yaxud həqir yaşamaq qəminə intihardan başqa bir əlac tapılmaz. Bu qəm və bu əlac əhəmiyyətini təlqin etmək məqsədilə Hafiz buyurmuş ki:*

اگر نه باده غم دل زيادما ببرد
نهيب حادثه بنيادما زجاببرد[5]

**Nişanə** 3: "Məqam": Məqam ya muqam ağır çətinliklərə dözmüş bir insanın iqamət etdiyi mənzilindən, yaxud çatdığı mərtəbəsindən ibarətdir.[6]

**Qeyd:**

*Ərş - İslam Peyğəmbərinin özəl "məqam"ıdır.*

*Kürsü – Umumxalqa göndərilmiş (ülul - əzm) peyğəmbərlər ruhunun məqamıdır.*

---

[1] Müəllif bu beyti "Ta Qafe-əndişe" kitabının 3-cü cildində şərh etmişdir.
[2] Qəzəl 5, beyt 4, qeyd 2
[3] İnsanın mənəvi həyat mərtəbəsində maddi şərair , yaxud bədən licimi olmadığı vəziyyətə "yox" demişlər.
[4] پرويز بابايی، مكتب های فلسفی، ص 297
[5] Müəllif bu beyti "Ta Qafe-əndişe" kitabının 2-ci cildində şərh etmişdir.
[6] دكتر سيد جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبيرات عرفانی

*7 – ci səma – ümumrəsullar  ruhunun məqamıdır.*

*6 – cı səma – nəbi adlı peyğəmbərlər ruhunun məqamıdfır.*

*5 – si səma – uca Allahın "vəli" ünvanlı dostlarının ruhuna məqamdır.*

*4 – ci səma – ariflər ruhuna məqamdır .*

*3 – cü səma – zahidlər ruhuna məqamdır.*

*2 – ci səma – abidlər ruhuna məqamdır.*

*1 – ci səma möminlər ruhuna məqamdır.*

**Anlam: Yer sakinliyində 4 – cü səma cəlalərindən bəhrələndirən nemət, həmişəlik ətəş və daimi hüzn nemətindən ibarətdir.**

Beyt 4: **Müridi – saqiyəm kim lütfi əhli – zövqə daimdir,**
**Nə hasil əhli – zöhdün şəfqətindən kim, müdam olmaz.**

Sözlük: Mürid – tələb əhli = mürşid məktəbindən təriqət adabı öyrənən tələbə = iradə sahibi; Müdam = həmişəlik = daimi = şərab

**Nişanə** 1. "Mürid": Öz fikrinə, əqlinə, elminə, iradə - ixtiyarına mütəal məhbubu malik tanıtmış aşiqdən ibarətdir.

**Qeyd** 1: *Mürid təriqət adabını öyrənməyə iradə etdiyinə görə təhsil başlanışında bir növ bəşəri iradəyə sahibdir.*

**Qeyd** 2: *Mürşid təlimatı qarşısında təslim olmuş aşiqin bəşəri iradədən boşalması, gərəkli mərhələ və qəti xeyirdən ibarətdir. Çünki o, "الاسلام هو تسليم"[1] sözünü, həm də təslimçiliyin  iradə sahibi olmağa təzadlı olduğunu aydın düşünə bilir.*

**Nişanə** 2. "Saqi": Feyz vasitəsilə qəlbləri diriləndən həzrəti xəbər eylədən, yaxud həzrət mürşiddən ibarətdir.

**Qeyd:** *Seyr yolunda səf bağlamış şəhvət, həvəs, qəzəb, mal, dövlət və digər dünyəvi təmayülat kimi yırtıcı heyvanlar kənarından qorxusuz – və büdrəmədən sovuşmaq, saqi bağışladığı feyzlər məstliyinə qovuşmaq ilə bağlıdır.*[2]

**Nişanə** 3. "Əhli-zövq": Fiziki mahiyyət təzahüratından ayrılmağa şövqlənmiş aşiqlərdən ibarətdir. Onlar elm və dəlillərlə ilə tədqiq olunmuş həqiqətləri zövq və hal ilə tapmış adamlardır.[3]

**Nişanə** 4. "Əhli-zöhd": Bu beytdə məişətşünas əqli yüksək insanlıq səviyyəsinə qaldıran əsas səbəb kimi tanıyıb, eşq hidayətini yerli – dibli

---

[1] Doktor Cavad Nurbəxş, Sufi kist, s. 16

[2] Qəzəl 37, beyt 1

[3] Qəzəl 1, beyt 2 , nişanə mey

inkar etmiş müddəidən ibarətdir.

**Nişanə** 5. “Lütf və şəfqət”: Bu beytdə kədərli ürəklər halını mülayimləşdirən nişanədən ibarətdir.

**Anlam: Həzrət mürşüdün ilahi – daimi lütfünü unudub, zahidin bəşəri etibarsız lütfünə ümidlənməyim mümkünsüz bir xəyaldır.**

Beyt 5: **Dedim: üşşaqə cövr etmə! Dedi ol xublər şahi:**
**Siyasət olmayınca eşq mülkündə nizam olmaz!**

Sözlük: Üşşaq – aşiqlər; Xublar = gözəllər

**Nişanə** 1. “Üşşaq”: Dünya və axirət nemətlərini unudub, yalnız uca Allah ünvanlı həqiqi məhbubu tələb etmiş adamlardan ibarətdir.[1]

**Nişanə** 2. “Cövr”: Saliki seyrdən dayandıran tənbeh - tərbiyədən ibarətdir.

**Nişanə** 3. “Xublar şahı”: A: Bəşəri camalda ilahi hüsnlər əks etdirmiş məhbubdan ibarətdir.

B: Aşiqin iradə - ixtiyarını öz əlinə almış mürşiddir.

**Anlam: Ölkələri siyasət, ürəkləri cövr nizamlayır.**

Beyt 6: **Ləbindən qətrə - qətrə qan içər könlüm kərahətsiz,**
**Şəkərdən olacaq mey qətrəsi guya həram olmaz.**

**Nişanə** 1. “Ləb”: İkinci nəfs ünvanlı həqiqi həyat bağışlayan məxsus feyzdən istiarədir.

**Nişanə** 2. “Qətrə - qətrə qan içmək”: A: Maddi əngəl həyat qanlarını hər an sormaqla, “qurbanlıq”[2] məqamına, yaxud ölməz həyat nailiyyətinə hazırlaşmaqdan nişanədir.[3]

B: Hər an təzələnmiş həqiqi həyatdan nişanədir.[4]

C: Ötən beytdə qeyd olunmuş cövr tənbehlərindən ibarətdir.

**Anlam: Üzüm suyundan hasil olmuş meyin sərxoşluğu günahdırsa, feyz şərabından məst olmaq savabdır.[5]**

**Qeyd:** *Yuxarıda xatırladığımız mənaya aid müəllif (Ə.Şahi) bir*

---

[1] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

[2] İmam Xomeyni, Şeirlər divanı

[3] Qəzəl 7, beyt 2

[4] Qəzəl 36, beyt 1, nişanə 4

[5] Qəzəl 71, beyt 3

*qəzəldə demişdir ki:*

***Ürək qanın şərab ilə, üzüm suyun dağıt çölə***
***Qəsəm səba sevən telə,  O nurdur,  bu nardır.***

Beyt 7: **Füzulini məlamət eyləyən bidərd bilməzmi**
**Ki, bazari – cünun rüsvalarında nəngü nam olmaz.**

Sözlük:  Cünun – divanəlik = məcnunluq; Nəngü nam = ar – şöhrət

**Nişanə** 1. “Bidərd” Bu beytdə acılıqdan asılı şirinliklərdən xəbərsiz, məişətşünas əql əhlindən ibarətdir.

**Nişanə** 2. ”Cünun”: Son dərəcəyə çatmış mənəvi məstlikdən, yaxud aşiqin özündən həm xəbərdar, həm də xəbərsiz halından nişanədir.[1]

**Nişanə** 3. “Bazari-cünun”: Məişətşünas əql  hakimiyyətini batil etmiş mövqeiyyətdən nişanədir.

**Nişanə** 4. “Rüsva”: Bəşəri qurama şəxsiyyəti təhkim edən “Nəngü-nam” ünvanlı iki xətərnak əngəl sifətdən xilas olmuş aşiqdən ibarətdir.

**Qeyd:** *Təcrid səmasına yüksəlmək şərti, bir ölü kimi mənəm – mənəmlikdən, yaxud bəşəri şəxsiyyətindən ayrılmaqdan ibarətdir.*[2]

**Anlam: Bəşəri əngəl şəxsiyyətini ilahi ərdəminə fəda etmiş bir aşiq, nəngü nam kimi maneələrdən heç də qorxmaz. Çünki nəngü nam yalnız maddi vücuda xasdır.**

---

[1] Qəzəl 36, beyt 3

[2] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

## Q Ə Z Ə L 112

(1) Oldu aləm şad səndən, mən əsiri qəm hənuz
Aləm etdi tərki qəm, məndə qəmi aləm hənuz.

(2) Can bağışlardı ləbin izhari – göftar eyləyib,
Urmadan İsa ləbi canbəxşlikdən dəm hənuz .

(3) Səcdəgah etmişdi eşq əhli qaşın mehrabini,
Qılmadan xeyli – məlaik səcdeyi – Adəm hənuz.

(4) Canə dərdin, cismə peykanın rəvan etmişdi hökm,
Cism ilə can irtibatı olmadan möhkəm hənuz.

(5) Əşk sərf eylər fələkdən kam hasil qılmaqa,
Bu gühər qədrini bilməz dideyi – pürqəm hənuz.

(6) Pərdeyi – çeşmim məqam etmişdi bir tərsabeçə.
Olmadan Məhdi – Məsiha daməni – Məryəm hənuz.

(7) Ey Füzuli, eylədi hər dərdə dərman ol təbib,
Bir mənim zəxmimdir ancaq bulmayan mərhəm hənuz.

Beyt 1: **Oldu aləm şad səndən, mən əsiri qəm hənuz**
**Aləm etdi tərki qəm, məndə qəmi aləm hənuz.**

Sözlük: Hənuz – hələ

**Nişanə** 1. "Şad": A: Bu beytdə ilahi feyzlərlə bağlı mövcud nailiyyətlərdən razılıq nişanəsidir.

B: Aşiqi keçmişdən, həm də gələcəkdən, yaxud zaman adlı maneə əngəlindən xəbərsiz və xilas edən "vəqt" ünvanlı özəl mərtəbədən ibarətdir.

**Nişanə** 2. "Qəm": A: Dünyəvi həyat axarına aid nigaranlıqdan nişanədir. Bu qəm mənəvi mərtəbələrdən bəhrəsiz həqir insanlar qəmi olduğundan eşq sahəsindən kənar və məzəmmət olunmuş qəmdən ibarətdir.

B: Qəbz və hicran ilə bağlı ürək yandırıcı eyni halda əziz və hörmətli müsibətdən ibarətdir.

C: Ədalətsiz hakimiyyət və ictimai təhlükələr nigaranlığından ibarətdir. Bu qəm peyğəmbərlər qəminə bənzər olduğundan hörmətlidir.

D: Vəhdət havalı aşiqin kəsrət şəraitində əzab çəkməyindən[1], yaxud uca Allah hüzuruna qəribsəmiş şəraitindən, ya da "tələb qürbəti"[2] ünvanlı mərhələdə şikayətlənmiş haldan ibarətdir. Bu şikayət insanı seyrdən dayandıran məcazi dünya həbsinə məhkum etdiyinə görə müsbət və iradsız şikayətdən ibarətdir. Lakin digər qəmlərdən giley etmək onların hörmətini yerə vurmaq, yaxud günaha batmaq kimi olduğundan aşiqin məzəmmətidir.

**Anlam: Ey həkim məhbub, bütün yaranmışlar, xüsusilə, bütün insanlar, sən ehsan etdiyin lütf cazibələri ilə fərəhlənmişlər, ancaq mən hələ də qəbz, yaxud hicran məcburiyyətində qəmgin yaşamaq cəzasına giriftaram.**

**Qeyd** 1: *Dünyəvi məhdud şəraitdə intihasız kamal nailiyyəti mümküncüz olduğuna görə Füzuli qəmgin həyat sürməyə məcburdur.*

**Qeyd** 2: *Füzuli bəstlər ardınca düşmüş qəbzlərdən xəbərdar olduğuna görə qəmsiz yaşayışdan məhrumdur.*

**Qeyd** 3: *Yuxarıda xatırladığımız iki qeyd, Füzuli mərifətini, əsrində yaşayan insanlar mərifətindən üstün eyham etməklə onun davamsız bəst, müşahidə, hal və digər mənəvi nailiyyətlərə razılıq vermədiyini aydın surətdə dəlilləşdirir.*

---

[1] Qəzəl 77 , beyt 7
[2] Qəzəl 34, beyt 3

Beyt 2: **Can bağışlardı ləbin izhari – göftar eyləyib,**
**Urmadan İsa ləbi canbəxşlikdən dəm hənuz.**

Sözlük: Göftar = danışıq = söhbət

**Nişanə** 1. “Can”: Bu beytdə insana həqiqi ölməz həyat bağışlayan ruh adlı gizli sirrdən ibarətdir.

**Qeyd** 1. *Ruh, cismani ürək arasını boşaldan, qəlb hərarəti ilə peyda olmuş lətif buxardan, yaxud bədənin hər yerinə yayılmış “heyvani ruh” ünvanlı cismani həyat bağışlayan gizli qüvvədən ibarətdir.*

**Qeyd** 2: *Ruh ariflər nəzərincə: Şərif ayə buyurduğu*[1]*, lətif, həqiqi və müdrik olan “insani ruh”dan ibarətdir.*[2]

**Nişanə** 2. “Ləb”: Yoxu var edən özəl feyzdən ibarətdir.[3]

**Nişanə** 3. “Göftar”: “Cilvə ətəşi”[4] ünvanlı məxsus hal yaradan nazdan asılı qəhrdən ibarətdir.

**Anlam: Ey gözəl dülbər, sən yoxu var edən zaman, hələ İsa peyğəmbərə ölünü yenidən dirildən möcüzə iqtidarı verilməmişdi.**

**Qeyd** 1: *Beyt, Məryəm oğlu İsanın ölünü qəbirdən diri çıxarmaq möcüzəsini yada salmaqla içəridən ölmüş bir insanın, həzrət Məhəmməd, və ya həzrət mürşid təlimatı ilə yenidən həyata qayıtmasını təlqin etmək istəyir.*[5]

**Qeyd** 2: *Beyt zavala uğrayan maddi vücudun mənəvi ölməz vücuda örnək olduğu kimi, möcüzənin də idraka sığmaz intihasız iqtidardan nümunə olmağını təlqin etmək istəyir.*

---

[1] Quran, İsra surəsi, 75 – ci ayə :و يسئلونك عن الروح قل الروح من امر ربي و ما اتيم من العلم الا قليلا (səndən ruh haqqında soruşarlar. De : “Ruh rəbbimin əmrindəndir və sizə o barədə yalnız az məlumat verilibdir.”)

[2] Doktor Qasım Qəni, Tarixi-təsəvvüf dər islam, s. 412, 411

[3] “Yox” varlıq ilə təzadlı bir termin deyil, bəlkə də dünyəvi həyat dövranına hazır olmamaqdan ibarətdir.

[4] Qəzəl 111, beyt 3

[5] Quran, Maidə surəsi, ayə 110 : “ اذ قال الله يا عيسي بن مريم ذكر نعمتى عليک و على والدتک اذا الدتك بروح القدوس فى المهد و كهلا و اذ علمتک الكتاب و الحكمه ئ التورات والانجيل و اذ تخلق من الطين كهيئة الطير باذنى فتنفخ فيها فتكون طير باذنى و نبرى الاكمه و الابرص باذنى واذنخرج الموتا باذنى واذ كففتُ بنى اسرائيل عنک اذجئتهم بالبينات فقال الذين كفرو منهم ان هذا الا سحرٌ مبين [ya Məhəmməd! Yad et ki,] bir zaman Allah buyurdu: Ey Məryəm oğlu İsa! Sənə və anana olan nemətimi xatırla! O zaman səni müqəddəs ruhla qüvvətləndirdim. Sən beşikdə olanda da, orta yaşda olanda da (vəhy vasitəsilə) insanlarla danışırdın. O zaman sənə kitabı, hikməti, Tövratı və İncili öyrətdim. Onda sən mənim iznimlə palçıqdan quşa bənzər bir şey düzəldib sonra onu üfürdün və o da Mənim iznimlə [həqiqi] quş oldu; Sən Mənim iznimlə anadan olma kor  cüzam naxoşluğu tutanı sağaldırdın; ölüləri Mənim iznimlə [qəbirdən diri] çıxardırdın. Sən Bəni-İsrailə aydın dəlillər gətirdiyin zaman Mən [onların bəlasını] səndən dəf etdim. Onlardan kafir olanlar isə: Bu, açıq – aydın sehrdən başqa bir şey deyildir”, dedilər).

Beyt 3: **Səcdəgah etmişdi eşq əhli qaşın mehrabini,**
**Qılmadan xeyli – məlaik səcdeyi – Adəm hənuz.**

Sözlük: Mehrab – qiblə = imam camaatın məsciddə namaza durduğu yer = məclisin yuxarı başı; Məlaik – məlaikə

**Nişanə** 1: "Qaş mehrabı": Qaş mehrabı bu beytdə uca Allahın qələbə və əzəmətinə bağlı cilvələrindən nişanədir.

**Nişanə** 2. "Səcdə": Özünü müşahidə nurunda fani bulmuş aşiq halından nişanədir.

**Anlam: Ey gözəl məbud, aşiq insanlar maddi dünyaya göz açmaqdan əvvəl, şühud cihalələri qarşısında səcdəyə düşmüş halda səni təsdiq etmişlər.**

**Qeyd** 1: *Bu beyt, yaxud bu məna, aşiqin həm də eşqin bir müsafir kimi ülvi aləmdən gəldiyini təlqin etmək istəyir.*

**Qeyd** 2: *Beyt mübarək "Əraf" surəsində, 11 - ci şərif ayəyə işarə məqsədilə buyurur: ("Əlbəttə, sizi yaratdıq, sonra sizə surət verdik, sonra mələklərə: "Adəmə səcdə edin!" dedik. İblisdən qeyri [hamısı] səcdə etdi. O isə səcdə edənlərdən olmadı").*[1]

**Qeyd** 3: *Bu beyt, yaxud bu qəzəl tamamilə:*

*A: "Nuri-xilqət" ünvanlı mərtəbədə Həzrəti Məhəmmədin bütün vücudlardan əvvəl yaranmasınıa eyham etməklə bu mötəbər hədisi təsdiq etmək istəyir: "Allah – Təala həqiqətən behişt, cəhənnəm, qələm*[2]*, lovh*[3]*, kürsü*[4]*, ərş*[5]*, yer və göyləri yaratmaqdan əvvəl, həm də həzrət Adəm və digər peyğəmbərlər yaranışdan qabaq həzrət Məhəmmədin nurunu xəlq etmişdir".*

*B: Füzuli insanın maddi vücuddan əvvəl yaranmış mənəvi vücudunu yoxdan var* [6] *olmasını yox, bəlkə də yoxluğa biganə varlığını eyham etməklə Hafiz Şirazinin bu beytini təlqin edir ki, buyurmuşdur:*

---

[1] و لقد خلقناكم ثم صورناكم ثم قلنا للملائكلة سجدو لا دم فسجدو الا ابليس لم يكن من الساجدين

[2] A : İlk yaranmış mövcud qələmdən ibarətdir ki, Allah – təalanın heybətli nəzərindən yarandı ... və qiyamətə qədər olan – olacağı yazdı. B : Görünməz ülvi aləmdə fikirlərin, nəfslərin və bütün əql əhlinin yaranmaq səbəbi "təfsili elm" ünvanlı "qələm" dən ibarətdir. (Fərhəngi Moin)

[3] Büsbütün əşya surətlərinin rəsmi çəkilmiş "nəfs səhifə"si ünvanlı mərtəbədən ibarətdir (Fərhəngi-Moin)

[4] Kürsü : A: İlahi səltənət və tədbir mərtəbəsindən ibarətdir. B : İlahi əmrlər və qadağanlar sadir olunmuş mərtəbədən ibarətdir (Fərhəngi-Moin).

[5] Qəzəl 5 , beyt 1

[6] Qəzəl 111, beyt 3

نبود نقش دو عالم که رنگ الفت بود
زمانه طرح محبت نه این زمان انداخت[1]

Beyt 4: **Canə dərdin, cismə peykanın rəvan etmişdi hökm,**
**Cism ilə can irtibatı olmadan möhkəm hənuz.**

Sözlük: Peykan – ox ucu, ox

**Nişanə** 1. "Dərd": Bu beytdə tələb biqərarlığından nişanədir.

**Nişanə** 2. "Peykan": Bu beytdə xarici vücudu daxili vücud tabeliyinə vadar etmiş ilahi qəmzələr qələbəsindən nişanədir.

**Anlam: Hələ, cisim ilə ruh birləşməmişdirlər ki, bir – bir tələb biqərarlığında ilahi əzəmətli etiraf etdilər.**

Beyt 5: **Əşk sərf eylər fələkdən kam hasil qılmağa,**
**Bu gühər qədrini bilməz, dideyi – pürqəm hənuz.**

Sözlük: Əşk – göz yaşı, dideyi pürqəm = yaş tökən göz

**Nişanə** 1. "Əşk": Bu beytdə ürək duruldan, yaxud insanı ilahi müşahidəyə nail edən vasitədən nişanədir.

**Nişanə** 2. "Fələkdən kam hasil qılmaq":

A: Səmavi nemətləri aşağı endirmək, yaxud yer sakinliyində göy dövlətindən bəhrələnmək, ya da hiyləgər dünya əngəllərini məğlub etməkdən nişanədir.

B: Məhəbbət ünvanlı mərtəbədə ilahi parlamalara cəhdsiz nail olmaq nişanəsidir.

**Anlam: Bəşəri vücudda, ilahi cilalar təzahür etdirməyə qadir vasitə, hiyləgər ruzgara və ya maddi küdurətlərə qələbə çalmış göz yaşından ibarətdir. Beləliklə, göz, bu iqtidarlı vasitə qədrini bilməlidir.**

Beyt 6: **Pərdeyi – çeşmim məqam etmişdi bir tərsabeçə,**
**Olmadan Məhdi – Məsiha daməni – Məryəm hənuz.**

Sözlük: Çeşm – göz; Tərsabeçə – tərsa balası = məsihi balası; Məhdi – Məsiha = İsa beşiyi; Damən – ətək

**Nişanə** 1. "Pərdeyi-çeşm": Şühud (müşahidə) nailiyyətinə

---

[1] Müəllif bu beyti, "Ta Qafe-əndişe" kitabının birinci cildində şərh etmişdir.

hazırlaşmış daxili vücud vəziyyətindən nişanədir.

**Nişanə** 2: “Tərsabeçə”: Ruh aləmindən nazil olmuş məxsus dərmandan, yaxud qəlbə, həm də cana qələbə çalmaqla, onları kəsrət maneələrindən xilas etmiş özəl ehsandan ibarətdir.[1]

**Anlam: Mən ilahi özəl cazibələr ilə sərxoş olan çağlarda hələ Məryəm oğlu İsa dünyaya göz açmamışdı.**

Beyt 7: **Ey Füzuli, eylədi hər dərdə dərman ol təbib,**
**Bir mənim zəxmimdir ancaq bulmayan mərhəm hənuz.**

Sözlük: Zəxm – yara

**Nişanə** 1. “Təbib”: Bu beytdə ülvi kamallar zirvəsinə yüksəlmiş mürşid həzrətindən ibarətdir.

**Nişanə** 2. “Zəxm, dərd”: Şəxsi vücud və yaxud dünyəvi həyat ilə mübarizə edərkən aşiqi qurbanlıq məqamına hazırlayan ətəşdən ibarətdir.

**Anlam: Həzrət mürşid, bütün eşq tələbələrini feyziyab edərkən razılaşdırdı. Ancaq hələ də ətəş vadilərində sərgərdan dolanan şikayətli tələbə yalnız mənəm.**

**Qeyd:** *Razılıq dayanmaq əlaməti olduğundan Füzuli dayanmaz seyr və mərifətini bildirmək istəyir.*

---

[1] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

## Q Ə Z Ə L 113

**(1) Qəmzə peykanin gözün mən mübtəladən saxlamaz,**
**Sərf edər əhli-kərəm nəqdin, gədadən saxlamaz.**

**(2) Dil nədir yanımda, çün qılmaz məni qəmdən xilas,**
**Çəkmən ol tə`viz barin kim, bəladan saxlamaz.**

**(3) Canə cismim ol xədəngi-qəmzədən olmaz pənah,**
**Hiç covşən kimsəni tiri-qəzadan saxlamaz.**

**(4) Eşqdən bir dəm, təni-suzani, dur etməz fələk**
**Vəh necə fanusdur şəm`i havadan saxlamaz.**

**(5) Aləmi şeyda qılar, gər olsa həm gözdən nihan,**
**Hər pərivəş kim, səri-zülfün səbadan saxlamaz.**

**(6) Eylərəm bixud fəğan gördükcə kuyun itlərin,**
**Aşina, dərdi-nihanın aşinadan saxlamaz.**

**(7) Bisəbəb sanman Füzulinin məlamət çəkdigin,**
**Bixəbərdir, məşrəbin əhli-riyadan saxlamaz.**

Beyt 1: **Qəmzə peykanin gözün mən mübtəladən saxlamaz,**
**Sərf edər əhli-kərəm nəqdin, gədadən saxlamaz.**

Sözlük: Peykan – ox ucu = süngü

**Nişanə** 1. “Qəmzə peykanı”: Şühud günəşinin, aşiq qəlbini söküb – tikməsindən, çıxma – batmasından ibarətdir.[1]

**Nişanə** 2. “Göz”: İlahi təsiri əks etdirmiş istiarədən ibarətdir.

**Nişanə** 3. “Mübtəla”: Bu beytdə istedadını kamilləşdirmək məqsədilə müxtəlif sınaqlara çəkilmiş aşiqdən ibarətdir.

**Anlam: Ey uca Allah, yoxsula – dilənçiyə əl tutmaq kərəm əhlinin təbii rəftarı olduğundan, qan tökən qəmzələr ilə qəlbimi yad etməyin təbii lütfünüzdən ibarətdir.**

**Qeyd** 1: *Bu beyt zahirdə şikayətlənməkdən söz açsa da, həqiqətdə minnətdarlıq etmək istəyidir.*

**Qeyd** 2: *Nəqd yaxşını pisdən ayırmaq mənasında eyham etməklə qəlbi sıxcalayıb safa çıxaran qəmzələrə təşəkkür etmək istəyir.*

**Qeyd** 3: *Gəda kəlməsi, irfani mənasına, yəni ətəşi – tələbi dəmbədəm əlavə olmuş aşiq halına, beləliklə, onun istedadlı – mərifətli olduğuna da işarə etmək istəyir.*

Beyt 2: **Dil nədir yanımda, çün qılmaz məni qəmdən xilas,**
**Çəkmən ol tə`viz barin kim bəladan saxlamaz.**

Sözlük: Təviz – pənahında saxlamaq = göz dəymək bəlasını dəf etmək məqsədilə boyuna ya da qola bağlanılan yazılı dua , bar =yük

**Nişanə** 1. “Dil”: Bu beytdə ilahi sirrlər xəzinəsi olmaq istedadını mükəmməl surətdə hazırlaya bilməyən qəlbdən nişanədir.[2]

**Nişanə** 2. “Qəmdən xilas olmaq”: Bu beytdə qəbzsiz bəst və ya daimi şühud təsəvvüründən ibarətdir.

**Qeyd:** *Həqiqi hissiyyata malik olmuş ürək uca Allah mənzili olduğundan duaların qəbulluq mərkəzində hesab olunur.*

**Anlam: Şair bu beytdə öz istedadsız qəlbini məzəmmət etməklə qəmzə peykanı ilə cəzalanmağını təsdiq etmək istəyir.**

Beyt 3: **Canə cismim ol xədəngi-qəmzədən olmaz pənah,**

---

[1] Qəzəl 12, beyt 6
[2] Qəzəl 13, beyt 1

**Hiç covşən kimsəni tiri-qəzadən saxlamaz.**

Sözlük: Xədəng – ox ucu = düz hədəfə dəyən ox; Covşən = halqa-halqa dəmirdən toxunmuş zirehli geyim

**Nişanə** 1. “Cism”: Bu beytdə fiziki mahiyyət xıltından, yaxud zavala uğramış maddi natəvan vücuddan ibarətdir.

**Nişanə** 2. “Xədəng”: Bax: 1 – ci beyt, “qəmzə peykanı”

**Anlam: Alın yazısını, yaxud ilahi hökmü, ehtiyatkarlığını (covşən) dəyişdirmək, ya da mənəvi qəmzələr önündə özünün fiziki mahiyyəti və dünyəvi səbəbləri ilə müqavimət etmək batil bir xəyalpərvərlikdən ibarətdir.**

Beyt 4: **Eşqdən bir dəm, təni-suzani, dur etməz fələk**
**Vəh necə fanusdur şəm`i havadan saxlamaz.**

Sözlük: Suzan – yanan; Dur = uzaq; Vəh = ba = bah; Şəm – şam

**Anlam: Şamı əhatələndirmiş çıraq kimi vücudumu hasarlayan asisman, eşqə bağlı atəşli hava nüfuzunu dayandırmaqdan, nəhayət natəvan vücudumu oddan kənar saxlamaqdan acizdir.**

**Qeyd** 1: “*Dur” sözü mühasirə və mühafizə mənasını daşıyan, dövr kəlməsində eyham edir.*

**Qeyd** 2: “*Fələk” sözü, həqiqi aşiqin səma kimi uca məqamdan nazil olmasına eyham edir.*

Beyt 5: **Aləmi şeyda qılar, gər olsa həm gözdən nihan**
**Hər pərivəş kim, səri-zülfün səbadan saxlamaz.**

Sözlük: Şeyda – divanə = məcnun = aşiq = heyran; Nihan – gizli; Pərivəş – pəri çöhrə = pəri sima = gözəl; Səri-zülf – zülf ucu

**Nişanə** 1. “Şeyda”: A: Şeyda İlahi cazibələrə nail olmuş aşiqdən ibarətdir.

B: Şeyda şiddətli eşq coşqunluğunda öz maddi vücudunu yaddan çıxaran aşiqdən ibarətdir.

**Nişanə** 2. “Pərivəş”: Bəşəri camalda ilahi cəlalər əks etdirmiş gözəldən, yaxud həzrət mürşiddən, ya da digər mənəvi vasitədən ibarətdir.

**Nişanə** 3. “Səri-zülf”: Bu beytdə aşiqi bəşəri səviyyədən İlahi mərtə-

bəyə yüksəldən, yaradıcılıq nöqtəsinə bağlı cilalar zühurundan nişanədir.[1]

**Nişanə** 4. “Səba”: Bu beytdə ruhani rayihə bağışlayan vasitədən ibarətdir.

**Anlam: Bəşəri mövqedə ilahi cilalar əks etdirmiş vasitə, özü qayib olsa da, mənəvi rayihəsi, aşiqi şeyda qılmağa kifayətlidir.**

Beyt 6: **Eylərəm bixud fəğan gördükcə kuyun itlərin**
**Aşina, dərdi nihanın aşinadan saxlamaz.**

Sözlük: Bixod – yersiz

**Nişanə** 1. “Fəqan”: Gizli əhvali-ruhiyyəni aşkara çıxaran nalə nişanəsirdir.

**Nişanə** 2. “İt”: Nəfs zəlilliyini, həm də öz həqirliyini Allah-taala hüzurunda etiraf etmiş aşiqdir.

**Nişanə** 3. “Aşina”: Bu beytdə ilahi ərəfədə öz həqir vücuduna biganə olmağa çalışan aşiqdir.

**Anlam: Həqir bir aşiqin halı digər həqir aşiqə məlum olduğundan, məhbub ərəfəsində fəqan etməyim daha yersizdir.**

Beyt 7: **Bisəbəb sanman Füzulinin məlamət çəkdigin,**
**Bixəbərdir, məşrəbin əhli-riyadan saxlamaz.**

Sözlük: Bisəbəb – səbəbsiz; Bixəbər – xəbərsiz; Məşrəb – dini və fəlsəfi yol = məslək

**Anlam: “Aşiq baş verər – sirr verməz” sözü müqəddəs qanun olduğundan, Füzuli eşq sirrini riyakar camaat içində aşkara çıxaran nalələrinə görə (fəqan) sərkilər ilə cəzalanmalıdır.**

**Qeyd** 1: *Riya əhli, mənəvi həqiqətləri dünyəvi mərtəbələrə fəda etmiş şöhrətbaz cəmaətdən ibarətdir.*

**Qeyd** 2: *Mənsur Həllac kimi aşiqlərin dar ağacına baş qoymaq məcburiyyətini dəlilləşdirən, onların “Ənəlhəq” kimi şəth demək*[2]*, yaxud sirr açmasından ibarətdir. Bir sıra aşiqlərin axirətdə uca Allah hüzuruna nail olmaqları qəti olsa da, dünyada şəth demək günahı ilə cəzalanmaqları da şəridir. Elə buna görə də Hafiz buyurmuşdur:*

گفت آن یار کزوگشت  سردار بلند          جرمش این بودکه اسرار هویدا می کرد

[1] Qəzəl 12, beyt 2
[2] Qəzəl 24, beyt 1

## Q Ə Z Ə L 114

**(1) Razi-eşqin saxlaram eldən nihan, ey sərvinaz,**
**Getsə başım şəm tək, mümkün degil ifşayi – raz.**

**(2) Xublər mehrabi – əbrusinə meyl etməz fəqih,**
**Ölsə kafərdir, müsəlmanlar, ona qılmın nəmaz.**

**(3) Kimsə ol bədxuyə izhar edə bilməz halımı,**
**Ey sürudi – nalə, Tanrıçün, sən olgil çarəsaz.**

**(4) Qalibim görmüş, tuhi, tökmək dilər bir tazə ruh,**
**Bərqi – ahim kim, gələn peykanına vermiş güdaz.**

**(5) Mən xud öldüm, ey turabımdan olan sağər, müdam**
**Rindlər bəzmin gəzib, bir – bir yetir məndən niyaz.**

**(6) Xub surətlərdən, ey naseh, məni mən etmə kim,**
**Pərtövi - ənvari – xurşidi – həqiqətdir məcaz.**

**(7) Ey Füzuli, qalmışam heyrətdə, bilmən neyləyim,**
**Dövr – zalim, bəxt – nafərman, tələb – çox, ömr – az.**

Beyt 1: **Razi-eşqin saxlaram eldən nihan, ey sərvinaz,**
**Getsə başım şəm tək, mümkün degil ifşayi – raz.**

Sözlük: Raz – sirr; Nihan – gizli; İfşayi-raz – sirr açmaq

**Nişanə** 1. "Razi-eşq": A: Bəşəri şüura sığmaz ilahi əhval-ruhiyyədən ibarətdir.

B: İrfani tərbiyə vasitəsilə maddi dünyadan qopub – qırılma və mənəvi atmosferdə qanad açmaqdan ibarətdir.

C: Ürək burunduran İlahi eşqdən ibarətdir.

D: Keçmişdən, həm də gələcəkdən, yaxud zaman işlərindən, beləliklə, ağır zəhmli bir hicabdan nicat verən sözə - yazıya sığmaz ilahi özəl rəhmətdən ibarətdir.[1]

**Nişanə** 2. "El": Bu beytdə əql ünvanlı fiziki yaşayış vasitəsi tabeliyində olan adamlardan ibarətdir.

**Nişanə** 3. "Sərvinaz": Bu beytdə ibadət əzəmətini sübut edən ilahi cilvələr uzantısından ibarətdir.

**Nişanə** 4. " Şəm": Bu beytdə ürəyi xalisləşdirən "nari-məhəbbət" nəaliyyətinə işarə edən nişanədir.

**Nişanə** 5. "İfşayi-raz": İlahi rəhmətlər qarşısında özünü itirmiş aşiqin "Şəth" deməyindən ibarətdir.[2]

**Qeyd:** *"Şibli"*[3] *məhrəm olduğu uca Allaha "Nədən Mənsur Həllac kimi düzgün aşiqinizi*[4] *aradan qaldırdınız" sualı barədə belə eşitdi ki: "Biz ona saya gəlməz sirrlərimizdən birini açdıq, lakin naməhrəm şəxslərə, yaxud əql tabelərinə sirr açmağına "Ənəlhəq" onu belə cəzalandırdıq.*[5]*"*

**Anlam: Ey mütəmadi cilvələr ilə qəlbimi "bəst"ləşdirmiş mehriban məbud, "aşiq baş verər, sirr verməz" sözünü müqəddəs qanun tək icra etməyə hazırlaşmışam.**

**Qeyd** 1: *Bu anlam aşiqin istedadlı olduğuna da işarə edir.*

**Qeyd** 2: *Gah öz istedadsızlığından üzr istəmək, gah da istedadlı olması ilə fəxr etmək, haldan-hala düşmüş aşiqin dəlilləşmiş rəftarından ibarətdir.*

---

[1] Qəzəl 1 , beyt 7 (haşiyə)
[2] Qəzəl 24, beyt 1
[3] III – IV əsrlərdə yaşamış məşhur bir sufi arif (hicri tarixlə - red.)
[4] Qəzəl 113 , beyt 7
[5] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

Beyt 2: **Xublar mehrabi-əbrusinə meyl etməz fəqih,**
**Ölsə kafərdir, müsəlmanlar, ona qılmın nəmaz.**

Sözlük: Mehrab – imam camaatın məsciddə namaza durduğu yer = məclisin yuxarı başı; Əbru – qaş; Fəqih = alim = şəri hökmlərdən xəbərdar alim

**Nişanə** 1. “Xublar”: Bəşəri camalda ilahi hüsnlər əks etdirmiş məhbublardan ibarətdir.

**Nişanə** 2. “Mehrabi-əbru”: Fiziki mahiyyətə bağlı təcrübələri batil etmiş camali hüsn qələbəsindən nişanədir.

**Nişanə** 3. “Fəqih”: Bu beytdə “mütəzəhhid” ünvanilə tanınmış riyakar zahiddən ibarətdir.[1]

**Nişanə** 4. “Müsəlman”: Bu beytdə dini hökmlər batinindən xəbərdar mömindən, yaxud məcazi həyatına bağlı həvəslərini tərk edərək, zəlil nəfsini ayaq altına alıb – öldürmüş insandan ibarətdir.

Buna görə də “الاسلام ان یموت عنک نفسک”[2] (“Sənin iti nəfsini öldürən həqiqətən İslamdır”) demişlər.

**Anlam: Dini hökmlər zahirinə qənaətlənmiş zahid cənazəsinin namaz mərasimində batinşünas aşiqlərin iştirakı heç də caiz deyil.**

Beyt 3: **Kimsə ol bədxuyə izhar edə bilməz halımı,**
**Ey sürudi-nalə, Tanrıçün, sən olgil çarəsaz.**[3]

Sözlük: Sürud – nəğmə = həyəcanlı avaz = həmasi, milli və vətən şeiri; Sürudi-nalə – nalə nəğməsi; Çarəsaz – çarə qılan, əlac edən

**Nişanə** 1. “Bədxu”: Aşiqi yetkinləşdirən cövrü cəfanı, yaxud tərbiyəvi sınaqları təlqin edən nişanədən ibarətdir.

**Qeyd** 1: *Bir çox hal baş verə bilir ki, aşiq həyəcan və hicran məğlubiyyətində bir məcnun kimi həzrət mürşüdün özünü, hətta mütəal Allaha, rəhmsiz, bədxu və digər bəşəri sifətlər ilə xitab etməklə özgəliyi və etirazlarını bildirmək istəyir.*

**Qeyd** 2: *Etiraz və şikayət, mütəal məhbubun iqtidarını kinayəli təsdiqetməkdən nişanədir.*[4]

---

[1] Qəzəl 9 , beyt 2
[2] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی
[3] Bu misra Füzuli “Divan”ının Bakı nəşrində də naqisdir – red.
[4] Qəzəl 24, beyt 1

**Nişanə** 2. “Surudi-nalə”: Həm hicran, həm də vüsal vəziyyətində məmlük və möhtac aşiqin qəlbi etirazından, yaxud özəl münacatından ibarətdir.

**Qeyd:** *“Bədxu” nişanəsi kinayə etdiyi fəqr və qəzəb bəlalərindən qurtarmağın yalnız münacat ilə mümkün olduğu üçün demişlər ki:*

“ انّ الله سبحانه سطوت و نقمات فاذا انزلت بكم فادفعوها بالدعاء فانه لا يدفع البلاء الا الدعاء” *(Pak olan Allahın bəla ünvanlı cəzalandıran fəqrləri başınıza nazil olmuş çağlarda onları dua vasitəsilə dəf etməyə çalışın, çünki bəlalər dəfi duadan başqa bir vasitə ilə mümkünsüzdür.)*[1]

**Anlam: Ey həsrətlər atəşində yanan qəlbim, qəbzlər həbsindən xilas olmaq yalnış sən etdiyin münacat ilə mümkündür.**

Beyt 4: **Qalibim görmüş tuhi tökmək dilər bir tazə ruh,**
**Bərqi – ahim kim, gələn peykanına vermiş güdaz.**

Sözlük: Tuhi – boş; Peykan – ox ucu; Güdaz – hərarət ilə ərimək = filizi əritmək = sısqalmaq

**Nişanə** 1. “Qalibim görmüş tuhi”: Tuhi qalib mənəvi sifətlər icad etmək eşqilə dünyəvi həyat ilgilərindən boşalmış vücuddan ibarətdir.

**Qeyd** 1: *Budda vəsf etdiyi “şunya” ünvanlı irfani mərtəbəyə yüksəlmək, yaxud ülvi məqsədə çatmaq yalnız “tuhi” vücud ilə şərtlənir.*[2]

**Qeyd** 2: *Boş (vücud) macal verir ki, ilahilik quşu batinə yol salsın.*[3]

**Qeyd** 3: *Vücud qalibi bəşəri sifətlərdən boşalarkən ilahi sifətlər ilə dolmağa başlayır. Çünki maddi yaranışda boş bir həcm heç vaxt yaranmayır.*

**Qeyd** 4: *Mövləvi “زندگانی آشتی ضدهاست”*[4] *(həyat ziddiyyətlərin barışmasıdır) buyurduğu kimi hər bir şeyin varlıq əsası öz ziddiyyətilə bağlı olduğundan, doluluq boşluq ilə mənalanır.*

**Nişanə** 2. “Tazə ruh”: Cismani həyat bağışlayan “heyvani” ruhdan boşalmış vücuda daxil olmuş lətif, həqiqi və müdrik olan “insani ruh”dan ibarətdir.[5]

**Nişanə** 3. “Bərqi-ah”: Bu beytdə aşiqi bürümüş mənəvi hərarətdən,

---

[1] Əli Səadətpərvər, Cımali-afitab, cild 3, s. 192
[2] Qəzəl 65, beyt 1
[3] اشو، خلاقیت، ترجمه مرجان فرجی، ص 59
[4] Mövləvi, Məsnəvi, dəftər 1, beyt 1324
[5] Qəzəl 112, beyt 2

yaxud “cilvə ətəşi”[1] yaradan atəşdən ibarətdir.

**Nişanə** 4. “Peykan”: Bu beytdə fiziki mahiyyəti məğlub etmiş İlahi qəmzələr iqtidarından nişanədir.

**Nişanə** 5. “Güdaz vermək”: Zahiri və batini vücudu əhatələndirmiş çətinliklərlə ortaqlıq nişanəsidir.

**Qeyd:** *Mənəvi yüksəlişlər nailiyyəti zəhmli çətinliklərlə bağlı olduğundan demişlər ki: “ان اله انِّما يحب المنازل الشريقه لعبده باحتمال المكاره” (Həqiqətən hikmət sahibi olan Allah, çətinliklərə dözmüş bəndələrini, ülvi mərtəbələr nailiyyətilə mükafatlandırır.)*[2]

**Anlam: Ey mehriban Allah, müxtəlif bəlaları alqışlayaraq heyvani ruhumu məğlub etdiyimdən “insani ruh” tələb edirəm.**

Beyt 5: **Mən xud öldüm, ey turabımdan olan sağər, müdam**
**Rindlər bəzmin gəzib, bir – bir yetir məndən niyaz.**

Sözlük: Turab – torpaq = türbət; Sağər – cam = qədəh = şərab piyaləsi; müdam – həmişə = daim; Şərab – ardı-arası kəsilməyən yağış; Rind – zirək = batini zahirindən gözəl = ictimai adabı tərk etmiş; Bəzm = ziyafət məclisi = xeymə

**Nişanə** 1. “Mən xud öldüm”:

A: Maddi, yaxud zahiri vücuddan xəbərsiz olmağa işarə edir.

B: Heyvani ruhdan ayrılmağa eyham edir.

**Nişanə** 2. “Sağər”: A: Hafiz “مادرپياله عكس رخ يار ديدهايم”[3] (Biz piyalədə yəni həzrət mürşidin qəlbi cəlalərini əks etdirmiş cəmalində, ya da öz qəlbimizdə ilahi cilvələr görmüşük) buyurduğu kimi ilahi camal nurunu əks etdirmiş səbəbdən nişanədir.

B: Sağər, bu beytdə, maddi ilgilərlə yaşamağa müraciət etməyi yox dərəcədə təlqin etmək istəyir.

**Nişanə** 3. “Rind”: A: Bu beytdə iç vücudunu sağ-salamat saxlayıb, çöl vücudunu əql əhlinin nəzəricə ləkələndirmiş arifdir.

B: Rind dünyəviliyini öldürüb, mənəviliyini dirildən mürşiddir.

**Anlam: Ey torpağımdan düzəlmiş sağər (ey ikinci həyatım, yaxud ey azad ruhum, ya da ey zavalsız qəlbim), mənəvi əhvali-**

[1] Qəzəl 111, beyt 3
[2] Əllamə Məhəmməd Baqir Məclisi, Biharül-ənvar, s.90
[3] Müəllif bu beyti “Ta Qafe-əndişe” kitabının 1-ci cildində şərh etmişdir.

**ruhiyyə nailiyyətində dünyaya sığmaz rindləri qəbzsiz bəst həsrətilə sürdüyüm həyatımdan xəbərdar et.**

**Qeyd** 1: *Düzgün aşiq qəbir içində, yaxud iki dünya arasındakı "bərzəx" adlı aləmdə dünyəvi ömür möhlətində, bəstsiz sovuşdurduğu xəsarətini xatırlayaraq təəssüflənməlidir.*

**Qeyd** 2: *Beyt, rindlər nail olmuş əhval – ruhiyyəyə davamsız eyham etmək istəyir.*

Beyt 6: **Xub surətlərdən, ey naseh, məni mən etmə kim,**
**Pərtövi - ənvari – xurşidi – həqiqətdir məcaz.**

Sözlük: Naseh = nəsihətçi, mən` etmək = mane olmaq, ənvar = nurlar = ziyalar; Xurşid – günəş

**Nişanə** 1. "Xub surətlər": Bu beytdə bəşəri simada ilahi cilvələr əks etdirmiş gözəllərdir.

**Nişanə** 2. "Naseh": Naseh isə zahid kimi dünyəvi sığınacaq və yaşayış məqsədilə başda yerləşmiş məhdud əqli, namütənahi kamal nailiyyətini kifayətli təsəvvür etmiş nəsihətçidən ibarətdir.

**Nişanə** 3. "Həqiqət": A: İlahi vüsal sahəsində daimi iqamət etməkdən nişanədir.

B: Vüsal, bəşəri sifətləri məhv edən, ilahi sifətlər qələbəsindən ibarətdir.[1]

C: Həqiqət dini hökmlərin ruhundan ibarətdir.

D: Həqiqət kəsrətləri aradan qaldıran vəhdət nurudur.[2]

**Qeyd** 1: *Həqiqətin ilk mərtəbəsi şühud məqamından, yaxud şeyx vücudundan ibarətdir.*

**Qeyd** 2: *Həqiqətin son mərtəbəsi ilahi parlamalar içində fani olmaqdan nişanədir.*

**Anlam: İlahi nur, yaxud "ənvari-xurşid" gah həzrət mürşid vücudunu, gah da bir bəşəri gözəl simanı güzgüyə şevirərək, özünü onlarda təzahür etdirir. Elə buna görə də Mövləvi zənn edir ki, saf qəlbli bir aşiq yer kürəsində yaşayan gözəl bir insan simasından hüsnlər qarşısında fədakarlığı və özünü unutmağı məşq edib öyrənərkən, özünü sevimli Allahın şühud nurunda məhv etməyə hazırlayır.**

---

[1] Doktor Qasım Qəni, Tarixi-təsəvvüf dər İslam, cild 2 , s. 644

[2] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

ای بسا کس را که صورت راه زد
قصد صورت کردوبرالله زد[1]

Elə buna görə də pak və düzgün eşq məcazi və dünyəvi səviyyədə müqəddəsdir.

**Qeyd** 3: *İrfani rəhbərlər, xüsusilə, "نجم الدین کبرادان"[2] sonrakı əsrlərdə yaşamış iranlı ariflər məcazi aləmə biganə olmurlar. Bəlkə onların bəzisi "المجاز قنطره الحقیقه"[3] deməklə, təbii və cismani eşqi həqiqi və İlahi eşq tanışlığına müqəddimə bilmişlər.*

*"Cami" IX əsrdə yaşamış yazıçı, şair və arif pak olan məbudun mütləq camalını hissiləşdirmiş aşiqi kamil insan tanımış və bu barədə ulu mürşidlər təlimatını nəzərdən keçirmişdir.*[4]

Beyt 7**: Ey Füzuli, qalmışam heyrətdə, bilmən neyləyim,**
**Dövr – zalim, bəxt – nafərman, tələb – çox, ömr – az.**

Sözlük: Nafərman – əmrdən çıxmış

**Nişanə** 1. "Heyrət": Bu beytdə dünyəvi səbəblər acizliyini düşünərkən, onlardan əl üzmüş aşiqi "ikini mərifət"[5] nailiyyətinə hazırlayan haldan ibarətdir.[6]

**Qeyd** : *"... insanlar, peyğəmbərləri, nəhayət, ruzi verən mehriban iqtidarlı məbudu ilə düzgün tanış ola bilsələr, özlərini bu qədər səbəblərə - vasitələrə əsir etməzlər, əfsuslar olsun ki, insanların çoxu səbəbləri səbəbkar tanrıya şərik edərkən, səbəbsiz iqtidardan qəflətdə qalmışlar (və diqqət etməyirlər ki) peyğəmbərlərə möcüzə iqtidarını bağışlayan səbəbsiz mənalar tanışlığıdır.*

**Nişanə** 2. "Dövr zalim": Bu nişanə ictimai ədalətsizliklərə eyham edərkən maddi mövcudların hicab olduğunu təlqin etmək istəyir.

**Nişanə** 3. "Bəxt nafərman": Bu nişanə aşiqin öz vücudunu ən xətərnak bir hicab təlqin etmək istəyir. Elə buna görə də Hafiz "توخودحجاب خودی حافظ از میان برخیز"[7] buyurmuşdur.

**Nişanə** 4. "Tələb": uca Allahı tanıyıb – tapdıqdan sonra hasil olmuş ətəşdən və xahişdən ibarətdir. Deмək, tələb, aşiqi biqərarlıq səbəbilə

---

[1] Mövləvi, Məsnəvi, dəftər 2, beyt 1186
[2] 6-cı və 7-ci(q-h) əsrlərdə yaşamış məşhur arif Nəcməddin Kübradan
[3] Məcaz, həqiqət aləminə çatdıran yol, ya körpü
[4] Doktor Qasım Qəni, Tarixi təsəvvüf dər İslam, cild 2 , s. 575
[5] Qəzəl 28, beyt 7
[6] Qəzəl 28, beyt 7
[7] Müəllif bu beyti "Ta Qafe-əndişe" kitabının 3-cü cildində şərh etmişdir

ilahi məqsəd yoluna yönlədən nişanədir.[1]

**Qeyd** 1: *Tələb, bir məqsədin özündən, həm də ona çatdıran mərifətdən xəbərdarlıqla bağlı olduğundan yeddi vadili aşiqin[2] ilk vadisi olsa da, 7-ci vadiyə qədər, yaxud fəna ünvanlı daimi vüsal nailiyyətinə qədər aşiqdən ayrılmazdır. Beləliklə, aşiq dünyasını dəyişən ləhzəyə qədər, bəlkə də qiyamətə qədər, tələb halında olmalıdır.*

*Bunun üçün də Hafiz buyurur:*

دست از طلب ندارم، تا کام من براید

یاتن رسد به جانان یاجان زتن براید[3]

**Nişanə** 5. “Ömr -az”: Bu nişanə, öz həqirlik və bəndəlik yolunu düşünmüş aşiqin uca Allaha layiq xidmət etmək imkanını daha az, bəlkə də yox dərəcədə, təlqin etmək istəyir.

**Anlam: Ey Füzuli, həqir vücud və aciz səbəblər ilə ilahi məqsədə çatmaq mümkünsüz təsəvvürdür.**

---

[1] Qəzəl 32, beyt 7
[2] Şeyx Fəridəddin Əttar Nişaburi, “Məntiqət-teyr”
[3] Müəllif bu beyti "Ta qafe əndişe" kitabının 2 ci cildində şərh etmişdir.

## Q Ə Z Ə L 115

**(1) Fəğan kim, bağrımın ol lalərux qan olduğun bilməz,**
**Cigər pərkaləsində dağı – pünhan olduğun bilməz.**

**(2) Həbibim könlümü cəm eyləməz rüxsarı dövründə,**
**Məgər zülfü kimi halim pərişan olduğun bilməz?**

**(3) Qılır təqsir edib bir lütf hərdəm könlüm almaqdan,**
**Vəfa rəsmin sanır düşvar, asan olduğun bilməz.**

**(4) Gözəllər dövləti – vəslin bulub, məğrur olan aşiq**
**Nişati – vəsldə ənduhi – hicran olduğun bilməz.**

**(5) Dili sədparədən bidad kəsməz qəmzeyi – məstin,**
**Nə qafil padişahdır, mülk viran olduğun bilməz.**

**(6) Sanır zahid özün xali xəyalından, qələtdir bu,**
**Bu heyran olduğundandır ki, heyran olduğun bilməz.**

**(7) Füzuli xəstəyə düşmən sözilə dust cövr eylər,**
**Zəhi sadə, müariz qövlə böhtan olduğun bilməz.**

Beyt 1: **Fəğan kim, bağrımın ol laləruх qan olduğun bilməz,**
**Cigər pərkaləsində daği – pünhan olduğun bilməz.**

Sözlük: Pərkalə – yamaq = tikə - parə = hissə = dairə

**Nişanə** 1. “Fəğan”: Хarici aləmdə təzahür etdirilmiş daxili əhval – ruhiyyədən ibarətdir.

**Nişanə** 2. “Bağrı qan olmaq”: Fiziki əngəl mahiyyətini, yaxud mənəm-mənəmliyi batil etməklə, qurbanlıq məqamına hazırlaşmaqdan nişanədir.[1]

**Nişanə** 3. “Laləruх”: Parçalanmış cigəri dağlamaqla qurbanlıq məqamına hazırlayan gülgəz ziyalı məhbubdan ibarətdir.

**Nişanə** 4. “Bilməz”: Bu beytdə “istiğna” məqamlı məhbubun etinasızlığından, yaxud aşiqi mənlik afiyətindən mənfi sağlığında ayıran qəmzələrindən ibarətdir.[2]

**Anlam: Dağlanmış cigərim qurbanlıq nailiyyətinə kifayətsiz olduğundan, istiğna məramlı məhbub ürək münacatıma etinasızlıq edir.**

Beyt 2: **Həbibim könlümü cəm eyləməz rüxsarı dövründə,**
**Məgər zülfü kimi halim pərişan olduğun bilməz?**

Sözlük: ruxsar = sima = üz = camal

**Nişanə** 1. “Könül”: İlahi ilgilər ilə dolu, daxili vücuddur.

**Nişanə** 2. “Cəm”: Bu beytdə yaradıcı Allahın özəl ehsanından, yaxud öz aşiqini, yaranmışlarda əks etdirdiyi cilvələr ilə məşğul etməsindən nişanədir.

**Qeyd** 1: *Cəm ilahi lütflər – ehsanlar nəticəsindən ibarətdir*.

**Qeyd** 2: *Cəmin əksi yaxud “təfriqə” bəşəri əhval ilə ilahi vəzifə daşımaqdan (bəndəlik etmək) ibarətdir*.

**Qeyd** 3: *Təfriqəsiz salik bəndəlikdən uzaqdır.*

**Qeyd** 4: *Cəmsiz salik mərifətdən uzaqdır.*

**Qeyd** 5: *Təfriqə-iradənin əvvəli və cəm onun axırıdır*[3].

**Nişanə** 3. “Rüxsar”: Bu beytdə həqiqi camalın hicabsız zühurundan ibarətdir.

**Nişanə** 4: “Zülf”: Bu beytdə ilahi camal ətrafını almış kəsrətdən

---

[1] Qəzəl 2, beyt 4
[2] Qəzəl 30, beyt 3
[3] دکتر قاسم غنی ، "تاریخ تصوف در اسلام" ، ص457

ibarətdir[1].

**Nişanə** 5. “Pərişan”: Təfriqə mərhələsindən ibarətdir.

**Anlam: Həkim məhbub mənim hicabsız şühud yaxud kəsrətsiz müşahidə möhtaclığıma etinasızlıq edir.**

Beyt 3: **Qılır təqsir edib bir lütf hərdəm könlüm almaqdan,**
**Vəfa rəsmin sanır düşvar, asan olduğun bilməz.**

Sözlük: Təqsir – bilə - bilə müzayiqə etmək; Düşvar – çətin

**Nişanə** 1. “Təqsir qılmaq”: Uca Allahın tərbiyəvi tənbehinə istiarədir.

**Nişanə** 2. “Lütf”: Bu beytdə şühud uzantısından, yaxud daxili aləmdə nüfuz etmiş hüsndən ibarətdir.

**Nişanə** 3. “Vəfa”: Bu beytdə mehriban məbudun əzəli[2] ehsan və təvəccöhündən ibarətdir.

**Anlam: Həkim məhbub əgər mənə qarşı etinasızlıq etməsəydi, hicabsız şühuda nail olmağım daha asan olardı.**

**Qeyd** : *Bu anlam aşiqin istedadsızlığına da eyham edir.*

Beyt 4: **Gözəllər dövləti-vəslin bulub, məğrur olan aşiq**
**Nişati-vəsldə ənduhi-hicran olduğun bilməz.**

Sözlük: Vəsl – vüsal; Ənduh – qəm = əfsus = ürəyi tutan

**Nişanə** 1. “Könül”: Bəşəri camalda ilahi hüsnlər əks etdirmiş dilbərdən, yaxud həzrət mürşiddən, ya da digər ilahi vasitədən ibarətdir.

**Nişanə** 2. “Vəsl”: Məşuqla aşiq arasındakı yox dərəcəyə çatmış fasilədən ibarətdir.

**Nişanə** 3. “Məğrur”: Bu beytdə vüsal arxasındakı hicran qəmindən xəbərsiz sərxoş aşiqdən ibarətdir.

**Anlam: Dünyəvi ömür möhlətində hicransız vəsl mümkünsüzdür.**

Beyt 5: **Dili sədparədən bidad kəsməz qəmzeyi – məstin,**

---

[1] Qəzəl 2, beyt 2

[2] Əzəl Mütəal Məhbubun adlarından, yaxud sifətlərindən biridir. Başlanışı olmayana “əzəl” deyərlər:
Əzəl, ilahi feyzlərin davamlanma şərtidir.
Əzəl, irfan araşdırmalarından məlum olduğu kimi, maddi – müddətdən üstün bir məna yağdıran ilahi zühurlar başlanğıcıdır.

**Nə qafil padişahdır, mülk viran olduğun bilməz.**

Sözlük: Sədparə – yüz tikə

**Nişanə** 1. "Dili-sədparə": Qurbanlıq məqamına hazırlaşmaqdan nişanədir.

**Nişanə** 2. "Qəmzə bidadı": Aşiqi yetkinləşdirən tərbiyəvi sınaqlardan nişanədir.

**Qeyd** : *Bidad ürək münacatının ahəngdar olduğuna da eyham edir.*

**Nişanə** 3. "Qafil, bilməz": Qafil, həm də bilməz bu beytdə "təğafül" yerinə oturmuş bilərəkdən qəflət etmək, yaxud etinasızlıq göstərmək nişanəsidir.

**Qeyd** : *"Təğafül" kamala çatdırmaq məqsədilə sınaqlara çəkilmiş aşiqin nalələrini qulaq ardına vurmaqdan nişanədir.*

**Nişanə** 4.: "Padşah": Bu beytdə məmlük aşiqlərin maliki və ixtiyar sahibi olan iqtidarlı məhbubdan ibarətdir.

**Anlam: Ürək mülkünü viran etmək: A: İstedadsız aşiqi tənbeh və tərbiyə etməkdən nişanədir. B: İstedadlı aşiqi qurbanlıq məqamına nail etməkdən nişanədir.**

Beyt 6: **Sanır zahid özün xali xəyalından, qəlötdir bu,**
**Bu heyran olduğundandır ki, heyran olduğun bilməz.**

**Nişanə** 1. "Xəyal": Xəyal, bu beytdə:

A: Görünməz təcrid aləmindən rayihələnmək nişanəsidir.[1]

B: Bəşəri hiss ilə üzbəüz olmayan bir şeyin zehində peyda olmuş surətindən ibarətdir.

**Nişanə** 2. "Heyran": A: Birinci heyranlıq elm və istiqlal ilə mərifəti axtaran şəxsləri tənbeh etməkdən, yaxud mərifət dayandıran mənfi heyrətdən ibarətdir.

B: İkinci heyranlıq bəşəri əql və təcrübə acizliyini sübut etmiş fikri dayandıran müsbət sərgərdanlıqdan ibarətdir.[2]

**Anlam: Zahid isə aşiq kimi ilahi ehsanlar məmnunluğunda, həm də ilahi rayihələr heyranlığında ömür sürməklə məşğuldur. Ancaq o,:**

A: Mərifəti naqis olduğuna görə öz heyranlığından xəbərsizdir.

B: Məhdud olan əql və idrakı heyrət önündə karsız olduğundan öz

---

[1] Qəzəl 21, beyt 2
[2] Qəzəl 106, beyt 3

heyranlığını dərk etməkdən acizdir. Çünki o, heyrət halında olanda əql ilə düşünmək istəyir.

Beyt 7: **Füzuli xəstəyə düşmən sözilə dust cövr eylər,**
**Zəhi sadə, müariz qövlə böhtan olduğun bilməz.**

Sözlük: Zəhi – afərin = əfsus = ah; Müariz = müxalif = düşmən

**Anlam: Həzrəti – mürşid qəbzlər həbsində xəstələşmiş Füzulini xas təlimatından məhrum saxlamaqla zahid kimi düşmənin irad – etirazını dəlilləşdirir.**

**Qeyd** 1: *Xəstələnmək, qurbanlıq məqamına hazırlaşmağa, həmçinin, öz xüsusi istedadını mürşidə nişan verməyə də eyham edir.*

**Qeyd** 2: *Mürşüdə hətta mütəal məhbuba "sadə müariz" kimi ibarələrlə xitab etmək, yaxud küfr danışmaq, müsbət eyhamlı olmazsa, yalnız "şəth"ünvanıyla dəlilləşə bilir. Yəni, bir çox hal baş verə bilər ki, aşiq həyəcan, hicran, məcnunluq və məğlubiyyət vəziyyətində mürşidin özünə, hətta mütəal məhbuba giley və etiraz edər, ancaq məzlumluq məğlubiyyətində olduğuna görə cəzalanmaqdan azad olar. Ona görə ki, məzlumluq divanəlikdir və şəriət divanəni mühakimə etməyə hökm verməyir.*

## Q Ə Z Ə L 116

**(1) Könüldə min qəmim vardır ki, pünhan eyləmək olmaz,**
**Bu həm bir qəm ki, el tənindən əfqan eyləmək olmaz.**

**(2) Nə müşkül dərd olursa bulunur aləmdə dərmanı,**
**Nə müşkül dərd imiş eşqin ki, dərman eyləmək olmaz.**

**(3) Fəna mülkünə çox əzm etmə, ey dil, çəkmə zəhmət kim,**
**Bu tədbir ilə dəfi-dərdi-hicran eyləmək olmaz.**

**(4) Saqın, könlüm yıxarsan, pənddən dəm urma, ey naseh,**
**Həvayi-nəfs ilə bir mülkü viran eyləmək olmaz.**

**(5) Dəhanın üzrə ləlin istəmiş dil, dəfi müşküldür,**
**Görünməz hiç cürmü, yox yerə qan eyləmək olmaz.**

**(6) Dualar eylərəm, məndən yana bir dəm güzar etməz,**
**Nə çarə, sehrilə sərvi xuraman eyləmək olmaz.**

**(7) Füzuli, aləmi-qeyd içrəsən, dəm urma eşqindən,**
**Kəmali-cəhl ilə dəvayi-irfan eyləmək olmaz.**

Beyt 1: **Könüldə min qəmim vardır ki, pünhan eyləmək olmaz,**
**Bu həm bir qəm ki, el tənindən əfqan eyləmək olmaz.**

Sözlük: Əfğan – fəğan; Tən – tənə

**Nişanə** 1. “Könül”: Ürək adlı ilahi sirrlər xəzinəsindən, yaxud əqldən üstün mənaları idrak edən daxili vücuddan nişanədir.

**Nişanə** 2. “Min”: Bir çox ədəbi əsərlərdə qeyd olunmuş tam ədədlər, öz həqiqi mənalarından sovuşub çoxluq ya digər məcazi mənalara eyham edirlər.

**Nişanə** 3. “Qəm”: Qəm bu beytdə:

A: “Tələb qürbəti” ünvanlı mərhələdə vəhdət mülkünə, yaxud uca Allah hüzuruna qəribsəmək qəmindən ibarətdir.

B: Bəstlər arxasındakı qəbzlər çətinliyindən ibarətdir.

**Nişanə** 4. “El”: Ağıl və təcrübələrdən üstün mərtəbələrdən xəbərsiz caamatdan ibarətdir.

**Nişanə** 5. “Tən”: “Təndən fəğan etmək olmaz” ifadəsi dil yarasının dilə gəlməz vəsfindən ibarətdir.

**Anlam: Atəşi ipək dəsmalda məxfi saxlamaq[1] kimi eşqi də ürəkdə gizlədib fəryad etməmək müşküldür. Eyni halda eşqdən xəbərsiz cəmaət sərkilərini qəbul etmək də başqa bir müşküldür.**

Beyt 2: **Nə müşkül dərd olursa bulunur aləmdə dərmanı,**
**Nə müşkül dərd imiş eşqin ki, dərman eyləmək olmaz.**

**Nişanə** 1. “Dərd”:

A: Dərd – günahlardan təmizə çıxaran yaxınlıq dərdindən ibarətdir.

B: Dərd acılıqdan asılı şirinlikdən ibarətdir.

**Qeyd** 1: *Yaxınlıq, yaxud qürb vasitəsilə dərdli ürəyə toxtaqlıq vermək mümkünsüzdür. Əksinə qürb yeni məərifətlər bağışlayan vasitə olduğundan, tələb və ətəş dərdini əlvaə etməlidir.*

**Qeyd** 2: *Uzaqlıq dərdi istedatsızlıq və həqirlik dərdindən ibarətdir.*

**Anlam: Dünyəvi ömür sahəsində, məcazi ehtiyaclardan qurtarmaq mümkün olsa da mənəvi hacətlərdən qurtarmaq çətindir.**

---

[1] در سوخته پنهان نتوان داشتن آتش
ما هیچ نگفتیم و حکایت بدر افتاد
"سعدی"

Beyt 3: **Fəna mülkünə çox əzm etmə, ey dil, çəkmə zəhmət kim,**
**Bu tədbir ilə dəfi-dərdi-hicran eyləmək olmaz.**

**Nişanə** 1. “Fəna”: Bu beytdə:

A: Nəhayətə çatmış fədakarlıqdan nişanədir.

B: Nəhayətə çatmış ilahi seyrdən nişanədir.

C: Qurbanlıq ərəfəsindən ibarətdir.

D: Bəşəri şüur məğlubiyyətindən nişanədir.

**Nişanə** 2. “Dərdi-hicran”: Bu beytdə:

A: Ayrılıq dərdi yox, bəlkə də ətəş dərdidir.

B: Vəzifə və qabiliyyət dərdidir.

**Qeyd** 1: *Hicranın bir mərtəbəsində niyaz ilə istena arasında fasilə olduğundan, mehriban məhbub hüzuru yaxud vüsal vəziyyəti, ürək ətəşini əlavə etməklə niyaz dərdi, yaxud hicran qəmi də ona əlavə olunur.*

**Qeyd** 2: *Hicran fədakarlıq, yaxud fanilik, “qürb” məqamının əsas şərti olduğuna görə ixlas – iradət kimi qabiliyyətlər ilə ölçülür. Beləliklə, eşq mədəniyyətində hər candan keçmiş insana, fədakar, yaxud qurban demək olmaz. Yersiz deyil ki, qabiliyyət ələ gətirməkdən əvvəl “qətl” ünvanlı qurbanlığa boyun əyən fədakar bir aşiq məşuq hüzurunda mühakiməyə məruz qalmalıdır. Elə bunun üçün də Hafiz buyurmuş:* عجب واقعه ای و غریب حادثه ایست

انا اصطبرت قتیل و قاتلی شاکی[1]

**Qeyd** 3: *Aşiq vüsal mərtəbəsində, yaxud məşuq hüzurunda öz həqirliyini aydın düşünərkən:*

*A: Mərtəbə fasiləsi ünvanlı xüsusi hicran dərdindən xəbərdar olur.*

*B: Heç bir qulluğu məşuqa layiq görməyib, xidmətçilik acizliyindən, beləliklə də mümkünsüz vəzifə daşımaqdan xəcalət çəkib, həzrəti Sədi kimi deyir:*

من چه در پای تو ریزم که پسند تو بود
سروجان را نتوان گفت که مقداری هست

**Anlam: Fəna nailiyyətinə hazırlaşmaqla ətəş dərdinə dərman etmək olmaz.**

Beyt 4: **Saqın, könlüm yıxarsan, pənddən dəm urma, ey naseh,**
**Həvayi-nəfs ilə bir mülkü viran eyləmək olmaz.**

Sözlük: Pənd – öyüd = nəsihət; Həvayi nəfs – cismani meyllər

---

[1] Qəribə burasıdır ki, məşuq mənim qanımı tökə - tökə məndən şikayətlənməkdədir.

**Nişanə** 1. “Könül”: Bax beyt 1, nişanə 1

**Nişanə** 2. “Naseh”: Dünyəvi məişət məqsədilə başda yerləşmiş məhdud əqli hələ dolğunlaşmamış kamal nailiyyətini kafi təsəvvür etmiş nəsihətçidən ibarətdir.

**Nişanə** 3. “Nəfs”: Nəfs, bu beytdə:

A: Bədən tərkibinə daxil olmuş “heyvani ruh” adlı lətafətli cövhərdən ibarətdir.

B: Bədəndə yerləşmiş yaramaz əxlaq mərkəzindən ibarətdir.

**Qeyd:** *Nəfsin aram olmağı yalnız batil işlərlə məşğul olmaqla mümkündür.*[1]

**Anlam: Ey naseh, iqtidar nəfs, yaxud dünyəvi meyllər mərkəzi, çox mülkləri viran etməyə qadirdir, lakin könül ünvanlı ilahi sirlər xəzinəsini dağıtmaqdan acizdir.**

**Qeyd** 1: *Aşiq dünyəvi şəxsiyyətini qorumaqla mənəvi şəxsiyyətini unutmaz.*

**Qeyd** 2: *Könül mülkünü həvayi nəfs ilə viran etmək heç də yararlı deyil.*

Beyt 5: **Dəhanın üzrə təlin istəmiş dil, dəfi müşküldür,**
**Görünməz hiç cürmü, yox yerə qan eyləmək olmaz.**

Sözlük: Dəhan – ağız

**Nişanə** 1. “Dəhan”: Bəşəri şüurda sığmaz “mütəkəllim” ünvanlı ilahi özəl sifətdən, yaxud görünməz aləm görünüşündən istiarədir.

**Nişanə** 2. “Ləl”: Ulu Allahın “rəhmani nəfs” ünvanlı yeni həyat (mənəvi həyat) bağışlayan ilhamlarından nişanədir.[2]

**Nişanə** 3. “Dil”: Bu beytdə könül ünvanlı ilahi xəzinədən ibarətdir.

**Anlam: Dəhan və ya ləl mərtəbəsindən bəhrələnmək, sağ – salamat saxlanmış batini vücudun, yaxud könül xəzinəsinin “ələst”[3] aləmindəki vədə verilmiş ilahi nəsibi olduğundan, ondan cəsarət tələb etmək heç də günah deyil, bəlkə də savaba layiq bir tələbdir. Çünki tələb cəsarəti ilahi vədələri təsdiq etmək nişanəsidir[4]. Elə buna görə də Hafiz demişdir:**

---

[1] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی
[2] Qəzəl 36, beyt 3.
[3] Qəzəl 19, beyt 4
[4] Qəzəl 61, beyt 1

فردا اگر نه روضه ای رضوان به ما دهند
غلمان زغرفه حور ز جنت بدر کشیم[1]

Beyt 6: **Dualar eylərəm, məndən yana bir dəm güzar etməz,**
**Nə çarə, sehrilə sərvi-xuraman eyləmək olmaz.**

Sözlük: Güzar etmək – sovuşmaq = baş çəkmək; Xuraman – nazlana-nazlana addım atmaq = təkəbbür ilə yerimək

**Nişanə** 1. "Mən": A: Birinci mən, aşiqin məcazi mahiyyətindən nişanədir.

B: İkinci mən, aşiqin həqiqi və batini mənindən yaxud həqiqi özlüyündən nişanədir[2].

**Nişanə** 2. "Sərv": Sərv, ilahi cilvələr uzantısından eyham etmək istəyir.

**Nişanə** 3. "Xuraman": Xuraman bu beytdə istiğna məqamlı məbudun bəst bağışlayan lütfündə eyham etmək istəyir.

**Anlam: Mütəal məhbub cəmalını, dua vasitəsilə qəlbimdə zühur etdirməyim, davamlı şühud məqamına sehr ilə nail olmaq kimi mümkünsüzdür.**

**Qeyd** 1: *Ayağı yerə bağlı sərvin "sehr ilə xuraman olmaz" təmsili xatırladığımız anlamı hissiləşdirmək istəyir.*

**Qeyd** 2: *Şühud dayanmasının baisi həqiqi vücudu ləkələndirmiş, məcazi bağlantılar xiltindən ibarətdir.*

Beyt 7: **Füzuli, aləmi – qeyd içrəsən, dəm urma eşqindən,**
**Kəmali – cəhl ilə dəvayi – irfan eyləmək olmaz.**

Sözlük: Qeyd – həbs = şərt = insan və ya heyvan ayağını bağlayan ip = miqdar

**Nişanə** 1. "Aləm-qeyd": Qeyd aləmi məcazi dünyadan, yaxud fiziki mahiyyət həbsindən ibarətdir.

**Qeyd:** *dünyəvi bağlantıları qat-qat soyub tökməklə "mücərrədlik" yaxud "fərdlik" məqamına çatmayan insan, qeyd aləmində həyat sürməyə məcburdur. Elə buna görə də mövlana Füzuli buyurur:*

***Zülməti qəm iztirabın çəkməz ol azadə kim***
***Hər təəllüqdən ola xurşidtək aləmdə fərd***

**Nişanə** 2. "Kəmali-cəhl": Bu beytdə mərifət dayandıran şəxsi fikri

---

[1] Müəllif bu beyti "Ta Qafe-əndişe" kitabının 3-cü cildində şərh etmişdir.
[2] Qəzəl 10, beyt 2

etibarlı bilmək nişanəsidir.

**Qeyd:** *Fikir, maddi vücudun təzahüratı olduğundan dəf olmalı yaxud, özünü eşq tədbirinə təslim etməlidir.*

**Nişanə** 3. "İrfan": A: İrfan, əşyalar həqiqətini, yaxud onlarda əks etdirilmiş ilahi cilvələri kəşf və şühud ilə dərk etməkdən ibarətdir.

B: İrfan, uca Tanrının adlarını – sifətlərini tanıtdıran yoldan ibarətdir.

**Qeyd** 1: *Təsəvvüfün göstərdiyi elmi və zehni cəhətə irfan demişlər*[1].

**Qeyd** 2: *Həqiqət ilə tanışlıq iki yol ilə mümkündür:*

*A: Aləmlər yolu: Bu yol, hər bir yaranışda yaradıcı iqtidarı sübut edən istidlal yolundan ibarətdir.*

*B: Peyğəmbərlər, vəlilər və ariflər yolu: Bu yol, daxili vücudu, dünyəvi və cismi ilgilərdən boşaldıb safa çıxaran, eyni halda ruhu cilalandıran mərifət yolundan ibarətdir*[2].

**Qeyd** 1: *İlahi müşahidədən əxz etdiyi nur cərəyanı ilə həyat sürüb, qan dövranına ehtiyacsız rəhbərə "vəli" demişlər*[3].

**Qeyd** 2: *İlahi iradəli vəlinin hər işə girişməsi, ilahi olduğundan şərif ayə "*[4]ما رميت اذ رميت ولكن الله رمى*" (Atdığın zaman sən atmadın, lakin Allah atdı.) buyurmuşdur.*

**Qeyd** 3: *"Nikolson", "Şəms Təbrizi" divanının tərcüməsində, ingilis dili ilı yazılmış müqəddimədə, uca Allahın bəşər idrakından üstün olduğunu təbliğ edən "Ploton" təlimatına işarə edərək, kəlisa filosofları kimi "neo Platonlar" nəzərincə, vəli yaxud mürşüd ünvanlı rəhbəri yer ilə göy arasında bir nurani nərdivan kimi təmsil etməklə, vasitəsiz yaxud vəlisiz ilahi kamala çatmağı mümkünsüz bilmişdir.*

**Anlam: Ey Füzuli, fiziki və cismi mərifətlər məhdudluğunda dünyəvi və mənəvi həqiqətləri kəşf etmək, imkansız olan və həm də ibarətdir.**

---

[1] Doktor Məhəmməd Moin, Fərhəngi-Moin

[2] دكتر سيد جعفر سجادى، فرهنگ لغات و اصطلاحات و تعبيرات عرفانى

[3] دكتر قاسم غنى، تاريخ تصوف در اسلام، جلد 2، ص 230

[4] Quran, Ənfal surəsi, 17-ci ayədən bir qismət

## Q Ə Z Ə L  117

**(1) Neçə illərdir səri-kuyi-məlamət bəkləriz,**
**Ləşkəri-sultani-irfaniz, vəlayət bəkləriz.**

**(2) Sakini-xaki-dəri-meyxanəyiz şamü səhər,**
**İrtifa`i-qədr üçün babi-səadət bəkləriz.**

**(3) Ciffeyi-dünya degil kərkəs kimi mətlubumuz,**
**Bir bölük ənqaləriz, Qafi-qənaət bəkləriz.**

**(4) Xab görməz çeşmimiz əndişeyi - əğyardən,**
**Pasibanuz, gənci - əsrari-məhəbbət bəkləriz.**

**(5) Surəti-divar edibdir heyrəti-eşqin bizi,**
**Qeyr seyri-bağ edər, biz künci-möhnət bəkləriz.**

**(6) Karivani-rahi-təcridiz xətər xofin çəkib,**
**Gah Məcnun, gah mən dövr içrə növbət bəkləriz.**

**(7)Sanmanız kim, gecələr bihudədir fəryadımız,**
**Mülki-eşq içrə həsari-istiqamət bəkləriz.**

**(8) Yatdılar Fərhadü Məcnun məsti-cami-eşq olub,**
**Ey Füzuli, biz olar yatdıqca söhbət bəkləriz.**

Beyt 1: **Neçə illərdir səri – kuyi – məlamət bəkləriz,**
**Ləşkəri – sultani – irfaniz, vəlayət bəkləriz.**

Sözlük: Səri ku – küçə başı

**Nişanə** 1. "Səri – kuyi – məlamət": Yaxud sərkilər ilə əhatələnmək, mənfi kəsrət tanınmış, camaət etibarını aşiq nəzərincə həqir edərək, onu "təcrid", yaxud "təfrid" (fərdlik) məqamına hazırlayan vəziyyətdən nişanədir.[1]

**Nişanə** 2. "Sultani-irfan": Mürşid, yaxud "vəli" ünvanlı rəhbərdən ibarətdir.[2]

**Nişanə** 3. "İrfan": İlahi cilvələrə nail edən kəşf və şühud vəziyyətindən ibarətdir.[3]

**Nişanə** 4. "Vəlayət":

A: Vilayət bəşəri iradədən boşalıb, ilahi iradə ilə dolmaq şəraitindən ibarətdir.

B: Vəlayət, "vəli" ünvanlı rəhbər hüzurundan ibarətdir.[4]

**Qeyd** 1: *Vəlayət, peyğəmbərliyə can kimi olduğundan, ondan daha üstündür. Demək peyğəmbərlər, həm vəli həm də peyğəmbərdirlər.*[5]

**Qeyd** 2: *Vəlayət, "feyz vasitəsi" ünvanlı rəhbər təlimatı ilə yaranmış ilahi cazibələr, yaxud "məczubluq" ya da "məğnatis" vəziyyətindən ibarətdir.*[6]

**Anlam: A: Uzun illərdir ki, məczubluq məktəbini qurmaq məqsədilə müxtəlif məlamətləri qarşılayırıq.**

B: Uzun illərdir ki, ilahi cəlalər intizarı ilə müxtəlif məlamətlərə səbr edirik.

Beyt 2: **Sakini – xaki – dəri – meyxanəyiz şamü səhər,**
**İrtifa`i – qədr üçün babi – səadət bəkləriz.**

Sözlük: Xak – torpaq; Dər – qapı; İrtifa`i-qədr – etibar qorumaq = qədr ucalandırmaq

**Nişanə** 1. "Meyxanə":

A: Meyxanə, aşiqi fiziki mahiyyətindən xəbərsiz edən vəziyyətdən

---

[1] Qəzəl 62, beyt 3
[2] Qəzəl 116, beyt 7
[3] Qəzəl 116, beyt 7
[4] Qəzəl 116, beyt 7
[5] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی
[6] Qəzəl 23, beyt 8 (qeyd 1, 2, 3, 4, 5)

nişanədir.

B: Meyxanə özünü kamal zirvəsinə qaldırmış arifin batinindən istiarədir.[1]

C: Meyxanə mənliyi ilahiliyə çevirən vəziyyətdən nişanədir.

**Nişanə** 2. “Şamü səhər”: Daimilikdən nişanədir, ancaq “şam” bəsitlik[2] və “səhər” mücərrədlik[3] məqamında eyham etmək istəyir.

**Nişanə** 3. “İrtifa`i – qədr”: İrfani dəyərlər, yaxud mənəvi etibarlar ucalığını təlqin edən nişanədən ibarətdir. Ancaq uca qapılı saraylara, həm də nəhayətə çatmış süluk mərtəbəsində [4] “Qədr gecəsi” ünvanlı nailiyyətə də eyham etmək istəyir.

**Qeyd:** *Maddi vüsudunu ilahi cilvələr ilə istehlak etmiş salikin isə mənəvi varlığını davamlandıran vəziyyətə “Qədr gecəsi” demişlər.*[5]

**Nişanə** 4 “Səadət”: Dünyada ilahi feyzlərə, axirətdə isə mənəvi məqamlara çatdıran nemətdən ibarətdir.

**Qeyd** 1: *Zikr ilə məşğul olmuş dil, həqiqi məhəbbət ilə qərq olmuş ürək və uca Allah nəzəri ilə dolu batin, səadət nailiyyətini sübut edən üc xüsusi nişanədir.*

**Qeyd** 2: *Fəlsəfədə irfan kimi səadət sözünü, diqqətə layiq nəhəng bir mövzu tanımış və III – IV əsrlərdə (q-h) yaşamış məşhur islam filosofu Farabi isə Ərəstu kimi bütün siyasətçiləri səadət xadimləri bilmişlər.*[6]

**Anlam: Birinci beytdə qeyd olunmuş “vəlayət” hörmətini qaldırmaq məqsədilə meyxanə ərəfəsini hifz edirik.**

Beyt 3: **Cifeyi – dünya degil kərkəs kimi mətlubumuz,**
**Bir bölük ənqaləriz, Qafi – qənaət bəkləriz.**

Sözlük: Cife – mordad = iylənmiş leş = iyrənc şey; Mətlub – məhbub = ürək sevən = tələb olunmuş; Ənqa – simurq = əfsanəvi quş; Qaf – Quranda adı çəkilmiş əfsanəvi bir dağ = Quran icmalçıları Qaf dağını yaşıl zəbərcəddən yaranılmış bir dağ kimi tərif etmişlər, demək səma, yaşıllığını o dağdan əxz etmiş, bütün dağlar ona əsaslanmış və yer kürəsində onunla əhatələnmişdir.

---

[1] Qəzəl 27 , beyt 7
[2] Qəzəl 20, beyt 1 (şəb)
[3] Qəzəl 56, beyt 1
[4] Qəzəl 104, beyt 1
[5] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی
[6] Tərcümə: Pərviz Babayi, Məktəbhayi-fəlsəfi

**Nişanə** 1. “Kərkəs”: Həvəskar iti nəfsinə məğlub olmuş bəşərdən nişanədir.

**Nişanə** 2. “Ənqa”: Özünü kamal zirvəsinə çatdırmış insandan nişanədir.

**Nişanə** 3. “Qənaət”: Uca Allah eşqilə qüvvəyə minmək vəziyyətindən nişanədir.[1]

**Nişanə** 4. “Qaf”: Bu beytdə qənaət mülkünün intəhasızlığından nişanədir.

**Anlam: Kamil insanlar kimi qənaət mülkünü, yaxud intəhasız aləm qüvvələrini mühafizə və ya tələb etmək uğrunda dünyəvi alçaq meyllərə məğlub olmayanlar, nəhayət, həvəskar şəxslərə qoşulmayanlar bizik.**

Beyt 4: **Xab görməz çeşmimiz əndişeyi - əğyardən,**
**Pasibanuz, gənci - əsrari – məhəbbət bəkləriz.**

Sözlük: Xab – yuxu; Çeşm – göz; Gənci əsrar – sirrlər xəzinəsi

**Nişanə** 1. “Əndişə”: Xətərli, həm də əzəmətli hadisələri də fikir etməkdən ibarətdir.

**Nişanə** 2. “Əğyar”: Həvəskar nəfs məğlubiyyətində mənəvi əhval – ruhiyyədən qəflət etmiş şəxslərdən (kərkəslər) ibarətdir.

**Nişanə** 3. “Gənci-əsrar”: Tam vüsal mərtəbəsinə çatdıran ilahi cəlalər ehtivasından ibarətdir.

**Nişanə** 4. “Məhəbbət”: Bu beytdə batini vücudu, ilahi camal cilvələri ilə məşğul etmiş vəziyyətdən ibarətdir.[2]

**Anlam: İlahi cilvələr nemətini həvəskar nəfsin, həm də naməhrəm camaatın sədəmə vurmağından qorumaq fikri ilə, dünən və bugün güdükçülük edirik.**

Beyt 5: **Surəti – divar edibdir heyrəti – eşqin bizi,**
**Qeyr seyri – bağ edər, biz künci – möhnət bəkləriz.**

**Nişanə** 1. “Heyrət”: Bu beytdə bəşəri təcrübəni və şüuru yaxud quru bir ağacı ayaq üstə saxlayan müsbət sərgərdanlıqdan ibarətdir.[3]

**Nişanə** 2. “Bağ”: Bu beytdə dünyəvi hüsnlərin ürək açan

---

[1] Qəzəl 104, beyt 7
[2] Qəzəl 105, beyt 7
[3] Qəzəl 103, beyt 3

cilvəsindən ibarətdir.

**Nişanə** 3ş. "Gənci möhnət": Bu beytdə vəhdət mülkünü istiqamətləndirən imtahanedici ətəşdən ibarətdir.

**Anlam: Dünyəvi hüsnlərə rəğbətsiz olduğumun baisi mənəvi mərtəbələrə yönlədən ətəşdən ibarətdir.**

Beyt 6: **Karivani – rahi – təcridiz xətər xofin çəkib,**
**Gah Məcnun, gah mən dövr içrə növbət bəkləriz.**

Sözlük: Rahi-təcrid = təcrid yolu

**Nişanə** 1. "Təcrid": A: Qılıncı qınından çəkib şaxələri qırmaq kimi, eşq sahilə dünyəvi ilgiləri qırıb – qurtarmaq, nəhayət, fərdilik məqamına çatmaqdan ibarətdir.[1] Elə buna görə də Mövlana Füzuli buyurur:

**"Zülməti-qəm iztirabın çəkməz ol azadə kim,**
**Hər təəllüqdən ola xurşid tək aləmdə fərd".**

B: Zahirdə dünya ləzzətlərini, batində axirət nemətlərini yaddan çıxarmaq nişanəsidir.[2]

**Anlam: Beyt silsiləvi ariflərin bir – birilə bağlılığını, yaxud dünya boyu davam edən təcrid eşqini karvan və növbət nişanələri ilə təlqin etmək istəyir.**

**Qeyd:** *Hafiz də eşq və irfan əhlini silsiləvi təsdiq etmək məasədilə buyurmuş:*

دور مجنون گذشت و نوبت ماست
هر کسی پنج روزه موبت اوست[3]

Beyt 7: **Sanmanız kim, gecələr bihudədir fəryadımız,**
**Mülki – eşq içrə həsari – istiqamət bəkləriz.**

Sözlük: Bihudə – batil = faydasız = mənasız = yava

**Nişanə** 1. " Gecə": Ürək münacatının qəbulluq zamanından ibarətdir.

**Qeyd** 1: *Gecə bəstlik məqamı olduğuna görə[4], duaların qəbul olmaq zamanıdı.*

**Qeyd** 2: Gecə, yaxud qaranlıq, bir pərdə kimi bütün əşyaları, yaxud

---

[1] Şeyx Fəridəddin Əttari Nişaburi , Əsrarnamə, s.306
[2] Qəzəl 104, beyt 1
[3] Qəzəl 98, beyt 2
[4] Qəzəl 20, beyt 1

kəsrət nişanələrini örtüb – itirdiyinə görə vəhdət vəziyyətindən nişanədir.

**Nişanə** 2. “Fəryad etmək”: Eşq atəşilə paka çıxmış ürəyin özəl münacatından ibarətdir.

**Qeyd** : *Zahiri paka çıxaran su və atəş kimi batini də paklayan göz yaşı və ürək atəşindən ibarətdir.*

**Nişanə** 3. “İstiqamət”: A: Günahları yox edən ibadətlərdən nişanədir.

B: Əqidəli aşiqin sərki və bəlalar önündə möhkəm dayanmasından, nəhayət, şərif ayəyə əsaslanmağından ibarətdir ki, buyurur:

“انّالدين قالو ربّنا الله ثومّ استقاموفلا خوف عليهم و لاهم يحزنون”[1] (Şübhəsiz ki: “Rəbbimiz Allahdır” deyən, sonra [sözləri üstündə] möhkəm duranların heç bir qorxusu yoxdur. Onlar məhzun olmazlar.)

C: Bəşəri iradə - ixtiyarı tərk etdirmiş haldan nişanədir.

**Anlam: “İstiqamət” məqamını mühafizə etmək məqsədilə, dünyəvi işlər və əşyalar hicabından xilas olmuş halda münacat edirik.**

Beyt 8: **Yatdılar Fərhadü Məcnun məsti – cami – eşq olub,**
**Ey Füzuli, biz olar yatdıqca söhbət bəkləriz.**

**Nişanə** 1: “Məsti-cami-eşq”: Bu beytdə uca Allah eşqində məğlub olmuş halda, yaxud bəşəri sifətlərdən boşalmış şəraitdə dünyasını dəyişən aşiqdən ibarətdir.

**Anlam: Bax: Beyt 6, Anlam (silsiləvi aşiqlər)**

---

[1] Quran, Əhqaf surəsi ayə 13

## **Q Ə Z Ə L 118**

**(1) Təşneyi – cami – vüsalın abi – heyvan istəməz,**
**Mayili – muri – xətin mülki – Süleyman istəməz.**

**(2) Zülməti – zülfün giriftarı dəm urmaz nurdən,**
**Talibi – şəmi – rüxün xurşidi – rəxşan istəməz.**

**(3) Eyləməz meyli-behişt oftadeyi – xaki – dərin,**
**Sakini – künci – qəmin seyri – gülüstan istəməz.**

**(4) Cövrüdən ah etmə, ey aşiq ki, eyni – lütfdür,**
**Dust, əsbabi – kəmali – hüsnə nöqsan istəməz.**

**(5) Aşiq isən rindü rüsvalıqdan ikrah etmə kim,**
**Eşq sirrin iqtizayi – dövr pünhan istəməz.**

**(6) Eşqdən vəhm etməsin aşiq, yıxar könlüm deyib,**
**Hiç sultanəm deyən mülkünü viran istəməz.**

**(7) Ey Füzuli, müttəsil, dövran müxalifdir sənə,**
**Qaliba, ərbabi – istedadı dövran istəməz.**

Beyt 1: **Təşneyi – cami – vüsalın abi – heyvan istəməz,**
**Mayili – muri – xətin mülki – Süleyman istəməz.**

Sözlük: Abi heyvan – dirilik suyu = (rəvayətlərə əsdasən "abi-heyvan" yaxud " abi-Xızr", ya "abi-bəqa", şimalda "zülmət" adlı qaranlıq bir məntəqədə özəl bir çeşmədən ibarətdir ki, guya İsgəndər onu çox axtardı, ancaq tapa bilmədi, lakin Xızır peyğəmbər ona çatarkən suyundan içib əbədi bir həyata nail oldu.)[1]; Mur – qarışqa; muri-xətt – üzün ətrafındakı nazik tükdən istiarə

**Nişanə** 1. "Təşnə": Uca Allah görüşünə istiqamətləndirən ətəşdən ibarətdir.[2]

**Nişanə** 2. "Cami-vüsal": Bu beytdə ilahi cilvələr əks etdirmiş qəlbdən nişanədir.

**Nişanə** 3. "Muri-xətt": A: Vəhdət rayihəli kəsrətdən nişanədir.

B: Yaradanın ətrafını dövrələyən kəsrətdən nişanədir.

**Nişanə** 4. "Mülki-Süleyman": Bu beytdə dünyəvi hakimiyyət və əzəmətdən nişanədir.

**Anlam: Vəhdət rayihəsindən xəbərdar aşiq kəsrət aləminə etina etməz.**

Beyt 2 və 3: **Zülməti – zülfün giriftarı dəm urmaz nurdən,**
**Talibi – şəmi – rüxün xurşidi – rəxşan istəməz.**
**Eyləməz meyli-behişt oftadeyi – xaki – dərin,**
**Sakini – künci – qəmin seyri – gülüstan istəməz.**

Sözlük: Xurşidi-rəxşan – parlaq günəş; Xaki dər – astana torpağı

**Nişanə** 1. "Zülməti-zülf": Bu beytdə "muri xətt" mənasını təkrar edən nişanədən ibarətdir.

**Nişanə** 2. "Nur": Bu beytdə dünyəvi etibarsız ziyalardan nişanədir.

**Nişanə** 3. "Talib": Daxili ətəş və xahiş vasitəsilə ilahi məqsəd yoluna yönəlmiş aşiqdir.[3]

**Nişanə** 4. "Şəmi-rüx": Bu beytdə ilahi camal cəlalarından nişanədir.

**Nişanə** 5. "Xurşidi-rəxşan": Bu beytdə dünyəvi ziyalar mətləindən nişanədir.

**Nişanə** 6. "Behişt": Behişt bu beytdə axirət nemətlərindən nişanədir.

---

[1] دکتر محمد معین، فرهنگ معین، اعلام
[2] Qəzəl 111, beyt 3
[3] Qəzəl 114, beyt 7

**Anlam: Bu iki beyt isə ötən beytin mənasını təkrar və təkid edir.**

Beyt 4: **Cövrdən ah etmə, ey aşiq ki, eyni – lütfdür,**
**Dust əsbabi – kəmali – hüsnə nöqsan istəməz.**

Sözlük: Əsbab – səbəblər

**Nişanə** 1. "Cövr": Bu beytdə aşiqin zahiri vücudunu maddi ləkələrdən paklandırmaqla ona cəla ünvanlı mənəvi cilvələr əks etdirmək istedadını bağışlayan özəl tərbiyədən ibarətdir.

**Nişanə** 2. "Lütf": Kədərli ürəklər halını mülayimləşdirən, nəhayət, aşiqi vücud adlı məsiyətdən paklayan, şərif ayə "[1]الله لطيف بعباده" buyuran xüsusi mehribanlıqdan nişanədir.

**Nişanə** 3. "Dust": Dünyəvi səbəbləri aşiqin fikrindən sildirən mehriban məhbubdan nişanədir.

**Nişanə** 4. "Hüsn": Bu beytdə içəri əhvalın, həm də xarici rəftarın, Allahın əmrilə müvafiq olmağından, yaxud mənəvi tərbiyələr nəticəsindən ibarətdir.

**Anlam: Cəfalar da, vəfadar kimi həkim məhbubun (Allahın – red.) mehribanlığına bağlıdır.**

**Qeyd:** *Cövr ilə lütf arasındakı fərqi bilmiş aşiq ikilik ünvanlı kəsrət günahına giriftar olmaqla vəhdət günəşindən bəhrəsiz qalmalıdır.*

Beyt 5: **Aşiq isən rindü rüsvalıqdan ikrah etmə kim,**
**Eşq sirrin iqtizayi – dövr pünhan istəməz.**

Sözlük: Rind – zirək = ictimai həyat tərzini tərk etmiş = batini zahirindən gözəl bir şəxs

**Nişanə** 1. "Eşq sirri": Aşiq ilə məşuq arasındakı elmə- idraka sığmaz mənəvi əlaqədən ibarətdir.

**Anlam: Eşq sirrini ürəkdə pümhan etmək, odu ipək dəsmalda gizlətmək kimi mümkünsüzdür.[2]**

Beyt 6: **Eşqdən vəhm etməsin aşiq, yıxar könlüm deyib,**
**Hiç sultanəm deyən mülkünü viran istəməz.**

---

[1] Quran, Əlşura surəsi, 19-cu ayədən bir qismət
[2] Qəzəl 70, beyt 5

**Anlam: A: İstedadsız aşiqi tənbeh etmək həm də istedadlı aşiqi qurbanlıq məqamına hazırlamaq ürək imtəhanına bağlı olduğundan, qəbz və qəhr sıxıntısı, könüllər yıxan deyil, bəlkə onları abad edən nişanədən ibarətdir.**

B: Dünyəvi sultan öz mülkünün abadlığına mail olan kimi mənəvi və həqiqi sultan da (mütəal məbud) ürək adlı mülkünü abad istəyir.

**Qeyd:** *Mövlana Cəlaləddin Rumi isə, islam peyğəmbərinin buyurduğu əsas – etibar ilə könülü (ürəyi) Allahın özəl evi (mülkü) bilmişdir*[1].

Beyt 7: **Ey Füzuli, müttəsil, dövran müxalifdir səna,**
**Qaliba, ərbabi – istedadı dövran istəməz.**

**Nişanə** 1. "Dövran": Eşq və irfandan xəbərsiz yaşayan camaatdan ibarətdir.

**Qeyd:** *Dövran, yaxud "zaman" və "məkan" adı ilə, xəlqə və cəmaətə işarə etmək "hal-məhəl" ünvanlı ədəbi sənətdən bəhrələnmək nişanəsidir.*

**Nişanə** 2. "İstedad": Bu beytdə dünyəvi müsbət üstünlük və mənəvi əl çatmaz mərtəbədən nişanədir.

**Anlam: Heç bir əsrdə, düşünən insanlar, düşünməz camaatın irad-etirazından asudə yaşamağı bacarmaz.**

**Qeyd:** *Nəzərə belə gəlir ki: Cahillər azarını çəkmək, alim insanların alın yazısı, yaxud təbii qisməti kimidir. Belə qismətə aid, Hafiz buyurmuşdur:*

فلک به مردم نادان دهد زمام مراد
تو اهل فضلی و دانش همین گناهت بس[2]

---

[1] گفت پیغمبر که حق فرموده است من نگنجم، در خم بالاوپست
در زمین و آسمان و عرش نیز من نگجم این یقین دان ای عزیز
در دل مومن بگنجم، ای عجب گرامرا جویی، در آن دلها طلب
مثنوی معنوی، دفتر 1، بیت: 2715، 2716، 2717

[2] Müəllif bu beyti "Ta Qafe-əndişe" kitabının 3-cü cildində şərh etmişdir.

## Q Ə Z Ə L  119

**(1) Xəlqə ağzın sirrini hər dəm qılır izhar söz,**
**Bu nə sirdir kim, olur hər ləhzə yoxdan var söz.**

**(2) Artıran söz qədrini sidqilə qədrin artırar,**
**Kim nə miqdar olsa, əhlin eylər ol miqdar söz.**

**(3) Ver sözə ehya ki, tutduqca səni xabi - əcəl,**
**Edə hər saət səni ol uyqudan bidar söz.**

**(4) Bir nigari - ənbərin xətdir könüllər almağa,**
**Göstərir hər dəm niqabi – qeybdən rüxsar söz.**

**(5) Xazini – gəncineyi - əsrardır, hər dəm çəkər**
**Rişteyi – izharə min – min gövhəri - əsrar söz.**

**(6) Olmayan qəvvasi – bəhri – mərifət arif degil**
**Kim, sədəf tərkibi – təndir, lölöi – şəhvar – söz.**

**(7) Gər çox istərsən, Füzuli, izzətin, az et sözü**
**Kim, çox olmaqdan qılıbdır çox əzizi xar söz.**

Beyt 1: **Xəlqə ağzın sirrini hər dəm qılır izhar söz,**
**Bu nə sirdir kim, olur hər ləhzə yoxdan var söz.**

**Nişanə** 1. “Ağız”: Bu beytdə insanın gizli və həqiqi özlüyünü açıb göstərən səbəbdən ibarətdir.

**Nişanə** 2. “Sirr”: Bu beytdə bəşəri elmə-təcrübəyə sığmaz “mütəkəllim” ünvanlı ilahi özəl sifətdən ibarətdir.

**Nişanə** 3. “Söz”: Bu beytdə ilahi ilhamlar mənbəyindən nişanədir.

**Qeyd** 1: *Söz – İlahi camal cilvələrindən məlumat verdiyinə görə müqəddəsdir.*

**Qeyd** 2: *Söz – hidayət edici və nəsihətyana olduğuna görə müqəddəsdir.*

**Qeyd** 3: *Aristotel demişkən, söz – əql mənbəyindən, yaxud bəşəri vücudun ən şərəfli hissəsindən törəndiyinə görə şərafətlidir*[1].

**Qeyd** 4: *Platon demişkən söz – ən möhtəşəm, eyni halda mübhəm əmrlərin əql ərşindən hiss aləminə nazil olma səbəbi olduğuna görə şərafətlidir*[2]

**Qeyd** 5: *Sokrat demişkən söz – ilham mənbəyinə bağlı olduğuna görə müqəddəsdir*[3]. *Buna görə də: “..., ölməz həmasələr yaratmış bir şairin əsərləri, onun sənətkar və alim olduğunu təlqin etməyir, bəlkə də onun ilahi cazibələr ehtivasında, huşu başından uçmuş halda, ilham cilvələrini əks etdirməyinə dəlalət edir. Demək, şairin tarix boyu, yaşamaq illəti onun Allah-taala fərmayişinə tərcüməçi olmağından ibarətdir. Belə bir mənsəbə yüksəlmək iradəsiz alət kimi (məmlüklük) haqq – təalaya təslim olmaqla şərtlənir.*[4]

**Qeyd** 6: *Söz – ruhun təfəkkür üvnanlı səssiz danışığını səsləndirmiş səbəb olduğuna görə şərəflidir.*[5]

**Qeyd** 7: *Söz – insanın düşünmək miqdarını məlum etdiyinə görə diqqətəlayidir. Demək, düşüncə ilə bağlı olan sualların dil, yaxud söz ilə əlaqədar olduqlarına görə müasir filosoflar,: “İnsan nəyi düşünür, nəyi düşünmür?” yerinə, “İnsan nə deyə bilir? Nə deyə bilmir?” sualını ortaya qoymuşlar.*[6] *Onlar, zehndən sual etmək, yaxud “Kant fəlsəfə”sini dil ilə sual etmək, yaxud “Vegenşteyn fəlsəfəsi” ilə əvəz edərək, sözün*

---

[1] Məhəmməd Əli Füruği, Seyre-hikmət dər Orupa, cild 1, səh. 60
[2] Dore asar Əflatun, cild 3, səh 1504
[3] Bertrand Rassel, Tarixe fəlsəfeyi-qərb, tərcümə Nəcəf Dəryabəndəri, səh. 143
[4] Dovreyi-asari-Əflatun, səh 576-577
[5] Göstərilən kitab, səh.1452
[6] Qəzəl 53, beyt 1, nişanə 4, qeyd 2

*inkar edilməz etibarını sübut etmişlər. Eyni halda, istər – istəməz 14 əsr bundan öncə, Həzrət Əli əleyhissəlam "المرء مجنوء تحت لسانه"*[1], *(Kişi dilinin arxasında gizlənmiş) buyuruğunu təsdiq etməklə şəxsiyyətin dil (söz) ilə bağlılığını təlqin etmişlər.*

**Qeyd** 8: *Dil, yaxud söz, elmi idrak mövzusuna daxil olmaqla, etibarlı və şərafətlidir.*[2]

**Qeyd** 9: *Aristotel çirkin sözü, çirkin elmin müqəddiməsi bilməklə bəşərin şəxsiyyətini onun söz ilə bağlı alması kimi təlqin etmək istəyir.*

**Nişanə** 4. *"Yoxdan var etmək": "Mən bu cahana sığmazam" deyən aşiqin maddi dünyada əl çatmaz mənəvi aləmdən verdiyi məlumat ilə törətdiyi yeni təfəkkür və ruhiyyə vəziyyətindən ibarətdir.*

**Anlam: Maddi məhdud dünyada intəhasız mənəvi dünyanı duyub – düşünmək aşiqlərin ilahi mənbəyə bağlı ürək münacatı ilə (söz) mümkündür.**

Beyt 2: **Artıran söz qədrini sidqilə qədrin artırar,**
**Kim nə miqdar olsa, əhlin eylər ol miqdar söz.**

Sözlük: Sidq – düzlük = doğruçuluq = üzdə və arxada bir cür olmaq

**Anlam: Hər bir insanın eybi – hünəri, yaxud düşünmək miqdarı, nəhayət, həqiqi şəxsiyyəti onun sözü ilə bağlı olduğundan, Həzrət Əli(ə) "تكلمو تعرفو"[3] buyurduğu kimi, ulu şeyx Sədi demişdir:**

تامرد سخن نگفته باشد
عیب و هنرش نهفته باشد[4]

Beyt 3: **Ver sözə ehya ki, tutduqca səni xabi - əcəl,**
**Edə hər saət səni ol uyqudan bidar söz.**

Sözlük: Xabi-əcəl – əcəl yuxusu = qəflət yuxusu; Bidar – ayıq

**Nişanə** 1. "Sözə ehya vermək": Mütaliəçi olmaqdan, yaxud fikir yürütməkdən, ya da həzrət mürşid sözünü düşünməkdən ibarətdir.

**Nişanə** 2. "Xabi - əcəl": Bu beytdə:

A: İlahi zikrdən məhrum olmuş dil qəflətindən ibarətdir.

---

[1] فیض الاسم، نهج البلاغه، ص 1159
[2] نوام چامسکیري، زبان و ذهن، ص 234
[3] فیض الاسم، نهج البلاغه، ص 1272
[4] کلستان سعدی، باب اول، سیرت پادشاهان

B: Həqiqi məhbubdan xəbərsiz qalmış qəlb qəflətindən ibarətdir.

**Nişanə** 3. “Bidar”: Bu beytdə ürəyi “bəst” məqamına nail edən “səhv” ünvanlı ehsandan ibarətdir.[1]

**Anlam: Qəflət yuxusundan ayılmaq, yalnız mütaliə və təfəkkür ilə mümkündür.**

Beyt 4: **Bir nigari - ənbərin xətdir könüllər almağa,**
**Göstərir hər dəm niqabi – qeybdən rüxsar söz.**

Sözlük: Ənbərin xət = gənclər üzündə təzəcə görünmüş ətirli tük,

rüxsar = üz = sima

**Nişanə.** “Ənbərin xət”: Bu beytdə dünyəvi vücudun mənəvi asarından ibarətdir.[2]

**Anlam: Söz isə ilahi camal cilvələri kimi ürəyi bəstləndirən müqəddəs bir nemətdən ibarətdir.**

Beyt 5: **Xazini – gəncineyi - əsrardır, hər dəm çəkər**
**Rişteyi – izharə min – min gövhəri - əsrar söz.**

Sözlük: Xazin – xəzinəçi = güdükçü; Gəncinə – xəzinə; Əsrar – sirrlər

**Nişanə** 1. “Əsrar”: İlahi əhval-ruhiyyə ilə əhatələnmiş mərtəbədən, yaxud Allah-taala eşqinə qərq olmaq vəziyyətindən ibarətdir.

**Nişanə** 2. “Göhəri-əsrar”: Bəşəri idraka sığmaz, həqiqi mənalardan nişanədir.

**Anlam: Bəşəri vücudda İlahi əhvali-ruhiyyə törətmək həzrəti mürşüdün ilham mənbəyi ilə əlaqədar sözləri ilə mümkündür.**

**Qeyd:** *Peyğəmbərlər, ağır ləşkər ilə yox, bəlkə ağır söz ilə qalib gəlmişlər.*

Beyt 6: **Olmayan qəvvasi – bəhri – mərifət arif degil**
**Kim, sədəf tərkibi – təndir, lölöi – şəhvar – söz.**

Sözlük: Qəvvas – üzgüçü; Bəhri-mərifət – mərifət dənizi; Lölöi-şəhvar – layiqli gövhər

**Nişanə** 1. “Qəvvas”: Həzrəti-mürşidin təlimatı və yardımıyla xarici

---

[1] “Sukr” ünvanlı mənəvi məstlik yuxusundan ayılmağa “səhv” demişlər.

[2] Qəzəl 70, beyt 1, nişanə “xət”

aləmdə, həm də daxili vücudunda seyrə çıxmış salikdən ibarətdir.

**Nişanə** 2. “Mərifət”: A: Heyrət üzüntüsündən ibarətdir.[1]

B: Qabilləşmiş salikin qəlbində çaxmış ilahi rəhmət nurundan ibarətdir.[2]

**Qeyd** 1: *İlahi rəhmət nuru dünyəvi ilgiləri tamamilə yandırıb kül edən nurdan ibarətdir.*

**Qeyd** 2: *Mərifət – elm ilə əldə edilmiş anlam deyil[3], bəlkə ilahi cazibələr ilə əlaqədar bilikdən ibarətdir.*

**Qeyd** 3: *İrfani araşdırmalar mərifət sözünü yunan məktəblərinin “Deosis”, yaxud “bilirəm” kəlməsi ilə bərabər tutmuşlar.*

**Qeyd** 4: *Quran icmalçıları özünü arada görməyən aşiqin ibadət məşğulluğunu onun bəhri-mərifətə hidayət olduğundan nişanə bilib, aşağıdakı şərif ayəyə istinad etmişlər:*

“والذين جاهدو فينا لنهدينهم سبلنا و انّا الله امع المحسنين[4]” *(Bizim yolumuzda çalışanları öz yollarımıza mütləq hidayət edərik. Çünki Allah yaxşı işlər görənlərlədir”)* .

**Nişanə** 3. “Arif”: “Şühud” ünvanlı mənəvi müşahidə vasitəsilə, Allah-taala hüzurunu dərk etmiş şəxsdən ibarətdir.[5]

**Qeyd** 1: *Həzrət məbudun fikri ilə gecələmək, ariflik nişanəsi olduğundan “ النّائم با الله فهو عارف”[6] demişlər. (Arif, mütəal məbudu xatırda tutmaqla yuxuya getmiş aşiqdən ibarətdir.)*

**Qeyd** 2: *Alim isə arif kimi Allah-taalanın hüzurunu dərk etməyə nail olmuşdur, lakin onun qəlbinə əql və təcrübədən üstün əhval – ruhiyyə daxil olmayıbdır.[7]*

**Anlam: Əqlindən – elmindən, yaxud özlüyündən ayrılmayan aşiq gövhərsiz sədəf kimi layiqsizdir.**

**Qeyd:** *Əql və elm ünvanlı dünyəvi vücud təzahüratını qənaətbəxş bilib, mənəvi vücud cilvələrindən qəflət etmək, məntiqcə qəbula keçməyən bir əmrdən ibarətdir.*

Beyt 7: **Gər çox istərsən, Füzuli, izzətin, az et sözü**

---

[1] Qəzəl 106 , beyt 3
[2] دکتر قاسم غنی، تاریخ تصوف در اسلام، جلد 2، ص 418
[3] Qəzəl 5, beyt 5, nişanə 1
[4] Quran, Ənkəbut surəsi, ayə 69
[5] Qəzəl 116, beyt 7, nişanə “ürfan”
[6] Ziyaəddin Əbu Nəcib Əbdülqahir Sührəvərdi, Adabül-müridin, səh.46,47
[7] دکتر قاسم غنی، تاریخ تصوف در اسلام، جلد 2، ص 650

**Kim, çox olmaqdan qılıbdır çox əzizi xar söz.**

**Anlam: Beyt "Az danış, əla danış" sifarişini təlqin etməklə həkim Nizaminin (کم گوی گزیده گوی چون در تازاندک تو جهان شود پر) buyurduğunu təsdiq etmişdir.[1]**

[1] Nizami Gəncəvi, Leyli və Məcnun, Müqəddimə, "Az danışmağın gözəlliyi"

## Q Ə Z Ə L 120

**(1) Mana badi - səba ol sərvi – gülruxdən xəbər verməz,**
**Açılmaz qönçeyi – bəxtim, ümidim nəxli bər verməz.**

**(2) Töküb göz yaşını sənsiz həlakim istərəm, əmma**
**Əcəl peykinə seyli - əşk girdabi güzər veməz.**

**(3) Gözümdə məskən et, xari – müjəmdən ehtiraz etmə,**
**Güli – xəndanə sordum, xarə yar olmaq zərər verməz.**

**(4) Əgər can almaq istərsən, tənimdən tiğini kəsmə**
**Ki, pəjmürdə nihalə verməyincə su səmər verməz.**

**(5) Qiyas et şəm'dən, vəhm eylə çərxin inqilabından**
**Kim, ol baş almağa qəsd etməyincə taci – zər verməz.**

**(6) Bəla zimnində rahət olduğun izhar edər xəlqə**
**Fələk, bihudə xari – xüşkdən gülbərgi – tər verməz.**

**(7) Füzuli, dəhrdən kam almaq olmaz olmadan giryan,**
**Sədəf su almayınca əbri – nisandan gühər verməz.**

Beyt 1: **Mana badi - səba ol sərvi – gülruxdən xəbər verməz,**
**Açılmaz qönçeyi – bəxtim, ümidim nəxli bər verməz.**

Sözlük: Gülrux – gül camal = gül çöhrə; Nəxl – ağac = xurma ağacı; Bər – bar = meyvə

**Nişanə** 1. "Badi-səba": A: Həzrəti Cəbraildən yaxud həzrət mürşüdün, ya da digər ilahi vasitədən istiarədir.

B: Badi səba, bədənə qalib gəlmiş istilaçı ruhdan istiarədir.[1]

**Nişanə** 2. "Sərvi-gülrux": Ürəyi "bəst" məqamına nail edən ilahi cilvələr uzantısından ibarətdir.

**Nişanə** 3. "Xəbər": Bu beytdə həqiqi elmdən, yaxud mənəvi mərifətdən nişanədir.

**Qeyd:** Mövlana Cəlaləddin hər bir insanın can miqdarını onun elm miqdarı ilə bərabər göstərmək məqsədilə buyurmuşdur:

جان نباشد جز خبر در آزمون هر که را افزون خبر جانش فزون[2]

**Nişanə** 4. "Bəxt": Açılmaz bəxtin istedadsız, yaxud sərmayəsiz eşqin ilahi cazibələrə nail olmamağından nişanədir.

**Anlam: Ümidsiz yaşamaq məcburluğuma İlahi cazibələrə nail edən daxili və xarici vasitələrdən məhrumluğum baisdir.**

Beyt 2: **Töküb göz yaşını sənsiz həlakim istərəm, əmma**
**Əcəl peykinə seyli - əşk girdabi, güzər veməz.**

Sözlük: Peyk – xəbərçi; Əşk – göz yaşı; Gözər – yol = məcal

**Nişanə** 1. "Göz yaşı": Bu beytdə maddi vücudu bir ləkə kimi yuyub – unudan, yaxud ürək duruldan vasitədən nişanədir.

**Nişanə** 2. "Həlak": Bu beytdə qurbanlıq məqamına nail olmaqdan nişanədir.

**Nişanə** 3. "Seyli-əşk": Bax "Göz yaşı" nişanəsinə.

**Anlam: Həlak olmaq, qurb, yaxud qurbanlıq məqamının əsas şərti olduğuna görə mənəvi sərmayə hesab olunur. Belə bir sərmayəni ələ gətirmək məqsədilə göz yaşı tökmək yaxud istedadlanmaq gərəklidir.[3]**

---

[1] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی
[2] Qəzəl 107, beyt 1, nişanə: "xurşid"
[3] Qəzəl 3, beyt 7

Beyt 3: **Gözümdə məskən et, xari – müjəmdən ehtiraz etmə,**
**Güli – xəndanə sordum, xarə yar olmaq zərər verməz.**

Sözlük: Müjə – kiprik

**Nişanə** 1. "Göz": Bu beytdə "şühud" ünvanlı ilahi camal müşahidəsindən nişanədir.

**Nişanə** 2. "Xari-müjə": Şühud məqamını tələb etmiş aşiqin istedadsızlığından nişanədir.

**Nişanə** 3. "Güli-xəndan": Ürəyi "bəst" məqamına nail edən gözəl məhbubdan istiarədir.

**Nişanə** 4. "Xarə yar olmaq": İstedadsız aşiqi İlahi cilvələrdən bəhrələndirmək nişanəsidir.

**Nişanə** 5. "Zərər verməz": Allah-taalanın "istiğna" və "səmədiyyət" məqamına eyham edən nişanədən ibarətdir.[1]

**Anlam: Ey Mütəal məbud, istedadsız aşiqi ilahi camal cilvəsindən bəhrələndirmək, sənin istiğna məqamına heç bir ziyan verə bilməz.**

Beyt 4: **Əgər can almaq istərsən, tənimdən tiğini kəsmə**
**Ki, pəjmürdə nihalə verməyincə su səmər verməz.**

Sözlük: Pəjmürdə – solğun = qurumuş = təravətsiz; Nəhal – körpə ağac = pöhrə; Səmər – səmərə

**Nişanə** 1. "Can almaq": Ötən beytdə qeyd olunmuş həlakətdən, yaxud qurub tələbini təkrar edən nişanədən ibarətdir.

**Nişanə** 2. "Tənimdən tiğini kəsmə": Qurbanlıq məqamına istiqamətləndirən tənbehdən ibarətdir.

**Nişanə** 3. "Pəjmürdə nihal": Mənəvi istedadını təmamilə əldən verməyən, daxili həyatı zəifləşmiş vücuddan nişanədir.

**Nişanə** 4. "Su": Bu beytdə həqiqi həyatı, yaxud mənəvi mərifətə eyham edən nişanədən ibarətdir.

**Qeyd:** Quran icmalçılarından bir çoxu, "su" ünvanlı həqiqi həyat barədə aşağıdakı ayəyə istinad etmişlər:

"...، يخرج الحى من الميت و مخرج الميت من الحى ذالكم الله فانا توفكون"[2] (Allah şübhəsiz) dirini ölüdən çıxardır və diridən ölü çıxardır. Budur Allah, axı

[1] Qəzəl 30, beyt 3
[2] Quran, Ənam surəsi, ayə 95

ondan necə üz döndərirsiniz?)

**Anlam: Bu beyt isə ötən beyt kimi qurban məqamına qaldıran yaxud həqiqi həyat bağışlayan İlahi cilvələr tələbini təkrar etmək istəyir.**

Beyt 5: **Qiyas et şəmdən, vəhm eylə çərxin inqilabından**
**Kim, ol baş almağa qəsd etməyincə taci – zər verməz.**

**Anlam: Bu beyt, mənəvi mərtəbələrin dünyəvi məqamlar kimi alqı – satqı (müamilə) qanununa tabeliyini, yaxud hər bir həqiqi dərəcəyə çatmağa bir özəl sərmayə hazırlamağı təlqin etmək istəyir.**

**Qeyd** 1: *Şəm və taci-zər qeyri hissi bir əmri hissiləşdirmək istəyir.*

**Qeyd** 2: *Baş almaq, zər tac vermək və çərxin inqilabı, "hər bir şeyin öz ziddi ilə tanındığına[1]" işarə etmək istəyir.*

Beyt 6: **Bəla zimnində rahət olduğun izhar edər xəlqə**
**Fələk, bihudə xari – xüşkdən gülbərgi – tər verməz.**

Sözlük: Zimn – daxil = ara; Bihudə – yersiz; Xari-xuşk – quru tikan = ucu iti xul; Gülbərg – gül yarpağı

**Nişanə** 1. "Bəla": Bu beytdə, müxtəlif əzablar və sınaqlarıyla. Istedadsız aşiqi qabilləşdirmək vasitəsindən ibarətdir.

**Nişanə** 2. "Rahət": Bu beytdə ürəyə yatan mənəvi haldan yaxud daxili həyatdan nişanədir.

**Nişanə** 3. "Fələk": Bu beytdə, təbiət dünyasını dolandıran tədbirdən ibarətdir.

**Anlam: A: Solğun pöhrəyə həyat və təravət verən təbii tədbir İlahi həyatdan məhrum qalmış daxili vücudu yenidən canlandıran mənəvi tədbirdən aydın bir nümunədir.**
**B: İstedadsız aşiqin qabilləşməyi, qurumuş pöhrənin yenidən canlanmağı kimi, müxtəlif çətinliklərə dözmək ilə şərtlənir.**

Beyt 7: **Füzuli, dəhrdən kam almaq olmaz olmadan giryan,**
**Sədəf su almayınca əbri – nisandan gühər verməz.**

---

[1] ورنریگر، پایدیا، ص 994

Sözlük: Dəhr – ruzgar = zaman = dövrə = əsr; Əbri-neysan – neysan buludu; gühər – gövhər

**Nişanə** 1. “Kam”: Bu beytdə hədəflərə çatmaqdan nişanədir.

**Nişanə** 2. “Giryanlıq”: Bu beytdə heyrət, hicran, qəbz və digər əzabverici səbəblər ilə maddi küdurətədn təmizlənib mənəvi işıqlığa yön almaqdan nişanədir.

**Anlam: Bu beyt də ötən beyt kimi mənəvi tərbiyələr əzabını, nəhayət, səbrlilik zərurətini təkid edir.**

## Q Ə Z Ə L 121

**(1) Nəmi - əşkim mükəddər xatirimdən dəfi – qəm qılmaz,**
**Bu rövşəndir ki, nəm ayinədən jəngarı kəm qılmaz.**

**(2) Xəmi - əbruyi – mişkinini görsə zahidi – kəcbin,**
**Dəxi qamət sücudi – guşeyi – mehrabə xəm qılmaz.**

**(3) Sənə, ey şuxi – səngindil, demən büt, necə kim, büt həm**
**Əgərçi səngdildir, böylə bidadü sitəm qılmaz.**

**(4) Cəfavü cövr ilə qan oldu bağrım, yarəb, ol bədxu**
**Neçün tərk eyləməz cövrü cəfasın, bir kərəm qılmaz?**

**(5) Muradım giryədən kəsbi – qübari – rəhgüzarındır,**
**Gözüm yaşı dəmadəm çöhrəmi bihudə nəm qılmaz.**

**(6) Xətin dövründə əşki – al ilə dərdü qəmim şərhin,**
**Dəm olmaz kim, rüxi – zərd üzrə müjganım rəqəm qılmaz.**

**(7) Füzuli xəstedel ta rövzeyi – kuyində sakindir,**
**Təmənnayi – behiştü meyli – gülzari – İrəm qılmaz.**

Beyt 1: **Nəmi - əşkim mükəddər xatirimdən dəfi – qəm qılmaz,**
**Bu rövşəndir ki, nəm ayinədən jəngarı kəm qılmaz.**

Sözlük: Əşk – göz yaşı; Mükəddər – qəmgin = tarlaşmış; Rövşən – aydın = zahir = nurlu; Zəngar – pas

**Nişanə** 1. “Nəmi-əşk”: Bu beytdə maddi vücud ilə tarlanmış mənəvi vücudu, yaxud mükəddər xatiri durultmaqdan ötrü kifayətsiz vasitədir.

**Nişanə** 2. “Mükəddər xatir”: A: İlahi cəlalər əks etdirmək istedadını əldən vermiş daxili vücuddan ibarətdir.

B: İlahi əhval iqamətindən məhrum qalmış qəlbdən nişanədir.

**Qeyd** 1: *İlahi əhval iqamət etmiş xatir Allah-taalanın xüsusi mülkündən ibarətdir.*

**Qeyd** 2: *İlahi vasitələr ilə maraqlanmış xatir, məlaikə mülkündən ibarətdir.*

**Qeyd** 3: *Dünyəvi ilgilər ilə maraqlanmış xatir nəfəs mülkündən ibarətdir.*

**Qeyd** 4: *Günahlar həvəsi ilə maraqlanmış xatir şeytan mülkündən ibarətdir.*[1]

**Nişanə** 3. *“Qəm”: Bu beytdə tarlanmış xatirin təşviş etməyindən nişanədir.*

**Anlam: Pas bağlamış güzgünü yaş dəstmal ilə parıldatmaq kimi mükəddər xatiri nəme-əşk ilə silib təmizləmək mümkünsüz bir işdən ibarətdir.**

**Qeyd** 1: *Maddi vücud küdurətini yuyub – təmizləməyə, nəm göz yaşı yox, bəlkə də selləmə göz yaşı lazımdır.*

**Qeyd** 2: *Tarlanmış şəraitdə həqiqət tanışlığı daha çətin və bir çox yol mümkünsüz olduğundan: Əflatun maddi vücudu, mərifət qarşısında dikəlmiş bir maneə kimi vəsf edərək, bədən hicabında əsir olmuş ruhu, həqiqi idrak və xalis mərifət nailiyyətindən məhrum bilmişdir.*[2]

**Qeyd** 3: *Maddi vücud tarlığından azad olmaq məqsədilə Mövlana Füzuli buyurur:*

*Qəd ənarəl-eşqə -lil üşşaqi minhacəl hüda!*
*Saliki-rahi-həqiqət eşqə eylər iqtida.*

Beyt 2: **Xəmi - əbruyi – mişginin görsə zahidi – kəcbin,**

---

[1] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

[2] Bertrand Rassel, Tarixi-fəlsəfeyi-Qərb, tərcümə Nəcəf Dəryabəndərinindir, səh.211

**Dəxi qamət sücudi – guşeyi – mehrabə xəm qılmaz.**

Sözlük: Xəmi - əbru = qaş əyriliyi; Kəcbin – düzü əyri görən = çər = səhvedən; Sücud – səcdə etmək; Mehrab – peyğəmbərin namaz qıldığı yer = evin yuxarı başı = məclisin yuxarı başı; Xəm – əyri = hilali

**Nişanə** 1. "Xəmi - əbruyi - mişgin": Allahın əzəmətini əks etdirən, lütf rayihəli qəhrindən istiarədir.

**Nişanə** 2. "Kəcbin": Mənəvi vücudu tarlandıran sədəmələrin nəticəsindən nişanədir.

**Nişanə** 3. "Mehrab guşəsinə səcdə etmək":

A: İbadətin həqiqətini onun qanun-qaydasına fəda etməkdən nişanədir.

B: İbadət nailiyyyətini öz fikrinə həsr etməklə özündən razı olmaq nişanəsidir.

**Anlam: Öz daxili vücudunu, xarici bağlantılar ləkəsindən təmizləyə bilmiş bir zahid isə ilahi əzəmətlər məşğulluğunda dini adab məhdudluğundan, nəhayət, özlüyündən bir aşiq kimi azad olmağa nail ola bilir.**

Beyt 3: **Sənə, ey şuxi – səngin dil, demən büt, necə kim, büt həm**
**Əgərçi səngdildir, böylə bidadü sitəm qılmaz.**

Sözlük: Səngin dil – daş ürəkli = ürəyi bərk

**Nişanə** 1. "Şuxi – səngin dil": Aşiqi ətəş və tələb atəşində tərbiyə edən Allah-taaladır.

B: Aşiqin ətəş və tələb atəşində yanmağına razılığ vermiş mürşid həzrətindən ibarətdir.

**Nişanə** 2. "Büt": Aşiqin  əqlini – idrakını, yaxud bütün bədən qüvvələrini daş kimi qorudub eşidən qoyan, tərbiyəvi qəhrlərə, yaxud onu "heyrət" ünvanlı məqama qaldıran çətinliklərə eyham edən nişanədən ibarətdir.

**Nişanə** 3. "Bidadü sitəm": Maddi vücud hicabından can qurtarmağa hazırlayan hikmət mənşəli əzablardan ibarətdir.

**Anlam: Xatiri durulmayan aşiqin nalələri, daşa təsir edə bilsə də, həkim məhbuba təsir edə bilməz.**

**Qeyd:** Bu anlam, aşiqi istedad qazanmağa təşviq etmək istəyir.

Beyt 4: **Cəfavü cövr ilə qan oldu bağrım, yarəb, ol bədxu**

**Neçün tərk eyləməz cövrü cəfasın, bir kərəm qılmaz?**

**Nişanə** 1. "Cəfavü cövr": Bax: Ötən beytə (bidadü-sitəm)

**Nişanə** 2. "Qan oldu bağrım": Bağrı qan olmaq – xatiri tarlandırmış fiziki əngəl mahiyyətini, yaxud mənəm – mənəmliyi batil etməyə hazırlaşmaqdan nişanədir.

**Nişanə** 3. "Bədxu": Bədxu isə səngin dil, cəfakar və digər beləcə sifətlər kimi "şəth" ünvanlı mərhələdə aşiqi qeyri ixtiyarı gileylənməyə məcbur edən nişanədən ibarətdir.

**Qeyd** 1: *Elə hal baş verə bilər ki, aşiq həyəcan, hicran, məcnunluq və məğlubiyyət vəziyyətində, həzrət mürşüdün özünə, hətta sevimli Allaha da, gileylər və etirazlar etsin.*[1]

**Qeyd** 2: *A: Şəth vəziyyəti ilə bağlı sözləri camaat arasında bəyan etmək küfr danışmağa bərabərdir.*

*B: Şəth vəziyyəti ilə bağlı sözlərin iradi halda aşkarca və yaxud xəlvəti bəyan olmağı küfr danışmağa bərabərdir.*

*C: Şəriət hakimi A və B mərhələsində şəth danışmış bir aşiqi cəzalandırmağa məcburdur.*

*D:Qeyri ixtiyari vəziyyətdə "şəth" demiş bir aşiqi cəzalanmağa məhkum etməyiblər. Çünki ixtiyarsız aşiq divanə kimidir və şəriət divanəni mühakimə etməyə hökm verməyibdir.*

**Anlam: Müxtəlif tərbiyəvi əzablar ilə bağrıqan olaraq xatır tarlığından azad olmağa hazırlaşmış, ancaq hələ də tənbehlər məhkumluğunda ilahi cilvələr nailiyyətindən məhrum yaşayıram.**

Beyt 5: **Muradım giryədən kəsbi – qubari – rəhgüzarındır,**
**Gözüm yaşı dəmadəm çöhrəmi bihudə nəm qılmaz.**

Sözlük: Giryə – ağlama = giryanlıq, rəhgüzər = yol = yolçu. Bihudə – yersiz = nəticəsiz

**Nişanə** 1. "Giryə": Bu beytdə daxili vücudu duruldan səbəbdən ibarətdir.

**Nişanə** 2. "Qubari – rəhgüzar": Ürfan mədəniyyətində bütün etibarlar, dəyərlər və mənalar baş – ayaq olan kimi[2], qubari-rəhgüzər, yaxud canan ərəfəsinin torpağında, xatir ünvanlı daxili vücudu

---

[1] Qəzəl 24, beyt 1
[2] Qəzəl 25, beyt 5

tarlandırmaq əvəzinə duruldar və cilalandırar.[1]

**Anlam: Mövlana Füzuli, “ləb-xəndan” ünvanlı “bəst” məqamına nail olmaq məqsədilə giryanlığı bəyənərkən: “Mənim kim bir ləb-xəndan üçün giryanlığım vardır” buyurduğu kimi, duru xatir, yaxud ilahi cəlalər əks etdirmək qabiliyyətini, giryanlığa bağlı təlqin etmək istəyir.**

Beyt 6: **Xətin dövründə əşki – al ilə dərdü qəmim şərhin,**
**Dəm olmaz kim, rüxi – zərd üzrə müjganım rəqəm qılmaz.**

Sözlük: Əşk – göz yaşı; Rüxi-zərd – saralmış surət; Müjgan – kirpiklər

**Nişanə** 1. “Xət”: Bu beytdə ilahi camal mənşəli rayihədən[2], yaxud vəhdət mənşəli kəsrətdən nişanədir.

**Nişanə** 2. “Əşki al”: Ürəyi tarlandırmış fiziki əngəl mahiyyətini karsız və batil edən nişanədən ibarətdir.

**Nişanə** 3. “Dərdü qəm”: Bu beytdə məcazi mahiyyətdən ayrılmağa hazırlayan çətinliklərdən nişanədir.

**Nişanə** 4. “Ruxi-zərd”: A: “Süluk” ünvanlı ilahi seyr nəticəsindən nişanədir.

B: Ruxi-zərd – ürəyi tarlandıran fiziki mahiyyətin fəaliyyətsiz olduğundan, nəhayət, onun süqut mərhələsinə çatmaq nişanəsindən ibarətdir.

**Nişanə** 5. “Müjgan”: Bu beytdə qara hicaba giriftar olmuş aşiqi tənbeh edən səbəbdən nişanədir.

**Anlam: Saralıb – solmuş surətim fiziki mahiyyət xəstəliyini sübut etməklə qəlbimin durulmağa hazırlaşmağını, yaxud ilahi camal cilvələrindən feyziyab olmaq istedadını təlqin etmək istəyir.**

**Qeyd:** Ulu şeyx Sədi Şirazi isə saralıb – solmuş üzü fiziki əngəl mahiyyətin sısqalanmağına əlamət bilib buyurmuş:

نوک مژگانم به سرخی بربیاض روی زرد
قصه دل می نویسد حاجت گفتار نیست[3]

[1] Qəzəl 34, beyt 3
[2] Qəzəl 48, beyt 1
[3] Sədi, Qəzəllər divanı, Təyyibat hissəsi

Beyt 7: **Füzuli xəstedel ta rövzeyi – kuyində sakindir,**
**Təmənnayi – behiştü meyli – gülzari – İrəm qılmaz.**

Sözlük: Rovze – bağ = gülzar

**Nişanə** 1. “Xəstədel”: Təriqət ünvanlı ilahi seyr yolunda azicləşmiş salikdən ibarətdir.

**Qeyd** 1: *Təriqət şəri hökmlərin məğzindən ibarətdir.*[1]

**Qeyd** 2: *Xəstədel olmaq – saliki öz məmlüklüyündən xəbərdar edərək, onu “kəsrət” başlanğıcı ikiliyindən azad etməklə vəhdət günəşinin cəlalərindən feyziyab olmağa hazırlaşdırar.*[2]

**Nişanə** 2. “Rövzeyi-kuyi”: Rövzeyi-kuy, “rəhman behişti” ünvanlı ilahi hüzur təsəvvürü ilə bəşəri iradə - ixtiyardan ayrı olmuş aşiqin təbiət dünyasına, həm də “rizvan behişti” adlı axirət nemətlərinə etinasızlıq etmək məqamından nişanədir.

**Anlam: Füzuli rəhman behiştindən feyziyab olan gündən rizvan behiştinə maraq göstərməkdən imtina etmişdir.**[3]

---

[1] Qəzəl 99, beyt 5, nişanə : “zöhdü təqva”
[2] Qəzəl 1, beyt 6, nişanə 2
[3] Qəzəl 11, beyt 1, nişanə 1

## Q Ə Z Ə L 122

**(1) Kuhkəndən görünür kuhdə asar hənuz,**
**Ol nə bənzər mənə, onun əsəri var hənuz.**

**(2) Çəkdi Məcnun ayağın badiyədən, leyk verir,**
**Qanlı güllər ayağından çəkilən xar hənuz.**

**(3) Vadiyi – eşqdə sevda ilə sərgəştə idim**
**Gəlmədən gərdişə bu günbədi – dəvvar hənuz.**

**(4) Nöqteyi – xalinə bağlanmış idi canü könül,**
**Gəzmədən daireyi – dövrdə pərgar hənuz.**

**(5) Mahə çəkdim şəbi – hicran ələmi – şöleyi – ah,**
**Ah kim, olmadı ol mah xəbərdar hənuz.**

**(6) Naleyi – zarım ilə xəlqə həram oldu yuxu,**
**Qarə bəxtim yuxudan olmadı bidar hənuz.**

**(7) Mərhəmi – vəsli ilə buldu hamı dərdə dəva,**
**Bu Füzuli ələmi – hicr ilə bimar hənuz.**

Beyt 1: **Kuhkəndən görünür kuhdə asar hənuz,**
**Ol nə bənzər mənə, onun əsəri var hənuz.**

Sözlük: Kuhkən – dağ qoparan = dağ qazan = Fərhadın ləqəbi;

Kuh – dağ; Hənuz – hələ

**Qeyd** 1: *İkilik ünvanlı kəsrət başlanğıcını itirib yox etmək vəhdət məqamına qovuşmaq nailiyyətinin əsas şərti olduğundan Xacə Əbdüllah Ənsari buyurmuş: "İlahi yetkinlik hamıya məsiyyətdirsə mənə qənimətdir."*[1]

**Qeyd** 2: *Aşiqin adı – sanı (asarı) onun başındakı fikirləri və zehnini doldurmuş elmləri və təcrübələri kimi ayrı – ayrılıqda ikilik, hətta neçəlik yaradan əngəllər və hicablardan ibarətdir.*[2]

**Qeyd** 3: *Mövlana Füzuli vəhdət mülkünü tələb etmiş bir aşiq üçün maddi vücuddan, yaxud fiziki mahiyətdən azad olmağı kifayətləndirici görməyib, ondan "hərf" ünvanlı ad və əsər qalmağı da tanıtdırmaq məqsədilə buyurmuş:*

***Eşq kilki çəkdi xət hərfi-vücud aşiqə***
***Kim ola sabit həq isbatında nəf'i-maidə***[3]

**Qeyd** 4: "*Lisanül-qeyb" adı verilən Hafiz isə eşq atəşində alovlanmış aşiqlər külünün havaya sovrulmağını təmənna etməklə onların əsər ünvanlı əngəldən (kül) azad olmaqlarını tələb etmiş:*

روی بنمای و وجود خودم ازیاد ببر
خرمن سو ختگان را همه گو بادببر [4]

**Anlam: Adını - əsər-əlamətini tamamilə unutmayan bir aşiq, özünü Fərhad kimi fədakarlıq və qurbanlıq məqamına çatdırsa da, kamal zirvəsinə, yaxud vəhdət məqamına nail ola bilməyən naqis bir aşiq hesaba alınmalıdır. Demək, Füzuli kimi adını – əsər-əlamətini unutmuş, yaxud yox dərəcəyə çatmış bir aşiq sadiq və kamil aşiq deməkdir.**

**Qeyd:** *Özünü yox dərəcəyə çatdırmayan aşiqin qurban olmağını məlamət etmək və cərimələndirmək məqsədilə Hafiz: "* ان اصطبرت قتيلا و قاتلی شاکی *" buyurmuşdur*[5]*:*

---

[1] Qəzəl 1 , beyt 6, qeyd 3
[2] Qəzəl 2, beyt 6, qeyd 2
[3] Qəzəl 1, beyt 6, qeyd 2
[4] Müəllif bu beyti "Ta Qafe-əndişe" kitabının 3-cü cildində izah etmişdir.
[5] Qəzəl 7, beyt 2, qeyd 3

Beyt 2: **Çəkdi Məcnun ayağın badiyədən, leyk verir,**
**Qanlı güllər ayağından çəkilən xar hənuz.**

Sözlük: Badiyə – çöl = biyaban = səhra; Leyk – lakin

**Anlam: Məcnuna kamil aşiq demək düzgün ola bilməz. Çünki onun ayağından çəkilən qanlı tikanlardan bitmiş qızıl güllər, hələ də səhranı onun əlaməti ilə doldurulmuşlar. (Hələ də səhrada Məcnundan ad var)**

**Qeyd:** *İrfan mədəniyyətində bütün etibarların, dəyərlərin, baxımla-rın, anlamların "baş – ayaq " ünvanlı qanun tabeliyində olduqlarına diqqət yetirməklə tikandan gül bitməyi mənalandırmaq asan olur.*[1]

Beyt 3: **Vadiyi – eşqdə sevda ilə sərgəştə idim**
**Gəlmədən gərdişə bu günbədi – dəvvar hənuz.**

Sözlük: Sərgəştə = sərgərdan = avara = heyran, günbədi dəvvar = fırlanan günbəz = asiman = fələk

**Nişanə** 1. "Vadiyi-eşq": İlahi sirr ilə canlanmış cahana sığmaz ürəyin seyr etdiyi aləmindən ibarətdir.

**Qeyd:** Sinədə çırpınan qəlb, eşq vadisini seyr edən ürəyin təxtindən ibarətdir.

**Nişanə** 2. "Sevda": İlahi sirr ilə canlanmış ürəyi ülvi aləmdə seyr etdirən mənəvi məcnunluqdan ibarətdir.

**Nişanə** 3. "Sərgəştə": İlahi əzəmətlər önündə əqlini, idrakını quru ağac kimi karsız hiss etməklə heyran qalmış aşiqdir.

**Anlam: Mən eşq vadisini bir Məcnun kimi dolanan zaman, yer- göy yaxud təbii dünya, hələ yaranılmamışdı.**

**Qeyd:** *Bu anlam: A: Eşqin, "ələst" ünvanlı ülvi aləmdən nazil olduğunu, nəhayət, müqəddəsliyini bildirir.*[2]

*B: Mövlana Füzuli:*

***"Canə dərdin, cismə peykanın rəvan etmişdi hökm***
***Cism ilə can irtibatı olmadan möhkəm hənuz"***

*deyə buyurduğunu təsdiq etməklə, aşiqin vücudunu da, onun qəlbi kimi pak və müqəddəs təlqin etmək istəyir.*

---

[1] Qəzəl 34, beyt 3, nişanə 1
[2] Qəzəl 19, beyt 4, qeyd

Beyt 4: **Nöqteyi – xalinə bağlanmış idi canü könül,**
**Gəzmədən daireyi – dövrdə pərgar hənuz.**

**Nişanə** 1. “Nöqteyi-xal”: Bu beyt də yaranış dairəsinin bəşəri idraka sığmaz mərkəz nöqtəsindən, yaxud ilahi gizli sirrdən ibarət olunduğuna nişanədir.

**Qeyd:** *İki aləm, yaxud dünyəvi və mənəvi kainat, xal nöqtəsini dövr etməklə, ziyarət feyzinə nail olaraq, nur və həyat əxz etməkdədirlər.*

**Nişanə** 2. “Can”: Bu beytdə dünyəvi həyat vasitəsindən nişanədir.

**Nişanə** 3. “Könül”: Bu beytdə mənəvi həyat vasitəsindən nişanədir.

**Anlam: Şair ötən beytin mənasını təkid etmək məqsədilə buyurur:**

Mən, kəsrət ünvanlı kainat yaranışından əvvəl, vəhdət nöqtəsini ziyarət etdiyim vaxt nur və həyat əxz edirdim.

**Qeyd:** *Yuxarıda xatırladığımız iki beyt birlikdə, islam peyğəmbərinin bütün kainatdan əvvəl yaranmış nuruna eyham etməklə həkim Nizaminin:*

”تخته ی اول که الف نقش بست          بر در محجوبه ی احمد نشست[1]“

*buyurduğunu təsdiq edərək, insanın maddi vücudundan əvvəl yaranmış, mənəvi vücuduna, yaxud onun ilahi əslinə işarə etmək istəyir.*[2]

Beyt 5: **Mahə çəkdim şəbi – hicran əlləmi – şöleyi – ah,**
**Ah kim, olmadı ol, mah xəbərdar hənuz.**

Sözlük: Mah – mahtab = ay; Şəbi-hicran – hicran gecəsi

**Nişanə** 1. “Hicran”: A: Mərifət mülkünə səfər etməkdən ibarətdir.

B: Məruf ünvanlı Allah-taala mülkünə səfər etməkdən ibarətdir.

C: Mərifət mülkü – bəşəri əndişə və elm ilə əlaqədardır.

E: Mərifət mülkü – İlahi cazibələr ilə əlaqədardır.[3]

**Nişanə** 2. “Şöleyi-ah”: Bu beytdə kəsrət mənalarını, xüsusilə məcazi mənliyini yandırıb aradan qaldıran “nari-məhəbbət”dən nişanədir.

**Qeyd:** *“Nari-məhəbbət” – şühud mərtəbəsindən əvvəl, “şövq” mənzilini dərk etmiş aşiqin qəlbinə daxil olan ilk məhəbbətdən ibarətdir. Bu məhəbbət, Allah-taala ilgilərindən başqa ilgiləri tamamilə yandırıb külünü şühud vasitəsinə tapşıran məhəbbətdir.*

**Nişanə** 3. “Şəbi-hicran”: Məruf ölkəsini tələb edən aşiqin biqərarlığından nişanədir.

---

[1] Nizami. Məxzənül-əsrar, həzrəti Peyğəmbərin vəsfi
[2] Qəzəl 112, beyt 3
[3] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

**Nişanə** 4. “Mah”: Bu beytdə qaraca kəsrəti şəffaf güzgü edib onda camal nurunu əks etdirmiş vahid məhbubdan nişanədir.

**Nişanə** 5. “Xəbərdar olmamaq”: Məruf ölkəsinə səfər etmək vasitəsini hazırlaya bilməyən aşiqi tənbeh edən qəhrdən ibarətdir.

**Anlam: Dünyəvi ilgiləri yandırıb külünü şühud vasitəsinə tapşırdım. Lakin müşahidə məqamına nail ola bilmədim.**

Beyt 6: **Naleyi – zarım ilə xəlqə həram oldu yuxu,**
**Qarə bəxtim yuxudan olmadı bidar hənuz.**

Sözlük: Bidar – oyaq

**Nişanə** 1. “Naleyi-zar”: Məhəbbət atəşində məğlub olmuş ürəyin özəl münacatından, biqərarlığından ibarətdir.

**Nişanə** 2. “Bəxti-siyah”: Məruf mülkünə səfər etmək vəsaitini hazırlaya bilməyən aşiqin ilahi cazibələrdən məhrum olmaq nişanəsidir.

**Nişanə** 3. “Yuxu”: A: Yuxu birinci misrada xarici vücudunu ruhun nurundan məhrum etmiş addi bəşərdən ibarətdir.

B: Yuxu, ikinci misrada şühud məhrumluğundan nişanədir.

**Nişanə** 4. “Bidar”: Xarici və daxili vücudunu ruhun nurundan bəhrələndirmiş, beləliklə ilahi cəlalar nailiyyətinə hazırlaşmış aşiqdən ibarətdir.

**Anlam: Ürək münacatım bütün aləmə təsir etdiyi halda şühud nailiyyətinə kifayət etmədi.**

Beyt 7: **Mərhəmi – vəsli ilə buldu hamı dərdə dəva,**
**Bu Füzuli ələmi – hicr ilə bimar hənuz.**

**Nişanə** 1. “Mərhəmi-vəsl”: Məşuqla aşiq arasında olan fasiləni yox dərəcəsinə çatdıran vasitədən ibarətdir.

**Nişanə** 2. “Dərd”: Bu beytdə vüsal biqərarlığından ibarətdir.

**Anlam: Bir çox biqərar aşiqlər ilahi cazibələr ilə məruf mülkünə yaxud vəhdət ərəfəsinə yaxınlaşdılar, lakin Füzuli tələb və həsrət vadisində hələ də sərgərdandır.**

## Q Ə Z Ə L 123

**(1) Ey könül, ol xəncəri – müjganə eylərsən həvəs,**
**Qəsdi – can etdin, bəqayi – ömrdən ümmid kəs.**

**(2) Çəkmə qürbət əzminə, ey sariban məhmil, saqın**
**Kim, bu yolda bimi – qürbətdəndir əfğani-cərəs.**

**(3) Hali – zarimdən səni fəryadim agah eylədi,**
**Şükrlillah, oldu fəryadım mənə fəryadrəs.**

**(4) Bir – birinə bəs ki, sancıldı tənimdə oxlarım,**
**Mürği – ruhum qeydinə oldu mürəttəb bir qəfəs.**

**(5) Təneyi - əhli – məlamətdən nə nöqsan aşiqə,**
**Bərqi – lame dəfin eylərmi hücumi – xarü xəs?**

**(6) Suzi – eşqin təndə nagəh bulmasın nöqsan deyib,**
**Can çıxınca istərəm çıxmaya təndən bir nəfəs.**

**(7) Ey Füzuli, mən qənaət mülkünün sultaniyəm,**
**Səltənət isbati əynimdə pəlasi – fəqr bəs.**

Beyt 1: **Ey könül, ol xəncəri – müjganə eylərsən həvəs,**
**Qəsdi – can etdin, bəqayi – ömrdən ümmid kəs.**

Sözlük: Müjgan – kipriklər; Bəqa – davam = davam etmək

**Nişanə** 1. "Könül": Bu beytdə "bəst" məqamına nail olmuş qəlbdən, yaxud qeyri maddi əhvali-ruhiyyə ilə fərəhlənmiş ürəkdən ibarətdir.

**Nişanə** 2. "Xəncəri-müjgan": Bu beytdə şühud aləmindən pəncərə açmaq məqsədilə ürəyi yaran ilahi qəmzələrdən nişanədir.

**Nişanə** 3. "Həvəs": Bu beytdə aşiqi öz ilahi əslinə qaytarıcı meyldən ibarətdir.

**Nişanə** 4. "Can": A: Can – İlahi mərifət idrakından aciz olan, " heyvani can", yaxud "birinci can", ya da bədən canından ibarətdir.

B: Can – İlahi mərifətləri əxz etməyə layiq olan "ikinci can", yaxud ürək canı, ya da həkim Nizami buyurduğu mənəvi və həqiqi candan ibarətdir:

زنده به جان خود همه حیوان بود      زنده به دل باش که جان آن بود[1]

**Anlam: A: Ey könül, Allahın qəmzələr meyl göstərmək birinci canı məqamına fəda etmək, yaxud qurban məqamına hazırlaş-maq nişanəsidir.**

B: Ey könül, mütəal məhbubun qəmzələr satmaqlarına meyl göstərmək ikinci yaxud həqiqi həyat ilə canlanmanın müqəddiməsidir.

Beyt 2: **Çəkmə qürbət əzminə, ey sariban məhmil, saqın**
**Kim, bu yolda bimi – qürbətdəndir əfğani cərəs.**

Sözlük: Sarban – sarvan; Məhmil – kəcavə; Bim – qorxu = xovf, əfgan = fəğan; Cərəs – zəng

**Nişanə** 1. "Qürbət": Aşiqin dünyəvi yaşayışından əvvəl yaşadığı mənəvi həyat mülkündən, yaxud vəhdət aləmindən, ya da Hafiz buyurduğu behiştdən ibarətdir.[2]

من ملک بودم و فردوس برین جایم بود
آدم آورد در این دیر خراب ابادم[3]

**Nişanə** 2. "Bimi qürbət": Vəhdət mülkünə, yaxud mənəvi həyat aləminə yol almış aşiq önündə baş qaldırmış dünyəvi ölçülərə - istiqamətlərə sığmayan ən çətin təhlükələr qorxusundan ibarətdir.

---

[1] نظامی، مخزن الاسرار
[2] Qəzəl 34, beyt 7, anlam
[3] Müəllif bu beyti "Ta Qafe-əndişe" kitabının 3-cü cildində şərh etmişdir

**Nişanə** 3. “Cərəs”: Bu beytdə “ələst”[1] aləmindən nazil olmuş ilahi heybət, yaxud “icmali qəhr” mərhələsinə eyham edən nişanədən ibarətdir.

**Anlam: Dünya və axirət ilgilərindən təmamilə azad olmaqdan əvvəl, vəhdət aləminə yaxud “məruf” ünvanlı mütəal məbud mülkünə[2] səfər etmək məqsədi ilə yol almaq bəşəri taqətlərə sığmayan, mənəvi qəhrlər və heybətlər ilə qarşı çıxmağa görə ən çətin və daha xətərnakdır.**

**Qeyd:** *Dünya axirətin və axirət dünyanın (rəhman behiştinin[3]) rəqibi olduğundan, aşiq üçün iki dünyadan əl götürmək vacib olmuşdur. Elə buna görə də Əmirəlmöminin Əli (ə) buyurmuşdur:*

“ الدنيا حرام على اهل الاخره و الاخره حرام على اهل الدنيا و هما حرامان على اهل الله”*: (Dünyanı dost tutmaq axirət əhlinə, axirət ilə dostluq isə dünya əhlinə həram olunmuşdur. İkisi də ( dünya və axirət), “əhl - Allah” ünvanlı vəhdət aşiqlərinə haramdır.)*

Beyt 3: **Hali – zarimdən səni fəryadim agah eylədi,**
**Şükrlillah, oldu fəryadım mənə fəryadrəs.**

Sözlük: Agah – xəbərdardar; Fəryadrəs – dadına dad vermək = köməyinə çatmaq

**Nişanə** 1. “Hali zar”: Öz dünyəvi sifətlərini, yaxud bəşəri mahiyyətini eşq atəşində şöləlәndirmiş aşiqin vəziyyətindən nişanədir.

**Nişanə** 2. “Fəryad”: Vəhdət mülkünə qəribsəmiş ürəyin, özəl münacatından ibarətdir.

**Nişanə** 3. “Agah olmaq”:Bu beytdə aşiqin istedadını təsdiq etməkdən istiarədir.

**Anlam: Eşq atəşində şölələnmiş qəlbdən qopmuş özəl münacatım “qurbanlıq” məqamına hazırlaşmağımı sübut edir.**

Beyt 4: **Bir – birinə bəs ki, sancıldı tənimdə oxlarım,**
**Mürği – ruhum qeydinə oldu mürəttəb bir qəfəs.**

Sözlük: Mürğ = quş; Qeyd – həbs etmək = ayağını bağlamaq

---

[1] Qəzəl 19, beyt 4
[2] Qəzəl 122, beyt 5, nişanə “hicran”
[3] Qəzəl 111, beyt 1, qeyd 2

**Nişanə** 1. “Ox”: Ötən beytdə qeyd olunmuş “hali-zar” məqamına hazırlayan, yaxud qurbanlıq mərtəbəsinə çatdıran qəbzlər və qəmzələrdən nişanədir.

**Nişanə** 2. “Mürği ruh”: İrfan səmasında seyr ilə məşğul olmuş batini vücuddan nişanədir.

**Nişanə** 3. “Qeyd etmək”: Batini vücudu seyrdən dayandıran tərbiyəvi maneələrdən nişanədir.

**Nişanə** 4. “Qəfəs”: Bu beytdə qeyd mərhələsini təkrar edən nişanədən ibarətdir.

**Anlam: Qəfəs yaxud “hali-zar” şəraitini davamlayan mərhələ İlahi məqsəd nailiyyətinə aydın müqəddimədir.**

Beyt 5: **Təneyi-əhli-məlamətdən nə nöqsan aşiqə,**
**Bərqi-lame dəfin eylərmi hücumi-xarü xəs?**

Sözlük: Bərqi-lame – parlaq işıq; Xarü xəs – çör-çöp

**Nişanə** 1. “Tənə”: Aşiqin fiziki mahiyyətini təhqir etməklə onu maddi vücud hicabından azad olmağa hazırlayan səbəbdən nişanədir.

**Nişanə** 2. “Əhli-məlamət”: Eşq prinsiplərindən xəbərsiz camaatdan ibarətdir.

**Nişanə** 3. “Bərqi-lame”: Uca Allah camalından parlayan nur vasitəsilə aşiqin qəlbində yaranmış “qürb”, yaxud vüsala çatdıran birinci qüvvəni eyham edən nişanədən ibarətdir.

**Anlam: Əql əhlinin tənəli tədbirləri eşq atəşinin bərabərində həqir olan çör – çöp kimi məhv olmalıdır.**

Beyt 6: **Suzi-eşqin təndə nagəh bulmasın nöqsan deyib,**
**Can çıxınca istərəm çıxmaya təndən bir nəfəs.**

Sözlük: Söz – hərarət; Nagəh – lapdan-lapa = vaxtsız

**Nişanə** 1. “Suzi-eşq”: Allah-taala eşqindən başqa eşqi, fikri, bağlantını (rəqibləri) hətta özlüyünü yandırıb, külünə süpürgə çəkmiş hərarətdən ibarətdir.[1]

**Nişanə** 2. “Can”: Bax beyt 1, nişanə 4, A

**Anlam: Suzi-eşq kamala çatdıran əsas vasitə olduğundan son nəfəsə qədər alqışlanmalı və mühafizə olmalıdır.**

---

[1] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

Beyt 7: **Ey Füzuli, mən qənaət mülkünün sultaniyəm,**
**Səltənət isbabi əynimdə pəlasi – fəqr bəs.**

Sözlük: Əsbab – səbəblər; Pəlas – palaz; Fəqr – fağırlıq

**Nişanə** 1. “Qənaət”: A: Yalnız ulu Tanrıdan hacət diləməkdən ibarətdir.

B: Abu Turab Nəxşəbinin “القناعه اخذ القوه من الله” buyurduğu kimi, qənaət yalnız mütəal məbud eşqi ilə qüvvəyə minməkdən ibarətdir.[1]

C: Xalqın əlində olanı tərk, və öz əlində olanı bəxş etməkdən ibarətdir.

**Nişanə** 2. “Sultan”: Bu beytdə ürəyini mənəvi hallar fəth etmiş aşiqdən ibarətdir.

**Qeyd:** *İrfan mədəniyyətində bütün mərtəbələr, məqamlar, hətta bütün sözlər, məna cəhətindən deyildikcə şərab, meyxana, dilənçi, yoxsul, fağır, palaz və bir çox mənfi mənalı kəlmələr müsbət mənalar kəsb edir. Beləliklə, özünü yoxsulluq palazına bürümüş aşiq isə həqiqi var – dövlət əldə etməyə nail olur. Demək, irfan baxımı fəqri səltənət bilir və səltənəti fəqr bilir. Elə bu mədəniyyət və bu baxımla həkim Xaqani buyurmuşdur:*

پس از سی سال روشن گشت بر خاقانی این مطلب
که سلطانیست درویشی و درویشیست سلطانی

**Anlam: Ey Füzuli, mən mənəvi mərtəbələr qarşısında, əngəllər törətmiş məcazi iqtidar – etibardan çəkinməklə, həqiqi dövlətlənmək məqamına nail oldum.**

---

[1] Göstərilən kitab

## Q Ə Z Ə L  124

**(1) Xaki – rəh etdi aşiqi – miskini ol həvəs**
**Kim, paybusi – yarə qaçan bula dəstrəs.**

**(2) Razi – dəruni dışraya salmaq rəva degil,**
**Budur günahı kim, asılır müttəssil cərəs.**

**(3) Didari – dustdur iki aləm nəticəsi,**
**Yox ondan özgə aşiqə aləmdə mültəməs.**

**(4) Sinəm həvayi – eşqin ilə doldu ney kimi,**
**Dəm urduğumca ahü fəğandır çıxan nəfəs.**

**(5) Hər qeyd olursa məhz bəladır ki bülbülə**
**Gər şaxi – güldən olsa, küdurət verir qəfəs.**

**(6) Ol qəmzədən, könül, əgər istərsən iltifat,**
**Tiği – təcərrüd ilə cahandan əlaqə kəs.**

**(7) Olmaz vücudi – aşiqə eşq içrə etibar,**
**Dözməz, Füzuli, atəşi – suzanə xarü xəs.**

Beyt 1**: Xaki – rəh etdi aşiqi – miskini ol həvəs**
**Kim, paybusi – yarə qaçan bula dəstrəs.**

Sözlük: Xaki rəh – yol torpağı; Paybusi – ayağı öpmək = ayağı öpən; Dəstrəs – əl tapmaq

**Nişanə** 1. "Xaki-rəh": Bu beytdə öz ürəyini dünyəvi ilgilərdən boşaltmaqla "ixtiyari ölüm" ünvanlı mərtəbədə [1] , yaxud İslam peyğəmbəri buyurduğu: "موتو قبل ان تموتو و[2]" vəziyyətində fiziki mahiyyətini bir ölü kimi fəaliyyətsiz etmiş aşiqdən ibarətdir.

**Nişanə** 2. "Miskin": Miskinlik xaki-rəhə mərtəbəsinə çatdıran müqəddimədən ibarətdir.

**Nişanə** 3. "Paybusi": Miskin aşiqin öz məmlüklüyünü [3] etiraf etməyindən ibarətdir.

**Anlam: Miskin aşiq, öz məmlüklüyünü nişan vermək məqsədilə özünü xaki-rəh mərtəbəsinə çatdırmışdır.**

Beyt 2: **Razi – dəruni dışraya salmaq rəva degil,**
**Budur günahı kim, asılır müttəssil cərəs.**

Sözlük: Razi-dəruni = batini sirr; Cərəs – zəng

**Nişanə** 1. "Razi-dəruni": Sözə - bəyana sığmaz daxili əhvali-ruhiyyədən ibarətdir.[4]

**Nişanə** 2. "Asılır": Asılmaq tərbiyəvi tənbehlər işgəncəsinə işarə edən nişanədən ibarətdir.

**Anlam: "Baş verər, sirr verməz" sözünü müqəddəs bir qanun kimi icra etməyib "şəth" demiş, yaxud şikayətlənmiş aşiq[5], zəng kimi asılmalı, yoxsa işgəncə görməlidir.**

Beyt 3: **Didari – dustdur iki aləm nəticəsi,**
**Yox ondan özgə aşiqə aləmdə mültəməs.**

Sözlük: Didar – görmək = görmüş; Mültəməs – hacət = təmənna

**Nişanə** 1. "Didari-dust": Dünya və axirətə sığmayan mütəal Allahın

---

[1] Ixtiyari ölüm dünyəvi ləzzətlərə arxa çevirmiş aşiqi xüsusi mərifət ilə insanlığın ən uca zirvəsinə qaldıran mərhələdən ibarətdir.
[2] Qəzəl 70, beyt 2, nişanə 2, qeyd
[3] Qəzəl 1, beyt 6, nişanə 2
[4] Qəzəl 114, beyt 1 "razi-eşq"
[5] Göstərilən qəzəl, anlam

cilvəsini dərk etməkdən ibarətdir.

**Qeyd** 1: *İnsan özü sonsuz aləm olduğundan, Allahın camalını özündə, yaxud batini vücud güzgüsündə müşahidə etməlidir, buna görə Oğustinus Qiddis hər insanı o dost tutduğu şeydən ibarət bilmişdir.*[1] *Beləliklə, yalnız özünü tanımış bir aşiq mütəal məhbub tanışlığına nail ola bilir.*

**Qeyd** 2: *Aşiq istədiyini, yaxud tələb etdiyi məhbubu tam şəkildə tapmaq istəyir, lakin onu tamamilə öz batinində, yaxud özündə tapmalıdır. Çünki məhbubu qıraqda gəzmək ikilikdən nişanə olduğuna görə vəhdət ilə müxalifdir.*[2]

**Anlam: Bu beyt, dünyanı axirət ilə birlikdə İlahi camal tanışlığına, yaxud vəhdət mərkəzi ünvanlı Pərvərdigarın hüzuruna tərbiyəedici məktəb kimi tanıtdırmaq istəyir.**

Beyt 4: **Sinəm həvayi – eşqin ilə doldu ney kimi,**
**Dəm urduğumca ahü fəğandır çıxan nəfəs.**

**Nişanə** 1. “Sinə”: Fiziki – fani təbiəti, mənəvi – ölməz mahiyyətə çevirən elm ilə dolmuş ürəkdən ibarətdir.[3]

**Nişanə** 2. “Həvayi-eşq”: Mütəal məhbub hüzurundan nazil olunmuş xüsusi rayihədən ibarətdir.

**Qeyd:** *İlahi özəl rayihədən bəhrələnmək dərəcəsini, irfani əhvalata nail olmaq mərtəbəsindən daha üstün bilmişlər.*

**Nişanə** 3. “Ney kimi dolmaq”: Mənəvi ölməz həyata, dübarə malik olmaq, yaxud namütənahi əslə qayıtmaq nailiyyətindən nişanədir.[4]

**Nişanə** 4. “Ah və fəğan”: Bu beytdə ney məqamına nail olmuş qəlbin xüsusi şükr və özəl münacatından nişanədir.

**Anlam: İlahi özəl rayihədən bəhrələnmiş ürəyim bir nəfəs qədəri şükr və münacatdan qalmayır.**

Beyt 5: **Hər qeyd olursa məhz bəladır ki bülbülə**
**Gər şaxi – güldən olsa, küdurət verir qəfəs.**

Sözlük: Qeyd – həsar = maneə

---

[1] Doktor Qasim Qəni, Tarixi-təsəvvüf dər İslam, cild 2, səh.340
[2] Qəzəl 32, beyt 7, qeyd 2
[3] Qəzəl 107, beyt 1, nişanə “xurşid”
[4] Qəzəl 1, beyt 2

**Nişanə** 1. “Bəla”: Bu beytdə həqiqi məşuqdan uzaq düşmüş aşiqi xəcalətləndirən mənfi müsibətdən ibarətdir.

**Qeyd:** *“Qürb” ünvanlı yaxınlıq hərarətindən hasil olmuş bəla günahlardan paka çıxaran müsbət müsibətdən ibarətdir.*[1]

**Anlam: Həqiqi məhbub məşğulluğundan başqa məşğulluq, xeyrli və müsbət olsa da, aşiqi xəcalətləndirən maneə hesab olunmuşdur. Elə buna görə də həkim Füzuli bir çox arif şairlər kimi özü məscid və namaz əhli olaraq namaz və məscid barəsində etirazlar rəva bilmiş.**[2]

**Qeyd:** *Bir çox hal baş verə bilərki, elm və mərifət məşğulluğu, insanı “məlum” və “məruf”dan*[3] *qafil saxlar. Buna görə də axirət və behişt fikri aşiqə hicab hesab olunur.*

Beyt 6: **Ol qəmzədən, könül, əgər istərsən iltifat,**
**Tiği – təcərrüd ilə cahandan əlaqə kəs.**

Sözlük: Təcərrüd – təcrid etmək = təcrid olmaq

**Nişanə** 1. “Qəmzə”: Gah iztirab, gah ümid törətmiş ilahi cazibələrdən ibarətdir.

**Nişanə** 2. “İltifat”: Aşiqi müşahidə ziyası ilə tərbiyə edən sifətdən nişanədir.

**Nişanə** 3. “Təcrid”: Etmək, iç vücudu çöl vücud ilə vahid paraleldə üryan edərkən mücərrədlik məqamına nail olmaq nişanəsidir.

**Qeyd** 1: *Çöl vücud üryanlığı dünyəvi istəkləri qat-qat soyub atmaqdan ibarətdir.*

**Qeyd** 2: *İç vücud üryanlığı dünyanı muzdsuz – mükafatsız yaxud əvəz-bədəlsiz tərk etməkdən ibarətdir.*[4]

**Anlam: Ey aşiq, özünü mənəvi müşahidə məqamına hazırlamaqla iç aləmə kök salmış dünyəvi xətərnak əngəlləri məğlub etməlisən.**

Beyt 7: **Olmaz vücudi – aşiqə eşq içrə etibar,**
**Dözməz, Füzuli, atəşi – suzanə xarü xəs.**

---

[1] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی
[2] Qəzəl 24, beyt 7, nişanə 1
[3] Qəzəl 122, beyt 5, nişanə “hicran (səfər)”
[4] Qəzəl 52, beyt 3

Sözlük: Suzan = yandırıcı; xarü xəs = çör-çöp

**Anlam: Mənəvi vüsal məqamını, yaxud məşuqla aşiq arasındakı fasilənin yox dərəcəsinə çatmağını istəyən aşiq, öz şəxsi vücudunu, yaxud özlüyünü, ya da mənəm-mənəmliyini eşq atəşində yandırıb kül etməklə fanilik məqamına çatmaq məcburiyyətində cəhd etməlidir.**

## Q Ə Z Ə L  125

**(1)  Göz yaşımdan suzi – pünhanım edər arif qiyas,**
**Bixəbər təsiri - əncümdən degil əxtərşünas.**

**(2)  Qan yetər kim, dəmbədəm gözdən yenib, örtər tənim,**
**Dəşti – qəm Məcnuniyəm, mən handanü handan libas?**

**(3)  Xiştlər tək bir – biri üzrə cigər pərkaləsin,**
**Göz yığıb salmış hübabi – xun binasiçün əsas.**

**(4) Ey sanan julidə mu başında Məcnunun, saqın,**
**Bitəkəllüf getmə kim, Leyli evidir ol pəlas.**

**(5) Ləhzə - ləhzə xəm qədim peykanın istər, ya qılır,**
**Zərrə -zərrə mahi – nov xurşiddən nur iqtibas.**

**(6) Tiği – qəmzən öylə bürrandır ki, cəlladi - əcəl**
**Töksə qan təcil üçün tiğindən eylər iltimas.**

**(7) Ey Füzuli, zəhri – qəhrilə doludur tasi – çərx,**
**Çəkməz onun qəhrini hər kim, çəkər bir dolu tas.**

Beyt 1: **Göz yaşımdan suzi – pünhanım edər arif qiyas,**
**Bixəbər təsiri - əncümdən degil əxtərşünas.**

Sözlük: Suzi-pünhan – içəri yanğı = batini hərarət; Əncüm – nücum = ulduzlar; Əxtərşinas – münəccim

**Nişanə** 1. "Göz yaşı": Fiziki mahiyyət ləkəsini paklayan yuyucu nişanədən ibarətdir.

**Nişanə** 2. "Suzi-pünhan": Ürəyi maddi atmosferdən üstün seyr etdirən özəl hərarətdən ibarətdir.

**Qeyd** 1: *Bütün varlıqların mahiyyəti hesab olunmuş hərəkətin əsas şərti hərarətdən ibarətdir.*

**Qeyd** 2: *Maddi və mənəvi vücudların yetkinliyi ümumən hərarət ilə bağlıdır.*

**Nişanə** 3. "Arif": Bu beytdə əql və təcrübədən üstün mərifətlərin idrakına nail olmuş şəxsdən ibarətdir.

**Anlam: Ulduz seyri alın yazısını məlum etdiyi kimi göz yaşım da ürəyimin seyr məqamına hazırlaşmasını nişan verir.**

**Qeyd:** *Keçmişlərdə ay – ulduz seyrini insanların alın yazısına təsir edici bilmişlər.*[1]

Beyt 2: **Qan yetər kim, dəmbədəm gözdən yenib, örtər tənim,**
**Dəşti – qəm Məcnuniyəm, mən handan və handan libas?**

Sözlük: Dəşt – çöl = biyaban

**Nişanə** 1. "Qan": Mənliyi yuyub batil edən nişanədən ibarətdir.

**Nişanə** 2: "Örtər tənim": Fiziki təmayülatı dəfn etmə müqəddimə-sidir.

**Nişanə** 3: "Dəşt": "Ruhani aləm" ünvanlı ilahi rayihələr qələbəsin-dən istiarədir.

**Nişanə** 4: "Qəm": Bu beytdə həzrət məhbub tələbində himmət etməkdən ibarətdir.

**Nişanə** 5: "Libas": Bu beytdə həqiqətin üstünü örtən maddi surətdən ibarətdir. Şərif ayə həqiqətin üstünü örtən surət barədə belə buyurmuşdur: "و لو جعلناه ملكا لجعلناه رجلا و للبسنا عليهم ما يلبسون" ("və əgər onu bir mələk etsəydik, yenə onu bir kişi [surətində] edərdik[2] və onları

---

[1] Qəzəl 71, beyt 4, nişanə 3, qeyd

[2] Kişi surəti, mələk vücudunu örtən surətdən ibarətdir.

düşdükləri şübhəyə[1] bir daha salmış olardıq[2]”)

**Qeyd:** *Dəşt – binasız olduğundan maneəsizlik, yaxud libassızlıq mövqiyyətini göstərir.*

**Qeyd** 1: *Libassız olmaq, yaxud üryanlıq, mücərrədlik aləminə eyham etmək istəyir.*

**Qeyd** 2: *Libas, dünyəvi hüsnləri kifayət edici bilmiş şəxslərin zahiri ziynətlərə məğrur olmaqlarını eyham etmək istəyir. Elə buna görə də:*

“لباس الزينة لا هل الدنيا” *demişlər.[3]*

**Anlam: Maddi vücudu batil etməklə (qan) üryanlıq məqamına, yaxud həqiqi camal müşahidəsinə hazırlaşmaq istəyirəm.**

Beyt 3: **Xiştlər tək bir – biri üzrə cigər pərkaləsin,**
**Göz yığıb salmış hübabi – xun binasiçün əsas.**

Sözlük: Xişt – kərpic; Pərkalə – hissə = para = yamaq; Hübab – köpük

**Nişanə** 1. “Cigər pərkaləsi”: Aşiqin sıxıntılarda – sınaqlarda hazırladığı sərmayəsindən, yaxud onun tərbiyə tapmasından və öz istedadını göstərməsindən nişanədir.

**Nişanə** 2. “Hübabi – xun binasi”: Maddi əngəl vücud maneəsini batil etməklə vəhdət dənizində məhv olmaq istedadına nailiyyət tapmış vücuddan nişanədir.

**Anlam: Maddi vücudu, yaxud kəsrət nişanəsini batil etməklə vəhdət dənizində məhv olmağa hazırlaşmaq istəyirəm.**

Beyt 4: **Ey sanan julidə mu başında Məcnunun, saqın,**
**Bitəkəllüf getmə kim, Leyli evidir ol pəlas.**

Sözlük: Julidə mu – pırpız = tükü biz-biz durmuş; Bitəkəllüf – məşəqqətsiz; Pəlas – palaz

**Nişanə** 1. “Mu”: Xarici aləmdə zühur etmiş ilahi zatın tərbiyə edici cilvələrindən ibarətdir.

**Anlam: Məcnunun başında bitmiş tüklərə sadəcə nəzər etmək qafillikdən nişanədir. Çünki o tüklərin hər bir riştəsi Leyli eşqilə canlanmış bir səfirdir, yaxud əqlə sığmaz bir aləmdən**

---

[1] Şübhəyə düşmək, həqiqətin üstü örtülü olduğundan nişanədir.
[2] Quran, Ənam surəsi, 9-cu ayə
[3] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

**nişanədir. Elə buna görə də ustad Yəhya Şeyda Təbrizin məşhur çağdaş şair və yazıçısı buyurmuşdur:**

**Bu tük deyil başımda, məhəbbət tikanıdır,**
**Bir – bir batıb ayağıma başdan veribdi baş.**

Beyt 5: **Ləhzə - ləhzə xəm qədim peykanın istər, ya qılır,**
**Zərrə -zərrə mahi-nov xurşiddən nur iqtibas.**

Sözlük: Xəm – əyri =hilahi; Peykan – ox ucu; Mahi-nov – təzə ay

**Nişanə** 1. “Xəm qəd”: Bu beytdə ilahi əslə və kökə, yaxud “انّا الله” mülkünə müraciət etmək istedadını göstərən nişanədən ibarətdir.

**Nişanə** 2. “Peykan”: Bu beytdə xarici vücudu daxili vücud tabeliyinə vadar etmiş ilahi qəmzələr qələbəsindən nişanədir.

**Nişanə** 3. “Mah”: Bu beytdə qara maddə ehtivasında mənəvi ağ nuru təzahür etdirən güzgü mərtəbəsinə nail olan vücuda eyham edən nişanədən ibarətdir.

**Nişanə** 4. “Xurşid”: Bu beytdə həqiqi can bağışlayan mərifətdən ibarətdir.[1]

**Nişanə** 5: “Nur”: Özü işıq olduğu halda başqalarını işıqlandıran və həqiqətləri aydınladan nişanədən ibarətdir. Şərif ayə “الله نورالسّماوت والارض”[2] (“Allah göylərin və yerin nurudur”) buyurmaqla bu nişanə, yaxud bu işığın əzəmətini təlqin etmək istəyir. Çünki bu işıq olmasa, dünya ilə heç bir vəchlə və heç bir varlıqla düzgün mənada tanış olmaq imkanı heç kimə müyəssər ola bilməz.[3]

**Anlam: Günəşdən nur əxz etmiş ay kimi ilahi qamətim vəhdət mülkünə qaytarılan İlahi qəmzələrdən faydalanır.**

Beyt 6: **Tiği – qəmzən öylə bürrandır ki, cəlladi - əcəl**
**Töksə qan təcil üçün tiğindən eylər iltimas.**

Sözlük: Bürran – kəsgin = iti

**Nişanə** 1. “Qəmzə”: Gah iztirab, gah da ümid törətmiş ilahi cazibələrdən ibarətdir.

---

[1] Qəzəl 107, beyt 1
[2] Quran, Nur surəsi, 35-ci ayədən bir qismət
[3] Qəzəl 1 , beyt 1

**Anlam: Ey gözəl məbud, Əzrayılın çətinliklə aldığı canı sənin cazibələrin asanlıqla alırlar.**

Beyt 7: **Ey Füzuli, zəhri – qəhrilə doludur tasi – çərx,**
**Çəkməz onun qəhrini hər kim, çəkər bir dolu tas.**

**Nişanə** 1. "Qəhr": Dünyəvi təmənnaları məhv edərək heyvani nəfsi[1] məcazi istəklərdən saxlayan ilahi əmrdən ibarətdir. Şərif ayə buna görə də buyurur: "و هو القاهرفوق عباد ه و هو الحكيم الخبير"[2] ("Və o öz bəndələrinə hakim mütləqdir. [Qahir], o hikmət sahibidir və [hər şeydən] xəbərdar-dır.")

**Nişanə** 2. "Çəkməz onun qəhrini": Çərxin yaxud ruzgarın qəhrini çəkməmək dünyəvi istəklər ilə müxalifət etmək deməkdir.

**Nişanə** 3. "Çəkər bir dolu tas": Bir dolu tas çəkmək, mənəvi yüksəkliyə zəminə yaradan tərbiyəvi sıxıntılara – sınaqlara giriftar olmaqdan nişanədir.

**Anlam: Ey Füzuli, mənəvi məqamlar nailiyyəti dünyəvi məşəqqətlər ilə sıx bağlıdır.**

**Qeyd** 1: *Dünyəvi yaşayışını mənəvi həyatına fəda etməyən bir aşiq, iki yaşayışa, yaxud vəhdət ilə müxalifət etməyə [ikiliyə] giriftar olmuşdur.*

**Qeyd** 2: *Maddi kainat və məcazi mərtəbələr kimi, mənəvi ruhiyyələr və ilahi məqamlar, nəhayət, vəhdət aləmi ilə ilgili olan nailiyyətlər "müamilə" ünvanlı cahanşümul qanun meydanından kənar deyildir. Bunu nəzərə alsaq ki, kapital olmayan yerdə müamilə mümkünsüzdür, mənəvi hallara, yaxud ilahi müamilələrə kapitalsız qurşanmaqda mövhumatçılıqdan başqa bir şey ola bilməz.*[3] *Bunun üçün də dünyəvi təmayülatı bir sərmayə kimi mənəvi nailiyyətlər bazarında xərc etmək vacib olur, yəni, heç kim bir neməti məxaric etməsə digər nemətə nailiyyət imkanı tapa bilməz.*[4]

---

[1] Qəzəl 111, beyt 1
[2] Quran, Ənam surəsi , 18-ci ayə
[3] Qəzəl 3, beyt 3, anlam
[4] Qəzəl 108, beyt 1, anlam, qeyd

## Q Ə Z Ə L 126

**(1) Məskən, ey bülbül, sənə gəh şaxi – güldür, gəh qəfəs,**
**Necə aşiqsən ki, ahindən tutuşmaz xarü xəs?**

**(2) Yar kuyində, müsəlmanlar, gər olsaydı yerim,**
**Kafərəm gər rövzeyi – rizvanə eylərdim həvəs.**

**(3) Kuh fəryadi – sədasin verdi Fərhadın demin,**
**Nəqşi-Şirindir verir avaz, olub fəryadrəs.**

**(4) Naqə Leyli məhmilin çəkmiş biyaban seyrinə,**
**Eylə Məcnunu bu halətdən xəbərdar, ey cərəs!**

**(5) Bir nəfəs qalmış həyatımdan, həbibim, sübh tək,**
**Nola gər bir mehr göstərsən mənə axir nəfəs.**

**(6) Xali etdim dil həvayi – ixtilati – xəlqdən,**
**Bəzmi – qəmdə ney kimi həmdəm mənə fəryad bəs.**

**(7) Ey Füzuli, gər sənə cəmiyyəti – dildir murad,**
**Bağla bir dildarə könlün, qeyrdən peyvəndi kəs.**

Beyt 1: **Məskən, ey bülbül, sənə gəh şaxi-güldür, gəh qəfəs,**
**Necə aşiqsən ki, ahindən tutuşmaz xarü xəs?**

Sözlük: Gəh – gah; xarü xəs – çör-çör

**Nişanə** 1. "Bülbül": Vücudu hal məğlubiyyətində öz niyazını, həm də məşuqun nazını əğyara bəlləndirmiş aşiqi eyham edən nişanədən ibarətdir.

**Nişanə** 2. "Şaxi-gül": "Qürb" ünvanlı yaxınlıqdan nişanədir.

**Nişanə** 3. "Qəfəs": "Bod" ünvanlı hicrandan nişanədir.

**Nişanə** 4. "Ah": Bəşəri heysiyyəti "nari-məhəbbət"[1] atəşində yandırıb məhv edən vasitədən nişanədir.

**Anlam: Bülbül layiq aşiq olsaydı "nari-məhəbbət" atəşində həm qəfəsi, həm gül şaxəsini yandırıb kül etməklə özünü "qürb" və "bod" ünvanlı hicabdan azad edə bilmişdi.**

**Qeyd** 1: *Vüsalda hicran qorxusu olduğundan, qürb də ürək iztirabını qurtarmağa qadir deyil, beləliklə, iztirabsız əhval axtaran aşiq özünü qürb mərhələsindən də azad etməlidir.*

**Qeyd** 2: *Mütəal məşuq hüzuruna istiqamətləndirən yol əvvəldən axıra kimi bod və qürb ünvanlı uzaqlıq və yaxınlıqla dolu olduğundan, salik mərtəbəli aşiq öz mənəvi seyrində hər ləhzə yeni bod və təzə qürb ilə üzbəüz olmalıdır.*[2] *Həkim Füzuli bu beytdə bod və qürb iztirabından azad edən istedad nailiyyətini təlqin etməklə aşağıda qeyd etdiyimiz müəyyən mövzular xülasəsinə işarə etmək istəyir.*

*A: Əvvəlcə yandırıb sonra öldürmək qürb hərarətinin təbii xasiyyəti olduğundan şairlər sultanı Xaqani buyurmuşdur:*

نيست عاشق را جز آن کاتش دهد پروانه وار

اوّلش قرب و ميانه سوختن،آخر فنا

*Beləliklə: 1 – Aşiq yanmaq mərhələsində iki və ya bütün hicablarını yandırıb kül etməlidir.*

*2 - Aşiq ölmək mərhələsində bir, iki və ya bütün bəşəri sifətlərini öldürməklə ilahi sifətlərini dirltməlidir.*

*3 – Nəticə: Maddi hicab və bəşəri sifətdən azad olmuş aşiq "məzhəriyyət" ünvanlı məqamda öz ilahi obrazını tapmaqla, yaxud məşuq cinsinə çevrilməklə*[3] *bod və qürb mərhələsindən azad olmalıdır. Çünki əsasən qürb və bod, yaxud fasilə sözü maddi sifətlər ilə bağlıdır.*

---

[1] Qəzəl 9, beyt 3, nişanə 1

[2] Hər mərhələnin arxası "bod" və önü "qürb"dən ibarətdir.

[3] Qəzəl 103, beyt 2, nişanə 2, qeyd "məzhəriyyət"

*B: “İstehlak məqamı”: Özünü Allah eşqində istehlak ünvanlı fanilik məqamına çatdırmış aşiq qürb və bod qanunundan azad olmalıdır, çünki həlak olmuş vücud barədə qanunilik mənasızdır. Elə buna görə də islamın ulu peyğəmbəri “موتو قبل ان تموتوا” buyurmuşdur.*[1]

Beyt 2: **Yar kuyində gər olsaydı, müsəlmanlar, yerim,**
**Kafərəm gər rövzeyi – rizvanə eylərdim həvəs.**

Sözlük: Rövzeyi – rizvan = behişt

**Nişanə** 1. “Yar kuyi”: Bu beytdə, “rəhman behişti”[2] ünvanlı ilahi hüzurdan, yaxud tanrıya qovuşmaq nemətindən ibarətdir.

**Anlam: Rəhman behiştindən bəhrələnmiş aşiqin rizvan behiştinə həvəs göstərməyi imkansızdır.**

Beyt 3: **Kuh fəryadi – sədasin verdi Fərhadın demin,**
**Nəqşi-Şirindir verir avaz, olub fəryadrəs.**

Sözlük: Kuh – dağ; Fəryadrəs – dadına dad verən = dada çatan

**Anlam: A: Dağdan qopmuş fəryad, Fərhadın şikayətli səsi yox, bəlkə Şirinin aşiqanə nəğməsindən ibarətdir.**

B: Dağdan qopmuş fəryad, Şirinin aşiqanə nəğməsi yox, bəlkə də təbiətin Fərhad ilə həmavaz olmaq səsindən ibarətdir.

**Qeyd:** *Hər iki anlam, aşiqin kama çatmağını, onun həlak olmağılə bağlı təlqin etmək istəyir (istehlak) . Elə buna görə də Sədi buyurmuşdur:*

مکن گریه بر کورمقتول دوست
بگو حمدالله که مقبول اوست

*(Həlakət ilə vücud hicabından azad olmuş bir aşiqin məzarı üstündə ağlama, bəlkə sərxoş olarkən şürk elə, ona görə ki, o öz arzusuna [yar kuyinə çatmağa] nail olubdur.)*

Beyt 4: **Naqə Leyli məhmilin çəkmiş biyaban seyrinə,**
**Eylə Məcnunu bu halətdən xəbərdar, ey cərəs!**

Sözlük: Naqə = dişi dəvə, məhmil = kəcavə, cərəs = zəng

**Nişanə** 1. “Biyaban seyrinə çıxmaq”: Açıq – aşkar cilvə etməkdən nişanədir.

---

[1] Qəzəl 37, beyt 1, nişanə 3, qeyd
[2] Qəzəl 111, beyt 1, qeyd 2

**Nişanə** 2. "Cərəs": "Ələst" aləmindən nazil olmuş ilahi heybətə eyham edən nişanədən ibarətdir.

**Anlam: Bu beyt ötən beyt ilə birlikdə:**

A: Mənəvi eşqin bəşəri idrakdan üstün mərtəbəsini dünyəvi təmsil göstərməklə hissiləşdirmək istəyir.

B: Pak və düzgün eşqin məcazi və dünyəvi səviyyədə müqəddəs olduğunu təlqin etmək istəyir.[1]

C: Hər bir yaranmışda yaradıcı məbud cilvəsini, yaxud kəsrət güzgüsündə vəhdət təzahürünü eyham etmək istəyir. Belə təzahürü təsdiq etmək məqsədilə şərif ayə buyurur: " و للهالمشرق و المغرب فاينما تولوفثّم وجه الله انّ الله و اسع عليم"[2] ("Şərq də, qərb dəAllahındır. Hər hansı tərəfə üz tutsanız [əslində] Allaha tərəf üz tutubsunuz. Həqiqətən Allahın rəhməti genişdir və O biləndir"), həmçinin:

"هو اوّل و الاخرو اللظاهرو الباطن"[3] ("O əvvəldir, O axirdir, O zahirdir, O batindir və O hər şeyi biləndir") Deməк, deyilən ayələr, "فؤادگوزو"[4], yaxud can gözü ilə, vəhdət nurunu kəsrət güzgüsündə müşahidə etmək imkanını təlqin edirlər. Belə bir müşahidə, yaxud bu şühud nailiyyətində demişlər ki:

"فايّ ظاهراظهرو اوضح امن الله؟"[5], (hansı bir şeydir ki Allah təala [camalı kimi]aşkar görünür?)belə bir baxımla VI əsrin ən məşhur arif şairi Əttar Nişaburi bütün kainatı ilahi camal güzgüsü bilib buyurmuş:

چشم بگشا که جلوه دلدار　　　متجلیست از درودیوار[6]
این تماشا چوبنگری،گویی　　　لیس فی الدارغیرهدیّار[7]

Həmçinin, müasir şair və arif Doktor Cavad Nurbəxş bütün kainata ilahi cilvələr güzgüsü təbliğ etmək məqsədilə buyurmuşdur:

در جمیع موجودات جلوه گر بود آن ذات
نور شمس و عین ماه، لاالا هه الاالله[8]

**Qeyd:** *Mütəal namütənahi məbudu, bir ləhzə maddi dünyadan ayrı sanmaq, onu məhdudlaşdırmağa bərabərdir.*

---

[1] Qəzəl 12, beyt 2, nişanə 3
[2] Quran , Bəqərə surəsi, 115-ci ayə
[3] Quran, Hədid surəsi, 3 –cü ayə
[4] Qəzəl 13, beyt 1, "ətvar"
[5] Molla Məhəmməd Baqir Məclisi, Biharül-ənvar, cild 4, s.178
[6] Əttar Nişaburi, Şeirlər divanı, Qəsidələr
[7] Dünyada ondan başqa vücud yoxdur (hamı fanidir)
[8] Doktor Cavad Nurbəxş, Şeirlər divanı

Beyt 5: **Bir nəfəs qalmış həyatımdan, həbibim, sübh tək,**
**Nola gər bir mehr göstərsən mənə axir nəfəs.**

Sözlük: Mehr – məhəbbət = günəş

**Nişanə** 1. “Sübh”: Bu beytdə maddi vücud küdurətindən azad olmağa hazırlaşmış aşiqin əhvalından ibarətdir.

**Nişanə** 2. “Mehr”: Bu beytdə aşiqi ilahi əslinə qaytaran cilvədən nişanədir.

**Anlam: Ey mehriban Allah ilahi cilvələr ilə bəşərilik, yaxud mənlik həbsindən azad olaraq mənəvi əslinə qayıtmaq istəyirəm.**

Beyt 6: **Xali etdim dil həvayi – ixtilati – xəlqdən,**
**Bəzmi – qəmdə ney kimi həmdəm mənə fəryad bəs.**

Sözlük: İxtilat – qarışma; Bəzm – ziyafət məclisi = əncümən = xeymə

**Nişanə** 1. “Birinci misra”: Özünü təcrid[1] mərhələsində əğyar ilə əlaqəsiz etmiş aşiq, “təfrid” ünvanlı mərhələyə daxil olaraq, heç bir insanın kənarında toxtaqlıq görməyib, fərdilik şəraitini ixtiyar etməlidir. Mövlana Füzuli belə bir mərhələni təbliğ etmək məqsədilə buyurmuşdur:

**Zülməti-qəm iztirabın çəkməz ol azadə kim,**
**Hər təəllüqdən ola dünyada çün xurşid fərd.**

**Qeyd:** *Leylinin məhəbbəti Məcnunu fərdilik mərtəbəsinə yetirərək onu vəhşi və yırtıcı heyvanlar ilə aşina, özünə oxşar insanlara biganə etmişdir.*[2]

**Nişanə** 2. “Bəzmi qəm”: Tələb və ətəş məğlubiyyətində törənmiş əhvaldan ibarətdir.

**Nişanə** 3. “Ney kimi olmaq”: Ney kimi olmaq[3] batini vücudu tamamilə dünyəvi ilgilərdən boşaltmaq və “təslim”[4] məqamına nail olmağın əsas şərtindən ibarətdir. Hər batin və hər ürək dünyəvi istəklərdən kamil boşalmasa və yalnız bir buğda qədər dünya, təbiət və mənlik havasını öz içərisində saxlasa o hava məşuq həzrətlərinə rəqib və əks sayılar, məşuq da rəqibin yolunda hazır olmaz. O səbəbdən Əşv demişdir: Boş zehin macal verir ki, uluhiyyət quşu batinə yol tapa, ....[5]

---

[1] Qəzəl 52, beyt 3, nişanə1
[2] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی
[3] Qəzəl 1, beyt 2, nişanə “ney”
[4] Qəzəl 37, beyt 1, nişanə 3
[5] Əşo, Xəllaqiyyət, tərcümə Mərcan Fərcinindir, cild 1, s.59

**Anlam: Ətəş və tələb qələbəsilə "təfrid" və "ney" məqamına nail olmaq aşiqin yolunu almış maneələri məğlub etməyə kifayətdir.**

Beyt 7: **Ey Füzuli gər sənə cəmiyyəti-dildir murad**
**Bağla bir dildarə könlün qeyrdən peyvəndi kəs.**

**Nişanə:** "Cəmiyyəti-dil": Uca Allaha məşğul olmaq məqsədilə müxtəlif himmətləri cəmləşdirmək, yaxud ilahi təmayülat görə başqa meyllərin kökünü ürəkdən qoparmaq, nəhayət, ilahi toxtaqlığa nail olmaqdan nişanədir.

**Anlam: Ey Füzuli, həqiqi taxtaqlığın əsas şərti Allah təalaya fikir etməkdən başqa fikirləri, xüsusilə, bəşəri əhvali-ruhiyyəni tərk etməkdən ibarətdir.**

## Q Ə Z Ə L 127

**(1) Dəhr bir mənzil, xəlayiq karbanı biş iməs,**
**Söz qamı əfsanə el əfsanəxanı biş iməs.**

**(2) Tərki-fikri-dünyəvü sevdayi-üqba eylə kim,**
**Dünyəvü üqba xəyaliyü və gümani biş iməs.**

**(3) Əhli-həşmət, kisvətin zərbəft edər bilməz kim, ol**
**Bağı-cəmiyyət baharına xəzani-biş iməs.**

**(4) Gər təvanalıq sözün söylər məlul etkəc qəza,**
**Hər kimi görsən təvana, natəvani biş iməs.**

**(5) Eyləyib möhnət zamanında, dəmadəm iztirab,**
**İstəmə rahət ki, rahət həm zəmani biş iməs.**

**(6) Ömr nəqdin sud sudasında, zaye eyləmə,**
**Ol kim, adın sud qılmışsan ziyani-biş iməs.**

**(7) Etibar ey dil Füzulidən götür kim ol fəqir**
**Bidilü bipareyü bixanimani biş iməs.**

Beyt 1: **Dəhr bir mənzil, xəlayiq karbanı biş iməs,**
**Söz qamı əfsanə el əfsanəxanı biş iməs.**

Sözlük: Dəhr – zaman = ruzgar; Xəlayiq – yaranmışlar = adamlar; Karban – karvan; Biş iməs – çox deyil = əlavə deyil; Əfsanəxan = əfsanəçi

**Anlam: Bütün yaranmışlar, xüsusilə, insanlar, dünya ünvanlı karvansaranı qəbir adlı, axirət adlı məqsədə sarı tərk etməlidirlər. Ona görə də zavala uğramış dünyəvi imtiyazlar barədə nəhs fəxr etmək əfsanəçilikdən əlavə bir şey deyil.**

**Qeyd** 1: *Dünya bütövlüyündə, həm də təfərrüatında hərəkət qanunu tabeliyində olduğundan*[1] *(xüsusilə, keyfiyyət hərəkəti) sakinlik mərkəzi ola bilməz. Buna görə də:*

*A: Xəlayiq karvandan başqa bir şey deyildir.*

*B:Yerdə qalmaq batil bir xəyaldır.*

*C: Hərəkət edici, yaxud qeyri sabit var – dövlətə bel bağlamaq batil bir şeydir.*

Beyt 2: **Tərki-fikri-dünyəvü sevdayi-üqba eylə kim,**
**Dünyəvü üqba xəyaliyü və gümani biş iməs.**

Sözlük: Dünyə – dünya = dünyəvi; Üqba – axirət dünyası = qiyamət

**Nişanə** 1. “Dünya”: 1 – Həzrət Əli əleyhissəlam dünyanı dövlətsizlərə dövlət və evsizlərə ev kimi tərif etmişdir.[2]

2 – Saliklər, insanları Allahdan qəflətdə saxlamış yerə dünya demişlər.

3 – Dünya şeytani nəfsi canlandıran hiyləbazlıq mərkəzindən ibarətdir.

4 – Hərəkət etdiyi halda özünü sakin göstərmək, dünyanın ilkin cadusundan nişanədir.[3]

5 – Dünyanı axirət ilə müqayisədə ən həqir bilmişlər.

6 – Axirətdə olan nemətlərin tamamilə dünyada mövcud olduğuna görə dünyanı axirətin surəti bilib əziz tutmuşlar.

7 – Dünyanı müxtəlif həqiqi fərəh bağışlayan müsibətlər, yaxud

---

[1] Qəzəl 1, beyt 1, nişanə “salik”

[2] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

[3] Məhəmməd Qəzzali, Kimyayi-səadət, s.75

acılıqdan asılı şirinliklər şəhəri[1] (sınaqlar və yetkinliklər şəhəri) bilib əziz tutmuşlar.

8 – Dünya və kainat ilahi sirrlər mənbəyi olduğundan əzizdirlər, elə buna görə də: "اللهُمَّ ارني الاشياءَ كَماهِيَ"[2] ("İlahi, əşyaların necəliyini mənə nişan ver") demişlər.

9 – Dünya və kainat ilahi cilvələr güzgüsü (məzhəriyyət) olduğundan əzizdirlər. Bu məzhəriyyəti təsdiq etmək məqsədilə Şeyx Məhəmməd Şəbüstəri buyurmuş:

دلی کزمعرفت نوروصفا دید به هر چیزی که دید اوّل خدا دید

10 – Dünya axirət ticarətxanası olduğundan əzizdir. Buna görə də "الا عمالُ في الدُّنيا تجارَةُالاخرَة"[3] demişlər. ("Dünyada görünmüş işlər axirət ticarətilə əlaqədardırlar".)

11 – Əflatun zənn etmiş ki: "Dünyəvi vücudlar, yaxud maddi kainat, mənəvi ölməz həqiqətin və ya axirət ünvanlı həqiqi aləmin təzahürat və kölgələrindən ibarətdir."[4] Buna görə də:

A: Müstəqillik təsəvvürü dünyanı həqirləndirir.

B: Nisbət təsəvvürü dünyanı əzizləndirir.[5]

12 – "Rizvan behişti, rəhman behişti ilə"[6] müqayisədə həqir olan kimi axirət, yaxud üqba da Allahın hüzuru ilə müqayisədə həqirdir.

13 – Ariflər nəzərincə axirət və ya behişt ikilik mənşəyi (bir tanrı, bir behişt ) olduğundan məlamət edilmişdir.

14 – Xüsusi aşiqlərdən başqa şəxslərin axirət və ya behişt barədə irad – etiraz etməkləri ədəbsizlik və xətakarlıqdan ibarətdir.

**Anlam: Dünyanı və ya axirəti müstəqil bilmək xəyalatçılıqdan başqa bir şey deyil.**

**Qeyd:** *Dünya, mehriban Allahın ehsan süfrəsindən ibarətdir. Buna görə:*

*1 – Dünyəvi nemətlərdən düzgün halda bəhrələnməyi və şükr etməyi savab bilmişlər. Ona görə də Sədi buyurmuş:*

ابروباد و مه و خورشید و فلک در کارند
تاتونانی به کف آریّ و به غفلت نخوری

*2 – Dünyəvi nemətlər həvəsilə mənəvi nemətlər və ilahi təkliflərdən*

---

[1] Qəzəl 97, beyt 3, "şəhri-bəla"
[2] Əli Səadətpərvər, Camali-afitab, s. 124
[3] Göstərilən kitab, s.159
[4] Məhəmmədəli Furuği, seyre-hikmət dər orupa, c.1 , səh 18.
[5] Qəzəl 40.
6 Qəzəl 111.

*qəflət etməyi günaha batmaq bilmişlər.*

*3 – Dünyanı tərk etmək ariflik nişanəsi deyil. Bəlkə arif də digər insanlar kimi dünyəvi nemətlərdən bəhrələnməlidir, ancaq o:*

*A: İbadət nemətini dünyəvi nemətlərdən yüksək bilməlidir.*

*B: Lazımi çağda, xüsusilə, imtahan ayağında, dünyəvi nemətləri hətta övladını, nəhayət, özünü fəda etməyə, Həzrət İmam Hüseyn əleyhissəlam kimi aşiqanə hazırlaşmalıdır.*

Beyt 3: **Əhli-həşmət kisvətin zərbəft edər bilməz kim, ol**
**Baği-cəmiyyət baharına xəzani-biş iməs.**

Sözlük: Kəsvət – libas = paltar; Zərbəft – zərli = zər ilə toxunmuş

**Anlam: Qızıl saplardan toxunmuş libaslar ilə həqiqi toxtaqlığıa nail olmaq mümkünsüzdür, çünki insanları təşvişə salan səbəblərin ən güclüsü zahiri cilvələrdən ibarətdir. (Zahiri bahara bənzətməklə batin xəzəlində azad olmaq olmaz)**

**Qeyd:** *Bu beyt isə zahir məşğulluğunda batindən qəflət etmiş insanları məlamət edir.*

Beyt 4: **Gər təvanalıq sözün söylər məlul etkəc qəza,**
**Hər kimi görsən təvana, natəvani biş iməs.**

**Nişanə:** “Təvanalıq”: Bu beytdə zavala uqramış dünyəvi iqtidardan ibarətdir.

**Anlam: Dünyəvi iqtidarları kamil və kafi bilmiş şəxslər, mənəvi və batini etibardan məhrum qalmaqla köksüz bir pöhrə kimi ən zəif və natəvandırlar.**

Müəllif özünü belə bir xətərnak qəflətdən xəbərdar etmək məqsədilə bir qəsidədə demiş ki:

قضا چو پای نهد برسرزبونی تو
تفاوتش نکند مور، یا سلیمانی

**Qeyd:** *Müsibət və mənəvi təvanalıq isə Yaradanın zəhmi qarşısında natəvanlıqdan başqa bir şey deyil. Qəzadan mərifət əlavə olduqca natəvanlıq da əlavə olunur. Buna görə də demişlər ki:*

درویش و غنی بنده ی این خاک درند
و انان که غنی ترند محتاج ترند[1]

---

[1] Sədi, Gülüstan, bab 1

Beyt 5: **Eyləyib möhnət zamanında dəmadəm iztirab,**
**İstəmə rahət ki, rahət hər zəmani biş iməs.**

Sözlük: Dəmadəm = dəmbədəm

**Anlam: Sakinlik və sabitlik yaranmayan dünyada, rahət də möhnət kimi zavala məruz qalmalıdır, nəhayət, mğhnət zamanı şikayətlənmək kimi rahət zamanı qəflətə məruz qalmaq yersizdir.**

**Qeyd** 1: *Dünyəvi varlığın əkslər barışığından hasil olduğu kimi, dünyəvi əhval, yaxud rahət və möhnət isə bir – birinə bağlıdırlar.*[1] *Buna görə də şərif ayə buyurur ki:* “ تولج الّيل في النّهار و تولج النّهرفي الّيل و تخرج الحيّ من الميّت و تخرجُ الميّت من الخيّ و ترزقُ من تشاء بغير حساب ”[2] *(“[İlahi]gecəni gündüzə, gündüzü isə gecəyə qatırsan, dirini ölüdən çıxarırsan, ölünü diridən çıxarırsan və istədigin şəxsə saysız – hesabsız ruzi verirsən”).*

**Qeyd** 2: *Möhnət və rahət ürfani əhval olsa da anlam fərq etməz, çünki əhval – şimşək kimi çaxar, ancaq dayanmaq bilməz.*[3] *Deməк, əhval da qeyri sakindir.*

Beyt 6: **Ömr nəqdin sud sudasında, zaye eyləmə,**
**Ol kim, adın sud qılmışsan ziyani-biş iməs.**

Sözlük: Sud – bəhrə = fayda

**Anlam: Dünyəvi ömür möhlətində, mənfəət götürməklə zərər görmək eynidir.**

**Qeyd** 1: *Dünyəvi mənfəət əldə etmək, mənəvi mənfəət möhlətini əldən vermək olduğundan ziyançılıqdan başqa bir şey deyil.*

**Qeyd** 2: *Mənəvi möhlətlərdə, ilahi cilvələrin dəmbədəm yeniləşməyilə birlikdə, mərifətlər də dəmbədəm əlavə olur. Demək, mənəvi möhlətin hər bir ləhzəsində gələcək ləhzə ilə müqayisədə bir nöqsan kəşf edilir, nöqsan isə arif nəzərincə zərər vericidir.*

**Qeyd** 3: *Dünyəvi ömür möhlətini tamamilə ibadət və itaər kimi mənəvi işlər məşğulluğunda sərf etmək, ilahi feyzlər ilə müqayisədə daha layiqsiz və nöqsan olduğundan, həqiqi mərifət sahibləri demişlər ki:* “الهي عاملنا بفضلك و لآتعاملنا بعدلك”[4] *(“İlahi, bəndələrinə ədalətlə yox, kərəm*

---

[1] Qəzəl 9, beyt 3
[2] Quran , Ali İmran surəsi, 27 – ci ayə
[3] Qəzəl  3, beyt 3
[4] Doktor Məhəmməd Moin, Fərhəngi-Moin

*və rəhmətinlə rəftar et") Belə bir mərifət baxımı ilə Mövlana Füzuli demişdir:*

*Yox məndə bir elm sənə şayəstə ah əgər*
*Amalıma görə verə ədlin cəza mana.*

*Bu beyt geniş universal mərifətdən hekayət edərək Yaradanın ehsan və əzəmətilə müqayisədə aşiq və arifin büsbütün ibadət və itaətini yüngül və dəyərsiz göstərmək istəyir.*[1] *(yüngüllük bir cür ziyankarlıqdır)*

**Qeyd** *4: Peyğəmbərlər, imamlar və ariflər mərifət zirvəsində olduqlarına görə ömür boyu gecə - gündüz ibadət – itaət etməyi və maldan, candan keçməyi daha həqir görürkən, günahlarından utanan günahkarlar kimi, öz ibadətlərindən xəcalət çəkirlər və onların halından bu beyt məlumat verir:*

عاصیان از گناه توبه کنند
عارقان از عبادت استغفار

Beyt 7: **Etibar, ey dil Füzulidən götür kim ol fəqir**
**Bidilü və bipareyü bixanimani biş iməs.**

**Nişanə** 1. "Etibar": Bu beytdə təbii xarakter, yaxud dünyəvi məqam mərtəbəsindən ibarətdir.

**Nişanə** 2. "Fəqir": Kəsrətə bağlı varlıqları bütünlüklə silib – atarkən öz məmlüklüyünü anıb – düşünmüş aşiqdir.

**Nişanə** 3. "Bidil və biçarə": Zahiri və batini vücudunu Allah eşqinə təslim etməklə özü özündən xəbərsiz qaib ölmüş aşiqdən ibarətdir.

**Nişanə** 4. "Bixaniman": Özünü "Təliq" ünvanlı dünyəvi ilgilərdən, yaxud məcazi ürəyə yatan şeylərdən azad etməklə "fərdilik", yaxud mücərrədlik məqamına çatmış aşiqdir.

**Anlam: Füzuli özündən qaib olmaqla camaatın həm məlamət həm də məhəbbətindən hacətsiz olmuşdur.**

[1] Qəzəl 3, beyt 4, qeyd

## Q Ə Z Ə L 128

**(1) Ey xoş ol məst ki, bilməz qəmi – aləm nə imiş,**
**Nə çəkər aləm üçün qəm, nə bilər qəm nə imiş.**

**(2) Bir pəri silsileyi – eşqinə düşdüm nagəh,**
**Şimdi bildim səbəbi – xilqəti – Adəm nə imiş.**

**(3) Vaiz ovsafi – cəhənnəm deyər, ey əhli vərə,**
**Var onun məclisinə, bil ki, cəhənnəm nə imiş.**

**(4) Oxu köksümdən ötüb, qalmış onun peykanı,**
**Ah, bildim səbəbi – ahi – dəmadəm nə imiş.**

**(5) Ey Füzuli, məzeyi – saqiyu səhba bildin,**
**Tövbə qıl, ta biləsən zərqu riya həm nə imiş.**

Beyt 1: **Ey xoş ol məst ki, bilməz qəmi – aləm nə imiş,**
**Nə çəkər aləm üçün qəm, nə bilər qəm nə imiş.**

**Nişanə** 1. “Xoş”: “Qürb” məqamına nail olmuş aşiqin ürəyini ləzzətləndirən haldan ibarətdir.

**Nişanə** 2. “Məst”: Yaradanın fikrində, eşqində və nurunda məğlub və məhv olmuş aşiqdən nişanədir.

**Nişanə** 3. “Qəm”: Bu beytdə dünyəvi təşvişlərdən ibarətdir.

**Anlam: “Qürb” məqamında dünyadan xəbərsiz məstlər həqiqi xoş hala nail olmuşlar.**

Beyt 2: **Bir pəri silsileyi – eşqinə düşdüm nagəh,**
**Şimdi bildim səbəbi – xilqəti – Adəm nə imiş.**

Sözlük: Nagəh – nagah =nagəhani

**Nişanə** 1. “Pəri”: A: Bəşəri simada ilahi hüsnlərdən əsər və nişanə göstərmiş gözəl insandan ibarətdir.

B: Pəri, aşiqin batini gözünü, yaxud fuadını[1] güzgü etmiş ilahi parıltıdan nişanədir.

**Nişanə** 2. “Eşq”: Eşq bu beytdə: A:İlahi ilhamlardan bəhrələndirən şövqdən nişanədir.

B: “Rəhmani isinmək” ünvanlı mərtəbədə məhbub ilə vasitəsiz əlaqələnmiş ürəyin xas halından ibarətdir.

**Qeyd** 1: *İrfani araşdırıcılar bütün kainatın hərəkət və coşqunluğuna yeganə səbəb, yaranışın əsası və yaşayışın davamçısı olan eşqi bilmişlər*.

**Qeyd** 2: *Ariflər nəcərincə səmaların vücudu və onların seyr etməsi eşq və məhəbbətə bağlıdır.*

**Anlam: İnsanların yaranma seyrindən xabərdar olmaq şövq nailiyyətində ilahi ilhamlardan bəhrələənmiş ürəklər ilə, yaxud yalnız eşq ilə mümkündür. Bu imkan mərtəbəsini tanıtdırmaq məqsədilə Allah-taala buyurmuşdur:**

“كنتُ كنزا مخفيّا فاحببت ام أُعرفَ فخاقتُ الخلقَ لكي أُعرف”[2] (“Mən gizli bir xəzinə kimi özümü tanıtdırmaq məqsədilə [insanları] yaratdım”)

Beyt 3: **Vaiz ovsafi – cəhənnəm deyər, ey əhli vərə,**
**Var onun məclisinə, bil ki, cəhənnəm nə imiş.**

---

[1] Qəzəl 13, beyt 1
[2] Seyid Əbdullah Şübbər, Misbahil ənvar, cild 2, s. 405

Sözlük: Vərə = pəhrizkarlıq = xətalardan qorunmaq

**Nişanə** 1. "Vaiz": Dünyaşünas əqlə söykənməklə, mənaşünas (mənəviyyatşünas)eşq hidayətini inkar etmiş zahiddən ibarətdir.

**Nişanə** 2. "Vərə əhli": Vaiz etdiyi savablara, bir müqəddəs təklif kimi əməl etməyi və kamal zirvəsinə çatmağı kafi bilmiş şəxslərdən ibarətdir.

**Nişanə** 3. Cəhənnəm ikinci misrada ariflərin nəzərincə ilahi camal cilvələrindən xəbərsiz yaşamaq cəhənnəmdə həyat sürməyə bərabərdir (Hal cəhənnəmi).

**Anlam: Camaatı cəhənnəm əzabından qorxudan vaiz özü cəhənnəm içində yaşamağını davam etdirir.**

**Qeyd** 1: *Vaiz bu dünyada cəhənnəm içində həyat sürməsindən xəbərsizdir.*

**Qeyd** 2: *Cəhənnəm əhvalatından yaxşı xəbərdar olan və yaxşı danışan yalnız vaizdir, çünki o, özü cəhənnəm içində yaşayır.*

Beyt 4: **Oxu köksümdən ötüb, qalmış onun peykanı,**
**Ah, bildim səbəbi – ahi – dəmadəm nə imiş.**

Sözlük: Peykan – ox ucu; Dəmadəm – dəmbədəm

**Nişanə** 1. "Ox, peykan": Aşiqi qurbanlıq məqamına hazırlamaq məqsədilə onun fiziki mahiyyətinə sədəmə toxunduran səbəblərdən nişanədir.

**Nişanə** 2. "Ahi-dəmadəm": "Nari-məhəbbət" atəşində, dünyəvi ilgiləri yandırmaq və fiziki mahiyyət qanunlarından xilas olmaq nişanəsidir.

**Anlam: A: Ox və peykan tərbiyəsini kamilləşdirən vasitə ah çəkməkdən ibarətdir.**

B: Aşiqi qurbanlıq məqamına nail edən ilahi qəmzələr sədəməsilə (peykan)həsrət atəşinin (ah) həmahəng olmasıdır.

Beyt 5: **Ey Füzuli, məzeyi – saqiyu səhba bildin,**
**Tövbə qıl, ta biləsən zərqü riya həm nə imiş.**

Sözlük: Sağər – cam = piyalə; Səhba – şərab; Zərq – riyakarlıq = ikiüzlülük

**Nişanə** 1. "Sağər": Əbədiyyət səmasının nurunu əks etdirmiş mərtəbələrdən nişanədir.

**Nişanə** 2. "Səhba": Bu beytdə ilahi cilalar qələbəsindən nişanədir.

**Nişanə** 3. "Tövbə": Bu beytdə naqis mərtəbədən kamil məqama müraciət etmək nişanəsidir.

**Anlam: Aşiqin sağər və səhba kimi mərtəbələr nailiyyətində xoşhal olması, onun öz vücudundan xəbərdar olduğunu sübut edir. Beləliklə, Füzuli ürfani nailiyyətlər xoşhallığını mənlik, yaxud ikilik əlaməti bilir: (bir mütəal məhbub, bir xoşhal aşiq)**

## Q Ə Z Ə L 129

(1) Bu gün tiğin çəkib çıxmışdır ol namehriban sərxoş,
Saqın, ey rəhm edən caninə kim, bilməz aman sərxoş.

(2) Ona huşyar ikən dərdi – dil istərmən deyəm, saqi
Peyapey vermə camı, qılma ol sərvi rəvan sərxoş.

(3) Degil təqvadən etsəm badə tərkin, vəhmim ondadır
Ki, izhar eyləyim xəlq içrə eşqin nagəhan sərxoş.

(4) Məgər qan içmək ilə əsrümüş nərgislərin, vər nə
Bəsi mey nuş edənlər gördüm, olmaz böylə qan sərxoş.

(5) Meyi – eşqinlə sərməst olduğum eldən nihan qalmaz,
Məhali - əqldir kim, saxlaya razin nihan sərxoş.

(6) Könül ta oldu bixud, aldı qəmzən canımı təndən,
Verər yəğmayə nəqdi-gəncin olğac pasiban sərxoş.

(7) Füzuli, qeyr ilə xəlvət məgər bəzm etmiş ol gülrux,
Rəqibi – kəcrövü gördüm bu gün bari yaman sərxoş.

Beyt 1: **Bu gün tiğin çəkib çıxmışdır ol namehriban sərxoş,**
**Saqın, ey rəhm edən caninə kim, bilməz aman sərxoş.**

**Nişanə** 1. "Sərxoş": Sərxoş bu beytdə:

A: Aşiqi müxtəlif sıxıntılar və sınaqlar ilə tərbiyə edən mürşid həzrətlərindən və ya digər mənəvi vasitələrdən nişanədir.

B: Aşiqin ətəş və atəşini coşqunlaşdıran şıdırğı şühud və müşahidə cəlalarından nişanədir.

C: Bəşəri simada ilahi hüsnləri təzahür etdirən gözəl insandan nişanədir.

D: "Şəth" şəraitində aşiqin gözünə alınmış Allahın sifatından nişanədir.

**Qeyd:** *Bir çox hal baş verə bilər ki, aşiq həyəcan, hicran, məcnunluq və məğlubiyyət vəziyyətində mürşidün özünə, hətta mütəal məhbuba namehriban, sərxoş, aman bilməz və digər beləcə sifətlər və kəlmələr ilə giley və etiraz edər, ancaq məcnunluq (şəth) məğlubiyyətində olduğuna görə cəzalanmaqdan azad olar. Ona görə ki, məcnunluq divanəlikdir və şəriət divanəni məhkəmə etməyi hökm verməmişdir.*

**Anlam: Beyt, aşiqin amansız və məhvedici olduğunu təlqin etmək istəyir.**

Beyt 2. **Ona huşyar ikən dərdi – dil istərmən deyəm, saqi**
**Peyapey vermə camı, qılma ol sərvi rəvan sərxoş.**

Sözlük: Huşyar – huşlu; Peyapey – dalbadal; Rəvan – hər an = cəld

**Nişanə** 1. "Huşyar": Bu beytdə aşiqin nalələrinə iltifat etmiş halda zühur edən məşuq sifətindən nişanədir.

**Nişanə** 2. "Saqi": Bu beytdə mürşüd həzrətilə əlaqədar ilahi vasitəni hətta Allah-taalanın özünü təlqin edən nişanəsindən ibarətdir.

**Nişanə** 3. "Cam": Bu beytdə istiğna məqamına qaldıran mənəvi qələbələrdən nişanədir.

**Nişanə** 4. "Sərxoş": Bu beytdə məşuqun "istiğna" məqamında[1], yəni aşiqin nalələrinə iltifat etməz halda zühur etməsindən nişanədir.

**Anlam: Aşiq öz nalələrinin təsir edici çağlarını, yaxud mütəal məşuqun zühur nümunələrini tanımaqla öz batini təkliflərini duyub – düşünməlidir.**

---

[1] Qəzəl 62, beyt 4

Beyt 3: **Degil təqvadən etsəm badə tərkin, vəhmim ondadır**
**Ki, izhar eyləyim xəlq içrə eşqin nagəhan sərxoş.**

Sözlük: Təqva – pəhrizkarlıq

**Nişanə** 1. “Təqva”: Bu beytdə öz kamalsızlığından xəbərsiz aşiqin ehtiyatkarlığından nişanədir.

**Nişanə** 2. “Badə”: Bu beytdə qəbz müşkülünə üstün gələn bəst məstliyindən nişanədir.

**Anlam: Təqva hökmü ilə yox, bəlkə də “aşiq baş verər sirr verməz” sözünü müqəddəs qanun kimi icra etmək məqsədilə öz batini məstliyimi gizli saxlayıram.**

Beyt 4: **Məgər qan içmək ilə əsrümüş nərgislərin, vər nə**
**Bəsi mey nuş edənlər gördüm, olmaz böylə qan sərxoş.**

Sözlük: Nərgis – nərgiz; Vər nə – yoxsa; Bəsi – bir çox

**Nişanə** 1. “Qan içmək”: Qurbanlıq məqamına hazırlayan tərbiyəvi qəbzlərdən nişanədir.

**Nişanə** 2. “Əsrmək”: Bu beytdə istiğna məqamında zühur etməkdən nişanədir.

**Nişanə** 3. “Nərgis”: Fərəh bə nişat kimi elmi nəticələrin elmdə zühur etməsindən nişanədir.

**Nişanə** 4. “Mey nuş edənlər”: Bu beytdə mənəvi sirrlərdən xəbərdar olmaqla təbii qüvvələrə üstün gələn rəhbərlərdən nişanədir.

**Anlam: Ey həkimi-məhbub, aşiqi qurbanlıq məqamına qaldırmaq məqsədilə onun məcazi əngəl vücuduna rəhm etməyən yalnız sənsən.**

Beyt 5: **Meyi – eşqinlə sərməst olduğum eldən nihan qalmaz,**
**Məhali - əqldir kim, saxlaya razin nihan sərxoş.**

Sözlük: Sərməst – sərxoş; Nihan – gizli; Raz – sirr

**Nişanə** 1. “Meyi-eşq”: “Nari-məhəbbət”in həqiqətdən xəbərdar edici qələbələrindən nişanədir.

**Nişanə** 2. “Sərməst”: Kamil arifin özündən xəbərsiz olmuş əhvalatından nişanədir.

**Nişanə** 3. “Raz”: Ürəyi bürüyən İlahi əhvali-ruhiyyədən ibarətdir.[1]

**Qeyd** 1: *Aşqilər raz mərtəbəsinin əvvəl dərəcəsindən bəhrələnmişlər.*

**Qeyd** 2: *“Aşina”lar raz mərtəbəsinin son dərəcəsindən bəhrələnmişlər.*

**Qeyd** 3: *“Səmavi xidmətçilər aşinaları”, altından arxlar axan behişt bağlarında endirəcəklər.*[2]

**Qeyd** 4: *“Səmavi xidmətçilər aşiqləri”, Yaradanın öz kənarında (xüsusi rəhmət dənizində) endiriləcəklər.*[3]

Beyt 6: **Könül ta oldu bixud, aldı qəmzən canımı təndən,**
**Verər yəğmayə nəqdi-gəncin olğac pasiban sərxoş.**

Sözlük: Bixud – özündən xəbərsiz; Yəğma – qarət = tarac; Gənc = xəzinə

**Nişanə** 1. “Bixud”: Hər bir insan başqa yaranmışlar kimi iki “xud” ilə mürəkkəbləşmiş bir vücuddur:

A: Həqiqi xud və ya iç aləm.

B: Məcazi xud və ya çöl aləm.[4]

**Qeyd** 1: *Vəhdət cilvələrindən məhrum saxlayan müddəilik və məğrurluq məcazi xud ilə əlaqədardır.*

**Qeyd** 2: *İlahi cazibələrdən bəhrələnmək, həqiqi xod ilə bağlıdır.*

**Qeyd** 3: *Aşiq öz məcazi xudunu unutmuş bixuddur.*[5]

**Nişanə** 2. “Qəmzə”: Qəhr burulğanı ilə tülf nəsiminin birlikdə zahiri mənliyi silərkən batini mənliyi obrazlaşdırmaq nişanəsidir

**Nişanə** 3. “Can”: Bu beytdə cismani ürək arasını boşaldan qəlb hərarətilə peyda olmuş lətif buxardan, yaxud bədənin hər yerinə yayılmış “heyvani ruh” ünvanlı cismani həyat bağışlayan gizli qüvvədən, ya da məcazi həyat qüvvəsindən ibarətdir.[6]

**Nişanə** 4. “Yəğma”: Yaxud qarət, ibadət və fəaliyyət səbəblərilə şərtlənməyən ilahi cazibələr zəncirindən ibarətdir.

**Nişanə** 5. “Gənc nəqdi”: Məcazi xud və ya cismani həyatdan ibarətdir.

**Nişanə** 6. “Pasiban”: Birinci misrada qeyd olunmuş bixud könüldən

---

[1] Qəzəl 114, beyt 1
[2] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی
[3] در سوخته پنهان نتوان داشتن آتش ما هیچ نگفتیم و حکایت بدرافتاد
[4] Qəzəl 47, beyt 4
[5] Qəzəl 3, beyt 2
[6] Qəzəl 112, beyt 2

ibarətdir.

**Anlam: Məst pasibanın qoruduğu xəzinə kimi sərxoş aşiqin məcazi həyat xəzinəsi bərbad olmalıdır.**

**Qeyd:** *Cani bərbad edən dəhşətli təhlükəni alqışlamaq yalnız bixudluq və sərxoşluq mərhələsində mükündür.*

Beyt 7: **Füzuli, qeyr ilə xəlvət məgər bəzm etmiş ol gülrux,**
**Rəqibi – kəcrövü gördüm bu gün bari yaman sərxoş.**

Sözlük: Bəzm – məclis = ziyafət məclisi = əncümən = xeymə; Gülrux – gül çöhrə; Köcröv – yolundan çıxmış

**Nişanə** 1. “Xəlvət”: Bu beytdə iç aləmi və fiziki vücudu büsbütün maddi məşğulluqlar və fiziki yöndəmlər, yaxud kəsrət hacətlərindən ayıran “bədən xəlvəti” ünvanlı mərtəbədən ibarətdir.[1]

**Nişanə** 2. “Gülrux”: Allahın ürəklərə “bəst” bağışlayan zühurundan nişanədir.

**Nişanə** 3. “Rəqibi-kəcröv”: Bu beytdə öz ürfani istedadına güvənməklə özünü hicaba giriftar etmiş müddəidən ibarətdir.

**Anlam: Beyt iddiaçı rəqibin mənəvi feyzlərdən bəhrələnməyini təlqin etməklə ilahi cilvələrin cahanşümulluğunu təbliğ edir.**

**Qeyd:** *Sədi demişkən dünyəvi nemətlər süfrəsi kafirləri bəhrələndirən kimi[2] ürfani cilvələr pəncərəsi müddəilər üzünə də açıqdır:*

ای کریمی که از خزانهء غیب     گبروترسا وظیفه خورداری
دوستان را کجا کنی محروم     تو که با داشمنان نظرداری

[1] Qəzəl 69, beyt 4
[2] “Gülüstani Sədi”, Dibaçə

## Q Ə Z Ə L 130

(1) Büti – növrəsim nəmazə şəbü ruz rağib olmuş,
Bu nə dindir, Allah – Allah, bütə səcdə vacib olmuş.

(2) Əsəri – qəbuli – taət ona vermiş öylə halət
Ki, qülubi - əhli – halə hərəkatı cazib olmuş.

(3) Fərəhim görüb, cəfasın həsənatə daxil eylər,
Nə mələk kim, ol pərinin əməlinə katib olmuş.

(4) Nə əcəb gər olsa qəmdən dünümü günüm bərabər,
Nəzərimdən ol üzü gün neçə gün ki, qaib olmuş.

(5) Qəmi – hicrdir kim, artar əsərilə eşq zövqü,
Qələt eyləmiş Füzuli ki, vüsalə talib olmuş.

Beyt 1: **Büti – növrəsim nəmazə şəbü ruz rağib olmuş,**
**Bu nə dindir, Allah – Allah, bütə səcdə vacib olmuş.**

Sözlük: Növrəs – gənc = cavan; Şəbü ruz – gecə-gündüz; Rağib – rəğbətli = şövqlü

**Nişanə** 1. “Büti-növrəs”: Ülvi mənalar və ilahi parlamalar cəmalında cilvələnən gözəl bəşərdən ibarətdir.

**Qeyd** 1: *Allah-taalanın cəmalında parlayan nur gah mürşüdün vücudunu, gah da bir gözəl simanı güzgü edərək, özünü onlarda təzahür etdirir. Elə buna görə də Mövləvi zənn edir ki, saf qəlbli bir aşiq yer kürəsində yaşayan gözəl bir insan simasındakı hüsnlər qarşısında fədakarlığını və özünü unutmağı məşq edib öyrənərkən, özünü Allahın şühud nurunda məhv etməyə hazırlayır.*

ای بسا کس را که صورت راه زد قصد صورت کرد و بر الله زد[1]

*Elə buna görə də pak və düzgün eşq məcazi və dünyəvi səviyyədə müqəddəsdir.*

**Qeyd** 2: *Büt daşdan yonulduğuna görə aşiqin əqlini, idrakını və bütün bədən qüvvələrini “heyrət” ünvanlı irfani mərtəbədə daş kimi qurudub işdən qoyan gözəllərə, yaxud bəşəri simada ilahi cazibələr təzahür etdirən dilbərə büt demişlər.*[2]

**Qeyd** 3*: Büt, ilahilik ilə əlaqədar keçmişinə görə müqəddəsliyi eyham etmək istəyir.*

**Anlam: Bəşəri vücudunda ilahi cilvələr əks etdirməklə aşiqləri səcdəyə vadar edən məşuq:**

A: Öz hüsn və gözəlliyinin mənşəyi olan Allah adı ilə səcdəyə durmuşdur.

B: Öz hüsnünə hörmət göstərmək məqsədi ilə səcdəyə duran şəxsdir. Bu hüsnün ehtiram və əzəmətini nişan vermək məqsədi ilə demişlər ki:

“الله یصلی و ما صلاته، صلاته الثناء نفسه، سبوح قدوس رب الملائکه و الروح” (“Ruh və məlaikəni yaradan sitayişə layiq pak olan Haqq təala özü, öz əzəmətinə qarşı hörmət göstərir”).

**Qeyd:** *“Allah Allah” nidası əqli və idrakı aciz edən heyrət və təəccübdən nişanədir.*

---

[1] Məsnəviyi-Mövləvi, 2 ci dəftər, beyt 1186
[2] Qəzəl 27, beyt 2

Beyt 2: **Əsəri – qəbuli – taət ona vermiş öylə halət**
**Ki, qülubi - əhli – halə hərəkatı cazib olmuş.**

Sözlük: Taət – itaət; Halət – hal; Qülub – qəlblər = ürəklər; Cazib – cazibəli

**Nişanə** 1. “Taət”: Bəşəri iradənin ilahi iradə ilə vahidləşməsindən ibarətdir. Lakin ibadət yalnız şəri hökmlərin icrası ilə məhdudlaşır.[1]

**Qeyd** 1: *Qorxu, ümid, məhəbbət, hüzn, həya, şövq, heybət və münacat öz yarı göy sakinliyindən xəbərdar insanın dünya üzərindəki itaətindən ibarətdir.*[2]

**Qeyd** 2: *İnsanı, bütün ilahi sifətləri əks etdirməklə Yaradanın tam məzhəri olmağa layiq edən taətdən ibarətdir.*

**Nişanə** 2. “Əsəri – qəbuli – taət”: Öz bəşəri iradəsini ilahi iradə ilə müvafiq etmiş mürşüdün və ya dünyəvi vücuduna mənəvi obraz bağışlamış dilbərin, ya da “güzgü” və “məzhər” ünvanlı məqama nail olmuş bəşərin[3] ilahi təbdil təcəssümündən ibarətdir.

**Nişanə** 3. “Qülub”: Yeddi mədənli həqiqi ürəyin ikinci mədənindən ibarətdir[4] . Bu mə’dən:

A: Şərif ayənin buyurduğu iman mədənindən ibarətdir: “ اولئك كتب في قاوبهم الايمانَ”[5] (“[Allaha və axirət gününə iman gətirmiş qövm onlar deyirlər ki, Allah] onların qəlblərinə iman yazıbdır”) .

B: Şərif ayə buyurduğu əql mədənindən ibarətdir: “ اولم يسير و في الارض فتكون لهم قلوبٌ يعقلون بها”[6] (“Məgər onlar yer üzündə gəzib dolanmırlar ki, düşünən qəlbləri, ...., olsun?”).

**Nişanə** 4: “Əhli hal”: Maddi dünyada mənəvi aləmin ətrini alanlar, yaxud həm keçmişi, həm də gələcəyi unutmuşlardan, nəhayət, maddi dünyanın zaman adlı güclü bir cəhətindən azad olmuşlardan ibarətdir.[7]

**Qeyd:** *Ruh cismi ziynətləndirən kimi hal aşiqin zamandan qaib olmuş möhlətini ziynətləndirir.*

**Nişanə** 5. “Hərəkat”: Aşiqi hal nailiyyətində maddə və müddətdən xəbərsiz edən məşuq cilvələrindən ibarətdir.

---

[1] دكتر سيد جعفر سجادى، فرهنگ لغات و اصطلاحات و تعبيرات عرفانى
[2] Göztərilən kitab
[3] Qəzəl 46, beyt 5, nişanə 1, “qeyd”
[4] Qəzəl 13, beyt 1, nişanə “ətval”
[5] Quran, Mücadilə surəsi, 22-ci ayə
[6] Quran, Həcc surəsi, 26-cı ayə
[7] Qəzəl 1, beyt 7, haşiyə

**Nişanə** 6. “Cazib”: Eşq vadilərini zəhmətsiz əzabsız sovuşub, mənəvi seyr mərhələlərini tamamlayan ilahi lütfdən ibarətdir.

**Anlam: A: Bəşəri iradəsini ilahi iradə ilə müvafiq etmiş insanın vücudunda, bəşəri sifətlərin ilahi sifətlərə çevrilməsi. “Əzdad” bəhsi sübut etmiş ki, təbii bir çevriliş, həm də uca Allahın vədə verdiyi qəti bir mükafatdır.[1]**
**B: Bəşəri iradəsini ilahi iradə ilə müvafiq etmiş insan, zavala məruz qalmış nalayiq vücudunu da ilahi zavalsız vücuda çevrilməyə layiq edir[2] . Beləliklə, onun əli (yədullah), gözü (eynullah) və vücudu (ayətullah) olaraq içlərinin də sifətləri kimi mənşəyi mütəal məbud olar. Belə bir çevriliş nailiyyətində demişlər ki, Əli əleyhissəlamın əlindəki şəmşiri endirən qüvvə həqiqətən Allah-taalanın öz qüvvəsindən ibarətdir.**

Beyt 3: **Fərəhim görüb, cəfasın həsənatə daxil eylər,**
**Nə mələk kim, ol pərinin əməlinə katib olmuş.**

Sözlük: Həsənat – xeyir işlər

**Nişanə** 1. “Fərəh”: Bəşəri simada ilahi parlamalar müşahidə etmiş aşiqin batini ləzzət almağından ibarətdir.

**Nişanə** 2. “Cəfa ”: Bu beytdə aşiqin qəlbini ətəş atəşində tərbiyə edən vəfasızlıqdan ibarətdir.

**Nişanə** 3. “Pəri”: Bu beytdə bəşəri iradəsini ilahi iradə ilə vahidləş-dirmiş gözəldən ibarətdir.

**Anlam: Məşuqun tərbiyəvi cəfakarlığı axirət məhkəməsində xeyir işlər kimi nəzərə alınacaqdır.**

Beyt 4: **Nə əcəb gər olsa qəmdən dünümü günüm bərabər,**
**Nəzərimdən ol üzü gün neçə gün ki, qaib olmuş.**

**Nişanə** 1. “Qəm”: Bu beytdə batini vücudun məşuq tələbində etdiyi himmətindən ibarətdir.

**Nişanə** 2. “Dünüm və günüm bərabər”: Bu ibarə “zülmət ünvanlı bədən küdurətində, yaxud təbiət məhdudluğunda giriftar olmaqdan istiarədir.

---

[1] Qəzəl 61, beyt 1, qeydlər
[2] Qəzəl 98, beyt 1, nişanə 3, “sultan”, qeydlər

**Nişanə** 3. "Üzü gün": Bəşəri simada ilahi parlamalar əks etdirmiş dilbərdən istiarədir.

**Nişanə** 4. "Qaib": Hicab arxasından cilvə edən dilbərdən ibarətdir.

**Anlam: Məşuq camalından bəhrəsiz həyat sürmək mərifət nurundan məhrum yaşamaqa bərabərdir.**

Beyt 5: **Qəmi – hicrdir kim, artar əsərilə eşq zövqü,**
**Qələt eyləmiş Füzuli ki, vüsalə talib olmuş.**

**Anlam: A: Hicran, aşiqi tərbiyə edən və yetişdirən mərhələ olduğuna görə əziz və hörmətlidir. Elə buna görə də demişlər:**
**"Ey rəqib səngdil, çox tənə vurma, Əzhərə[1]**
**Sən vüsalından xoş olsan, mən də hicrandan xoşam".**
**B: Hicran mütəal məhbubun istədiyi və məsləhət bildiyi olduğundan vüsaldan, yaxud aşiq istədiyindən üstündür.**
**C: Hicranda vüsal ümidi və vüsalda hicran qorxusu olduğuna görə ümidi qorxudan və hicranı vüsaldan üstün bilmişlər:**

هست در قرب همه بیم زوال
نیست در بُعد جزامّید وصال[2]

[1] Əzhər Ərdəbilinin qəzəlindən bir beyt
[2] Cami, Şeirlər divanı

## Q Ə Z Ə L 131

**(1) Bilməz idim, bilmək ağzın sirrini düşvar imiş,**
**Ağzını derlərdi yox, dediklərincə var imiş.**

**(2) Aciz olmuş yıxmağa ah ilə kuhi Kuhkən,**
**Neyləsin miskin, onun həm eşqi ol miqdar imiş.**

**(3) Daşə çəkmiş xəlq üçün Fərhad Şirin surətin,**
**Ərzə qılmış xəlqə məhbubin, əcəb biar imiş.**

**(4) Kə`bə ehraminə zahid, dedilər, bel bağladı,**
**Eylədim təhqiq, onun bağlandığı zünnar imiş.**

**(5) Ömrlərdir eylərəm əhvali – dünya imtəhan,**
**Nəqdi – ömrü hasili – dünya həman bir yar imiş.**

**(6) Zövqi – didarilə dildarın yox etdim varimi,**
**Dövləti – baqi ki, derlər, dövləti – didar imiş.**

**(7) Dün Füzuli arizin görkəc, rəvan tapşırdı can,**
**Laf edib derdi ki, canım var, əmanətdar imiş.**

Beyt 1: **Bilməz idim, bilmək ağzın sirrini düşvar imiş,**
**Ağzını derlərdi yox, dediklərincə var imiş.**

Sözlük: Düşvar – çətin

**Nişanə** 1. “Ağız”: İlahi işarələr və intibahlardan nişanədir.

**Nişanə** 2. “Sirr”: Bəşəri təcrübəyə sığmaz “mütəkəllim” ünvanlı ilahi sifətdən ibarətdir.

**Nişanə** 3. “Düşvar”: İlahi intibahlara nail olmaq, dünyəvi nemətləri, xüsusilə özünü unutmağa məcbur olduğuna görə düşvardır.

**Nişanə** 4. “Ağzını derlər yox”: Yoxluq – fəhmin gözünə görünməz hüsnü, yaxud bəşəri idrakda olmayan iqtidarı təlqin edən nişanədən ibarətdir.

**Anlam: Ariflər düz demişlər ki, bəşəri fəhmdə ağızı idrak etməyə qabiliyyət yoxdur.**

Beyt 2: **Aciz olmuş yıxmağa ah ilə kuhi Kuhkən,**
**Neyləsin miskin, onun həm eşqi ol miqdar imiş.**

Sözlük: Kuh – dağ; Kuhkən – dağ qazan = dağ qoparan = Fərhadın ləqəbi

**Nişanə** 1. “Ah”: Bu beytdə dünyəvi ilgilərini yandırmış aşiqin maddi qanunlara qələbə çalmaq iqtidarından nişanədir.

**Nişanə** 2. “Kuhkən”: Məcazi eşq güzgüsündə müşahidə etdiyi parlamaları kamil və kafi bilmiş aşiqdən istiarədir.

**Nişanə** 3. “Miskin”: Bu beytdə bəşəri hüsnü kamil xəyal etmiş aşiqi təhqir edən nişanədir.

**Anlam: Məcazi eşq və iqtidar ilə dağ kimi ağır məneələri aradan qaldırmaq mümkünsüzdür.**

**Qeyd:** *Eşqin iqtidar miqdarı hüsnün mənəvi dərəcəsinə bağlıdır. Buna görə buyurmuşdur: “Hüsn nə ilə miqdar olursa eşq ol miqdar olur”.*

Beyt 3: **Daşə çəkmiş xəlq üçün Fərhad Şirin surətin,**
**Ərz qılmış xəlqə məhbubin, əcəb biar imiş.**

Sözlük: Ərz qılmaq – izhar etmək = nişan vermək

**Anlam: Bu beyt, aşiqi təhqir edən “miskin” nişanəsini aşağıdakı sübutlarla aydınlatmaq istəyir:**

1 –Fərhad, daşa surət çəkməklə naməhrəm şəxslərə, yaxud əql

tabelərinə sirr açdığından cəzalanmalıdır.[1]

2 – Fərhad, ağız mərtəbəsində dediyimiz görünməz əzəməti görünmüş fərz etməklə özünün mərifətsiz olduğunu sübut etmişdir.

3 – Məşuq surətini əks etdirməyə yalnız “nari-məhəbbət” atəşində paklanmış ürək[2] layiqdir. Ona görə də canan surətini daşda rəsm etmək:

A: Surət hörmətini yerə vurmağa bərabərdir.

B: Ürək güzgüsünə ədəbsizlik etmək nişanəsidir.

C: Öz ürəyinin layiqsiz olduğunu təsdiq etmək nişanəsidir.

Beyt 4: **Kə`bə ehraminə zahid, dedilər, bel bağladı,**
**Eylədim təhqiq, onun bağlandığı zünnar imiş.**

Sözlük: Kə`bə – Allahın evi = dörd guşəli yer; Ehram – qəsd etmək = ziyarət niyyətinə düşmək = Kə`bəni ziyarət etmək niyyətilə tikişsiz iki çadraya bürünmək; Zünnar – qurşaq = Zərdüştilərin özəl qurşağı = xaç asılmış bağ

**Nişanə** 1. “Kə`bə”: Kə`bə bu beytdə:

1 –Ziyarətin zahiri qayda-qanununu qənaətbəxş bilmiş hacıları məzəmmət edən nişanədən ibarətdir.

2 –Ziyarət əvəzində mükafat tələb etmiş hacıları məzəmmət edən nişanədən ibarətdir.

**Qeyd** 1: *Ayaq – ayaq ilə gəlmiş şəxs, nəhayət, Kə`bə binasını ziyarət etməlidir.*

**Qeyd** 2: *Öz ürəyini hərəkətə gətirmiş bir şəxsin vücudunu Kə`bə özü ziyarət etməlidir.*

**Qeyd** 3: *Maddi dünyanın ortasında yerləşmiş Kə`bə, ümumi qiblədən ibarətdir.*

**Qeyd** 4: *Uca Allahın “ərş[3]” ünvanlı əmr mərkəsində yerləşmiş əl çatmaz Kə`bə xüsusi qiblədən ibarətdir.*

**Qeyd** 5: *Mürşidlərin qəlbi həmçinin ariflərin canı da xüsusi qiblədən ibarətdir.*

**Qeyd** 6: *Zahiri Kə`bə – aşiqi mənəvi inkişaflara nail edən “müamilə qiblə”si ünvanlı məqamdan ibarətdir.*

**Qeyd** 7: *Batini Kə`bə – haqq-taalanın öz hüzuruna qaytardığı*

---

[1] Qəzəl 114, beyt 1, nişanə 5 “ifşayi raz”
[2] Qəzəl 54, beyt7, nişanə 2
[3] Qəzəl 50 , beyt 1

*"müşahidə qibləsi" ünvanlı məqamdan ibarətdir.*[1]

**Nişanə** 2. "Zünnar": Bu beytdə bəşəri idraka, yaxud dünyaşünas əql tədbirinə bel bağlamaqdan nişanədir.[2]

**Qeyd** 1: *Sufilər zünnar bağlamağı kafirlik nişanəsi bilmişlər.*

**Qeyd** 2: *Şərq ərazisində yaşayan məsihilər, müsəlmanların hökmilə zünnar bağlayaraq onlardan fərqlənmək məcbutiyyətini qəbul etmişlər.*[3]

**Anlam: Mükafat məqsədilə ziyarət etmək həmçinin zahiri qanun-qayda icrasını kafi bilmək, zahidi mütəal məhbub hüzuruna müraciət etdirən qiblədən, yaxud Kə`bənin batini cilvəsindən qəflətdə saxlamışdır.**

Beyt 5: **Ömrlərdir eylərəm əhvali – dünya imtəhan,**
**Nəqdi – ömrü hasili – dünya həman bir yar imiş.**

**Nişanə** 1. "Yar": Şühud aləminə, yaxud mütəal məbud cəmalini müşahidə etməyə "yar" demişlər.

**Qeyd** 1: *İrfani mərhələlər, mərtəbələr, seyrlər, hərəkətlər və əhval – ruhiyyələr təmamilə müşahidə məqamının müqəddimələrindən ibarətdir.*

**Qeyd** 2:*Müşahidə məqamının məhsulları aşağıdakılardan ibarətdir:*

*A: Ülvi cazibələr nailiyyəti;*

*B: Əl çatmaz gizli camalın ürək güzgüsündə zahir olması;*

*C: Bəşəri mahiyyət maneəsindən azad olmaq;*

*D: Fanilik məqamına nail olmaq.*

**Anlam: Yalnız şühud məqamına nail olmuşlar dünyəvi ömür möhlətindən düzgün bəhrələnmişlər.**

Beyt 6: **Zövqi – didarilə dildarın yox etdim varimi,**
**Dövləti – baqi ki, derlər, dövləti – didar imiş.**

Sözlük: Didar – görmək = görüşmək; Baqi – sabit = canlı = daimi = mütəal məbudun adlarından biri

**Nişanə** 1. "Zövq": A: Şühud məqamının ilk mərtəbəsindən nişanədir. Bu mərtəbəni dərk edən aşiq, şühud nemətinin dadını – tamını düşünərkən, dəmbədəm özünün atəşini və tələbini əlavə edər, nəhayət

---

[1] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

[2] Qəzəl 81, beyt 4

[3] Yunan ədəbiyyatında hər cür riştəyə xüsusilə bütpərəst və atəşpərəst bağladığı qurşağa "zonari" və ya "zonarion" demişlər (Fərhəgi-Moin)

“hal” səamsının şıdırğı parlamalarına yetişər.

B: Zövq mərtəbəsində asanlıqlarla yanaşı çətinliklər zühur edirlər.

C: Zövq müşahidə və mükaşifə məqamının meyvəsindən ibarətdir.[1]

**Nişanə** 2. “Didar”: İlahi parlamaları, yaxud həqiqət simasını “fuad” ünvanlı ürək gözü ilə görməkdən ibarətdir.

**Nişanə** 3. “Yox etdim varımı”: Varı yox etmək, fiziki mahiyyət hicabından, yaxud özündən azad olmuş aşiqin fanilik ərəfəsinə daxil olmağından ibarətdir.

**Nişanə** 4. “Dövlət”: Bu beytdə Allah-taalanın “əzəli ehsan” [2] ünvanlı lütf və rəhmətindən, yaxud mənəvi feyzlərin davam olmasından, ya da maddə müddətindən üstün bir məna yağdıran ilahi zühurlardan ibarətdir.

**Anlam: Şühud nurunda bəşəri vücud hicabından, yaxud özümdən azad olmaqla əzəli ehsan əzəmətini düşünərkən həqiqi ölməz həyatla tanış oldum.**

Beyt 7: **Dün Füzuli arizin görkəc, rəvan tapşırdı can,**
**Laf edib derdi ki, canım var, əmanətdar imiş.**

Sözlük: Ariz – sima = camal = surət, rəvan = cəld = fövrən = axıcı

**Nişanə** 1. “Ariz”: Bu beytdə hicabsız camal feyzindən ibarətdir. Bu feyz, yaxud bu nur aşiqin ürəyindəki bəzi mənəvi sirrləri açıb ağardan ehsandan nişanədir.

**Nişanə** 2. “Rəvan can tapşırmaq”: “Ələst”[3] ünvanlı yuxarı aləmdən gətirdiyi xarakterini salim saxlaya bilməyən canın ülvi aləmə dikəlməsi,xüsusilə, vəhdət mülkünə, yaxud “انا الله” nöqtəsinə müraciət etməsi gah müşkül, gah da mümkünsüzdür. Beləliklə, rəvan can tapşıqmaq, yaxud mütəal məbud hüzuruna asanca qayıtmaq aşağıdakı mərtəbələrdən istiarədir:

1 – “Nari-məhəbbət” atəşində yanıb paka çıxmaq mərtəbəsi (atəş isə su kimi paka çıxaran maddədən ibarətdir.)

2 – şühud cəlalərilə yanıb saflaşmaq mərtəbəsi.

**Qeyd** 1: *Dünyəvi ömür möhlətində qeyri maddi canın maddi bədən küdurətilə qaralması onun dübarə safa çıxmasını lüzumlu edir.*

**Qeyd** 2: *Canın əmanət olduğunu etiraf etmək, onun salim*

---

[1] Qəzəl 37, beyt 3, nişanə 1
[2] Başlanışı olmayana “əzəl” demişlər
[3] Qəzəl 19, beyt 4

*saxlanılmasına işarə edir. Bu mənanı nəzərə alaraq lisanül-qeyb Hafiz Mövlana Füzuli kimi öz canını "borc" bilib, onu mütəal məbud hüzuruna təslim etmək istəyir:*

این جان عاریت که به حافظ سپرد دوست
روزی رخش ببینم و تسلیم وی کنم[1]

**Anlam: Füzuli şühud nurunda yanmaqla (ariz mərtəbəsi) öz canının ariyə (borc) olduğundan xəbərdar oldu.**

---

[1] Müəllif bu beyti "Ta Qafe-əndişe" kitabının 3-cü cildində şərh etmişdir.

## **Q Ə Z Ə L 132**

**(1) Dil ki, sərmənzili ol zülfi – pərişan olmuş,**
**Nola cürmi ki, asılmasına fərman olmuş ?**

**(2) Şahsən mülki – məlahətdə, sənə qullar çox,**
**Biri oldur ki, varıb Misrdə sultan olmuş.**

**(3) Rəhm edib aşiqini həşr günü yaxmayalar**
**Ki, bu dünyada əsiri – qəmi – hicran olmuş.**

**(4) Dedilər, qəm gedirər badə, çox içdim sənsiz,**
**Qəmi – hicranə müfid olmadı ol qan olmuş.**

**(5) Bağibani – çəməni – dəhrə xəyali – dəhənin**
**Səbəbi – tərbiyəti – qönçeyi – xəndan olmuş.**

**(6) Adəm əvvəl səri-kuyin verib almış cənnət,**
**Eşidib təni – mələk, sonra peşiman olmuş.**

**(7) Ey Füzuli, mənim əhvalimə bir vaqif yox,**
**Böylə kim, aləm onun hüsnünə heyran olmuş.**

Beyt 1: **Dil ki, sərmənzili ol zülfi – pərişan olmuş,**
**Nola cürmi ki, asılmasına fərman olmuş ?**

Sözlük: Sərmənzil – mənzil = məskən = məqam

**Nişanə** 1. “Del”: Aşiqin ilahi eşq ilə dolmuş ürəyindən, yaxud yerə - göyə sığmaz həqiqi iç aləmi.

**Nişanə** 2. “Sərmənzil”: Aşiqi fanilik mərtəbəsinə tərbiyə edən məqam.

**Nişanə** 3. “Zülfi pərişan”: Hər bir çeşiddə ilahi camal nurunu əks etdirmiş kəsrət güzgüləri (qaraca maddədə ağ nur əks etdirən mərtəbə).

**Nişanə** 4. “Cürm”: Məcazi həyat tortasından nişanə.

**Nişanə** 5. “Asılma”: Qurbanlıq bazarına hazırlayan imtahanlar və ehsanlardan nişanədir.[1]

**Anlam: Dil fanilik, yaxud qurbanlıq qarşısında maneə törətmiş fiziki mahiyyət tortasından azad olmaq məqsədilə, zülf mənzilini məskən etmişdir.**

Beyt 2: **Şahsən mülki – məlahətdə, sənə qullar çox,**
**Biri oldur ki, varıb Misrdə sultan olmuş.**

**Nişanə** 1. “Şah”: Bu beytdə həzrət məbudun özünü, yaxud həzrət peyğəmbəri təlqin edən nişanədir.

**Qeyd** 1: *Ürfan mədəniyyətində öz bəşəri nəfsinə hökmran olmuş insana şah demişlər.*

**Qeyd** 2: *Bədən tərkibinə daxil olmuş “heyvani ruh” adlı lətifələr cövhəri, yaxud yaramaz sifətlər mənşəyi bəşəri nəfsdən ibarətdir.*

**Nişanə** 2. *“Məlahət”: heç bir elm və fikir nəhayətini dərk etməyən ilahi kamala məlahət demişlər.*

**Nişanə** 3. “Qul”: Öz malına, canına, elminə və bütün vücuduna mütəal məhbubu malik bilmiş, “məmlük”[2] ünvanlı aşiqə qul demişlər.

**Qeyd:** *Aşiq damla qədəri bir şeyə malik olsa belə, onda iki malik olmalıdır: bir aşiq – bir məşuq, bir damla – bir dəniz. İkilik isə aşiqin tələb etdiyi vəhdət məqamı ilə tuş və uyğun gələn anlayış deyildir.*[3]

**Nişanə** 4. “Yusif”: İlahi ruhunu bədən zülmətdə nuranilik saxlamış aşiqə iıarə edən nişanədir.

---

[1] Qəzəl 2, beyt 2
[2] Qəzəl 1, beyt 6, nişanə 2, qeyd 1,2,3,4
[3] Qəzəl 1, beyt 6, haşiyə 3

**Anlam: Öz ilahi ruhunu salim saxlamış insan, yer üzərinə malik olsa da, uca Allah ərəfəsinəd məmlükdür.**

Beyt 3: **Rəhm edib aşiqini həşr günü yaxmayalar**
**Ki, bu dünyada əsiri – qəmi – hicran olmuş.**

**Nişanə** 1: "Qəmi-hicran": Aşiqin qəlbini paka çıxaran tələb və həsrət atəşi.

**Anlam: Öz qəlbini tələb və həsrət atəşində paka çıxarmış aşiq axirət dünyasında yanmaqdan azaddır. Çünki:**
**A: Asılma mərhələsində (birinci beyt) cəzalanmış aşiqi yenidən cəzalandırmaq (yaxmaq) adətindən kənardır.**
**B: Bir vücudun iki atəşdə yanmağı adətindən kənardır. Belə bir zənn ilə bu sətirlərin müəllifi bir qəzəlində demiş ki:**

شاهی به ریاضت که تورا هست ز هجران
والله که بر دوز خیان نیست عذابی
بر حرمت عشقی که توداری، به قیامت
شاید زگناه تو نپر سند، حسابی

Beyt 4: **Dedilər, qəm gedirər badə, çox içdim sənsiz,**
**Qəmi – hicranə müfid olmadı ol qan olmuş.**

**Nişanə** 1. "Badə": Bu beytdə əql və elm maneələrini aradan qaldıran dünyəvi aciz vasitələr və etibarsız qələbələr.

**Nişanə** 2. "Müfid olmaq": Arxasında "qəbz" olmayan "bəst" yaxud daimi vüsal nişanəsi.

**Nişanə** 3. "Qan olmuş": Müfid olmayan mərhələdə əzab çəkməkdən istiarədir.

**Anlam: Fiziki mahiyyət məhdudluğunda, yaxud dünyəvi həyat möhlətində, həsrət atəşindən azad olmaq, yaxud daimi vüsala çatmaq heç tədbir ilə (badə) mümkün deyildir.**

Beyt 5: **Bağibani – çəməni – dəhrə xəyali – dəhənin**
**Səbəbi – tərbiyəti – qönçeyi – xəndan olmuş.**

Sözlük: Dəhr – əsr = zaman = dövr; Dəhən = ağız

**Nişanə** 1. "Bağban": Bu beytdə məcazi gözəlliklərdən mənəvi rayihələr əxz etmiş insandan nişanədir.

**Nişanə** 2. "Çəmən": Yaşıllıq bu beytdə maddi aləmdə qeyri maddi rayihələr dərk etdirən vasitədən, yaxud mütləq kamaldan, ya da vəhdət

mərkəzilə əlaqədar cilvədən ibarətdir.

**Qeyd** 1: *Yaşıllıq həyat əlaməti olduğundan müqəddəsdir.*

**Qeyd** 2: *Yaşıllıq ilahi xilafət nişanəsi olduğundan müqəddəsdir.*

**Nişanə** 3. "Xəyali-dəhən": İlahi işarələri bəşəri təcrübəyə sığışdıran mərtəbədən nişanədir.[1]

**Qeyd:** *Maddi vücudu, mənəvi duyğular səmasına qaldıran və görünməz məqamları göstərən nəhəng qüvvədən ibarətdir.*[2]

Beyt 6: **Adəm əvvəl səri-kuyin verib almış cənnət,**
**Eşidib təni – mələk, sonra peşiman olmuş.**

Sözlük: Tən – tənə = sərki

**Nişanə** 1. "Səri-kuy": Rəhman behişti [3] ünvanlı ilahi hüzur müqəddiməsindən, yaxud vəhdət mülkünün ərəfəsindən nişanədir.

**Anlam: Həzrət Adəm rizvan behiştində sakin olmağa razılıq göstərməklə rəhman behişti ünvanlı əsl vətənindən kənar durmağı qəbul etmişdir. Ona görə də "nasut" ünvanlı yer aləminə süqut etməklə cəzalandırmışdir.**

**Qeyd** 1: *Vəhdət nöqtəsindən və ya innəllah mərkəsindən parlayan ilk nur Adəm adı ilə "ha", "lahut", "mələkut", "cəbərut" ünvanlı aləmlərin hər birindən xüsusi bir surətdə sovuşub cənnət adlı aləmə daxil olmuşdur.*

**Qeyd** 2: *Füzuli şərif ayənin buyurduğu qadağan edilmiş ağacın meyvəsindən istifadə etməyi* [4] *Həzrət Adəmin yer aləminə süqut etdirilməklə cəzalanmasına zahiri və xırda günah bilib, onun yuxarıda xatırladığımız əsl vətənindən kənar durmağa razılıq göstərməsini əsas günah kimi təlqin edir.*

Beyt 7: **Ey Füzuli, mənim əhvalimə bir vaqif yox,**
**Böylə kim, aləm onun hüsnünə heyran olmuş.**

**Nişanə** 1. "Əhval": Aşiqin batini vücudunu titrədən və onu özlüyündən xəbərsiz edən fərəh, qəbz, şövq, heybət və digər beləcə

---

[1] Qəzəl 131, beyt 1, nişanə 4

[2] Qəzəl 21. beyt 2, nişanə3

[3] Qəzəl 111, beyt 1, nişanə 1

[4] Quran, Bəqərə surəsi, 35-ci ayə: و قلنا يا آدم اسكن انت و زوجک الجنه و كلا منها رغداً حيث شيتما و لا تقربا هذه الشجره فتكونا من الظالمين. ("Və sonra dedilər ki: Ya Adəm! Sən öz zövcən ilə bu cənnətdə sakin ol, istədiyiniz kimi onun [nemətlərindən] bol-bol yeyin, təkcə bu ağaca yaxın düşməyin! Yoxsa zülmkarlalardan olarsınız.) Quran,Bəqərə surəsi, 35-ci ayə

keyfiyyətlərdən ibarətdir.[1]

**Nişanə** 2. “Hüsn”: A: Bütün kamalların yalnız bir vücudda, yaxud mütəal məbud vücudunda cəmləşməyindən ibarətdir.

B: Hüsn, xüsusilə, bu beytdə bütün batinləri təsirləndirən ilahi kamaldan ibarətdir.

**Nişanə** 3. “Heyran”: Heyranlıq bu beytdə sonsuz kamal qarşısında aciz və mat qalmaqdan nişanədir.

**Anlam: Hər bir yaranmış öz miqdarı qədər kamal qarşısında heyran olduğundan? başqa yaranmışın heyrətindən xəbərsizdir.**

**Qeyd** 1: *“Jan Mari Kuyi” cansız – hərəkətsiz kimi nəzərə çarpan mövcudların canlı olduğunu qeyd edərək, onların təsbih etməklərilə yanaşı, kamal arxasınca olduqlarına da işarə edir.*[2]

**Qeyd** 2: *Qəddar insanlar və yolkəsən çapqınçılar kamala çatmaq məqsədilə çalışqanlıq edirlər, ancaq onlar həqiqi kamalı tanıtdıran mərifətdən məhrumdurlar.*

---

[1] Qəzəl 42, beyt 7
[2] Qəzəl 4, beyt 1, “haşiyə”

## Q Ə Z Ə L 133

**(1) Hübabi - əşki – xunin cismimi eldən nihan etmiş,**
**Qəmi – eşqin məni – rüsvayi binamü nişan etmiş.**

**(2) Götürmüş xakdan tüğyani - əşkim xarü xaşaki,**
**Başım üzrə məlamət quşlariçün aşiyan etmiş.**

**(3) Büküb möhnət yükündən qəddimi, çıxmış tənimdən can,**
**Təvafi – kuyin etmək qəsdinə teyyi – məkan etmiş.**

**(4) Səninlə etdigiçün də`viyi-təqdim hüsn içrə,**
**Fələk tə`zir edib Leylini rüsvayi – cəhan etmiş.**

**(5) Məgər tərkibi – İsa gərdi-xaki-dərgəhindəndir**
**Ki, durmuş xakdən qədrilə əzmi – asiman etmiş.**

**(6) Gəzən peykanlarındır təndə, ya can bağına eşqin**
**Bəla sərçeşməsindən hər tərəf sular rəvan etmiş.**

**(7) Füzulidən mizacın münhərif gördüm bu gün yarın,**
**Məgər fürsət bulub bir şəmmə hali-dil bəyan etmiş?**

Beyt 1: **Hübabi - əşki – xunin cismimi eldən nihan etmiş,**
**Qəmi – eşqin məni – rüsvayi binamü nişan etmiş.**

Sözlük: Hübab – köpük; Əşk – göz yaşı; Xunin – qanlı; Nihan – gizli; Binamü nişan – ad-sansız

**Nişanə** 1. “Hübabi - əşk”: Dünyəvi ilgi - əlaqələri, xüsusilə, bəşəri sifətləri yuyub iç aləmi “ney” ünvanlı boş mənzilə çevirmiş mərtəbə.

**Nişanə** 2. “Əşki-xunin”: Qan batil etmək əlaməti olduğuna görə əşki-xunin, yaxud qan ağlamaq dünyəvi əngəl varlığını, yaxud bəşəri sifətləri batil edən nişanədən ibarətdir.

**Nişanə** 3. “Cismimi eldən nihan etmiş”: Özünü bəşəri sifətlər ilə tanıtdırmış camaata, yaxud xəlqə oxşamazlıqdan istiarədir.

**Nişanə** 4. “Qəmi-eşq”: Yeganə məşuq tələbində çalışqanlıqdan ibarətdir.

**Nişanə** 5. “Rüsva”: A: Rüsvaylıq – fiziki mahiyyəti təhqir edən sərkilər nəticəsindən ibarətdir.

B: Rüsvaylıq – yetkinlik səbəbi, yaxud “ikinci” etibar nvanlı məqama nail olmaq əlamətidir.

**Nişanə** 6. “Binamü nişan”: Fanilik məqamına nail olmaqdan nişanədir. Aşiq bu məqamda:

1 – “Təyyin” ünvanlı mərhələdən, yəni göz vasitəsilə görüb yəqin etmək mərhələsindən azad olar.

2 – “Dünyəvi uğurlar və etibarlardan” hacətsiz olar.

3 – “İlahi zat mərtəbəsini müşahidə” etməyə nail olar.

4 – “Kəsrət aləmindən azad olarkən vəhdət aləminə” daxil olar.

5 – “Yəqin adlı çeşmədən dirilik suyu içməklə özəl həyat aləminə” daxil olar.

6 – “Ruhun yaşıl aləmi kimi həmişə şad və canlı yaşar.”[1]

**Anlam: Eşq aləmindən xəbərsiz xəlqin sərkiləri camaat ünvanlı kəsrətdən ayrılmağıma həmçinin vəhdət aləmindən bəhrələnməyimə yardım oldu.**

Beyt 2: **Götürmüş xakdən tüğyani - əşkim xarü xaşaki,**
**Başım üzrə məlamət quşlariçün aşiyan etmiş.**

Sözlük: Xak – torpaq; Əşk – göz yaşı; Xarü xaşak – kol-kos; Aşiyan – yuva

---

[1] Şeyx Mahmud Şəbüstəri, Gülşəni-raz, 1382-ci il nəşri, s.456

**Nişanə** 1. “Tüğyani-əşk”: Bu beytdə ömür binası üstündən aşıb daşmış fəna dalğalarından nişanədir.

**Nişanə** 2: “Xarü xaşak”: Məcazi mahiyyəti təhqir edən nişanədən ibarətdir.

**Nişanə** 3. “Baş”: Bu beytdə ülvi aləmdən xəbərsiz saxlayan bəşəri elm və şəxsi fikir məğrurluğundan istiarədir. Buna görə də müəllif (Ə.Şahi - red.) bir qəzəldə belə demişdir:

**O baş ki, tac edir soraq onu dolandır et ayaq**
**Sora həman ayaq ilən, üruc edib xudayə bax.**

**Nişanə** 4. “ Məlamət quşları”: Bax beyt 1, nişanə 5 (“rüsvaylıq”)

**Anlam: Məcazi vücud məğrurluğunu, fəna dalğalarilə (əşk) yuyub məhv etmək məqsədilə müxtəlif məlamətləri alqışlayıram.**

Beyt 3: **Büküb möhnət yükündən qəddimi, çıxmış tənimdən can,**
**Təvafi – kuyin etmək qəsdinə teyyi – məkan etmiş.**

Sözlük: Təvaf – bir şeyin dövrəsinə dolanmaq = məxsus tərz ilə Allah evinin dövrəsinə dolanmaq; Təyyi-məkan – yol getmək

**Nişanə** 1. “Möhnət”: Möhnət – məhəbbət qədimdən qoşa yoldaşdırlar. Məhəbbətdən dəm vuran bir şəxsin qəlbini – canını sınaqlara çəkməklə onun naqisliyini, yaxud kamilliyini üzə çıxarıb aydınlaşdıran yalnız möhnətdir.

**Nişanə** 2. “Bükülmüş qədd”: A: Bu beytdə baş endirmək, boyun əymək, hörmət gözləmək və bir də əslə və kökə, yaxud “اناّللها” - a müraciət etmək nişanəsidir.

B: “Müstədir hərəkət” ünvanlı seyrə hazırlaşmaqdan nişanədir.[1]

C: İkinci misrada qeyd olunmuş təvaf mənzilinə hazırlaşmaqdan nişanədir.

D: Fiziki mahiyyət həbsindən azad olmaq müqəddiməsidir.

**Nişanə** 3. “Təvafi-kuy”: “Can Kə`bəsi”, yaxud “Raz Kə`bə”si, ya da yeganə məbud və məhbubun öz ərəfəsini (ilahi hüzur məqamını) ziyarət etməkdən nişanədir.[2]

**Nişanə** 4. “Təyyi-məkan”: Təyyi-məkan bir aləmdən digər aləmə səfər etmək nişanəsidir.

---

[1] Qəzəl 1, beyt 1, nişanə “salik”

[2] Kə`bə = Allah evi (aqil hacıların ziyarət etdikləri Kə`bə, Hicaz Kə`bəsidir. Ancaq aşiqlər ziyarət etdiyi məbud ərəfəsi Raz Kə`bəsi, yaxud Can Kə`bəsindən ibarətdir.)

**Anlam: Hübabi-əşk, rüsvaylıq, məlamət (ötən iki beyt) və möhnət vasitələri ilə fiziki mahiyyət hicabından azad olaraq "Raz Kə`bə"sini ziyarət etməyə hazırlaşmışam.**

Beyt 4: **Səninlə etdigiçün də`viyi-təqdim hüsn içrə,
Fələk tə`zir edib Leylini rüsvayi – cəhan etmiş.**

Sözlük: Də`vi – iddia = iddia etmək; Təqdimi-hüsn – hüsnünü göstərmək; Tə`zir – cəzalandırmaq = üzr istəmək

**Nişanə** 1. "Leyli": A: Leyli – bu beytdə öz bəşəri hüsnünə güvənməklə, ilahi hüsndən xəbərsiz qalmış dilbər.

B: Leyli öz bəşəri hüsnünü müstəqil təsvir etməklə həqiqi gözəllik mənşəyindən xəbərsiz qalmış dilbər.

**Nişanə** 2. "Rüsvayi-cahan": Bu beytdə öz adını dildən-dilə salmaqla[1] mənfi rüsvaylıq ünvanlı cəzalanmağa (tə`zir) məhkum olmaqdan nişanədir.

**Anlam: Bəşəri imtiyazları müstəqil görmüş insan məcazi dünya vasitəsilə cəzalanmalıdır.**

Beyt 5: **Məgər tərkibi – İsa gərdi-xaki-dərgəhindəndir
Ki, durmuş xakdən qədrilə əzmi – asiman etmiş.**

Sözlük: Gərdi-xak – torpağın tozu; Dərgəh – barigah = qəsr

**Anlam: Həzrəti İsa Allah-taalanın ərəfəsində olan xüsusi torpaqdan yarandığına səma sakinliyinə nail oldu!**

**Qeyd** 1: *Məryəm oğlu İsa əlehissəlamı ülvi aləmə yüksəldən səbəb, onun mənəviyyatı ilə yanaşı ilahi hikmətdən ibarətdir, ancaq Füzuli, xüsusi torpaqdan yaranmağı, o yüksəlişə səbəb sanmaqla "hüsnü təlil" ünvanlı ədəbi sənətdən istifadə etmişdir.*[2] *Həmin sənətdən istifadə edərkən:*

*1 – Münim Ərdəbili buyurmuşdur:*
*Qarun qürura qərq idi, qərq etdilər yerə,*
*İsa qüruru vurdu yerə, çıxdı göylərə.*[3]

---

[1] Dini və əxlaqi mədəniyyətlər baxımıyla, xüsusilə keçmiş əsrlərdə adı dillərə düşmək qadınlar üçün abırdan düşməyə bərabərdir.

[2] Hüsnü təlil, bir sifəti, yaxud sözü, onun həqiqi illəti ilə yox, bəlkə onunla lətif tənasübdə olan başqa bir illət ilə sübut etməkdən ibarətdir.

[3] Munim Ərdəbili , Təcəlliyat

*2 – Mövlana Saib Təbrizi taxtanın su üzündə durmasında, suyun analıq məhəbbətini dəlil bilib buyurmuşdur:*

چوب را آب فرو می نبرد دانی چیست؟
عارش آید زفرویردن پرورده ی خویش

**Qeyd** 2: *Məsihilərin nəzərincə həzrət İsa dara çəkilib öləndən sonra bir dəstə mömin qadınlar vasitəsilə dəfn oldu. Ancaq o üç gündən sonra dübarə dirildi və yenidən qırx gün həyat sürüb sonra göylərə yüksəldi.*[1]

**Qeyd** 3: *Qurani Kərim həzrət İsanın dara çəkilməyi barədə belə buyurmuş:* " و قولهم انّا قتلنالمسيح عسي ابنَ مَريَمَ رَسوُلَ الله وَ ما قتلوهُ و ما صلبوهُ وَ لاكن شُبّهَ لَهُم وَ انَّ الّذينَ اختلفو فيه لفي شَكًّ منهُ ما لهم به من علم الّا اتباع الظنّ و ما قتلوه يقينا' بل رفعه الله اليه و كانَ الله عزيزا حكيما"[2] *("Biz Allahın peyğəmbəri olan Məryəm oğlu İsa Məsihi öldürdük"demələri üzündən ... Halbuki onlar onu öldürmədilər və dara çəkmədilər, lakin onlara elə gəldi. Həqiqətən, onun haqqında ixtilafda olanlar əlbəttə şəkk və şübhədədirlər, onların buna dair məlumatları yoxdur, onlar ancaq zənnə tabedirllər və onu qətiyyən öldürməyiblər. Əslində Allah onu öz tərəfinə yüksəltdi (ucaltdı). Və Allah izzət və hikmət sahibidir".*

Beyt 6: **Gəzən peykanlarındır təndə, ya can bağına eşqin**
**Bəla sərçeşməsindən hər tərəf sular rəvan etmiş.**

Sözlük: Peykan – ox ucu = ox; Sərçeşmə – çeşmə başı

**Nişanə** 1. "Peykan": Bu beytdə maddi həyata sədəmə vurmaqla, mənəvi yaşayışa hazırlayan səbəbdən ibarətdir.

**Nişanə** 2. "Can bağı": Bəst rayihəsindən bəhrələnmiş batindən ibarətdir.

**Nişanə** 3. "Bəla": İnsanı dünyəvi ilgi - əlaqədən, xüsusilə fiziki mahiyyətdən qoparıb, kəsrət həbsindən vəhdət gülşəninə aparan sınaq – sıxıntıdan ibarətdir.

**Nişanə** 4. "Su": Bu beytdə mənəvi mərifət və həqiqi həyatdan nişanədir.

**Anlam: Vücudumu məğlub etmiş peykanlar mənəvi mərifət və həqiqi həyata nail olmağımdan nişanədirlər**

---

[1] Doktor Məhəmməd Moin, Fərhəngi-Moin
[2] Quran , Nisa surəsi, 157 və 158-ci ayələr

Beyt 7: **Füzulidən mizacın münhərif gördüm bu gün yarın,**
**Məgər fürsət bulub bir şəmmə hali-dil bəyan etmiş?**

Sözlük: Münhərif – üz çevirən = inhirafçı; Şəmmə – az miqdar = az

**Nişanə** 1. “Yar”: Bu beytdə şühud mərtəbəsinə tərbiyə edən mürşid, yaxud Allah-taaladır.

**Nişanə** 2. “Hali-d-l”: Bu beytdə səssiz-ibarəsiz bəyandan ibarətdir.

**Anlam: A: Həzrət mürşid Füzulidən üz çevirməklə onu ibarəyə sığmaz xüsusi təlimatı ilə bəhrələnmişdir.**

B: Həkim məbud şühud cilvələrini dayandırmaqla Füzulini işarə - intibahdan bəhrələndirmişdir.

## **Q Ə Z Ə L 134**

**(1) Ta ki, taqi-zərnigarın çərx viran eyləmiş,**
**Xişti-zərrinin səba fərşi-gülüstan eyləmiş.**

**(2) Katibi-tədbir xətti-səbzə təhrir etməyə**
**Lövhi-gülzari-xəzan bərgi zərəfşan eyləmiş.**

**(3) Qət` edib fəsli-xəzan abi-rəvan şirazəsin,**
**Nüsxeyi-gülzarın övraqın pərişan eyləmiş.**

**(4) Dövr cövrün gör ki, nezhətgahi-əhli-zövq ikən,**
**Cuybari-gülşəni zənciri-zindan eyləmiş.**

**(5) Eyləmiş tədbiri-təşvişi-xəzan taracına**
**Lalə, rəngin rəxtini dağ içrə pünhan eyləmiş.**

**(6) Ruzigarın tirə, bəxtin qarə, nitqin lal edib,**
**Matəmi-gül bülbülü zağ ilə yeksan eyləmiş.**

**(7) Ey Füzuli, dəhr halın şaxi-güldən qıl qiyas**
**Kim, verib əvvəl təcəmmül, sonra üryan eyləmiş.**

Beyt 1: **Ta ki, taqi-zərnigarın çərx viran eyləmiş,**
**Xişti-zərrinin səba fərşi-gülüstan eyləmiş.**

Sözlük: Taqi-zərnigar – asiman = altunlı asiman = günəşli asiman; Xişti-zərrin = zərli kərpic (xəzan yarpaqlı); Gülüstan – gülzar

**Anlam: Zərli fərş, yaxud qızıl kərpic kimi, gülşən sahəsində döşənilmiş xəzəl, zər telli günəş camalından məhrum olmuş səmanın hekayəsini tərif edir. (Beyt gülzarın xəzəlləşmək vəqtini vəsf edir) .**

Beyt 2: **Katibi-tədbir xətti-səbzə təhrir etməyə**
**Lövhi-gülzari-xəzan bərgi zərəfşan eyləmiş.**

Sözlük: Təhrir – yazmaq = paklamaq, löh = lövhə = səhifə; Xətti-səbzə – üzün təzə bitmiş yumşaq tükü = ruhlar aləmindən gözə çarpan mütəal məbuda daha yaxın "təyyin"[1] ünvanlı mərtəbələr; Bərg – yarpaq

**Nişanə:** "Xət": Bu beytdə hökm və sənəd nişanəsidir.

**Anlam: Xəzan fəsli gülşən sahəsinə cəvahir səpməklə təqdir hökmünü alqışlamaq istəyibdir.**

Beyt 3: **Qət` edib fəsli-xəzan abi-rəvan şirazəsin,**
**Nüsxeyi-gülzarın övraqın pərişan eyləmiş.**

Sözlük: Abi-rəvan – axarsu; Şirazə – səhifə bağlayan; Övraq – vərəqlər

**Nişanə:** "Şirazə": Şirazənin kəsilməsi bu beytdə davamsızlığı eyham edən nişanədən ibarətdir.

**Anlam: Xəzan hökmü ilə qurumuş çeşmələr, gülşən mühitini vərəq – vərəq dağılmış kitab kimi pərişan etmişlər.**

Beyt 4: **Dövr cövrün gör ki, nezhətgahi-əhli-zövq ikən,**
**Cuybari-gülşəni zənciri-zindan eyləmiş.**

Sözlük: Nehzətbəxş = fərəhləndirici, cuybar = arx

**Anlam: Ruzgar, axar sular və güllü bağların fərəhləndirici sahəsini ürək sıxan və qəmginləşdirən mühit ilə əvəz etmişdir.**

---

[1] Qəzəl 123, beyt 1, nişanə 6

Beyt 5: **Eyləmiş tədbiri-təşvişi-xəzan taracına**
**Lalə, rəngin rəxtini dağ içrə pünhan eyləmiş.**

Sözlük: Rəngin rəxt = rəngli paltar

**Anlam: Lalə öz rəngin cilvələrini xəzan taracından amanda saxlamaq məqsədilə özünü dağ içrə nihan etmişdir (beyt rəngi solan laləni vəsf etmək istəyir).**

Beyt 6: **Ruzigarın tirə, bəxtin qarə, nitqin lal edib,**
**Matəmi-gül bülbülü zağ ilə yeksan eyləmiş.**

Sözlük: Tirə = qara, qarə = qara

**Anlam: Bülbül tarac olunmuş bağın matəmini tutmaqla özünü qarğaya bənzətmişdir.**

**Qeyd:** *Qarğa ədəbiyyat baxımıyla bədlik, müsibətzədəlik səfiridir.*

Beyt 7: **Ey Füzuli, dəhr halın şaxi-güldən qıl qiyas**
**Kim, verib əvvəl təcəmmül, sonra üryan eyləmiş.**

Sözlük: Dəhr – ruzgar; Təcəmmül – cəlal = mal-dövlət = böyüklük

**Anlam: Gül şaxəsini əvvəl bəzəyib sonra solğunlaşdıran ruzgar insanları da əvvəl əziz, sonrasa zəlil edir (Dünyəvi imtiyazlar etibarsızdır) .**

**Qeyd:** *Əvvəl yüksəldib axırda alçaltmaq, məcazi həyat aləminin təbii işidir. Əksinə, əvvəl "üryanlıq", yaxud "təcrid" mərhələsində bütün izzət – etibardan ayırıb sonra tükənməz və əlçatmaz imtiyaz – etibara nail etmək mənəvi həyat aləminin qəti şivəsindən ibarətdir.*

## Q Ə Z Ə L  135

(1) Cismimi yandırma,rəhm et yaşimə, ey bağrı daş !
Ehtiyat et, yanmasın nagəh quru yanında yaş.

(2)  Xoş keçər nəzzareyi-hüsnünlə ömrüm, var ümid
Kim, edə məqbul dərgahın məni hüsni-məaş.

(3)  Tövfi-kuyində ayaqdan başə irmiş bir mədəd,
Nola gər qəddim büküb hərdəm, ayağım olsa baş.

(4) Fitnə yayın qurmağa atəşmi olmuş ehtiyac
Kim, urarsan aləmə atəş, çatıb peyvəstə qaş.

(5) Ey hübabi - əşk! Nayab et təni – üryanımı
Kim, bu rüsva pərdəmi çak etdi, sirrim qıldı faş.

(6) Parə - parə könlümün suzi-dərunə tabı yox,
Göz yolundan qətrə - qətrə qan olub, çıxsaydı kaş.

(7) Ey Füzuli, qərqi – xunab etdi göz mərdümlərin,
Görəyim qüllabi – müjganə urulsun qanlı yaş.

Beyt 1: **Cismimi yandırma, rəhm et yaşimə, ey bağrı daş !**
**Ehtiyat et, yanmasın nagəh quru yanında yaş.**

Sözlük: Nagəh – nagah

**Nişanə** 1. “Rəhm”: Qəbz mərhələsindən azad edib bəst mərtəbəsinə nail edən ilahi lütfdən ibarətdir.

**Nişanə** 2. “Yaş”: Bu beytdə dünyəviliyi yuyub-təmizləyən nişanədən ibarətdir.

**Nişanə** 3. “Bağrı daş”: Həzrət mürşüdün, yaxud mütəal məbudun cəlali-sifət ünvanlı qəhr və qəmzəsindən ibarətdir.

**Qeyd** 1: *Cəlali-sifət aşiqi ətəş və tələb atəşində tərbiyə edən ilahi sifətdən ibarətdir.*

**Qeyd** 2: *Çox hal baş verə bilər ki, aşiq həyəcan, hicran, məcnunluq və məğlubiyyət vəziyyətində həzrət mürşüdün özünə, hətta mütəal məhbuba bağrı daş, rəhmsiz, namehriban və digər beləcə sifətlər və sözlər ilə giley və etiraz edər (şəth). Ancaq məcnunluq məğlubiyyətində olduğuna görə cəzalanmaqdan azad olar, ona görə ki, məcnunluq divanəlikdir və şəriət divanəni məhkəmə etməyə hökm verməmişdir.*

**Nişanə** 4. “Yaşın yanmağı”: Bu beytdə şühud nailiyyətində hasil olmuş bəstin qəbzə çevrilməsindən istiarədir.

**Anlam: Ey həkimi-məhbub, bəşəri vücudumun tənbeh və tərbiyə atəşində yanması ilə yanaşı ikinci tənbehdən, yaxud şühud nurunun kəsilməsindən qorxuram.**

Beyt 2: **Xoş keçər nəzzareyi-hüsnünlə ömrüm, var ümid**
**Kim, edə məqbul dərgahın məni hüsni-məaş.**

Sözlük: Nəzzarə – tamaşa; Məqbul – qəbula keçmiş; Dərgah – bargah; Hüsni məaş – gözəl məişət = gözəl yaşayış

**Nişanə** 1. “Hüsn”: Bu beytdə Allah-taalaya həsr olunmuş bir yerdə cəmləşən kamalların cazibəsindən ibarətdir.

**Nişanə** 2. “Məqbul dərgah”: İlahi hüsn cazibələrini davam etdirən mərtəbəyə nail və layiq olmaq nişanəsidir.

**Nişanə** 3. “Hüsni-məaş”: “Xoş keçər nəzzarəyi-hüsnünlə ömür” məzmununu təkrar və təkid edən nişanədir.

**Anlam: İlahi cazibələrin davam etdirilməsinə ümid bağlamağım onların önündə fiziki mahiyyətindən ayrılmağımla əlaqədardır.**

**Qeyd:** *İlahi cazibələrin davam etdirilməsi, fiziki mahiyyətdən*

*ayrılmaqla şərtlənir.*

Beyt 3: **Tövfi-kuyində ayaqdan başə irmiş bir mədəd,**
**Nola gər qəddim büküb hərdəm, ayağım olsa baş.**

Sözlük: Tövf – təvaf = bir şeyin dövrəsinə dolanmaq = xüsusi tərz ilə Allah evinin dövrəsinə dolanmaq

**Nişanə** 1. “Tövfi-kuyi”: “Hicaz Kə`bəsinin” ziyarətini qənaətbəxş bilməyib “Raz Kə`bəsini”, yaxud yeganə məbudun öz ərəfəsini (ilahi hüzur məqamını) ziyarət etməyə çalışmaqdan ibarətdir.

**Nişanə** 2. “Ayaqdan başa irmiş bir mədəd”: Bütün vücudu ilə ilahi cazibələrə məğlub olmaqdan nişanədir.

**Nişanə** 3. “Bükülmüş qəd”: A: “Tövfi-kuyi” mərtəbəsini davam etdirən nişanədən ibarətdir.

B: Bükülmüş qəd, “انّا لله” ünvanlı əslə tərəf müraciət etməyin müqəddiməsidir.[1]

**Nişanə** 4. “Ayağım olsa baş”: Başın ayaq olması:

A: “Müstədir hərəkət” ünvanlı seyrə nail olmaqdan nişanədir.[2]

B: İlahi yüksəlişdən saxlayan bəşəri qüruru məhv etməkdən nişanədir, bu nişanəni təbliğ etmək məqsədilə bu sətirlərin müəllifi (Ə.Şahi – red.) bir qəzəlində belə demişdir:

راه بین تو و ایوان ابد، یک قدم است
یک قدم نه بسر خویش وسر افرازی کن

**Anlam: Vücudumun hər bir zərrəsi müstəqil eşq ilə Raz Kə`bəsini ziyarət etmək istəyir.**

Beyt 4 **: Fitnə yayın qurmağa atəşmi olmuş ehtiyac**
**Kim, urarsan aləmə atəş, çatıb peyvəstə qaş.**

Sözlük : Peyvəstə = müttəsil = qohum = nizamlı

**Nişanə 1 :** "Fitnə": Müxtəlif sınayıcı hadisələrdən nişanədir.

**Nişanə 2 :** "Qaş": Lütfdən asılı qəhrdən nişanədir.

**Anlam : Əql əhli də eşq əhli kimi sınayıcı hadisələrlə əhatələnmişdir.**

---

[1] Qəzəl 133, beyt 3
[2] Qəzəl 133, beyt 3

Beyt 5: **Ey hübabi - əşk! Nayab et təni – üryanımı**
**Kim, bu rüsva pərdəmi çak etdi, sirrim qıldı faş.**

Sözlük: Hübab – köpük; Əşk – göz yaşı; Nayab – ələ keçməz; Çak – çat

**Nişanə** 1. “Hübabi-əşk”: Dünyəvi ilgi – əlaqələri, xüsusilə bəşəri təmayülatı yuyub iç aləmi “ney” ünvanlı boş mənzilə çevirmiş mərtəbədən nişanədir.

**Nişanə** 2. “Təni-üryan”: Bu beytdə fiziki mahiyyət tortasından (xıltından – red.) nişanədir.

**Qeyd:** *Bəşəri vücudun izini və tortasını da hicab və maneə bilmək, mərifət üstünlüyündən nişanədir.*

**Nişanə** 3. “Pərdəni çak etmək”: Sirri açılmasından və abır-həyanın tükənməsindən nişanədir.

**Nişanə** 4. “Sirr”: Bu beytdə fiziki mahiyyət tortasından azad ola bilməyən aşiqin layiqsizliyinə işarə edən nişanədir.

**Anlam: Ey göz yaşım, bir torta kimi axıra qalmış dünyəvi mahiyyətimi yuyub məhv etməklə mənəvi abrımı mühafizə qıl.**

Beyt 6: **Parə - parə könlümün suzi – dərunə tabı yox,**
**Göz yolundan qətrə - qətrə qan olub, çıxsaydı kaş.**

Sözlük: Suzi dərun – daxili yanmaq = batini şövq = iztirab

**Nişanə** 1. “Parə - parə könül”: Qurbanlıq və fanilik məqamına hazırlaşmaqdan nişanədir.

**Nişanə** 2. “Qan olmaq”: A: Fiziki mahiyyətə qalib gəlməkdən nişanədir.

B: Bəşəri sifətləri batil etməkdən nişanədir.

**Anlam: Daxili vücudumun iztirabdan azad olması yalnız qurbanlıq nailiyyəti ilə mümkündür.**

Beyt 7: **Ey Füzuli, qərqi – xunab etdi göz mərdümlərin,**
**Görəyim qüllabi – müjganə urulsun qanlı yaş.**

Sözlük: Xunab – qanlı yaş; Mərdüm – bəbək; Qullab = çəngəl; müjgan – kirpiklər

**Nişanə** 1. “Qərq”: Qərq olmaq fanilik müqəddiməsindən nişanədir.

**Nişanə** 2. “Xunab”: Fiziki mahiyyəti batil edən nişanədir.

**Nişanə** 3. “Göz mərdümlərinin qərq olması”: Dünyəvi varlıqdan göz

çəkmək nişanəsidir.

**Nişanə** 4. “Müjgan”: Müjgan bu beytdə vəhdət günəşindən məhrum edən hicabdan nişanədir.

**Nişanə** 5: “Urulsun (düzülsün) qanlı yaş”: Müjgan ünvanlı hicab məhvliyinə nail edən nişanədir.

**Anlam: Ey Füzuli, vəhdət qarşısında hicab törətmiş fiziki mahiyyət xıltını batil etmək istəyirəm.**

## Q Ə Z Ə L 136

**(1) Zəhi, cəvahiri – ehsani-amə, mədəni-xas,**
**Düri səfaət üçün bəhri – rəhmətə qəvvas.**

**(2) Yetib hüzurinə merac vəqti qılmışlar,**
**Qəmər hüsuli – məasir, Süheyl kəsbi – xəvas.**

**(3) Fələk həm ol gecə bulmuş səfa ki, sufi tək**
**Qərar tutmayıb, olmuş bu bəzmdə rəqqas.**

**(4) Rəhi – mütabiətindir təriqi – fövzi nəcat,**
**Həvayi-mərhmətindir ümidi – xeyrü xilas.**

**(5) Təfaxür eylə, Füzuli ki, ondan özgə degil**
**Sənə zəmanədə nəqşi – səhifeyi – ixlas.**

Beyt 1: **Zəhi, cəvahiri – ehsani-amə, mədəni-xas,**
**Düri səfaət üçün bəhri – rəhmətə qəvvas.**

Sözlük: Zəhi – afərin = ehsan; Şəfaət – xətakarlara "bağışlanmaq və hidayət olmaq" istəmək; Bəhr – dəniz; Qəvvas – üzgüçü

**Anlam: Ey rəhmət peyğəmbəri, bütün uğurlara, afərinlərə layiq sənsən. Çünki sənin xüsusi batininlə bağlı və ümumi hidayətinlə qarışıq şəfaət meylin daimi ehsan süfrəsi tək xətakarlar üzünə açılıbdır. Elə buna görə də şərif ayədə buyurmuşdur: "و ما ارسلناک الا رحمه للعالمين[1]" ("və səni aləmlərə ancaq bir rəhmət olaraq göndərdik").**

Beyt 2: **Yetib hüzurinə merac vəqti qılmışlar**
**Qəmər hüsuli – məasir, Süheyl kəsbi – xəvas.**

Sözlük: Merac – pilləkan = nərdivan = islamın ulu peyğəmbərinin İsra gecəsi yerdən ayaq götürüb göylərə yüksəlməsi; Qəmər – ay; Hüsul – hasil olmaq = icad = əldə etmək; Məasər – xeyir işlər = xeyir nişanələr; Süheyl – ərəb ölkələrində görünən işıqlı ulduz; Xəvas – xasiyyətlər = faydalar

**Anlam: Ay və günəş öz xeyirli xasiyyətlərini təmamilə merac mərtəbəsindən kəsb etmişlər.**

**Qeyd:** *Bu anlam aşağıdakı məzmunlara şıarə edir:*

A: "لو لاک لما خلقت الافلاک[2]" ("*[Ey peyğəmbər] sən olmasaydın həqiqətən göyləri yaratmazdım"*).

B: ان الله تبارک و تعالا خلق نور محمد صلی الله علیه و آله قبل ان خلق السماوات و الارض...، و قبل ان خلق آدم،...[3] ("*Həqiqətdə Allah təbarək və təala göylərin, yerlərin,...və həzrəti Adəmin,..., yaranmasından əvvəl həzrəti Məhəmmədin (s) nurunu yaratdı").*

Beyt 3: **Fələk həm ol gecə bulmuş səfa ki, sufi tək**
**Qərar tutmayıb, olmuş bu bəzmdə rəqqas.**

Sözlük: Sufi – təsəvvüf məktəbinin ümməti = təsəvvüf təmsilçisi; Bəzm – ziyafət məclisi = xeymə

---

[1] Quran, Ənbiya surəsi, 107-ci ayə
[2] علی سعادت چرور، جمال آفتاب، ج.2 ص.304
[3] Göstərilən kitab

**Nişanə** 1. “Səfa”: A: Səfa küdurətin əksindən ibarətdir.

B: Səfa, asılılıqdan qurtulmuşlardan nişanədir.

**Qeyd** 1: *Asılılıq, “təəllüq” əlaməti olduğundan “fərdlik”, yaxud “təcrid” qarşısında əngəl maneə hesab edilir. Elə bu mənaya işarə etmək məqsədilə mövlana Füzuli demişdir ki:*

**Zülmət qəm iztirabın çəkməz ol azadə kim,**
**Hər təəllüqdən ola dünyadə çün xurşidi fərd**

**Qeyd** 2: *Asılılıqdan azad olmaq əzəmətini bildirmək məqsədilə şərif ayədə buyurulmuşdur:* الله الذی رفع السماوات بغير عمد ترونها ثم استوی علی العرش و سخر الشمس و القمر كل يجری لاجل مسمی يدبر الامر يفصل الايات لعلكم بلقاء ربكم توقينون[1] *(Göyləri görə biləcəyiniz sütunu olmayan halda ucaldan, sonra ərşi öz istilasına (istilası altına) alan, müəyyən vaxta qədər dolanan günəşi və ayı öz əmri altına alan, hər işi idarə edən və öz ayələrini müfəssəl açıqlayan məhz Allahdır. Ümid edilir ki, rəbbinizə qovuşacağınıza inanasınız. )*

**Nişanə** 2. “Sufi”: A: Saf qəlbli mürşüddən ibarətdir.

B: Sufi, həzrəti mürşüdün, qəlbləri safa çıxaran cəlalarından nişanədir.

C: Heyvani nəfs və təbii meylini tərk edərək ruhani şəxslər ilə söhbətləşmiş aşiqdən ibarətdir.

E: Xeyir və ilahi işlər sahəsində hamıdan qabaqda səfə durmuş aşiqdən ibarətdir.

Ə: İlk mənzildə mənliyini məhv etmiş aşiq 29 mənzil seyr edəndən sonra islam təsdiq edən sufilik məqamında nailiyyət tapar[2].

**Anlam: Göylər də merac mərtəbəsinə hörmət göstərmək məqsədilə səfalanmışlar.**

Beyt 4: **Rəhi-mütabiətindir təriqi-fövzi nəcat,**
**Həvayi-mərhmətindir ümidi-xeyrü xilas.**

Sözlük: Rəh – rah = yol; Mütabiət – tabelik; Təriq – yol = təriqət; Fövz – qələbə = xilas = azadlıq; Mərhəmət – lütfkarlıq = mehribanlıq

**Anlam: Ey rəhmət peyğəmbəri, sənin tabeliyində həyat sürən camaat, həmçinin sənin lütfündən bəhrələnmiş xalq həqiqi səadətə nail olmuşlar.**

---

[1] Quran, Rəd surəsi, ayə 2
[2] Doktor Nurbəxş, Sufi kist, səh. 27

Beyt 5: **Təfaxür eylə, Füzuli ki, ondan özgə degil**
**Sənə zəmanədə nəqşi – səhifeyi – ixlas.**

Sözlük: Təfaxür – fəxr etmək = naz qılmaq

**Nişanə:** "İxlas": Allah təaladan başqa, hər şeydən üryan olub bəstlənmiş qəlb ilə əməl etməkdən nişanədir.[1]

**Anlam: Ey Füzuli, səni ixlas məqamına qaldırıb iftixarlandıran rəhbər yalnız islam peyğəmbərindən ibarətdir.**

---

[1] Qəzəl 59, beyt 1

## Q Ə Z Ə L 137

(1) **Xəlqə xublardan vüsali – rahətəfzadır qərəz,**
**Aşiqə ancaq təsərrüfsüz təmaşadır qərəz.**

(2) **Zahida, tərk etmə şahidlər vüsali – rahətin,**
**Gər ibadətdən həmin qilmanü huradır qərəz.**

(3) **Hurü kövsərdən ki, derlər rövzeyi – rizvandadır,**
**Saqiyi – gülçöhrəvü cami – müsəffadır qərəz.**

(4) **Zövqsüz lazım çıxar dünyadan ol dünyapərəst,**
**Kim, ona dünyadan ancaq zövqi – dünyadır qərəz.**

(5) **Rahət olsaydı qərəz, dünyadə fəqr istərdi xəlq,**
**Qaliba kim, xəlqə bir bihudə qövğadır qərəz.**

(6) **Arif ol, sövdayi – eşq inkarın etmə, ey həkim,**
**Kim, vücudi – xəlqdən ancaq bu sevdadır qərəz.**

(7) **Qıl Füzuli, tərk ibrami – təkəllüm kim, yetər,**
**Surəti – halın, gər izhari – təmənnadır qərəz.**

Beyt 1: **Xəlqə xublardan vüsali – rahətəfzadır qərəz**
**Aşiqə ancaq təsərrüfsüz təmaşadır qərəz.**

Sözlük: Xub – gözəl = yaxşı = bəyənilmiş = qəşəng; Rahətəfza – rahatlığı artıran

**Nişanə** 1. “Xub”: Bəşəri simada ilahi hüsnlər əks etdirmiş gözəldən ibarətdir.[1]

**Nişanə** 2. “Rahət”: Bu beytdə iztirabsız sərxoşluqdan ibarətdir.

**Nişanə** 3. “Aşiq”: Nəhayətsiz vəcd ilə həqiqi məhbub və məbud tələbində çalışqanlıq edən bəndədən ibarətdir.

**Nişanə** 4. “Təmaşa”: Bu beytdə ruhani əhval – ruhiyyə törənməsinə bais olmuş mənəvi müşahidədən ibarətdir.

**Qeyd** 1: *Müşahidə görünməz aləmdə gizli olan həqiqəti “fuad”[2] gözü ilə görməkdən ibarətdir.*

**Qeyd** 2: *Ariflər nəzərincə Allah təala nurunu təzahür etdirən “mişkat” ünvanlı xüsusi güzgü, yaxud müşahidə nailiyyətini mümkün edən səbəb mömin aşiqin ürəyindən ibarətdir. Bu güzgünü tanımaq məqsədilə şərif ayədə buyurur ki:*

الله نور السماوات و الارض مثل نوره کمشکات فیها مصباح المصباح فی زجاج کانها کوکب دری،.... (“*Allah göylərin və yerin nurudur. Onun nurunun məsəli içində çıraq olan o qəndilin mislidir ki, o çıraq bir büllur içindədir, o büllurda parlaq bir ulduz kimidir ki,...*”)[3]

**Qeyd** 3: *Sufilərin[4] nəzərincə durulmuş və paklanmış fuad güzgüsündə təzahür etdirilən ilahi nur ilahi sifətlər müşahidəsini mümkün edən səbəbdən ibarətdir.[5]*

**Anlam: Gözəl dilbərlər vüsalına nail olmaq ümumxalqın arzusu olan kimi, gözəl camal güzgüsündə ilahi nur məşğulluğuda, xüsusi aşiqlərin istəyidir.**

Beyt 2: **Zahida, tərk etmə şahidlər vüsali – rahətin,**
**Gər ibadətdən həmin qilmanü huradır qərəz.**

---

[1] Qəzəl 107, beyt 1
[2] Qəzəl 13, beyt 1
[3] Quran, Nur surəsi, 35 ci-ayə
[4] Qəzəl 136, beyt 3
[5] Doktor Qasim Qəni, Tarixe-təsəvvüf dər İslam, c.2, səh.367

Sözlük: Şahid – gözəl = məhbub = Allah təala; Qılman – gözəl oğlanlar = xadimlər = behişt xidmətçiləri; Hura – behişt gözəlləri = behişt qadınları

**Nişanə** 1. “Şahid”: Bu beytdə bəşəri gözəllik sahibindən ibarətdir.

**Nişanə** 2. “Qılman və hura”: Cənnət xidmətçiləri və behişt gözəllərindən ibarətdir.

**Anlam: Beyt behişti hüsnləri də dünyəvi gözəlliklər kimi ilahi camal hüsnün örnəyi və xülasəsi olduğunu təlqin etməklə, hura və qılman hüsnünü kamil təsəvvür etmiş zahidi təhqir etmək istəyir.**

**Qeyd** 1: *Bütün hüsnlər yalnız ilahi nisbət baxımıyla həqirdirlər.*

**Qeyd** 2: *Bütün hüsnlər müstəqillik baxımıyla həqirdirlər*[1].

Beyt 3: **Hurü kövsərdən ki, derlər rövzeyi – rizvandadır,**
**Saqiyi – gülçöhrəvü cami – müsəffadır qərəz.**

Sözlük: Kövsər – behişt çeşməsi; Rövzeyi rizvan – rizvan behişti; Müsəffa – səfalı

**Nişanə** 1. “Hurü kövsər”: Behişt gözəlliklərini təlqin edən nişanələrdirlər.

**Nişanə** 2. “Saqiyi-gülçöhrə”: Bu beytdə ürək açan şühud nuruna işarə etmiş ilahi camaldan nişanədir.

**Nişanə** 3. “Cam”: Mənəvi cəlaları əks etdirmiş maddi vücuddan, yaxud bəşəri ilgilərdən boşalıb ilahi maraqlarla dolmuş mürşüd ürəyindən, ya da məhz mənəvi ziyalardan ibarətdir.

**Nişanə** 4. “Müsəffa”: Vücudun içəri üzündən maddi küdurətləri qoparan və onu incəlik və mücərrədlik məqamına yaxınlaşdıran sifətdən ibarətdir.

**Anlam: Hurü kövsər, Allahın cəmalını təqdim edən örnəklərdirlər.**

**Qeyd:** *Beyt rizvan behiştini rəhman behiştinin örnəyi, yaxud müqəddiməsi olduğunu təlqin edir.*[2]

Beyt 4: **Zövqsüz lazım çıxar dünyadən ol dünyapərəst,**
**Kim, ona dünyadan ancaq zövqi – dünyadır qərəz.**

---

[1] Qəzəl 40, beyt 5

[2] Qəzəl 111, beyt 1

**Nişanə** 1. “Zövq”: A: Zövq, mütəal məhbubun camalından çaxan cəlalardır.

B: Xalis ürəyə daxil olmuş qeybi mənalar nəticəsində parlayan mənəvi müşahidə cəlaları zövqün ilkin dərəcəsi və ya birinci səmərəsidir.[1]

**Nişanə** 2. “Zövqi dünya”: Dünyəvi maraqlar məşğulluğunda mənəvi müşahidələr nailiyyətindən xəbərsiz saxlayan naqis mərifətdən nişanədir.

**Nişanə** 3. “Dünyapərəst”: Dünyanı sakinlik mərkəzi təsəvvür edərək, onun qeyri sabit var – dövlətini kafi bilmiş şəxsdən ibarətdir.[2]

**Anlam: Dünyəvi maraqlar məşğulluğunda ömür sürmüş insan mənəvi maraqlar nailiyyətindən məhrum qalmalıdır.**

Beyt 5: **Rahət olsaydı qərəz, dünyadə fəqr istərdi xəlq,**
**Qaliba kim, xəlqə bir bihudə qövğadır qərəz.**

Sözlük: Fəqr – fağırlıq = yoxsulluq; Bihudə – yersiz = səmərəsiz; Qovğa – hay-küy

**Anlam: Hər nemətin, yaxud təəllüqün arxasınca bir məhrumluq durduğundan həqiqi rahatlığa çatmaq təəllüqsüz yaşamaq-la mümkündür. Ona görə də Füzuli buyurur:**

**Bəla zimnində rahət olduğun izhar edər xəlqə**
**Fələk, bihudə xari-xoşkdən gülbərgi tər verməz**

Ancaq ümum camaat etibarsızlara məğrur olmaqla, fəqrə bağlı asudəlikdən xəbərsizdir.

Beyt 6: **Arif ol, sövdayi – eşq inkarın etmə, ey həkim,**
**Kim, vücudi – xəlqdən ancaq bu sevdadır qərəz.**

**Nişanə** 1. “Arif”: “Şühud” ünvanlı mənəvi müşahidə vasitəsilə Allah-taala hüzurunu dərk etmiş aşiqdən ibarətdir.

**Nişanə** 2. “Sövdayi-eşq”: Eşq bazarında varını, dövlətini, ad-sanını, dünyəvi abrını və cismilə əlaqədar canını (təəllüqlərini) mənəvi ziyalar nailiyyətinə sərf etməkdən ibarətdir. Buna görə də sevda (müamilə) kəlməsi beytin məzmunu ilə uyğun nəzərə gəlir.

Beyt 7: **Qıl Füzuli, tərk ibrami – təkəllüm kim, yetər,**

---

[1] Qəzəl 1, beyt 7
[2] Qəzəl 127, beyt 1

**Surəti – halın, gər izhari – təmənnadır qərəz.**

Sözlük: İbram – təhkim eləmək; Təkəllüm – danışmaq

**Anlam: A: Xarici hadisələr hər bir insanın daxili vücudunu müsbət və ya mənfi təsirləndirən kimi daxili əhval – ruhiyyə isə xarici vücudda təsir edici olmalı və təzahür etməlidir[1]. Ona görə də Füzuli batini hay – küyün zahiri dil ilə bəyan olmasını yersiz və mümkünsüz bilir.**

B: Allah-taala gizli sirlərdən təmamilə xəbərdar olduğuna görə, "təkəllüm", yaxud "izhari-təmənna" ədəbsizlik sayılır. Elə bu mənanı təlqin etmək məqsədilə Mövləvi hətta dua etməyi aşiq üçün eyb – irad bilərkən buyurmuşdur: "Mən Allahın "övliya" ünvanlı özəl dostlarından bir çoxlarını tanıyıram ki, omlar ağızlarını dua oxumaqdan da bağlaya bilər[2].

قوم دیگر می شناسم ز اولیا     که دهانشان بسته باشد از دعا[3]

---

[1] Qəzəl 103, beyt 2, qeyd

[2] Qəzəl 37, beyt 4

[3] مثنوی مولوی، دفتر 3، بیت 1910

## **Q Ə Z Ə L 138**

**(1) Qıl, səba, könlüm pərişan olduğun canana ərz,**
**Surəti – halın bu viran mülkün et sultanə ərz.**

**(2) Dərhəm olmuş sünbülün guya ki, qılmışdır ona**
**Mu – bə - mu hali – dilim, dillər uzadıb şanə ərz.**

**(3) Təndə canım bir pərinindir, əmanət saxlaram**
**Ol zamandan kim, əmanət qıldılar insanə ərz.**

**(4) Xəlq küfr əhlinə iman ərz edər, mən dəmbədəm**
**Küfri – zülfün eylərəm köksümdəki imanə ərz.**

**(5) Surəti – bican ilə cənnət dolar bütxanə tək,**
**Qılsalar cənnətdə təsvirin çəkib qılmanı ərz.**

**(6) Mün'imin ərzi – təcəmmüldür işi fəqr əhlinə,**
**Nola gər dil qılsa hər dəm dərdi – eşqin canə ərz.**

**(7) Ey Füzuli, böylə pünhan tutma əşki – alini,**
**Eylə hər rəngilə kim, var ol güli – xəndanə ərz.**

Beyt 1: **Qıl, səba, könlüm pərişan olduğun canana ərz,**
**Surəti – halın bu viran mülkün et sultanə ərz.**

**Nişanə** 1. “Səba”: Həzrət Cəbraildən yaxud digər səmavi və ilahi vasitələrdən nişanədir.

**Nişanə** 2. “Könül”: Mənəvi məzələrdən dad alan batini özəl bir qüvvədən nişanədir.

**Nişanə** 3. “Pərişan”: Bu beytdə vəhdət rayihəli kəsrət məşğulluğuna razılıq verməyən, nəhayət, “Rəhman behişti” ünvanlı ilahi və daimi hüzur tələb edən batindən nişanədir.

**Nişanə** 4. “Canan”: Allah-taalanın bütün yaranmışlara varlıq bağışlayan “qəyyum” ünvanlı özəl sifətindən nişanədir.

**Nişanə** 5. “Surəti-hal”: Hal, pərişan batinin iztirabından ibarətdir.

**Nişanə** 6. “Viran mülk”: Maddi bağlantılardan azad olmuş batindən nişanədir.

**Qeyd:** *Viranlıq abadanlığın müqəddiməsi olduğundan aşiqlər viran olmuş könlü sevmişlər.*

**Nişanə** 7. “Sultan”: Yaxud canan, bəşəri iradəni ilahi iradəyə çevirən Allahdır.

**Anlam: Maddi bağlantılardan azad olmuş batin, səba vasitəsilə hüzur nailiyyətini, yaxud “rəhmani behişti” tələb etməyə layiqdir.**

Beyt 2: **Dərhəm olmuş sünbülün guya ki, qılmışdır ona**
**Mu bə-mu hali – dilim, dillər uzadıb şanə ərz.**

Sözlük: Dərhəm – pırtlaşıq = pırpız; Mu – tük; Mubəmu – diqqətlə

**Nişanə** 1. “Dərhəm olmuş sünbül”: Yaxud pərişan zülf. Bütün kainatda təzahür etdirilmiş ilahi cəlal nurundan ibarətdir.

**Qeyd** 1: *Cəlal - əql çərçivəsinə sığmayan ilahi əzəmət zühurundan nişanədir.*

**Qeyd** 2: *Aşiqin qul və bəndə olduğunu sübut edən zühur cəlali nur zühurundan ibarətdir.*

**Nişanə** 2. “Hali-dil”: Bax 1, nişanə 5, surəti-hal

**Nişanə** 3. “Şanə”: Vəhdət nurunu təzahür etdirən kəsrətdən nişanədir.

**Anlam: Bütün kainatda təzahür etdirilmiş cəlali nur, mütəal məhbub hüzurunu tələb etmiş pərişan könlümü:**

A: Tənbeh edir;

B: Tərbiyə edir;
C: Təsdiq edir.

Beyt 3: **Təndə canım bir pərinindir, əmanət saxlaram**
**Ol zamandan kim, əmanət qıldılar insanə ərz.**

**Nişanə** 1. “Can”: Bu beytdə ilahi mərifətlər əxz etməyə layiq olan ikinci candan, yaxud həkim Nizaminin buyurduğu ürək canından ibarətdir:

زنده به جان خود همه حیوان بود
زنده به دل باش که جان آن بود

**Nişanə** 2. “Pəri”: Bu beytdə aşiqin fuad gözü ünvanlı batini gözünə göstərilən ilahi camal parlamalarından nişanədir.

**Qeyd:** *Aşiq, ad və sifətlərdən üstün əzəmətləri, “camali-vəlayət” ünvanlı mərtəbədən: pəri, pəripeykər, hurqamət və digər beləcə kəlmələr ilə xitab edərək “bənzətmə” vasitəsilə meyl və sədaqətini göstərmək istəyir. Deməк o, həzrət məbud ilə əlaqə saxlamağa və o həzrətə ürək sözünü bəyan etməyə “təşbih” məcburiyyətini qəbul etməlidir.*[1]

**Nişanə** 3. “Əmanət”: İnsanın batinində yerləşmiş həqiqi, yaxud ilahi eşqi, ürfan panteizm baxımından əmanət bilmişlər. Şərif ayədə bu eşqi təlqin etmək məqsədilə buyurulmuşdur: “انّا عرضنا الا مانة علي السماوت والارض والجبال فابين انَ يحملنها و اشفقن منها و حملها الانسان انّه كان ظلوماً جهولا”[2] (“Biz [ilahi] əmanəti göylərə, yerə və dağlara təklif etdik (göstərdik), onlar onu götürməkdən (haqsız yerə götürməkdən və ona xəyanət etməkdən) qorxurlar. İnsan isə onu götürdü. Həqiqətən (insan) [öz həqqində] çox zülm edən və çox cahil idi. Beləliklə, insanın ilahi şəxsiyyətinə yaraşan həyat onun eşq ünvanlı can ilə yaşamağından ibarətdir”).

**Anlam: Eşq ünvanlı əmanəti özümdə yerləşdirməklə şərəflənmiş ilahi canı həqiqi malikinə (mütəal məbud hüzuruna) qaytarmaq məqsədilə yaşayıram.**

**Qeyd:** *Canın əmanət olduğunu etiraf etmək, onun “ələst” şəraitdə*[3] *saxlanılmasına, yaxud mənəvi salamatlığına işarə edir. Bu mənanı təlqin etmək məqsədilə lisanül ğeyb Hafiz demişdir:*

این جان عاریت که به حافظ سپرد دوست

---

[1] Qəzəl 21, beyt 3
[2] Quran, Əhzab surəsi, 72-ci ayə
[3] Qəzəl 19, beyt 4

روزی خش ببینم و تسلیم وي کنم

Beyt 4: **Xəlq küfr əhlinə iman ərz edər, mən dəmbədəm**
**Küfri – zülfün eylərəm köksümdəki imanə ərz.**

**Nişanə** 1. “Küfri-zülf”: Məbdə ətrafını dövr etmiş kəsrətdən nişanədir.

**Anlam: Bir çox hal baş verə bilər ki, əql və elm əhli, hər bir yaranmışda yaradıcı məbud cilvəsini sübut etməklə öz dini imtiyazı ilə iftixar edər, lakin mən hər bir yaranmışın yaradıcı məbud cilvəsinə hicab olduğunu bəyan etməklə əql və təcrübəyə bağlı mərifətlərə etiraz etmək istəyirəm.**

**Qeyd** 1: *Mütəal məbudun öz təzahür etdiyi surətdə (güzgüdə) məxfi qalmağını, ilahi bir hökmkimi təlqin etmək məqsədilə demişlər:*
“سبحان من ظهر فى بطونه و بطن فى طهوره”[1] (“*vəhdət pünhanlığından zühur edən və zühur aydınlığında məxfi olan Allah təala pakdır”*).

**Qeyd** 2: *Beyt, ürfan mədəniyyətində etibarların baş – ayaq olduğuna eyham edərkən zahirdə küfr danışmış aşiqin batini xalis imanını təsdiq etmək istəyir.*[2]

Beyt 5: **Surəti – bican ilə cənnət dolar bütxanə tək,**
**Qılsalar cənnətdə təsvirin çəkib qılmanı ərz.**

Sözlük: bütxanə = büt evi, qılman = gözəl oğlanlar = behişt xadimləri

Anlam : Ey gözəl Tanrı, sən öz həqiqi cilvələrini, behişt səmasında təzahür etdirsən, (təzahür etdiyin güzgüdə məxfi qalmasan) cənnət gözəllərinin əqlini – idrakını daşdan yonulmuş ilahələr kimi qurudub işdən salarsan. (heyranlıq)

Beyt 6: **Mün’imin ərzi – təcəmmüldür işi fəqr əhlinə,**
**Nola gər dil qılsa hər dəm dərdi – eşqin canə ərz.**

Sözlük: Mün’im – nemət bağışlayan = varlı = mal-dövlət sahibi; Ərzi – təcəmmül – öz cəlalını göstərmək = mal-dövlətini nişan vermək

**Nişanə** 1. “Mün’im”: Bu beytdə “istiğna”[3] mərtəbəsində təzahür etmiş mütəal məbudu, yaxud ilahi seyr tələb etmiş aşiqi hidayət

---

[1] Şeyx Mahmud Şəbüstəri, Gülşəni-raz, səh.445
[2] Qəzəl 25, beyt 5
[3] Qəzəl30, beyt 3

nemətindən bəhrələndirən mürşüdə işarə edir.

**Nişanə** 2. “Ərzi-təcəmmül”: Bütün kainatı bürüyən ilahi cəlal nuruna işarə edən nişanədir.

**Nişanə** 3. “Fəqr əhli”: Aşiqin qul və bəndə olduğuna işarə edir.

**Nişanə** 4. “Dil”: Bax beyt 1, “pərişan könül”.

**Nişanə** 5. “Can”: Birinci beytdə qeyd olunmuş canandan ibarətdir.

**Nişanə** 6. “Dərdi-eşq”: Tələb və ətəş atəşində alovlanan qəlbin tükənməz iztirabından nişanədir.

**Anlam: Aşiq mütəal məhbubun cəlalını, nəhayət, mənliyini təsdiq etmək məqsədilə hacət diləməyi arzu edir.**

Beyt 7: **Ey Füzuli, böylə pünhan tutma əşki – alini,**
**Eylə hər rəngilə kim, var ol güli – xəndanə ərz.**

**Nişanə** 1. “Əşki al”: Dünyəviliyi yuyub batil edən nişanədən ibarətdir.

**Nişanə** 2. “Rəng”: Bu beytdə bəşəri şivələrin ilahi çeşidindən nişanədir.

**Nişanə** 3. “Güli-xəndan”: Bu beytdə ürəyi bəst məqamına nail edən gözəl məhbubdan istiarədir.

**Anlam: Ey Füzuli, dünyəvilik hicabından azad olmuş halda mehriban məbudun şühud ehsanını ürək münacatilə tələb qılmalısan.**

## QƏZƏL 139

**(1) Qılmağıl möhkəm könül, dünyayə əqdi-irtibat**
**Sən bir avarə müsafirsən, bu bir viran ribat.**

**(2) Bu çəməndə qönçələr, güllər görən arif bilir**
**Kim, səbat üstündə qalmaz hiç qəbzü inbisat.**

**(3) Əhli-irfandır cahan keyfiyyətin təhqiq edən**
**Kim, nişatından bulur yüz qəm, qəmindən yüz nişat.**

**(4) Eşq dövranı mənə tapşırdı Məcnun növbətin**
**Xali olmaz, nəqşi-ərbabiivəfadən bu büsat.**

**(5) Hər yetən məhruyə sərf etmə, Füzuli, ömrünü**
**Bivəfalərdən həzər qıl tut təriqi-ehtiyat.**

Beyt 1: **Qılmağıl möhkəm könül, dünyayə əqdi-irtibat**
**Sən bir avarə müsafirsən, bu bir viran ribat.**

Sözlük: Avarə – avara; Rəbat – karvansara

**Anlam: Ey ürək, yaxud ey həqiqi vücudum, bütün yaranmışlar xüsusilə insanlar karvansaraya bənzər dünyanı qəbir adlı, nəhayət, axirət ünvanlı məqsədə sarı tərk etməlidirlər. Buna görə də karvansaraya yaxud dünyaya bel bağlamaq əbəsdir.**

**Qeyd:** *Dünya bütövlüyündə, həm də təfərrüatında hərəkət qanunu tabeliyində olduğundan (xüsusilə keyfiyyət hərəkəti) sakinlik mərkəzi ola bilməz. Buna görə də Füzuli buyurmuşdur:*

***Dəhr bir mənzil, xəlayiq karbani biş iməs***
***Söz qami əfsanə, el əfsanəxani biş iməs.***

*Nəhayət, hərəkət edici və qeyri sabit dünyaya bel bağlamaq batil bir işdir*[1]

Beyt 2: **Bu çəməndə qönçələr, güllər görən arif bilir**
**Kim, səbat üstündə qalmaz hiç qəbzü inbisat.**

Sözlük: Qəbz – qəm = sıxılmaq; İnbisat – şadlıq = genişlik

**Nişanə** 1. “Çəmən”: Bu beytdə həqiqi vəhdət ilə bağlı ürək açan kamal mövqeyyətinə işarə edilir.

**Nişanə** 2. “Qönçə”: Bu beytdə qəbz ünvanlı irfani mərhələyə işarə edilir.

**Nişanə** 3. “Gül”: Bu beytdə bəst ünvanlı irfani mərtəbəyə işarə edilir.

**Nişanə** 4. “Arif”: Əql və elmdən üstün əhval-ruhiyyə ilə, yaxud şühud ünvanlı mənəvi müşahidə vasitəsilə həqiqəti dərk etmiş aşiq[2].

**Nişanə** 5. “Qəbz”: Qat-qat maddi ləkələri mənəvi və ya batini vücuddan qoparan ilahi parlamaların saxlanmasından ibarətdir[3]. (Qəlbi bəst məqamına tərbiyə edən sıxma-boğmalar)

**Nişanə** 6. “İnbisat”: Yaxud bəst-ürəyin genişlik nişanəsidir və dünyəvi bağlılıqdan boşalmaqla mümkün olur.

---

[1] Qəzəl 127, beyt 1 və 2
[2] Qəzəl 119, beyt 6, “mərifət” nişanəsi
[3] Qəzəl, 2, beyt 5, qeyd 1,2,3,4,5

**Anlam: Dünyəvi varlıq ziddiyyətlər barışığı olduğundan Mövləvi buyurmuş:**

زندگانی آشتی ضدهاست     مرگ آن کاندر میانشان جنگ خاست[1]

Beləliklə hündür – alçaq, işıq – qaranlıq, gizli – açıq, dost – düşmən, incə - qalın, iri – düz və habelə "əzdad" baxımı təsdiq edən digər nümunələr hər şeyin öz ziddi ilə (əksi) bağlılığını və tanımağını təsdiq edərək, baharın isə xəzan ilə əlaqədar olduğunu sübut edir. Beləliklə həm dünyəvi həm də mənəvi ürək açan mövqeiyyətlər (gül, inbisat), zahiri və batini ürək sıxan vəziyyətlər ilə (qönçə, qəbz) bağlıdırlar. Buna görə də şərif ayə buyurur:

يولج الليل فی النهار و يولج النهار فی الّيل و هو عليم بذات الصدور[2] ("[Allah] gecəni gündüzə qatır və gündüzü gecəyə qatır. Ürəklərdə olanı dəqiq biləndir"). Bu şərif ayə işarə etdiyi "əzdad" adlı dəyişdirilməz qanuna əsaslanaraq demişlər ki: "Şadlıq gündüzün möhnət gecəsinin arxasındadır, əksinə, habelə, budur əhval, gah qəbz gah bəst."[3]

**Qeyd:** *Bu anlam, dünyəvi var – dövlət vəziyyətində məğrurluqdan çəkinməyi təlqin etdiyi kimi yoxsulluq və bədbəxtlik şəraitində də səbirsizlikdən pəhriz etməyi təkid edir.*

Beyt 3: **Əhli-irfandır cahan keyfiyyətin təhqiq edən**
**Kim, nişatından bulur yüz qəm, qəmindən yüz nişat.**

Sözlük: Nəşat = şadlıq

**Nişanə** 1. "Əhli-ürfan": Bu beytdə mənəvi cilvələr nailiyyətində dünyəvi əşyaların həqiqətini tanımış aşiqlərdən söhbət gedir.

**Anlam: Bu beyt isə ötən beyt təlqin etdiyi mənanı təkrar və təkid edir.**

Beyt 4: **Eşq dövranı mənə tapşırdı Məcnun növbətin**
**Xali olmaz, nəqşi-ərbabi vəfadən bu büsat.**

Sözlük: Bəst – meydan = dəstgah = şahmat ərsəsi

**Nişanə** 1. "Məcnun": Vahid zamanda özündən həm xəbərsiz, həm də xəbərdar aşiqdən istiarədir.

[1] Mövləvi, Məsnəvi, 1 ci dəftər, beyt 1324
[2] Quran, Hədid surəsi, 6 cı ayə
[3] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

**Anlam: Bu beyt silsiləvi aşiqlərin bir-birinə bağlılığını, yaxud dünya boyu davam edən eşq həyatını "növbət" nişanə ilə təlqin etmək istəyir.[1]**

Beyt 5: **Hər yetən məhruyə sərf etmə, Füzuli, ömrünü**
**Bivəfalərdən həzər qıl tut təriqi-ehtiyat.**

Sözlük: Məhru – mah camallı = gözəl

**Nişanə** 1. "Məhru": Bu beyt də mütləq ilahi cilvələrdən başqa etibarsız cəlalərdən nişanədir.

**Nişanə** 2. "Bivəfa": Bu beyt də təğyiredici və qeyri sabit nailiyyətlərdən nişanədir.

**Anlam: Ey Füzuli, təğyiredici imtiyazlara bel bağlamaqla sabit və sonsuz nailiyyətdən qafil olma.**

---

[1] Qəzəl 98, beyt 2

## Q Ə Z Ə L 140

**(1) Dürcdür ləli – rəvanbəxşin, düri – şəhvar ləfz,**
**Dürcdən dürlər tökərsən eyləsən izhar ləfz.**

**(2) Öylə ağzın təngdir kim, söyləşir saət sənə,**
**Gərçi nazikdir, verir, əlbəttə, bir azar ləfz.**

**(3) Yetmək olmaz ləfzi – canbəxşinlə ağzın sirrinə,**
**Vəhydir guya bu kim, mütləq ağız yox, var ləfz.**

**(4) Nişə ləlin gec gəlir göftarə, guya kim, görür,**
**Mən kimi ol ləldən ayrılmağı düşvar ləfz.**

**(5) Qönçə ləlinə lətafətdən dəm urmuş, bilməzəm,**
**Neylər izhar eyləgəc ol ləli – gövhərbar ləfz.**

**(6) Ey Füzuli, istərəm dildar halim sormaya,**
**Rəşkdən kim, bulmasın vəsli – ləbi – dildar ləfz.**

Beyt 1: **Dürcdür ləli – rəvanbəxşin, düri – şəhvar ləfz,**
**Dürcdən dürlər tökərsən, eyləsən izhar ləfz.**

Sözlük: Dürc – sandıqça = cəvahir və ətir sandıqçası; Rəvanbəxş – ruh verici = ruhlandırıcı; Düri-şəhvar – layiqli dürr

**Qeyd:** *Bu qəzəl, "camali-vilayət" ilə, yaxud həzrət mürşüd ilə söhbətdən bəhs edir.*

**Nişanə** 1. "Dürc": İlahi işarələr mənbəyindən nişanədir.

**Nişanə** 2. "Ləl": Bu beyt yox imkanda var törədən, həm də içəri xarakteri dəmbədəm dirildən ilahi feyzlər və rəhmani nəfslər mənbəyindən nişanədir.

**Nişanə** 3. "Dürr": A: Bu beyt aşiqin həqiqi vücudunu (batini) təsirləndirməklə onun qəlbini ibadətə məşğul edən ilahi işarələrdən nişanədir.

B: Aşiqin qəlbinə həyat bağışlayan ilahi intibahdan ibarətdir.

**Nişanə** 4. "Ləfz": Bax: dürr

**Anlam: Ey həkim olan məhbub, özəl intibah – işarələr ilə ürəklər həyatını əbədiləşdirən Yaradan yalnız sənsən.**

Beyt 2: **Öylə ağzın təngdir kim, söyləşir saət sənə,**
**Gərçi nazikdir, verir, əlbəttə, bir azar ləfz.**

**Nişanə** 1. "Təng ağız": Bəşəri vəhm və fəhm çərçivəsinə sığmayan "mütəkəllim" ünvanlı ilahi sifətdən nişanədir[1].

**Nişanə** 2. "Nazik": Arif və aşiqin ""riştə" ünvanlı mərtəbədə dərk etdikləri mücərrəd həqiqətlərdən nişanədir[2].

**Nişanə** 3. "Azar": Allahın öz təcəlli etdiyi sifətdən üstün olduğunu eyham edən nişanədir.

**Anlam: Ey Yaradan, öz cilvələndirdiyin sifətlər də sənin həqiqətini təzahür etdirməyirlər.**

**Qeyd:** *Beyt Allahın həqiqəti ilə tanışlığı mümkünsüz bilməklə islam peyğəmbərinin "*[3]*الهی ما عرفناک حق معرفته" buyurduğunu təsdiq edir.*

Beyt 3: **Yetmək olmaz ləfzi – canbəxşinlə ağzın sirrinə,**

---

[1] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

[2] Qəzəl 12, beyt 1

[3] "Ey mənim ulu Tanrım, sənin həqiqətini tanımaqdan aciz oldum". (Əllamə Məclisi, Biharül-ənvar, cild 67, səh. 338, bab 59, "Xovf və Rəca")

**Vəhydir guya bu kim, mütləq ağız yox, var ləfz.**

**Nişanə** 1. "Ağzın sirri": İlahi intibah – işarələrin yaxud mütəkəllim ünvanlı ilahi sifətin bəşəri təcrübəyə sığmazlığını təlqin edən nişanədir.

**Nişanə** 2. "Vəhy": Bu beytdə mənəvi sirlərin məcazi surətdə təzahür etdirilməsindən nişanədir.

**Nişanə** 3. "Ağız yox": Yoxluq, vəhm və fəhm çərçivəsinə, yaxud bəşəri idrak aləminə sığmaz hüsnü təlqin edən nişanədir.

**Anlam: Bu beyt də ilahi cilvələr qarşında bəşəri idrakın acizliyini təkrar edir.**

Beyt 4: **Nişələlin gec gəlir göftarə, guya kim, görür,**
**Mən kimi ol ləldən ayrılmağı düşvar ləfz.**

Sözlük: Göftar – danışıq; Düşvar – çətin

**Nişanə** 1. "Göftar": Bax beyt 3, vəhy

**Anlam: "mütəkəllim" ünvanlı sifətlər isə mən kimi, ilahi mənbədən, yaxud vüsal mərkəzindən ayrılmağı çətin bilməklə gec-gec təzahür edir.**

**Qeyd** 1: *Beyt insanın ilahi mənşəli olduğunu, beləliklə "innəllah" nöqtəsinə qayıtmaq zərurətinə işarə edir*.

**Qeyd** 2: *Beyt ilahi sifətlərin gec-gec təzahür etdirilməsini "hüsni təlil" ünvanlı ədəbi sənət ilə əlaqələndirir*[1].

Beyt 5: **Qönçə ləlinə lətafətdən dəm urmuş, bilməzəm,**
**Neylər izhar eyləgəc ol ləli – gövhərbar ləfz.**

Sözlük: Ləli-gühərbar – gövhər yagdıran ləl

Nişanə 1. "Qönçə": Bu beytdə ürək açan dünyəvi imtiyazlardan nişanədir.

**Anlam: Dünyəvi hüsnlərdən məğrur olmuş bir şəxs, mənəvi hüsnlərdən xəbərdar ola bilsə xəcalətindən ölməyini arzu edər.**

**Qeyd:** *Beyt, mənəvi hüsnlərin dünyəvi ölçülərdə sığmazlığına işarə etməklə "Qurani-Kərim"in buyurduğu* ليس كمثله شيى *ayəsini təlqin edir*[2].

---

[1] Qəzəl 133, beyt 5 (haşiyə)
[2] Quran, Şura surəsi, 11-ci ayədən bir qismət: ("...heç bir şey ona bənzər ola bilməz").

Beyt 6: **Ey Füzuli, istərəm dildar halim sormaya,**
**Rəşkdən kim, bulmasın vəsli – ləbi – dildar ləfz.**

Sözlük: Rəşk – qısqanclıq = qibtə

**Nişanə** 1: “Rəşk”: Bu beytdə kamal zirvəsinə yüksəlmişlərin məqamını maraqlandıran müsbət həsrətdən nişanədir.

**Anlam: İlahi cilvələri qurub və vüsal ilə bağlı müşahidə etməklə həsrət həm də qeyrət atəşində alışıram, bunun üçün də bir çox hal baş verir ki, gözəl məhbubun ürəkaçan (bəst) cilvələri də rəşk ilə bağlı iztirabımı aradan qaldırmayır.**

## Q Ə Z Ə L 141

**(1) Afitabi tələtin tutduqca övci-irtifa**
**Qətli-əhli-eşqə tiği-qəmzədir ondan şüa.**

**(2) Dəşt tutmaq adətin qoymuşdu Məcnun eşqdə,**
**Şöhreyi-şəhr olmağın rəsmin mən etdim ixtira.**

**(3) Zərq dəryasında bir xaşakdır kim çizginir**
**Sufiyi-şəyyad kim, dövran tutub eylər səma.**

**(4) Keçdigim dünyavü üqbadən səninçün oldu faş**
**Doğru derlər: "külli sirrin cavəz-əl isneynə şa".**

**(5) Ol büti-sərkəş gəlir, salmış cəmalından niqab**
**Ey səlamət əl-firaq, ey əqlü iman, əlvida.**

**(6) Canü dil bir ömrdür, tiğinçün eylərlər cidal,**
**Girmədən tiğin sənin ortayə, qət olmaz niza.**

**(7) Ey Füzuli, axirət mülkünə lazımdır səfər**
**Böylə fariğ gəzmə, təqvadən mühəyya qıl məta.**

Beyt 1: **Afitabi tələtin tutduqca övci-irtifa**
**Qətli-əhli-eşqə tiği-qəmzədir ondan şüa.**

Sözlük: Afitab – günəş; Tələt – görmək = camal = tülu; Övc – əla dərəcə = ucalıq = üşşaq avazında bir şöbə = ulduzun ən uca dərəcəsi; İrtifa – ucalıq

**Nişanə** 1. “Afitabi-tələt”: Aşiqin mənliyini qoparan ilahi camal cəlalarından ibarətdir.

**Nişanə** 2. A: “Qətl”: Qürb, yaxud qurban məqamının əsas şərtindən ibarətdir[1].

B: Qətl, daimi vüsalın müxtəlif şərtlərindən biri.

**Nişanə** 3. “Əhli-eşq”: Bu beytdə tələb atəşini nəhayətə çatdırmış halda, ilahi feyzlər şərabından qurtum-qurtum yox, bəlkə qədəh-qədəh bəhrələnmiş şəxslərdən ibarətdir.

**Nişanə** 4. “Qəmzə”: Bu beytdə salikin varlığını atəşləndirməklə onun mənlik adlı hacətini aradan qaldıran yandırıcı nurdan ibarətdir (cəlal nuru).

**Qeyd** 1: *Yandırıcı nurun təkrarlanmağına “ləvame” demişlər.*

**Qeyd** 2: *Yandırıcı nurun nəhayət dərəcəsinə “təcəlli cəlalı” demişlər.*

**Qeyd** 3: *Aşiqə vücud bağışlayan qəmzə – ilk qəmzədən ibarətdir.*

**Qeyd** 4: *Aşiqi fanilik məqamına nail edən qəmzə – orta qəmzədən ibarətdir.*

**Qeyd** 5: *Aşiqi əbədiyyətə qovuşduran qəmzə – axır qəmzədən ibarətdir*[2].

**Anlam: Cəlalı parlamalar, aşiqi mənlik hicabından azad edərkən fanilik nailiyyətinə hazırlayır.**

Beyt 2: **Dəşt tutmaq adətin qoymuşdu Məcnun eşqdə**
**Şöhreyi şəhr olmağın rəsmin mən etdim ixtira.**

Sözlük: Dəşt – səhra = çöl; Şöhrə – şöhrətli = məşhur

**Nişanə** 1. “Dəşt”: Xarici vücudu cəmaət yaxud kəsrət əngəlindən azad edən məcazi vəziyyətdən nişanədir.

**Nişanə** 2. “Şəhr”: Xarici vücudu cəmaət, yaxud kəsrət əngəlindən azad edən irfani vəziyyətindən nişanədir.

---

[1] Qəzəl 7, beyt 2
[2] Şeyx Mahmud Şəbüstəri, Gülşəni-raz, səh. 480

**Nişanə** 3. “Şöhreyi-şəhr”: Vücudun çöl üzünü içəri üzlə həmcins etmiş aşiqdən ibarətdir. Belə bir aşiq öz xarici vücudunu qürb, yaxud hüzur məqamından bəhrələnmiş daxili vücudu ilə həmcins etməklə, maddi dünyadan, yaxud kəsrət əngəlindən qayib olmuş halda həyat sürür, buna görə də onun camaatdan (kəsrətdən) ayrılmaq məqsədilə səhraya üz tutmağı hacətsizdir.

**Anlam: Kəsrət maneələrindən kənar olmuş halda vahid məhbub ilə məşğulluq şivəsini Məcnun ixtira etmişsə də kəsrət içində vəhdət ilə məşğul olmağı mən ixtira etdim.**

**Qeyd:** *Bu anlam, Füzulinin Məcnundan üstün olduğunu təlqin edir.*

Beyt 3: **Zərq dəryasında bir xaşakdır kim çizginir**
**Sufiyi-şəyyad kim, dövran tutub eylər səma.**

Sözlük: Zərq – riyakarlıq = iki üzlülük = göyərmək; Xaşak – kol-kos; Şəyyad – riyakar = hiyləgər; ;səma – sufilərin dəstələnmiş halda, yaxud tək başına xüsusi tərzdə rəqs etmələri = avaz = dinləmək

**Nişanə** 1. “Sufi”: A: Sufi bu beytdə “mütəzəhhid” ifadəsi ilə tənqid olunmuş iki üzlü zahiddən ibarətdir[1]. Lisanül-qeyb Hafiz bu barədə belə buyurmuşdur:

صوفی شهر بین که چون لقمه ی شبهه می خورد
پاردمش دراز باد، آن حیوان خوش علف[2]

B: Sufi bu beytdə ictimai hörmət qazanmaq məqsədilə özünü təsəvvüf əhlinə oxşatmış riyakar şəxsdən ibarətdir.

**Anlam: İrfani səfalardan xəbərsiz nadan bir şəxs səma əhlinə qoşulmaqla, özünü sufi nişan vermək və ad qazanmaq istəyir.**

Beyt 4: **Keçdigim dünyavü üqbadən səninçün oldu faş**
**Doğru derlər: “külli sirrin cavəz-əl isneynə şa”.**

Sözlük: Üqba – axirət dünyası = qiyamət; Küllü sirrin cavəz-əl isneynə şa – ikidən əlavə şəxsə məlum olunmuş sirr, faş olmalıdır.

**Nişanə** 1. “Dünya”: A: Dünya axirət ilə müqayisədə həqirdir.

---

[1] Qəzəl 9, beyt 2
[2] Müəllif bu beyti “Ta Qafe-əndişe” kitabının 3-cü cildində şərh etmiş

B: Saliklər nəzərincə, insani mənəvi cəlalardan qəflətdə saxlamış dünya məzəmmət olunmuşdur.

**Nişanə** 2. "Üqba": Üqba yaxud rizvan behişti, rəhman behişti ünvanlı mütəal məbud hüzuru ilə müqayisədə həqir və tərk etməli yer timsalı tanınmış[1].

**Anlam: Vüsal mərtəbəsini yaxud ilahi cilvələri vasitəsiz dərk etmək mümkünsüz olduğuna görə mehriban məbud "səba" ünvanlı mələk vasitəsilə aşiqin möhtac qəlbini vüsal rayihəsindən bəhrələndirir. Amma vasitə ikilik[2] və üçlük[3] əlaməti olduğuna görə ərəblər "كل سر جاوز الاثنين شاع"deyərək onun (aşiqin) sirrini aşkara çıxarır.**

Beyt 5: **Ol büti-sərkəş gəlir, salmış cəmalından niqab**
**Ey səlamət əl- firaq, ey əqlü iman, əlvida.**

**Nişanə** 1. "Büt": Əsasən daşdan yonulmuş ilahə olduğuna görə əqli, idrakı və dini təcrübələri (ikinci misra) daş kimi qurudub işdən salan ilahi hüsndən nişanədir.

**Nişanə** 2. "Sərkəş": Mütəal məbudun "istiğna" mənşəli cəlalını hissiləşdirən nişanədən ibarətdir.

**Qeyd:** *Bir çox hal baş verə bilər ki, aşiq "şəth" mərhələsində həzrət mürşüdə, həzrət Cəbaril, hətta məbuda, büti-sərkəş kimi ibarələrlə xitab edərək öz giley – etirazını bəyan edər lakin o Məcnunluq məğlubiyyətində olduğuna görə cəzalanmaqdan azad olar. Ona görə ki, məcnunluq divanəlikdir və şəriət divanəni mühakimə etməyə hökm verməmişdir.*

**Anlam: Əql, idrak, elm, iman, cism və can aşiq ilə məşuq arasında hicab olduğundan, niqabsız camal cilvələri ilə yanıb məhv olmalıdırlar.**

**Qeyd:** *Niqabsız camal, aşiq ilə məşuq arasında dayanmış təkcə bir mülk vasitəsilə cilvə edən camaldan ibarətdir.*

Beyt 6: **Canü dil bir ömrdür, tiğinçün eylərlər cidal**
**Girmədən tiğin sənin ortayə qət olmaz niza.**

Sözlük: Niza – müharibə = düşmənlik

---

[1] Qəzəl 127, beyt 1 və 2
[2] İkilik = bir aşiq + bir vasitə
[3] Üçlük = bir məşuq + bir aşiq + bir vasitə

**Nişanə** 1. “Canü dil”: A: Dünyəvi həyat vasitələrindən ibarətdir.

B: Mənəvi və həqiqi həyat vasitələrindən ibarətdir.

**Nişanə** 2. “Tiğ”:A: Tiğ bu beytdə zahiri əngəl mahiyyətini batil edən ilahi lütfdən asılı qəhrdən ibarətdir.

B: Aşiqi qurban məqamına nail edən vasitədən ibarətdir.

C: Aşiqi kəsrət məhdudluğundan vəhdət məhrumsuzluğuna qaytaran vasitədən nişanədir.

**Anlam: Ey gözəl məbud, vəhdət mərkəzindən kəsrət aləminə yollandığım ləhzədən zahiri və batini vücudum müraciət mıəqsədilə qərarsızlıq edir.**

**Qeyd:** *Mövləvi vəhdət mərkəzinə qayıtmaq şövqü ilə qərardan getmiş aşiqin əhvalatını bəyan etmək məqsədilə “* بشنو از نی چون حکایت می کند*” buyurmuş.*

Beyt 7: **Ey Füzuli, axirət mülkünə lazımdır səfər**
**Böylə fariğ gəzmə, təqvadən mühəyya qıl məta.**

Sözlük: Fariğ – xəbərsiz = bikar; Təqva – pəhriz = itaət etmək; Mühəyya – hazır

**Nişanə** 1. “Səfər”: Bu beytdə ilahi cazibələr ilə “məruf mülk”[1] ünvanlı gizli aləmə səfər etməkdən ibarətdir.

**Nişanə** 2. “Təqva”: Mütəal məhbub tələbindən başqa tələbləri ürəkdən qoparan itaətdən ibarətdir.

**Qeyd:** *Bir çox şair və arifin tənqid etdiyi təqva:*

*A: Dini qayda-qanunun zahirini məşğul edən naqis təqvadan ibarətdir. (batindən xəbərsiz edən təqva)*

*B: Riyakar şəxsin göstərdiyi təqva*[2].

**Anlam: Ey Füzuli, məruf mülkə səfər etmək (vəhdət mərkəzinə qovuşmaq) zərurəti məcazi və dünyəvi, yaxud zehni və cismi bağlantılardan (təəllüqlərdən) təmamilə azad olmağı vacib etmişdir.**

**Qeyd:** *Bu anlam, yaxud bu zərurəti dərk etmək aşiqin ilahi, yaxud Ələsti şəxsiyyətini təsdiq edir.*

---

[1] Qəzəl 122, beyt 5, nişanə 1
[2] Qəzəl 9, beyt 2, “zahid və mütəzəhhid”

## Q Ə Z Ə L 142

**(1) Yar vəslin istəyən kəsmək gərək candan təmə,**
**Hər kişi kim vəsli-yar istər, kəsin andan təmə.**

**(2) Arizuyi-vəsli-canan, canə afətdir könül,**
**Ya təllüq candan üz, ya vəsli-canandan təmə.**

**(3) Çün mənə bir zərrə yox, tabi-tamaşayi camal,**
**Mən kiməm, vəsl etmək ol xurşidi-rəxşandan təmə,**

**(4) Aşiq oldur kim, təmənnayi-bəlayi-hicr edə,**
**Yoxsa çoxdur mehr edən ol mahi-tabandan təmə.**

**(5) Rişteyi-tuli-əməl dami-bəladır, neyləyim?**
**Üzmək olmaz ol səri-zülfi-pərişandan təmə.**

**(6) Arizin görmək həyatım tazə eylər, vəh nə eyb,**
**Gər gəda vəchi-məaşın qılsa sultandan təmə.**

**(7) Müttəsil hirman qılar hasil təmədən əhli-hirs,**
**Türfə kim, artar ona gəldikcə hərmandan təmə.**

**(8) İstər isən həsrətü hirmanə hərdəm düşməmək**
**Kəs, Füzuli, dəhrdən ümmidü, dövrandan təmə.**

Beyt 1: **Yar vəslin istəyən kəsmək gərək candan təmə,**
**Hər kişi kim vəsli-yar istər, kəsin andan təmə.**

Sözlük: Vəsl – vüsal

**Nişanə** 1. "Yar": Ariflər şühud aləminə, yaxud mütəal məbudun "vəch" ünvanlı camalını müşahidə etməyə yar demişlər[1].

**Nişanə** 2. "Vəsl": Öz həqiqətini tapıb – tanımaqla özünü bütün kainata məbdə və məadı (əvvəl və axır) dərk etmiş insanın mövqeiyyətinə vəsl demişlər.

**Qeyd** 1: *Gah ilahi cazibə və ilham vasitəsilə, gah "müraqibə"[2] və riyazət yollarıyla, gah da hər iki vasitə ilə vüsala çatmaq mümkün olur. Ancaq hər üç mərtəbə aşiqin istedad miqdarı ilə bağlıdır[3].*

**Qeyd** 2: *Öz həqiqətini tanımaq, şəxsi, ümum və zehni qatqılardan ayrılmaqla mümkün olur (kəsrətdən azad olmaq).*

**Qeyd** 3: *Xarici və maddi dünyada yerləşmiş bağ, dağ, dəniz, günəş, ay, ulduz, saray, qəsr, taxt, tac, məscid, minbər və sair ümumi qatqılardırlar.*

**Qeyd** 4: *Cismi üzvlər, iqtidarlar, hüsnlər, tənasüblər və sair şəxsi qatqılardırlar.*

**Qeyd** 5: *Kinlər, küdurətlər, meyllər, həvəslər, elmlər, cövhərlər, mahiyyətlər və sair zehni qatqılardırlar.*

**Qeyd** 6: *Şəxsi, ümumi və zehni qatqılardan azad olmaqla "riştə"[4] və "səfa"[5] ünvanlı mərtəbələr nailiyyəti mümkün olur.*

**Qeyd** 7: *Aşiq istədiyi, yaxud tələb etdiyi məhbubu tam şəkildə tanımaq istəyir, lakin onu təmamilə öz batinində tapmalıdır, çünki məhbubu qıraqdan görmək ikilikdən nişanə olduğuna görə vəhdət ilə müxalif olmaqdan əlamətdir[6], buna görə də o, "riştə" və "səfa" mərtəbələrində özünü doğrultmaqla mütəal məhbub ilə həmcins etməlidir.*

**Nişanə** 3. "Can": Bu beytdə ilahi mərifət idrakından aciz olan heyvani can yaxud bədən canından ibarətdir.

**Qeyd:** *Bədən canı yalnız onu qurban məqamına bəxş etmək və*

---

[1] Qəzəl 131, beyt 5

[2] Müraqibə, dünyəvi məşğulluqlardan qəlbi mühafizə edən yaxud onu ibadət ilə xalisləşdirən qüvvədən ibarətdir.

[3] Şeyx Mahmud Şəbüstəri, Gülşəni-raz, səh. 325

[4] Qəzəl 12, beyt 1

[5] Qəzəl 70, beyt 7

[6] Qəzəl 32, beyt 7, qeyd 1 və 2

*vəhdət cilvəsinə hədiyyə vermək məqsədilə qorunmalıdır.*

**Nişanə** 4. “Kişi”: Vəhdət ərəfəsinə çatmaq məqsədilə nəhəng təhlükələri alqışlayan, kamil olan bir arifə kişi demişlər.

**Anlam: Vəhdət mənşəli gizli və həqiqi həyatından xəbərdar bir aşiq dünyəvi yaxud cismi həyatını qurban verməlidir.**

Beyt 2: **Arizuyi vəsli-canan, canə afətdir, könül,**
**Ya təllüq candan üz, ya vəsli-canandan təmə.**

Sözlük: Təəllüq – ürək bağlamaq = asılmaq = hər hansı bir şey ki onunla əlaqə saxlamaq mümkündür.

**Nişanə** 1. “Canan”: Bax beyt 1, “yar”

**Nişanə** 2. “Can”: Bax beyt 1, “can”

**Anlam: Bu beyt də ötən beytin mənasını təkrar edir.**

Beyt 3: **Çün mənə bir zərrə yox, tabi-tamaşayi-camal,**
**Mən kiməm, vəsl etmək ol xurşidi-rəxşandan təmə**

Sözlük: Xurşid – günəş; Rəxşan – parlaq

**Nişanə** 1. “Tamaşayi-camal”: Bu beytdə “riştə” və “səfa” mərtəbələrinə nail olmuş aşiqin batinində ruhani əhval – ruhiyyə törədən mənəvi müşahidə nailiyyətindən ibarətdir[1].

**Nişanə** 2. “Xurşidi-rəxşan”: Daş ünvanlı fiziki fani qəlbdən ləl adlı mənəvi ölməz ürək tərbiyə edən tovhid günəşindən ibarətdir[2].

**Anlam: Beyt, ümumi, şəxsi, xüsusən zehni qatqılardan mükəmməl surətdə azad olmaq çətinliyini yaxud “riştə” və “səfa” nailiyyətinin müşkül olduğunu, nəhayət, istedad naqisliyini təlqin edir.**

**Qeyd:** *İstedad naqisliyindən xəbərdar olmaq mərifət kamilliyinə işarə edir.*

Beyt 4: **Aşiq oldur kim, təmənnayi-bəlayi-hicr edə,**
**Yoxsa çoxdur mehr edən ol mahi-tabandan təmə.**

Sözlük: Mehr – məhəbbət = günəş; Mah – ay; Taban – parlaq

---

[1] Qəzəl 137, beyt 1
[2] Qəzəl 1, beyt 1

**Qeyd:** *A: Hicran mütəal məhbubun istəyi və məsləhət bildiyi olduğundan vüsaldan, yaxud aşiq istədiyindən üstündür.*

*B: Hicran – aşiqi tərbiyə edən və yetişdirən mərhələ olduğuna görə əzizdir.*

*C: Hicranda vüsal ümidi və vüsalda hicran qorxusu olduğuna görə ümidi qorxudan və hicran vüsaldan üstün bilmişlər.*

**Anlam: Həqiqi aşiq hicranı da vüsal kimi alqışlamalıdır.**

Beyt 5: **Rişteyi-tuli-əməl dami-bəladır, neyləyim?**
**Üzmək olmaz ol səri-zülfi-pərişandan təmə.**

**Nişanə** 1. “Tuli-əməl”: Birinci beytdə qeyd olunmuş “yar” vüsalını istəməkdən ibarətdir.

**Nişanə** 2. “Dami-bəla”: Bu beytdə aşiqin bədənini sınağa çəkən, əzabverici xəstəliklər, məşəqqətlər, qəhrlər və qəbzlər hücumundan nişanədir[1].

**Qeyd:** *“Qürb”: ünvanlı ilahi yaxınlığının miqdarı bəlaların miqdarı ilə yanaşıdır.*

**Nişanə** 3. “Zülfi-pərişan”: Bu beytdə mütəal məbud ərəfəsinə yönəldən vəhdət rayihəli kəsrətdən nişanədir.

**Anlam: Vəhdət vəslini istəyən aşiq kəsrət mənaları ilə imtahan olunmalıdır.**

Beyt 6: **Arizin görmək həyatım tazə eylər, vəh nə eyb,**
**Gər gəda vəchi-məaşın qılsa sultandan təmə**

Sözlük: Ariz – sima = surət = camal; Vəh – ba = əcəba; Gəda – dilənçi; Vəchi məaş – məişət vəsiləsi = maaş xərci

**Nişanə** 1. “Ariz”: Aşiqi arzularından əlavə ilahi camal nurundan feyzyab etməkdən nişanədir.

**Nişanə** 2. “Tazə həyat”: İrfani əhval-ruhiyyənin, həm də ilahi tanışlıqların dalbadal tazələnməyindən nişanədir.

**Qeyd** 1: *Aşiq mənəvi əhval – ruhiyyənin təzələnməyini duyub – düşünməklə vəhdət nöqtəsinə, yaxud “İnna lillah”[2] əslinə hidayət olur.*

**Qeyd** 2: *Qiyamətəcən verilən dini suallara aydın cavab almaq, yaxud təzə əsrlərdə təzə nəsillər suallarına cavab vermək dini*

---

[1] Qəzəl 23, beyt 1, nişanə 3
[2] Quran , Bəqərə surəsi, 156-cı ayə

*yeniləşməyə bağlıdır*[1].

**Nişanə** 3. “Gəda”: Gəda nişanəsi aşiqin dalbadal əlavə olmuş ətəşinə – atəşinə, beləliklə onun istedadlı və mərifətli olduğuna işarə edir.

**Nişanə** 4. “Vəchi-məaş”: Ariflərin, yaxud həqiqi canın, “Allah təamı” adlanan xüsusi qidasına işarə edir.

Nəzərə alsaq ki bədənə yemək yetişməzsə onun varlığı təhlükəyə məruz qalar və nəhayət məhv olar, insanın da həqiqi can ünvanlı mənəvi cəhətinə həyat verən və mənəvi varlığının davamını ödəyən – “nur” ünvanlı Allah təamıdır[2]. Bu təamın əzəmətini təlqin etmək məqsədilə Mövləvi buyurmuşdur:

قوت اصلی بشر نور خداست     قوت حیوانی مراورا ناسزاست[3]
چون خوری یک لقمه زین ماکول نور     خاک ریزی بر سر نان و تنور [4]

**Nişanə** 5. “Sultan”: Bu beytdə hüsnü camal aşiqin əhval- ruhiyyə mənşəyi və əməllər səbəbi olmuş mehriban məhbubu eyham edir.

**Anlam: Sultan həzrətindən məişət istəyən dilənçi kimi mehriban məhbubdan nur təamı tələb edirəm.**

Beyt 7: **Müttəsil hirman qılar hasil təmədən əhli-hirs,**
**Türfə kim, artar ona gəldikcə hirmandan təmə.**

Sözlük: Hirman – ruzisiz qalmaq = bəhrəsizlik = məyusluq; Türfə – əcibə = təzə şey

**Nişanə** 1. “Hirman”: Beytdə məcazilik asarına işarə edən nişanədən ibarətdir.

**Nişanə** 2. “Hərəs”: Tələb çalışqanlığından nişanədir.

**Anlam: Öz tamahının ucbatından dönə-dönə ziyan çəkmiş tamahkar dəmbədəm tamahlanmağını bldirir ki, bu iş həqiqətən qəribədir.**

**Qeyd** 1: *Dünyəvi məişət qismətindən əlavə tamahlanmayan bir şəxs məcazi qənaət məqamına nail olmaqla əziz və hörmətli olur.*

**Qeyd** 2: *Mənəvi qüvvəni kamil bilməklə dünyəvi bəhrələnməyi tərk etmiş bir aşiq həqiqi qənaət məqamına nail olmaqla daha əziz və hörmətli olur.*

---

[1] Qəzəl 71, beyt 3, nişanə 4, qeydlər
[2] Qəzəl 1, beyt 1, nişanə (ənar)
[3] مولوی مثنوی دفتر 1 ذثغف 1090
[4] مولوی مصنوی، بیت 1976

**Qeyd** 3: *Tamah hacət istəmək əlamətidir və aşiqin hacət istəməyi isə onun şikayət etməyi kimi nadanlıq əlamətidir, çünki:*

*1 – Mütləq təslim halında "*[1]الاسلام هو تسليم*" düşünmüş aşiqin şikayət etməyi və hacət istəməyi təslimdən qıraq düşməkdən ibarətdir.*

*2 – Özünü, özünə malik bilməkdən, demək bəndəlikdən kənar düşməkdən ibarətdir.*

*3 – Həkim, iqtidarlı və mehriban olan məhbubun qəhrini lütfündən ayırmaq, beləliklə şikayət etmək, yaxud hacət diləmək yaramazlıq və məhkumluq əlamətidir.*

*4 – Mütəal məhbubun rəhməti ucu-bucağı yox bir dəniz olduğuna görə hamının o cümlədən aşiqin də o dənizdə payı və qisməti var.*

*5 – Yuxarıda dediyimiz qeydlər, bir çox başqa paralel dəlillər olduğuna görə, Mövləvi hətta dua etməyi aşiqə eyb – irad bilərkən demişdir: "Mən mütəal məhbubun övliya ünvanlı özəl dostlarından bir çoxlarını tanıyıram ki, onlar ağızlarını duadan bağlamışlar"*[2].

**Qeyd:** *Dua özünü bir şəxs yaxud bir vücuda malik bilib hacət diləməklədir, zikr deməkdən, münacatdan və məmlüklük izhar etməkdən fərqlidir.*

Beyt 8: **İstər isən həsrətü hirmanə hərdəm düşməmək**
**Kəs, Füzuli, dəhrdən ümmidü dövrandan təmə.**

Sözlük: Dəhr = zamanə = ruzgar

**Anlam: Bu beyt də yuxarıda qeyd etdiyimiz dünyəvi və mənəvi qənaət əhəmiyyətini təkrar edir.**

---

[1] İslam təslim olmaqdan ibarətdir. (Doktor Cavad Nurbəxş, Sufi kist)
[2] قوم دیگر می شناسم زولیا كه دهانشان بسته باشد از دعا مثنوی دفتر 3 بیت 1910

## Q Ə Z Ə L 143

**(1) Dil uzadır bəhs ilə ol arizi-xəndanə şəm`,**
**Od çıxar ağzından, etməzmi həzər kim, yanə şəm`.**

**(2) Nola qeyrət atəşi canım əritsə mum tək,**
**Bu nə sözdür kim, demişlər arizi – cananə şəm`?**

**(3) Arizi-canan ilə bəhsi-kəmali-hüsn edər,**
**Dil ucundandır ki, hər saət düşər nöqsanə şəm`.**

**(4) Gah ayağı bağlı, gah boynu, nədəndir bilməzəm,**
**Bir pəri eşqindən olmuşdur məgər divanə şəm`?**

**(5) Nola canım qamətin istərsə, könlüm arizin,**
**Rəsmdir aləmdə: bülbül gül sevər, pərvanə şəm`.**

**(6) Qıl şəbistanı müşərrəf kim, nisarın qılmağa,**
**Riştədən dürlər çəkib cəm` eyləmiş damanə şəm`.**

**(7) Ey Füzuli, şövqdən yaqdın tənin ruzi – vüsal,**
**Netdin, ey qafil, gərəkməzmi şəbi – hicranə şəm`?**

Beyt 1: **Dil uzadır bəhs ilə ol arizi-xəndanə şəm`,**
**Od çıxar ağzından, etməzmi həzər kim, yanə şəm`.**

Sözlük: Ariz – surət = camal

**Nişanə** 1. "Dil uzadır": "Dil uzatmaq" bu beytdə məcazi imtiyazlar məğrurluğundan nişanədir.

**Nişanə** 2. "Arizi-xəndan": İlahi camaldan parlayan bəst rayihəli hicabsız nurdan ibarətdir.

**Qeyd:** *Maddi hicablar məhvliyi mümkün olsa da, ilahi cəlal və əzəmət kimi hicabların, həmçinin, bəşəri aciz elm və iqtidar kimi maddi maneələrin məhvliyi, yaxud məhz hicabsızlıq imkandan xaricdir.*

**Nişanə** 3. "Şəm`": Bu qəzəldə ümumən dünyəvi maraqlardan nişanədir.

**Nişanə** 4. "Od çıxar ağzından": Müddəini [1] tənbeh edən cəzalanmaq atəşindən ibarətdir.

**Anlam: Beyt, dünyəvi müsbət maraqları (şəm`), mənəvi cazibələr ilə müqayisə edilməz kimi təlqin edir.**

Beyt 2: **Nola qeyrət atəşi canım əritsə mum tək,**
**Bu nə sözdür kim, demişlər arizi – cananə şəm`?**

**Nişanə** 1: "Qeyrət": Allah-taaladan başqa mailliyə razılıq verməyən əhval – ruhiyyədən ibarətdir.

**Anlam: Ariflər nəzərincə dünyəvi cilvələri mənəvi cəlalər ilə müqayisə etmək, atəş kimi əzabvericidir.**

Beyt 3: **Arizi-canan ilə bəhsi-kəmali-hüsn edər,**
**Dil ucundandır ki, hər saət düşər nöqsanə şəm`.**

**Nişanə** 1. "Kəmali-hüsn": Kəmal və camal cəlalərinin nəhayətə çatmış gözəlliklərindən ibarətdir.

**Anlam: Şəm`, nurunu ariz nuruna bənzətdiyi baş tərəfində (dil) nöqsan görməklə cəzalanır.**

Beyt 4: **Gah ayağı bağlı, gah boynu, nədəndir bilməzəm,**
**Bir pəri eşqindən olmuşdur məgər divanə şəm`?**

---

[1] Qəzəl 6, beyt 2

**Anlam: Şəm` də ayağı – boynu bağlanmış düvanələr kimi zəncirə çəkilmişdir.**

**Qeyd** 1: *Bağlanmaq, yaxud zəncirlənmək də nöqsan kimi cəzalanmaq əlamətidir.*

**Qeyd** 2: *Şamdan içində sabit qalmaq, ayağı bağlılıqdan istiarədir.*

**Qeyd** 3: *Baş tərəfdən rəngin lent ilə bağlanmaq boynu bağlılıq əlamətidir.*

Beyt 5: **Nola canım qamətin istərsə, könlüm arizin,**
**Rəsmdir aləmdə: bülbül gül sevər, pərvanə şəm`.**

**Nişanə** 1. "Ariz": Bu beytdə tovhid günəşinin çıxıb – batmasından nişanədir.

**Nişanə** 2. "Qamət": Mənəvi hüsnlər uzantısından nişanədir.

**Anlam: Beyt ariz və qamət ünvanlı mənəvi mərtəbələr mayilliyini bülbül, gül, pərvanə və şam kimi dünyəvi rəvayətçilərdən istifadə etməklə hissə gətirmək və dəlilləşdirmək istəyir. Çünki:**

A: Dünyəvi vücudlar, yaxud bütün kainat mənəvi ölməz həqiqətin və ya axirət adlı həqiqi aləmin təzahürləri və kölgələridirlər.

B: Dünya və kainat ilahi sirlər mənbəidir.

C: Dünya və kainat ilahi cilvələrin "məzhər" ünvanlı güzgüsüdür[1].

Beyt 6: **Qıl şəbistanı müşərrəf kim, nisarın qılmağa,**
**Riştədən dürlər çəkib cəm` eyləmiş damanə şəm`.**

Sözlük: Şəbistan – hərəmxana = məscidin qadınlara məxsus hissəsi; Müşərrəf – şərəflənmiş; Nisar – hədiyyə = gəlinin, yaxud digər şəxsin başına və ya ayağına səpilmiş cəvahir; Daman – ətək

**Nişanə** 1. "Şəbistan": Aşiqi vəhdət cilvəsindən məhrum etmiş kəsrət qaranlığından ibarətdir.

**Nişanə** 2. "Riştə": Bu beytdə aşıb-daşan göz yaşından nişanədir.

**Nişanə** 3. "Dürr": Bu beytdə bəst və şühud məqamına maneə törətmiş keçmişlə əlaqədar əməlləri yuyub batil edən mövqeiyyətdən nişanədir.

**Nişanə** 4. "Şəm`": Bu beytdə "nari-məhəbbət"[2] şöləsində vücudunu

---

[1] Qəzəl 127, beyt 2, nişanə "dünya"
[2] Qəzəl 9, beyt 3, nişanə 1

arıtmış aşiqdir.

**Anlam: Beyt, aşiqin şühud nailiyyətinə hazırlaşmasını təlqin edir.**

Beyt 7: **Ey Füzuli, şövqdən yaqdın tənin ruzi – vüsal,**
**Netdin, ey qafil, gərəkməzmi şəbi – hicranə şəm`?**

**Nişanə** 1. "Şövq": Bu beytdə Molla Sədranın[1] zənn etdiyi, şölələri məhəbbətdən saçılan, maddi-əlaqə-əngəlləri yandıran, intizar qaydasını xarab və aşiqi biqərar edən bir atəşdən ibarətdir. Demək şövq əhli hicran vəziyyətində vüsala çatmış aşiqlərdirlər. Onları bir çeşid həm əzabverici, həm də ləzzət aparmalı sonu məlum olmayan vəhşət və heyrət buyurub[2].

**Nişanə** 2. "Ruzi-vüsal": "Məşhud gündüzü" ünvanlı mərtəbədə müvəqqəti şühud nailiyyətindən nişanədir.

**Nişanə** 3. "Şəbi-hicran": Şühud nurundan məhrum edən vəziyyətdən nişanədir.

**Nişanə** 4. "Şəm`": Şövq hərarətində yanmış maddi vücuddan nişanədir.

**Anlam: Ey Füzuli şövq məğlubiyyətində vüsaldan asılı hicrandan xəbərsiz qalmaqla vücud adlı mənəviyyata xərc etməli məcazi sərmayəni təhlükəyə salmısan.**

**Qeyd** 1: *İnsanın qabiliyyətlərini müəyyən edib üzə çıxaran çalışqanlıq, fədakarlıq, sınaq-sıxıntı, cəfa çəkmək, bəlalara düşmək, hətta şəhid olmaq cismsiz imkanlı olmadığına görə, cismi həyatı, yaxud maddi vücudu mühafizə etmək və qurban mərtəbəsinə, yaxud vəhdət mülkünə sərmayə və hədiyyə hazırlamaq gərəklidir.*

**Qeyd** 2: *Vücudu özünə görə mühafizə etmək, yaxud özünü qorumaq ikilik və müddəilik əlamətidir. Buna görə də islamın peyğəmbəri "* وجودک ذنب لایقاس به ذنب[3]*" buyurmuşdur.*

---

[1] Qeyd. Böyük İran filisofu Sədrəddin Məhəmməd İbrahimdir. O, gəncliyində İsfahana gələrək "Mir Damad" kimi tanınan məşhur alim Mir Məhəmmədbaqirin yanında hikmət elmini öyrənmiş, Şeyx Bəhaəddin Amelinin yanında isə şəriət elmlərini mənimsəmişdir. Riyaziyyatı gözəl bilirdi. I və II Şah Abbas Dövründə yaşayan Molla Sədra 7 dəfə Həccə getmiş, son səfəri zamanı Bəsrədə vəfat etmişdir. Ondan "Əsfari-Ərbəə", "Şəvahedər-robubiyyət", "Məbdə və Miad" və s. Çoxsaylı əsərlər yadigar qalmışdır – redaktor.

[2] Qəzəl 24, beyt 6, qeyd 3

[3] Qəzəl 1, beyt 6

## Q Ə Z Ə L 144

(1) Eyş üçün bir türfə mənzildir bəhar əyyamı bağ,
Onda tutsun qönçəvəş hər kim ki, eyş istər otağ

(2) Qönçələr açıldı, seyri-bağ edin, ey əhli dil
Kim, görüb güllər, könüllər açılan çağdır bu çağ.

(3) Səndən ey bülbül, füzundur məndə möhnəti fəsli-gül,
Sənsənü min tazə gül, hala mənü min tazə dağ.

(4) Bağə sərvim gəldiyin bilmiş səhərdən şaxi – gül,
Rövşən etmiş rəhgüzari üzrə hər yan min çırağ.

(5) Çəksələr zəncir ilə gülzarə getmən kim, mənə
Sünbüli – zülfün fəraqından müşəvvəşdir dəmağ.

(6) Mövsimi – güldür, vəli getmən çəmən seyrinə kim,
Rövzeyi – kuyin mənə ol seyrdən vermiş fərağ.

(7) Məhrəm olmaz rindlər bəzminə mey nuş etməyən,
Ey Füzuli, çək ayağ ol bəzmdən, ya çək əyağ.

Beyt 1: **Eyş üçün bir türfə mənzildir bəhar əyyamı bağ,**
**Onda tutsun qönçəvəş hər kim ki eyş istər otağ**

Sözlük: Türfə – qəribə = təzə bir şey; Qönçəvəş – qönçə kimi

**Qeyd:** *Bu qəzəl: 1 – Dünyəvi nümunələr vasitəsilə mənəvi mərtəbələri hissiləşdirmək istəyir;*

*2 – Fəlsəfə və irfan demişkən, dünyəvi naqis hüsnləri mənəvi kamil hüsnlərin xülasəsi və rayihəsi olduğunu bildirir.*

**Nişanə** 1. "Eyş": Zahiri nigərançılıqdan xilas edən, batini ləzzətlər isinişməyinə, yaxud dünyəvilikdə əks etdirilmiş mənəviliyə işarə edən nişanədir.

**Nişanə** 2. "Bəhar": Aşiqin içəridən dəyişməsinə və yeni bir heyət və həyat tapmasına işarə edir.

**Nişanə** 3. "Bağ": Şad və geniş olan ruhani aləmə işarə edir.

**Nişanə** 4. "Qönçə": İç sifətlərini nazik ürəkdə pünhan etmiş mənəvi eşq tələblərinə işarə edir.

**Nişanə** 5. "Otağ": Mehriban Allahın "rəbb" sifətilə əlaqədar dünyəvi və mənəvi ehsanından nişanədir[1].

**Anlam: Mehriban Allahın dünyəvi və mənəvi ehsanından bəhrələndirən mövqeiyyət bağ və bahardan ibarətdir.**

**Qeyd:** *Aşiqi mənəvi bəhar nailiyyətinə hazırlayan müqəddimə, dünyəvi bahardan ibarətdir[2]. Buna görə də bir çox ariflər məcazi aləmə biganə olmayıblar, əksinə onlar dünyəvi hüsnləri mənəvi nümunələr bilmişlər[3]*

Beyt 2: **Qönçələr açıldı, seyri-bağ edin, ey əhli dil**
**Kim, görüb güllər, könüllər açılan çağdır bu çağ.**

**Nişanə** 1. "Qönçələr açıldı": Açılmış qönçələr yaxud qönçeyixəndan bu beytdə ürək açan ilahi ilhamlara işarə edir.

**Nişanə** 2. "Seyr": Bu beytdə kəsrət güzgüsündə vəhdət cilvələrini dərk etmək əlamətidir.

**Qeyd** 1: *Dünya darısqallığından xaric olmaq həqiqi seyrin ilkin dərəcəsindən ibarətdir.*

**Qeyd** 2: *İlk seyrdə kənara çıxmış hicabları yandırıb külə döndərən mərtəbə ikinci seyrdən ibarətdir.*

---

[1] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی
[2] Qəzəl 80, beyt 3
[3] Qəzəl 114, beyt 6

**Nişanə** 3. “Bağ”: Bax beyt 1, nişanə 3

**Nişanə** 4. “Əhli-dil”: İçərisini təbii bulaşıqlardan pak saxlamış və özündə ilahi cəlaları əks etdirmiş arifdən nişanədir[1].

**Nişanə** 5. “Güllər”: Ürək açan dünyəvi hüsnlərdən ibarətdir.

**Nişanə** 6. “Könüllər açmaq”: Açılmış könüllər həqiqi bəst məqamına hazırlaşmış ürəklərdən ibarətdir.

**Anlam: Beyt, dünyəvi bəhar güzgüsündə mənəvi bəhar təzahürünü göstərmək istəyir. Ulu şeyx Sədi Şirazi həmin məqsədlə buyurmuşdur:**

آفرینش همه تنبیه خداوند دل است
دل ندارد که ندارد به خداوند اقرار

Beyt 3: **Səndən ey bülbül, füzundur məndə möhnəti fəsli-gül,**
**Sənsənü min tazə gül, hala mənü min tazə dağ.**

**Nişanə** 1. “Bülbül”: Bütün vücudunu hüsn cazibələrinə məğlub etmiş səbirsiz aşiqdən istiarədir.

**Nişanə** 2. “Möhnət”: Möhnət-məhəbbət qədimi qoşa yoldaşdırlar. Məhəbbətdən dəm vuran bir şəxsin qəlbini – canını sınaqlara çəkməklə onun naqisliyini, yaxud kamilliyini üzə çıxarıb aydınlaşdıran yalnız möhnətdir.

**Nişanə** 3. “Fəsli-gül”: Dünyəvi və mənəvi bəst mövqeiyyətindən nişanədir.

**Nişanə** 4. “Tazə gül”: Ürəyi bəst məqamına nail edən hüsndən nişanədir.

**Nişanə** 5: “Tazə dağ”: A – Tazə dağ aşiqin qəlbinə girmiş qəbzlər nişanından ibarətdir.

B – Tazə dağ aşiqin ətəşini-atəşini əlavə edən cilvələr təsirindən ibarətdir.

C – Tazə dağ aşiqin xəcalətini əlavə edən cilvələr təsirindən ibarətdir.

**Anlam: Ey bülbül sən yalnız bəst hərarəti ilə şöləlEnirsən (möhnət), lakin mən həm bəst, həm ətəş, həm də xəcalət oduna yanıram.**

**Qeyd:** *Möhnət və xəcalət aşiqin həmişəlik qisməti olduğuna görə, bəst, şühud, hətta vüsal mərtəbəsində də vardır. Çünki aşiq məşuqun*

---

[1] Qəzəl 13, beyt 1, “ətvar”

*hüzurunda öz həqirliyini aydın düşünərkən heç bir qulluğu məşuqa layiq görməyib, xidmətçilik acizliyindən, beləliklə mümkünsüz vəzifə daşımaqdan xəcalət çəkməlidir*[1].

Beyt 4: **Bağə sərvim gəldiyin bilmiş səhərdən şaxi – gül,**
**Rövşən etmiş rəhgüzari üzrə hər yan min çırağ.**

Sözlük: Rəhgüzar – yol = küçə

**Nişanə** 1. "Bağ": Bəst və bəhar mövqeiyyətindən nişanədir.

**Nişanə** 2. "Sərv": Bu beytdə mütəal məhbubun vəhdət ilə kəsrət arasında davam etdirdiyi təcəllilərindən, yaxud şühud nurunun dalbadal yeniləşib çıxmağından nişanədir.

**Nişanə** 3. "Səhər": Məcazi bağlantılardan azad edən mövqeiyyətdən nişanədir.

**Nişanə** 4. "Şaxi gül": A: Qurub məqamına nail olmuşlardan nişanədir.

B: Mürşüd həzrətinə, yaxud həzrəti Cəbrail kimi ilahi vasitələrə işarə edən nişanədir.

**Nişanə** 5. "Çırağ": Qara maddəni (kəsrəti) ağ nur təzahürünə hazırlamış mövqeiyyətdən nişanədir.

**Anlam: İlahi lütfdən xəbərdar vasitələr şühud nurunun davamlı çıxmağına imkan törətmişlər.**

Beyt 5: **Çəksələr zəncir ilə gülzarə getmən kim, mənə**
**Sünbüli – zülfün fəraqından müşəvvəşdir dəmağ.**

Sözlük: Müşəvvəş – pərişan = qarışıq; Dəmağ – damaq = məğz = hal

**Nişanə** 1. "Gülzar": Bu beytdə ürək açan dünyəvi hüsnlər mərtəbəsindən nişanədir.

**Nişanə** 2. "Sünbüli-zülf": İlahi cəlal və camal nurunun dayanılmasından nişanədir.

**Anlam: Mənəvi və dünyəvi cilvələr ilə (birinci misra) səliqə-sahman salmaq mümkünsüzdür.**

Beyt 6: **Mövsimi – güldür, vəli getmən çəmən seyrinə kim,**
**Rövzeyi – kuyin mənə ol seyrdən vermiş fərağ.**

---

[1] Qəzəl 51, beyt 7

Sözlük: Rövzə – bağ = gülzar; Fəraö – fərağət = aram olmaq

**Nişanə** 1. “Mövsümi-gül”: Bax beyt 3, nişanə 3, “fəsli-gül”;

**Nişanə** 2. “Çəmən”: Bax beyt 5, nişanə 1, “gülzar”;

**Nişanə** 3. “Seyr”: Bax beyt 2, nişanə 2;

**Nişanə** 4. “Rövzeyi-kuy”: “Rəhman behişti” ünvanlı ilahi hüzur təsəvvürü ilə bəşəri iradə - ixtiyardan azad olmuş aşiqin təbiət hüsnünə, həm də “rizvan behişti” adlı bağçalı behiştin nemətlərinə etinasızlıq etmək məqamından, yaxud bəndəlik mərtəbəsindən nişanədir.

**Anlam: Dünyəvi hüsnlərdən hacətsiz olduğumun yeganə səbəbi mənəvi hüsnlər tanışlığından ibarətdir.**

Beyt 7: **Məhrəm olmaz rindlər bəzminə mey nuş etməyən,**
**Ey Füzuli, çək ayağ ol bəzmdən, ya çək əyağ.**

Sözlük: Rind – zirək = hiyləgər = ictimai-umumi qaydalara, görüşlərə etina etməyən; Bəzm – əncümən = məclis = ziyafət məclisi = xeymə; Ayağ – cam = qədəh

**Nişanə** 1. “Rind”: A: Maddi imkanları-etibarları qət etmiş dünyaya sığmaz mürşüddən ibarətdir.

B: Varlığını təmamilə ilahi eşqə məğlub etmiş mürşüddən ibarətdir.

C: İç vücudunu sağ-salamat saxlayıb, çöl vücudunu sərkilər ləkələndirdiyi arifdən ibarətdir.

D: Dünyəviliyi öldürüb, mənəviliyi dirildən təlimatçıdan ibarətdir.

E: Bütün bəşəri sifətlərdən yan olmaqla ilahi sifətlərə nail olmuş rəhbərdən ibarətdir.

**Nişanə** 2: “Mey nuş edənlər”: Məcazi mənliyə və dünyəvi ilgilərə üstün gələn əhval-ruhiyyədən feyzyab olmuşlardır[1].

**Nişanə** 3: “Ayağ çəkmək”: Mey nuş etmək, yaxud ilahi müşahidə nailiyyətində mənəvi sirlər idrakına imkan tapmaqdan nişanədir.

**Anlam: Ey Füzuli, ya rindlər məclisinə məhrəm ol, ya o məclisdən kənar gəz.**

---

[1] Qəzəl 1, beyt 2, nişanə “mey”

## Q Ə Z Ə L 145

**(1) Ey xədəngi – qəminə sineyi - əhbab hədəf,**
**Müntəzir xəncəri – müjganinə canlar səf – səf.**

**(2) Xaki – dərgahinə hər sübh sürər gün üzünü,**
**Qaliba ondan ona hasil olubdur bu şərəf.**

**(3) Haşə lilləh ki, bu divaneyi – şövqi – xətinə**
**Səbəbi – qeyd ola, zənciri – süturi – müshəf.**

**(4) Saldı dəryayə səba xəncəri – qəmzən vəhmin**
**Ki, çıxarmayə dəxi gövhəri – nasüftə sədəf.**

**(5) Ey könül, aləmə aldanma, sənə rəng verir,**
**Xakdır kim, onu gəh ləl qılır, gah xəzəf.**

**(6) Bəzmi – Cəmşid fəna bulmaq ilə bildim kim,**
**Dövr cövründən imiş, naleyi ney, noheyi dəf.**

**(7) Ey Füzuli, tələbi – rütbeyi – irfan eylə,**
**Cəhl ilə hasili – övqati – şərif etmə tələf.**

Beyt 1: **Ey xədəngi – qəminə sineyi - əhbab hədəf,**
**Müntəzir xəncəri – müjganinə canlar səf – səf.**

Sözlük: Xədəng – ox ucu = düz hədəfə dəyən ox; Əhbab – həbiblər = dostlar; Müjgan – kipriklər

**Nişanə** 1. “Xədəngi-qəm”: Aşiqin yaralı qəlbini fəryad ünvanlı özəl münacata vadar edən qəmdən nişanədir.

**Nişanə** 2. “Xədəngə hədəf olmuş sinə”: Sinə çatı, yaxud bağrın dəlinməyi şühud nailiyyətini, yaxud mənəvi görüşü mümkün edən səbəbdən ibarətdir. Elə buna görə də Mövləvi ilahi görüşü ürəkdə açılmış qapıya bərabər tutub buyurmuşdur:

هر که را از سینه باشد فتح باب      اوز هر شهری ببیند آفتاب[1]

**Nişanə** 3. “Əhbab”: “Nari-məhəbbət”[2] atəşində dünya və axirət istəklərini yandırmış aşiqlərdən ibarətdir.

**Nişanə** 4. “Xəncəri-müjgan”: Bu beytdə şühud aləminə pəncərə açmaq məqsədi ilə ürəyi yaran ilahi qəmzə satmaqdan nişanədir.

**Anlam: Şühud nailiyyətinə müqəddimə törədən ən gözəl təmtəraqlı səbəblər xədəngi-qəm və xəncəri-müjgandan ibarətdir.**

Beyt 2: **Xaki – dərgahinə hər sübh sürər gün üzünü,**
**Qaliba ondan ona hasil olubdur bu şərəf.**

Sözlük: Xak – torpaq; Dərgah – ərəfə = qapı = qəsr

**Nişanə** 1. “Xaki-dərgah”: Vəhdət ərəfəsində fanilikdən nişanədir.

**Anlam: Günəş öz yüksəkliyini vəhdət ərəfəsində fani olmuş aşiqlərdən borc almış, bunun üçün də hər sübh nurunu həmin ərəfəyə yaymaqla öz təşəkkürünü bildirmək və bəhrəsini davam etdirmək istəyir.**

Beyt 3: **Haşə lilləh ki, bu divaneyi – şövqi – xətinə**
**Səbəbi – qeyd ola, zənciri – süturi – müshəf.**

Sözlük: “Haşa lilləh” =Allah göstərməsin = məbada; Sütur = sətirlər; Müshəf – kitab = Quran = asimani kitab

**Nişanə** 1: “Divanə”: Həyəcan məğlubiyyətində qərarını əldən vermiş aşiqdən ibarətdir.

---

[1] مولوی، مثنوی، دفتر 1، بیت 1435

[2] Qəzəl 9, beyt 3, nişanə 1

**Qeyd:** *Fəlsəfə iki çeşid divanəliyi təsdiq etmişdir:*

*A: "Ruhi xəstəlik, yaxud məcazi divanəlik"(əql divanəliyi).*

*B: "Mənəvi divanəlik, yaxud ilahi cazibələr önündə çevrilmiş əhval-ruhiyyə"[1](eşq divanəliyi)*

**Nişanə** 2. "Xətt": Bu beytdə mütəal canan camalından parlayan nurların mənəvi həyatı bitirən mərtəbələrindən nişanədir.

**Nişanə** 3. "Süturi-müshəf": Müshəf məhbub camalına, sütur isə onun ətrafını almış xəttə[2] ki, həm hadi[3] olur, həm də, əksinə, hayil olur, işarə edir.[4]

**Anlam: A: Həyəcan məğlubiyyətində qərarını əldən vermiş aşiq dini hökmlər ilə (süturi müshəf) mühakimə edilməz. B: İlahi parlamalar məğlubiyyətində qərardan getmiş aşiq dini hökmlərin, yaxud şərif ayələrin batini ilə məşğul olmuşdur... Bu anlam məcazi eşq baxımında münasib nəzərə gəlir, yəni ki, bəşəri gözəl camalın ətrafını almış təzə bitmiş nazik tük onun hüsnünə, həm də aşiqin ətəşinə nöqsan yetirməz, çünki:**

1: O tük nazik və gözəldir;

2: Canan camalına ən yaxındır (qürb);

3: Həqiqi aşiq, hüsnün zahirindən batininə daxil olmuşdur;

4: Quranın ədəbi incəlikləri ən gözəldir (süturi müshəf), ancaq o gözəllikləri qənaətbəxş bilmək və şərif ayələrin batinindən, yaxud həqiqi gözəlliyindən xəbərsiz qalmaq mərifət naqisliyini sübut edərkən daha ağır qəflət və böyük xəsarətdən bir nişanə olur, bunun üçün də şərif ayələrin ədəbi gözəlliyinə, yaxud zahiri hüsnünə məşğul olmaq (xət) hayillikdir (maneə olmaq), lakin zahiri hüsnlər vasitəsilə Quranın batininə varıb həqiqi hüsndən feyziyab olmaq hadilik nişanəsidir.

Nəticə: A: Həqiqi aşiq zahiri gözəlliklərə (süturi müshəf, xət) razılıq verməklə özünü batini hüsndən xəbərsiz və məhrum etməz.

B: Həqiqi aşiq zahiri maneələrə (süturi müshəf, xət) məğlub olmaz.

Beyt 4: **Saldı dəryayə səba xəncəri – qəmzən vəhmin**
**Ki, çıxarmayə dəxi gövhəri – nasüftə sədəf.**

---

[1] Qəzəl 48, beyt 1
[2] Qəzəl 48, beyt 1
[3] Hayil – hicab – mane olmaq
[4] Qəzəl 4, beyt 3, nişanə 1, qeyd 1 və 2

Sözlük: Gövhəri – nasüftə = dəlinməmiş gövhər

**Nişanə** 1: "Səba": Həzrəti Cəbrayıldan, yaxud digər səmavi və ilahi vasitələrdən nişanədir.

**Nişanə** 2: "Xəncəri-qəmzə": Bu beytdə dünyəviliyi və mənəm-mənəmliyi məhv edən ilahi feyzlərdən nişanədir.

**Nişanə** 3: "Gövhəri – nasüftə": Dünyəvi hüsnələr, yaxud etibarsız kamaldan nişanədir.

**Anlam: Səba vasitəsilə zahirə çıxmış həqiqi hüsnlər, məcazi hüsnlərə məğrur olmuş müddəini:**

**A: Qəflət yuxusundan ayıltmaq istəyir.**

**B: Tənbeh etmək istəyir.**

Beyt 5: **Ey könül, aləmə aldanma, sənə rəng verir,**
**Xakdır kim, onu gəh ləl qılır, gah xəzəf.**

Sözlük: Xak = torpaq , xəzəf = saxsı

**Anlam: A: Yer kürəsində mövcud olmuş nemətlərin heç biri həqiqi cəlalardan bəhrələnməyiblər, çünki onların maddi yaranış və qayıdış mərkəzi qara torpaqdan başqa bir şey deyildir. Beləliklə, mal-dövlətə, tac-taxta, ləl-cəvahirə və digər beləcə məcazi imtiyazlara ürək bağlayıb məğrur olmaq özünü aldatmaqdan başqa bir iş ola bilməz. Şərif ayədə bu aldanma xətərindən qorunmaq məqsədilə buyurulmuş ki: "و ماالحياةُ الدّنيا الّا متاعُ العرور"[1] ("..., və əslində dünya həyatı aldadıcı var-dövlətdən başqa bir şey deyildir"). Həmçinin, digər şərif ayədə məcazi mərtəbələrin, nəhayət, dünyəvi həyatın, dəyərsiz – davamsız olduğunu bildirmək məqsədilə buyurur:**
**"انما الحياه الدنيا لعب و لهو و ان تومنو و تتقو يوتكم اجوركم ولا يسئلكم اموالكم"[2], ("Şübhəsiz ki, dünya həyatı oyun – oyuncaqdır. Əgər iman gətirəsiniz və pəhrizkarlıq edəsiniz [Allaha] sizin əcrlərinizi verəcəkdir. Və O, bütün mallarınızı sizdən istəməz").**

---

[1] Quran, Ali İmran surəsi, 185-ci ayədən bir qismət
[2] Quran, Məhəmməd surəsi, 36- ci ayə

Beyt 6: **Bəzmi – Cəmşid fəna bulmaq ilə bildim kim,**
**Dövr cövründən imiş, naleyi-ney, noheyi-dəf.**

Sözlük: Bəzm – ziyafət məclisi = əncümən = xeymə; Cəmşid – Cəmşid, yaxud İran milli hekayətlərində Pişdadi ünvanlı əfsanəvi şahlardan biri

**Nişanə** 1. “Cəmşid”: Cəmşid, bu beytdə dünyəvi etibar və iqtidardan nişanədir.[1]

**Qeyd** 1: *Bütün yaranmışlar, hətta ney, dəf, dağ və daş kimi cansız mövcudlar, dünyəvi varlığın etibarsız olduğunu zəban halilə təlqin edirlər, ancaq onların təlqinini düşünmək yalnız ibrət götürmüş insanlara mümkündür.*

**Qeyd** 2: *“Can mavi göyü” bütün cansız – həyatsız fenomenlərin canlı olduqları barədə sübutlar göstərməklə[2] onların insan kimi zikr deməklərini təlqin edərək ibrət verici nəsihətlərinə işarə edir.*

**Nişanə** 2. “Dövr covru”: Dünya həyatının aldadıcı olduğunu (hicab olduğunu) yaxud 5-ci beyti təkrar edən nişanədir.

**Nişanə** 3. “Naleyi-ney”: Bu beytdə namütənahi əslə yönəldən münacatdan ibarətdir.

**Nişanə** 4. “Noheyi-dəf”: Aşiqi özündən şikayət etməyə vadar edən istiarədən ibarətdir.

**Qeyd:** *Hər bir cansız yaranmış da bir xidmətşi kimi insanın qulluğunda olmalıdır.*

**Anlam: Ney və dəf də arif insanlar kimi dünya həyatının aldadıcı olduğundan şikayət etməklə şairlər sultanı Xaqaninin:**

هان ای دل عبرت بین از دیده نظر کن هان
ایوان مداین را ، آئینه ی عبرت دان

mətləilə başlanmış qəsidəsini təfsir edirlər.

Beyt 7: **Ey Füzuli, tələbi – rütbeyi – irfan eylə,**
**Cəhl ilə hasili – övqati – şərif etmə tələf.**

**Nişanə** 1. “İrfan”: İrfan bu beytdə dəf, ney və digər əşyalar həqiqətini, yaxud onlarda əks etdirilmiş ilahi sirrləri, ya da onların xüsusi dilini – danışığını kəşf və şühud ilə dərk etməkdən ibarətdir.

[1] Qəzəl 45, beyt 4
[2] Qəzəl 4, beyt 1, haşiyə, qeyd 2

**Nişanə** 2. “Cəhl”: Şəxsi fikri əşyaların həqiqətinə çatdıran səbəb bilməkdən nişanədir.

**Nişanə** 3: “Ovqat”: Ürəyə daxil olan sözə söhbətə sığmaz mənəvi sirlərə və ya qeybi hədiyyələrə, yaxud aşiqi keçmişdən və gələcəkdən xəbərsiz və qaib edən cazibələrə “ovqat” və “əhval” demişlər[1].

**Anlam: Ey Füzuli dünyəvi imtiyazlar (5 - ci beyt (ləl) məşğulluğunda “ovqat” ünvanlı mənəvi sirlərdən qafil olma.**

---

[1] Qəzəl 1, beyt 7, haşiyə “hal”

## Q Ə Z Ə L 146

(1) Möhnəti eşq ey dil, asandır deyib, çox urma laf,
Eşq bir yükdür ki, xəm olmuş onun altında Qaf.

(2) Olma qafil dürdkeşlər söhbətindən, ey könül,
Gər dilərsən edəsən ayineyi – idrakı saf.

(3) Sübhdəm zülfün dağıt, ya şam ərzi – ariz et,
Qoyma sübhü şam arasında təriqi – ixtilaf.

(4) Rəşki – rüxsarın dili – xurşidə salmış iztirab,
Qeyrəti – qəddin mizaci – şəm`ə vermiş inhiraf.

(5) Xaki – kuyin Kə`bəyə nisbət qılan bilməzmi kim,
Bunda hərdəm, onda bir növbət olur vacib təvaf.

(6) Vəhmim ondandır ki, mümkün olmaya qəmdən nicat,
Fərric-il lahümmə həmmi, nəccini mimma nəxaf.

(7) Ey Füzuli, zahid ər də`vayi - əql eylər, nə sud,
Nəfyi – zövqi – eşqdir cəhlinə eyni – etiraf.

Beyt 1: **Möhnəti eşq ey dil, asandır deyib, çox urma laf,**
**Eşq bir yükdür ki, xəm olmuş onun altında Qaf.**

Sözlük: Xəm – əyri = qövs; Qaf – Quranda adı çəkilmiş əfsanəvi dağ = Quran icmalçılarının zənnincə aləmin ətrafını almış Qaf dağı yaşıl zəbərcəddən yarandığına görə səmanın yaşıllığına bais olmuş, keçmiş zamanlarda Qaf dağını "Əlborz" adlı günəşin doğma – batma məbdəyi bilmişlər və bəzi araşdırıcılar Qafqaz dağlarına Qaf demişlər[1].

**Nişanə** 1. "Möhnəti-eşq": Məhəbbətdən dəm vuran aşiqin qəlbini – canını sınaqlara çəkməklə onun naqisliyini, yaxud kamilliyini üzə çıxarıb aydınlaşdıran bəlalardan nişanədir.

**Nişanə** 2. "Urma laf": Laf urmaq, özünü ixtiyar – iqtidar sahibi bilməkdir. Bunu nəzərə alsaq ki, aşiq məşuq önündə ixtiyarsız və iradəsiz qul kimidir (məmlük), və bütün varlığını onun eşqində fəna edibdir, məlum olar ki dəm urmaq, yaxud müddəilik eşq ilə biganə olmaq əlamətidir.

**Nişanə** 3. "Eşq": Həqiqət ümmanına dalmaqdan əlamətdir[2].

**Nişanə** 4. "Qaf": "Aləm ətrafını almış Qaf dağı, (övliya ünvanlı) ilahi dostlar qəlbinə dayirə vurmuş həqiqi Qafdan bir örnəkdir. Beləliklə, maddi dünyada Qaf dağından sovuşmağın mümkünsüz olduğu kimi, qəlb aləmində, yaxud sinə səhrasında da, ürək sifətlərindən, yaxud sinə vilayətindən bir addım xaric olmaq istəyən şəxsi də qeybi xitab edənlər" hara gedirsiz? Biz səninlə varıq deyə" saxlayarlar[3].

**Anlam: Ey müddəi, aşiqlik yaxud adı, abrı, əqli, fikri, malı və canı fəda etmək asan deyildir.**

Beyt 2: **Olma qafil dürdkeşlər söhbətindən, ey könül,**
**Gər dilərsən edəsən ayineyi – idrakı saf.**

Sözlük: Dürd = yağdan, yaxud şərabdan, camın dibinə çökmüş qara maddə = xılt; Dürdkeş – şərabxor = piyaləni dibinə qədər başına çəkən

**Nişanə** 1. "Dürdkeş": İlahi məhəbbət qələbəsində şəxsi möhnətini yaddan çıxarmış aşiq.

---

[1] دکتر محمد معین، فرهنگ معین، اعلام
[2] Qəzəl 1, beyt 1, nişanə 2
[3] دکتر محمد معین، فرهنگ معین، اعلام

**Nişanə** 2. “Söhbət”: A: Bütün kainatın mütəal məhbub ilə nisbətini alqışlamaq məqsədilə onlara məhəbbət və hörmət göstərməkdən ibarətdir[1].

B: Kamal məqamına çatdıran ilahi seyri tamamlamaq üçün batini seyr ilə paralel zahiri seyr də gərəklidir, bu istiqamətdə bir çox mürşüdlər söhbət ünvanlı xarici seyri daxili seyrdən önəmli bilmişlər. Həzrət Mövləvi elmini-mərifətini, yaxud batini inkişaflarını ustadı Şəmsin gözünə çəkməyir, bəlkə O, zahiri seyrini maraqlı bilərkən belə deyir:

ای پادشاه عاشقان چون من موافق دیده ای؟

بازندگانت زنده ام با مردگانت مرده ام[2]

C: Söhbət, həzrəti mürşüd kimi alimlər hüzurunu dərk etməkdən ibarətdir.

**Qeyd:** *Söhbət mərhələsini dərk etməyən salikin mənəvi məqsədə nail olmağı mümkünsüzdür.*

**Nişanə** 3. “Ayinə”: İlahi parlamaları zahir etdirən batindən nişanədir.

**Nişanə** 4. “İdrak”: Bu beytdə mütəal məhbubu tanıtdıran “bəsit idrak” və “mürəkkəb idrak”dan ibarətdir:

A: Bəsit idrak mütəal məbudu dərk etmək qüvvəsidir, ancaq aşiq o qüvvənin necəliyindən və mərkəzindən xəbərsizdir.

B: Mürəkkəb idrak, mütəal məbudu dərk etmək qüvvəsidir, ancaq aşiq həm o qüvvənin özündə, həm də ilahidə olduğundan xəbərdardır[3].

**Nişanə** 5. “Saf”: Ümumi, şəxsi və zehni qatqılardan paklayan mərtəbədən nişanədir[4].

**Anlam: Allah-taalanı dərk etməyin ilkin şərti içərini saflaşdırmaqdan ibarətdir. Ancaq bu nailiyyət söhbətsiz mümkün deyil.**

Beyt 3: **Sübhdəm zülfün dağıt, ya şam ərzi – ariz et,**
**Qoyma sübhü şam arasında təriqi – ixtilaf.**

Sözlük: Sübhdəm – səhərçağı; Ariz – sima = camal; Təriq = yol

**Nişanə** 1. “Zülf”: A: Zülf, əsasən, canan camalının ətrafında örpək olduğuna görə hicab nişanəsidir.

B: Camal ətrafında örpək olmuş zülf həmin camala ən yaxın

[1] Qəzəl 40, beyt 5, qeyd
[2] Doktor Nurbəxş, Sufi kist, səh.11
[3] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی
[4] Qəzəl 142, beyt 1, qeydlər

olduğuna görə “qürb” və “vüsal” əlamətidir[1].

C: Qara zərrələr batinində parlaq nur kəşfinə çalışqanlıq edən alim və filosofların nəzəriyyələrinə [2] əsaslanaraq, zülf işıqlıqdan yaxud sübhdən də nişanədir.

Nişanə 2. “Ərzi-ariz”: İlahi camaldan parlayan hicabsız nurdan ibarətdir.

**Qeyd:** *Şiddətli nur, göz qamaşdıran yaxud göz çıxaran olduğuna görə, ərzi-ariz qaranlıqdan və ya sübhü şama çevirməkdən də nişanədir.*

**Anlam: A: Beyt dünyəvi həyat möhlətində varı-dövlətə, yaxud yoxsulluğa və bədbəxtliyə, hətta mənəvi qəbzlərə və bəstlərə davamsız işarə etməklə şərif ayə buyurduğu kimi bildirir ki:**

**“يولج الليل فى النهار و يولج النهار فى اليل و هو عليم بذات الصدور[3]” (“Gecəni gündüzə və gündüzü gecəyə qatır. O, ürəklərdə olanı dəqiq biləndir”).**

**B: Kəsrət ilə vəhdətin ixtilafsız olduğunu, yaxud vahid həqiqətin, ya da yeganə məhbubun eyni zamanda peyda və pünhan olduğunu təlqin edir[4].**

**C: Hicran vəziyyətində vüsala çatmış və vüsal arxasındakı hicrandan vəhşət etmiş aşiqlər halını, yaxud hicran ilə vüsalın vahidliyini təlqin edir[5].**

**D: “Riza” mərtəbəsinə nail olmaq vəziyyətini vəsf edir.**

**Qeyd** 1: *Riza məqamı bəlalardan ləzzət almaq mərtəbəsindən ibarətdir.*

**Qeyd** 2: *Riza öz razılığını unudub canan razılığını alqışlamaq mərtəbəsindən ibarətdir.*

**Qeyd** 3: *Riza batini vücudun məşəqqətli, yaxud ləzzətli möveiyyətdə vahid halda qalmasından ibarətdir.*

**Qeyd** 4: *İslamın ulu peyğəmbəri gülümsər halda asimana baxıb buyurdu: İlahi hökmdən və asimanı qəzadan təəccüb edirəm ki imanlı bəndə üçün həm nazil olunmuş əzab, həm də nazil olunmuş nemət xeyrlidir[6].*

---

[1] Qəzəl 12, beyt 2, nişanə 1
[2] Verniger, Paydya, səh.994
[3] Quran, Hədid surəsi 6 – cı ayə
[4] Qəzəl 138, beyt 4, qeyd 1
[5] Qəzəl 24, beyt 6, qeyd 3
[6] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

Beyt 4: **Rəşki – rüxsarın dili – xurşidə salmış iztirab,**
**Qeyrəti – qəddin mizaci – şəm`ə vermiş inhiraf.**

Sözlük: Rəşk – qibtə = qeyrət = qələbə; Rüxsar – surət = sima = camal; Xurşid – günəş

**Nişanə** 1. "Rəşk": Daxili vücud məğlubiyyətindən nişanədir.

**Nişanə** 2. "Rüxsar": İlahi hüsnlər törənişindən nişanədir.

**Nişanə** 3. "Xurşid": Bu beytdə dünyəvi ziyalar mətləindən nişanədir.

**Nişanə** 4. "Qeyrət": Bu beytdə şərif ayə " ليس كمثله شيئ و هو السميع البصير"[1] ("Onun bənzəri olan heç bir şey yoxdur, və O, eşidəndir, görəndir"), buyurduğu mərtəbəni, yaxud "istiğna" və "səmədiyyət"[2] cilvəsini təkid edən nişanədir.

**Nişanə** 5. "Qədd": Maddə ilə məna arasındakı ilahilik uzantısından ibarətdir.

**Nişanə** 6. "Şəm`": Bu beytdə məcazi hüsnlər uzantısından nişanədir.

**Anlam: Mənəvi cəlalar önündə dünyəvi hüsnlər təmamilə məğlubdurlar.**

Beyt 5: **Xaki – kuyin Kə`bəyə nisbət qılan bilməzmi kim,**
**Bunda hərdəm, onda bir növbət olur vacib təvaf.**

Sözlük: Xak – torpaq; Kə`bə – Allah evi = dörd guşəli yer; Təvaf – bir şeyin dövrəsinə dolanmaq = Kə`bənin dövrəsinə xüsusi tərz ilə dolanmaq.

**Nişanə** 1. "Xaki-kuy": A: İrfan mədəniyyətində bütün etibarlar, dəyərlər və mənalar baş-ayaq olan kimi[3], xaki-kuy, yaxud canan ərəfəsinin torpağı da, xatir ünvanlı daxili vücudu, tarlandırmaq əvəzinə[4] duruldar və cəlalandırar.

B: Xaki-kuy, bəndəlik məqamında səcdəyə düşməkdən işarədir.

**Anlam: A: Beyt Allah-taalanın öz hüzuruna müraciət etdirən "müşahidə qibləsi"ünvanlı batini Kə`bəni, yaxud bəndəlik**

---

[1] Quran , Şura surəsi, 11- ci ayədən bir qismət
[2] Qəzəl 34, beyt 7
[3] Qəzəl 25, beyt 5
[4] Qəzəl 34, beyt 3

**məqamını müvəqqəti inkişaflara nail edən zahiri Kə`bə ziyarətindən üstün təlqin edir[1].**

**B: Maddi dünyanın ortasında yerləşmiş müəyyən Kə`bəni, yaxud ümumi qibləni ziyarət etmək yalnız bir növbət vacibdir, lakin ərş ünvanlı əmr mərkəzində yerləşmiş əlçatmaz xüsusi Kə`bənin ələsti ürəklərdə, yaxud bəndəlik məqamında əks etdirdiyi qibləni ziyarət etməyi (aşiqlər üçün) hər gün, yaxud hər ləhzə vacibdir.**

**Qeyd** 1: *Mövləvi, islam peyğəmbəri buyurduğu kimi[2] əsas etibarı ilə, ələsti ürəyi mütəal məhbubun özəl Kə`bəsi bilməklə, onun hər dəm ziyarət edilmək zərurətini (təvaf) bildirmişdir:*

گفت پیغمبر که حق فرموده است      من نگنجم هیچ، در بالا و پست
در زمین و آسیمان و عرش نیز      من نگنجم این یقین دان ای عزیز
در دل مومن بگنجم، ای عجب      گر مرا جویی در آن دل ها طلب

**Qeyd** 2: *Təvaf dayirəvi olduğuna görə, bəşərin "İnna lillah" ünvanlı qayıdış mərkəzini bildirir.*

Beyt 6: **Vəhmim ondandır ki, mümkün olmaya qəmdən nicat,**
**Fərric-il lahümmə həmmi, nəccini mimma nəxaf.**

Sözlük: İkinci misra – İlahi, mənə düyünə düşmüş işdən və vəhşət etdiyim şeydən nicat ver.

**Nişanə** 1. "Qəm": Bu beytdə qəbz sıxıntılarıyla paralel həsrət çətinliyindən nişanədir.

**Anlam: Beyt, arxasındakı bəst olmayan qəbz vəhşətini, yaxud istedadsızlıq xəsarətini təlqin edir.**

Beyt 7: **Ey Füzuli, zahid ər də`vayi - əql eylər, nə sud,**
**Nəfyi – zövqi – eşqdir cəhlinə eyni – etiraf.**

Sözlük: Ər – əgər; Sud – bəhrə = fayda = səmərə = nəf; Nəfy – rədd etmək = batil etmək = uzaq salmaq

**Nişanə** 1. "Zahid": A: Zahid, dünyəvi həyat hissəsində yalnız əql və məntiq hökmünü qəbul etmiş şəxsdən ibarətdir.

---

[1] Qəzəl 131, beyt 4
[2] مولوی، مثنوی، دفتر 1، بیت 2715، 2716، 2717

B: “Mütəzəhhid” ifadəsini zahid adı ilə təlqin edən nişanədir[1]. (riyakar zahid)

**Nişanə** 2: “Əql”: Əql bu beytdə nisbi həqiqətləri tanımaq vəsiləsi yox, bəlkə eşqə bağlı ilahi kamal, yaxud mənəvi mərtəbələr tanışlığına hidayət edən həqiqi əqldən ibarətdir[2].

**Anlam: Eşqi inkar etmək zahidin ağılsız olduğuna aydın sübutdur.**

---

[1] Qəzəl 9, beyt 2
[2] Qəzəl 64, beyt 3

## Q Ə Z Ə L 147

**(1) Olur rüxsarına gün, ləlinə gülbərgi – tər aşiq,**
**Sənə əskik degil, göydən yağar, yerdən bitər aşiq.**

**(2) Mənə məqsud tərki – eşq idi, vəh kim, meyi-hüsnün**
**Olub gün – gündən əfzun, qıldı gün – gündən bətər aşiq.**

**(3) Təmaşayi – cəmalından nəzər əhlini mən` etmə,**
**Nə sud ol xub yüzdən kim, ona qılmaz nəzər aşiq.**

**(4) Çəməndə paybusindən olubdur səbzələr xürrəm,**
**Haman bir səzbəcə olmağə aləmdə yetər, aşiq.**

**(5) Qılarsan bir cigər qan, hər yana baxdıqca, ey zalim,**
**Nə baxmaqdır bu, hər dəm qandan alsın bir cigər aşiq?**

**(6) Qılarsan əhli – eşqi, tutalım, kimsə əlin tutmaz,**
**Nə işdir bu, gərəkməzmi sənə, ey simbər, aşiq?**

**(7) Nə pərvanə dözər bir şöləyə, nə şəm' bir ahə,**
**Füzuli, sanma kim, bənzər sənə aləmdə hər aşiq.**

Beyt 1: **Olur rüxsarına gün,ləlinə gülbərgi – tər aşiq,**
**Sənə əskik degil, göydən yağar, yerdən bitər aşiq.**

Sözlük: Ruxsar – surət = sima; Gülbərgi-tər – təzə gül yarpağı

**Nişanə** 1. “Rüxsar”: Bütün kainatın varlığına səbəb ilahi camal cilvələrdir.

**Nişanə** 2. “Ləl”: Bu beytdə yoxu var edən ilahi özəl feyzdən nişanədir.

**Nişanə** 3. “Gün, gülbərgi-tər”: Dünyəvi hüsnlər və imtiyazlardan nişanədir.

**Anlam: Bütün kainatın varlığı ilahi eşqə bağlıdır. Həmin mənanı təlqin etmək məqsədilə aşiqə belə xitab etmişlər: “Ey miskin, sən güman etmisən ki eşq şərbətini nuş edən yalnız sən insansan, yaxud məhəbbət yolunda təkcə sən addım atıbsan? Belə güman etsən ki, bu iqtidar meydanında gözəl məbuda sitayiş etməyə sənin kimi bəndə yoxdur, daha qələt gümana düşmüşsən. Əgər cansız bütlərin batinindən qəhr pərdəsini kənar etsələr və bu qapı – bacadan, dam – divardan və ağaclardan, lallıq yüyənini açıb – atsalar, o qədər (aşiqanə) zikrlər dinləyərsən ki, qeyrət və xəcalətdən başını qınına çəkib aciz olmuş halda bütün kainatın aşiq olduğunu etiraf edərsən[1]”.**

**Qeyd:** *Bu anlam, aşiqi inkar etmiş zahidə saya gəlməz sübutlar göstərmək istəyir.*

Beyt 2: **Mənə məqsud tərki – eşq idi, vəh kim, meyi-hüsnün**
**Olub gün – gündən əfzun, qıldı gün – gündən bətər aşiq.**

Sözlük: Vəh – ba = əcəba; Əfzun – əlavə

**Nişanə** 1. “Tərki-eşq”: Hamı kimi zahidin də təbliğ etdiyi dünyaşünas əql və məntiq hökmünü qəbul etməkdən ibarətdir.

**Nişanə** 2. “Hüsn”: Yeganə məbudun kamal və camal gözəlliklərindən nişanədir.

**Nişanə** 3. “Hüsnün gün – gündən əfzun olmağı”: Mütəal məhbubun təcəlli ünvanlı mükaşifə, yaxud şühud nurunun hər ləhzədə yeniləşməyini təlqin edir[2].

---

[1] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی
[2] Qəzəl 42, beyt 1

**Nişanə** 4. “Gün – gündən betər aşiq olmaq”: Dünyəvi təcrübə çərçivəsinə sığmayan tanışlığın əlavə olduğunu, yaxud mərifət nailiyyətini təlqin edir.

**Anlam: Yeni mükaşifələr təzə tanışlıqlar nailiyyəti olmasaydı mən də əqlin məsləhət bildiyinə mayil olmalıydım.**

Beyt 3: **Təmaşayi – cəmalından nəzər əhlini mən` etmə,**
**Nə sud ol xub yüzdən kim, ona qılmaz nəzər aşiq.**

Sözlük: Mən` – mane olmaq; Sud – fayda = səmərə = bəhrə; Xub – gözəl = yaxşı = bəyənilmiş

**Nişanə** 1. “Təmaşayi-camal”: Bu beytdə ruhani əhval – ruhiyyə törənməsinə bais olmuş mənəvi müşahidəyə işarə edir.

**Nişanə** 2. “Nəzər əhli”: Bu beytdə mənəvi hüsnlər ilə tanış olmuş “bəsirət” əhlindən ibarətdir.

**Qeyd:** *Qüdsiyyət nurunda qəlbi cəlalandıran özəl qüvvəyə bəsirət demişlər*[1].

**Nişanə** 3. “İkinci misra”: İkinci misra, şəth məğlubiyyətində[2] mütəal məhbuba, yaxud mürşüdə xitab edən nişanədir.

**Nişanə** 4. “Üz”: “Vəch” ünvanlı ilahi surətə işarədir[3].

**Anlam: A: Camal tamaşasından məhrum qalmış bir insan, həyat nemətindən bəhrələnməlidir.**

B: Hicab arxasında gizli qalmış camal istifadədən əsirgəmişdır.

**Qeyd:** *Əsirgəmək aşiqin istedadı ilə əlaqədardır.*

Beyt 4: **Çəməndə paybusindən olubdur səbzələr xürrəm,**
**Haman bir səzbəcə olmağə aləmdə yetər, aşiq.**

Sözlük: Paybus – ayağını öpmək; Xürrəm – şad = xəndan

**Nişanə** 1. “Çəmən”: Bu beytdə maddi aləmdə qeyri-maddi rayihələr dərk etdirən vəziyyətdən nişanədir, ancaq misra mütləq kamala və ya vəhdət mərkəzi ilə əlaqədar cilvələrə də işarə vurur.

**Nişanə** 2. “Paybus”: Paybus bu beytdə öz məmlüklüyünü etiraf etməklə ülvi feyzlərdən bəhrələnmiş aşiqdən nişanədir.

---

[1] Doktor Qasim Qəni, Tarixi-təsəvvüf dər İslam, səh. 640
[2] Qəzəl 34, beyt 1
[3] Qəzəl 99, beyt 3

**Anlam: A: Ey öz qədəmləri ilə (hüzur) səbzələri sevindirən mürşüd, mənim də qəlbimi mənəvi təlimatınla səfa ehsanından bəhrələndir.**

**Qeyd:** *Səbzənin, gülün və bütün kainatın varlığı Məhəmməd (s) peyğəmbərin və digər ülvi məqamlı insanların hörmətinə bağlıdır.*

*B: Ey mehriban məbud ki, həzrət mürşüd hörmətinə bağları – bostanları səfalandırıbsan, mənim də möhtac qəlbimi bəst feyzi ilə bəhrələndir.*

**Qeyd:** *Beyt, xüsusilə ikinci misra, qeyri-hissi vəziyyəti hissə gətirmək istəyir.*

Beyt 5: **Qılarsan bir cigər qan, hər yana baxdıqca, ey zalim,**
**Nə baxmaqdır bu, hər dəm qandan alsın bir cigər aşiq?**

**Nişanə** 1. “Cigər qan etmək”: Qurban məqamına hazırlaşa bilməyən aşiqi tənbeh etməkdən ibarətdir.

**Nişanə** 2. “Zalim”: Zülm, ürək sıxma – boğmasından, yaxud qəbz mərhələsindən nişanədir.

**Qeyd:** Necə ki, elmi akademiyalar bir sıra ağır və müşkül təkliflər ilə öz tələbələrini sınamaq, nəhayət bişirib – yetirmək istəyir, eşq məktəbində onlarla paralel eşq tələbələrini, bəşəri səviyyədən ilahi mərtəbəyə yüksəltməyə sıxçalamaq və tərbiyə edib hazırlamaq istəyir, bu sıxıntılar yaxud bu qəbz, hal və kamal səmasına, ya da bəst məqamına yüksəlməyin şərti və açarıdır, ancaq bir çox yol baş verir ki, aşiq qorxu və vəhşət məğlubiyyətində, şəth şəraitində, cəfakar, zalim və digər beləcə xitablarla istedad və imkan təmənna etməyə məcbur olur[1]

**Nişanə** 3. “Baxmaq”: Bu beytdə aşiqi bəhrələndiyi feyzdən xəbərsiz saxlayan xüsusi nur qələbəsindən, yaxud tənbeh feyzindən nişanədir.

**Anlam: İstedadsız aşiqin tərbiyəvi tənbehindən xilas olması hər ləhzə yeni bir can fəda etməklə mümkündür.**

**Qeyd:** *Bu anlam aşiqi hətta ülvi mərtəbələr nəailiyyətində qul, məmlük və möhtac kimi təqdim edir. O (aşiq), Mövləvi demişkən, heç bir şeyə hətta öz fikrinə - xəyalına da malik deyil, elə buna görə də hər işdə onun “inşallah” deməyi vacibdir[2].*

Beyt 6: **Qılarsan əhli – eşqi, tutalım, kimsə əlin tutmaz,**

---

[1] Qəzəl 7, beyt 6, nişanə 2, qeydlər
[2] Mövləvi, “fih ma fih”, səh. 118

**Nə işdir bu, gərəkməzmi sənə, ey simbər, aşiq?**

Sözlük: Simbər – gənc = ağ bədən

**Anlam: A: Beyt məcazi yöndəm vasitəsilə mənəvi məfhumu hissiləşdirmək anlamındadır.**

**B: Qəbz və qəhr məğlubiyyətində təngləşmiş aşiqin şikayətini dəlilləşdirmək anlamındadır.**

**Qeyd** 1: *Aşiq hər ləhzə yeni bir əhval – ruhiyyə məğlubiyyətində olduğundan şikayəti şükr ilə mürəkkəbləşdirir. Demək özü özünü mühakimə edir. Buna görə də o başqa mühakimədən azad olur. Çünki bir şəxsi iki məhkəmədə mühakimə etməmişlər.*

**Qeyd** 2: *Vahid qəzəlin təzadlı beytlərini, qəzəl yazan şairin aşiqanə əhval- ruhiyyəsi dəlilləşdirə bilir. Buna görə də qəzəlin hər beyti müstəqil məna verir.*

Beyt 7: **Nə pərvanə dözər bir şöləyə, nə şəm bir ahə,**
**Füzuli, sanma kim, bənzər sənə aləmdə hər aşiq.**

**Nişanə** 1. “Pərvanə”: Bu beytdə fədakar məcazi aşiqdən nişanədir.

**Nişanə** 2. “Şəm”: Bu beytdə dünyəvi əzablar atəşində taqət gətirən qəlbdən nişanədir.

**Anlam: Pərvanə, ya şəm təkcə bir şölə ilə öz varlığını tərk edir, lakin mən hər şölədə yanmaqla, yeni bir həyat əxz edirəm.**

**Qeyd:** *Beyt mənəvi eşqin məcazi eşqdən daha üstün və müqayisə edilməz olduğunu təlqin edir.*

## Q Ə Z Ə L 148

(1) Tabi – xurşid məhi – ruyinə vermiş rövnəq,
Ta ki, ziba xət üçün ola bu təzhibi – vərəq.

(2) Əksi – qəddini görən daireyi – ayinədə,
Der məhi – bədrdir əngüşti – nübüvvətdən şəq.

(3) Sənə gülşəndə nisar etmək üçün hər nərgis
Götürübdür başa altun dolu bir sim təbəq.

(4) Hər xətin müshəfi – hüsni – həqə bir ayətdir,
Məktəbi – eşqdə hər dil ona bir tifli – səbəq.

(5) Sənə aşiqliyimizdir bizə bürhani – cünun,
Hüsnə əql əhli müqəyyəd ola bilməz mütləq.

(6) Rəsmdir aşiqə gəlmək qaşı yaylardan ox,
Eşq peyda olalı böylə qurulmuş bu nəsəq.

(7) Şahdır hüsn büsatında bu gün ol gülrux,
Ey Füzuli, məni – avarə sürülmüş beydəq.

Beyt 1: **Tabi – xurşid məhi – ruyinə vermiş rövnəq,**
**Ta ki, ziba xət üçün ola bu təzhibi – vərəq.**

Sözlük: Tab – nur = parlamaq = hərarət; Xurşid – günəş; Məh ruy – ayüzlü; Xət – üzün təzə bitmiş yumşaq tükü; Təzhib = qızıllatmaq = qızıllama = qızıla tutma

**Nişanə** 1. "Tabi-xurşid": Bu beytdə mütəal məbudun əzəmət və iqtidar cilvələrindən nişanədir.

**Nişanə** 2. "Məh ruy": Qara maddə ağ nurunu təzahür etdirən canan camalından nişanədir.

**Nişanə** 3. "Xət": Bu beytdə kəsrət güzgüsündə əks etdirilmiş vəhdət nurundan nişanədir.

**Anlam: A: Hicabsız təcəlli parlamaları kəsrət güzgüsündə əks etdirilmiş vəhdət nurunun ətrafını almaqla şühud məqamını daha maraqlandırmışdır.**

**B: Bəşəri gözəl surət ilahi hüsnlər əks etdirməklə daha da gözəlləşmişdir.**

**C: Aybəniz camal günəş işığında daha gözəllənmişdir (məcazi məna).**

Beyt 2: **Əksi – qəddini görən daireyi – ayinədə,**
**Der məhi – bədrdir əngüşti – nübüvvətdən şəq.**

Sözlük: Məhi-bədr – bədirlənmiş ay; Əngüşt – barmaq; Nübüvvət – peyğəmbərlik = qeybdən xəbər vermək; Şəq – iki tikə olmaq = paralanmış = şaqqalanmış

**Nişanə** 1. "Əksi-qəd": Bu beytdə maddə ilə məna arasındakı ilahilik uzantısından nişanədir.

**Nişanə** 2. "Dayireyi-ayinə": Bu beytdə ilahilik uzantısını əks etdirən "məzhər"[1] ünvanlı elmi, yaxud zehni, ya da xarici mərtəbədən, ya da səfa mərtəbəsinə nail olmuş kamil insanın qəlbindən ibarətdir[2].

**Anlam: İlahilik uzantısı ariflər qəlbini, ya digər məzhərləri elə yarmışdır ki, guya İslam Peyğəmbəri (s) mübarək barmağıyla ayı iki hissəyə bölmüşdür.**

---

[1] Mütəal məbudun adları, yaxud sifətləri zühur edən mərtəbəyə, ya təcəlli mövqeiyyətinə ya da mənaşünas insan canına məzhər demişlər

[2] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

**Qeyd** 1: *İki bölünmək, yaxud yarmaq məzhərlərin taqətsiz olduğuna eyham edir.*

**Qeyd** 2: *Şəq yaxud iki tikə olmaq şərif ayəyə işarə edir ki buyurur:* “اقتربت الساعه وانشق القمر[1] *(“Qiyamət yaxınlaşdı, ay parçalandı”).*

**Qeyd** 3: *Bu beyt ayın iki tikə olmağını islam peyğəmbərindən tələb etmiş kafirlərin tənqidinə yönəlmişdir.*

**Qeyd** 4: *Bu beyt ilahi cilvələrin möcüzə olmağına işarə etməklə irfani mərtəbələrin və ya aşiqanə əhvalın inkar edilməzliyini də sübut edir.*

Beyt 3: **Sənə gülşəndə nisar etmək üçün hər nərgis**
**Götürübdür başa altun dolu bir sim təbəq.**

Sözlük: Nisar – hədiyyə = gəlinin, yaxud digər şəxsin başına və ya ayağına səpilmiş cəvahir

**Nişanə** 1. “Gülşən”: Bu beytdə mənəvi rayihəli dünyəvi hüsnlərdən nişanədir.

**Nişanə** 2. “Nərgis”: Şühud mərtəbəsində, yaxud məcnunluq qələbələrində fərəhlənməkdən və batinin sərxoşluğundan nişanədir.

**Anlam: İkinci beytdə qeyd olunmuş əksi-qəddi alqışlamaq məqsədilə füllər və səbzələr fərəhlənib və bəzəniblər.**

**Qeyd** 1: *Dünyəvi hüsnlərin mənşəyi mənəvi hüsnlərdən ibarətdir.*

**Qeyd** 2: *“Baş” – kiçik ağacın, yaxud butanın intəhasından istiarədir.*

**Qeyd** 3: *“Gümüş tabaq”: Ağ yaraqdan istiarədir.*

**Qeyd** 4: *“Altun”: Nərgiz gülünün ortasındakı sarı halqadan istiarədir.*

**Qeyd** 5: *“Beyt “hüsni-tətil” ünvanlı ədəbi sənətdən bəhrələnmiş*[2]

Beyt 4: **Hər xətin müshəfi – hüsni – həqə bir ayətdir,**
**Məktəbi – eşqdə hər dil ona bir tifli – səbəq.**

Sözlük: Müshəf – kitab = asimani kitab = Quran; Səbəq – kitabın gündəlik təlim olan miqdarı = Quran

**Nişanə** 1. “Sənəm”: Bu beytdə mürşüd həzrətindən, yaxud kamal zirvəsinə hidayət edən digər vasitədən, ya da bəşəri surətdə ilahi hüsnlər

---

[1] Quran, Qəmər surəsi 1-ci ayə
[2] Qəzəl 133, beyt 5, “haşiyə”

əks etdirmiş gözəldən nişanədir.

**Nişanə** 2. “Müshəfi-hüsn”: “Batini Quran” ünvanlı ilahi hüsnlər mərkəzindən və “zahiri Quran” ünvanlı Allah kəlamından nişanədir.

**Qeyd** 1: *Əqli heyran edən bənzərsiz ədəbi incəliklər Quranın zahiri hüsnündən ibarətdir*

**Qeyd** 2: *İslam peğyəmbərinin müqəddəs qəlbinə vəhy olunmuş dərin və kamil mənalar, yaxud yeddi bətnli məna Quranın batini hüsnündən ibarətdir.*

**Qeyd** 3: *Quranın yeddi batinini təmamilə idrak etmək peyğəmbərdən və imamlardan başqalarına mümkünsüzdür.*

**Nişanə** 3. “Ayət”: Ayətlər, Allah təalanın zatına yönələn adları və sifətləridir, ancaq “vilayət”[1] məqamının əla dərəcəsinə çatmışlar, yaxud peyğəmbərlər səfinə qoşulmuşlar, ayətlər ilə yox, bəlkə də zatın özü vasitəsilə özünə yönəlmişlər[2].

**Nişanə** 4. “Dil”: Bu beytdə əqlə sığmaz mənalarla tanış olmuş batini qüvvədən, yaxud bəşəri vücudun ilahi və həqiqi hissəsindən nişanədir.

**Nişanə** 5. “Tifl”: Aşiqin uşaq kimi saf qəlbli olduğuna işarə edir.

**Nişanə** 6. “Səbəq”: Aşiqin istedad miqdarından nişanədir.

**Anlam: Arif və aşiq isə məktəb uşağı kimi müəyyən istedadı qədər irfani təlimatdan da bəhrələnməlidir.**

**Qeyd:** *Bu anlam: A: Asimani mərtəbələrə yüksəlmiş ariflərin, mütəal məbudun “istiğna”*[3] *məktəbində aciz və möhtac uşaq kimi olduqlarını, yaxud məmlüklükllərini təkid edir.*

*B: İlahi cilvələrin saxlanılmasını, yaxud qəbz və qəhr cəfasını dəlilləşdirmək istəyir.*

Beyt 5: **Sənə aşiqliyimizdir, bizə bürhani – cünun,**
**Hüsnə əql əhli müqəyyəd ola bilməz mütləq.**

Sözlük: Cünun – məcnunluq = divanəlik

**Nişanə** 1. “Cünun”: Əql zirvəsindən üstün mərtəbəyə nail olmuş aşiqin son dərəcəyə çatmış mənəvi məstliyindən nişanədir.

**Nişanə** 2. “Hüsn”: Bu beytdə əqlə sığmaz kamallar cazibəsindən nişanədir.

---

[1] Vəlayət peyğəmbərliyə can kimi tanınmış bəlalar ləzzətindən və fanilik məqamından, yaxud kəsrət içində vəhdət gülşəni törədən vəziyyətdən ibarətdir.

[2] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

[3] Qəzəl 34, beyt 7

**Anlam: Mütəal məhbub camalına, yaxud mürşüd həzrətinə və ya ilahi hüsnlər əks etdirmiş bəşəri camala aşiq olmağımız əql səmasından üstün mərtəbələrə yüksəlməyimizin aydın dəlilidir.**

Beyt 6: **Rəsmdir aşiqə gəlmək qaşı yaylardan ox,**
**Eşq peyda olalı böylə qurulmuş bu nəsəq.**

Sözlük: Nəsəq – nizam = tərtib

**Nişanə** 1. "Qaşı yay": Dayirəvi seyr təhlükələrindən qorxmuş aşiqi yerə endirməklə dübarə tənbeh-tərbiyə edən ilahi lütfdən nişanədir.

**Nişanə** 2. "Ox": İlahi qəmzə satmaqlar önündə cismi unutmaq nişanəsidir.

**Anlam: Aşiqin qəlbini müxtəlif qəbzlər ilə nalə ünvanlı özəl münacata vadar etmək eşq aləminin təbii və dəyişməz nizamından ibarətdir.**

**Qeyd:** *İlahi sirlərdən xəbərdar olmaq münacat məşğulluğuna bağlıdır.*

Beyt 7: **Şahdır hüsn büsatında bu gün ol gülrux,**
**Ey Füzuli, məni – avarə sürülmüş beydəq.**

Sözlük: Bəst – fərş = dəstgah = xeymə; Gülrux – gül üzlü; Beydəq = bayraq

**Nişanə** 1. "Şah": Bu beytdə aşiqin qəlbini zəbt edən mütəal məhbubdan, yaxud həzrət mürşüddən, ya da digər mənəvi təlimatçıdan nişanədir.

**Nişanə** 2. "Gülrux": Ürək açan şühud nurunu ehsan etmiş Allah təaladan yaxud həzrət mürşüddən nişanədir.

**Nişanə** 3. "Avarə": Aşiqin fikrini – elmini bir quru ağac kimi karsız edən sərgərdanlıqdan ibarətdir.

**Nişanə** 4. "Sürülmüş beydəq": Müstəqillik və mənlik mərtəbəsindən aşağı düşmüş aşiqin miskinliyini, yaxud məğlub və məmlük olduğunu təlqin edən nişanədir.

**Qeyd:** *Bu beytdə şahmat oyununa aid ifadələr, həmçinin digər beytlərə aid ədəbi incəliklər izahı bu şərhin öhdəliyindən xaricdir.*

**Anlam: Aşiq bütün varlıqlara malik olan mütəal məbud bərabərində iradəsiz qul olduğunu (məmlüklük) etiraf edir.**

## Q Ə Z Ə L 149

**(1) Olmaz oldu görüb əhvalımı el xublara aşiq,**
**Eşq nəhyində bu rüsvalığı gör şər`ə müvafiq.**

**(2) Gəlir olsan, qılaram fərşi – rəhin pərdeyi – çeşmim,**
**Dəxi nəm var, əzizim, gözə qarşı sənə layiq?**

**(3) Gülüb açılmaq umulmaz dəhənindən, məgər oldur,**
**Güzv kim, ləyatəcəzza[1] der ona əhli – dəqayiq.**

**(4) Bağrımın parələrin gözlərin asmış müjələrdən,**
**Mərdümi – guşənişin, handanü handan bu əlayiq?**

**(5) Gecələr şəm` yanar, əşk tökər sübh gəlincə,**
**Can verir sübh gələn dəmdə, zəhi aşiqi – sadiq.**

**(6) Sibqət etmişdi cigər qanı, gözüm yaşına bir vəqt,**
**Eşq hökm etdi, yenə cari ola adəti – sabiq.**

**(7) Ey Füzuli, özünü guşənişin et xümi – mey tək,**
**Ola nagəh olasan kaşifi - əsrari – həqayiq.**

---

[1] Hissələrə ayrılmayan

Beyt 1: **Olmaz oldu görüb əhvalımı el xublara aşiq,**
**Eşq nəhyində bu rüsvalığı gör şər`ə müvafiq.**

Sözlük: Xub – yaxşı = qəşəng = gözəl; Nəhy – mane olmaq

**Nişanə** 1. "Əhval": Bu beytdə əql və məntiq çərçivəsinə sığmaz, hüzn və ya çövq mənşəli rəftardan nişanədir.

**Nişanə** 2. "Xublar": Bəşəri simada ilahi hüsnlər əks etdirmiş gözəllərdən ibarətdir.

**Nişanə** 3. "Rüsvalıq": Mənaşünaslığa nail olmaqla məcazi etibarları nifrətamiz bilməkdən, beləliklə dünyaşünasların sərki – danlağını qəbul etməkdən nişanədir.

**Anlam: Dünyəvi məntiqlər çərçivəsinə sığmaz əhvalat ilə rüsvay olduğum xəlqi əql və abır aləminə istiqamətləndirməklə, şəriət hökmünə yardımçılıq etdi. Çünki: A: Hədis:** من حكم به عقل حكم به شرع **("Əql hökm veridyi barədə şəriət də hökm vermiş") buyurmuşdur ("əql verdiyi hökmü şəriət təsdiq etmiş"dir).**

**B: Şəriət rəftarların zahirinə qarşı hökm vermişdir.**

**Qeyd:** *Yalnız qiyamət günü batinlər, yaxud niyyətlər barədə hökm veriləcəkdir.*

Beyt 2: **Gəlir olsan, qılaram fərşi – rəhin pərdeyi – çeşmim,**
**Dəxi nəm var, əzizim, gözə qarşı sənə layiq?**

Sözlük: Fərşi-rəhin – yola döşənmiş fərşin; Pərdə çeşmim – gözümün pərdəsi

**Nişanə** 1. "Gəlir olsan": Gəlir olmaq, şühud nurunun zuhur etməsindən nişanədir.

**Nişanə** 2. "Pərdeyi-çeşm": Bu beytdə maddi vücudu, yaxud bütün dünyanı gözdən salmaq nişanəsidir.

**Nişanə** 3. "Gözə qarşı": Gözə qarşı zahiri və qeyri həqiqi etibardan nişanədir.

**Anlam: Şühud nurunu alqışlamaq üçün etibarsız zahiri vücuddan başqa bir imkanım yoxdur.**

Beyt 3: **Gülüb açılmaq umulmaz dəhənindən, məgər oldur,**
**Güzv kim, ləyatəcəzza der ona əhli – dəqayiq.**

Sözlük: Dəhən – ağız; Layətəcəzza – təqsim olmaz = bölünməz; Dəqayiq – dəqiqələr = incə mətləblər = çətin işlər

**Nişanə** 1. "Gülüb - açılmaq": Gülüb açılmaq, qəlbi dirçəldən ilahi ilhamların əqlə və elmə sığmazlığından nişanədir.

**Nişanə** 2. "Dəhən": Bu beytdə yoxu var edən ilahi işarələrdən nişanədir.

**Nişanə** 3. "Layətəcəzza": A: Layətəcəzza, bölünməz zərrə, yaxud bölünməyən cüz olduğuna görə maddi vücudun təğyir etməz əslindən nişanədir.

B: Layətəcəzza təcrid məqamına hazırlaşmış qatsız- qatqısız vücuddan nişanədir.

**Qeyd:** *Layətəcəzza, yaxud bölünməz cüz sözü, müxtəlif fəlsəfi nəzəriyyəbazlıqlar və elmi bəhslər peyda olmasına bais olmuşdur, o cümlədən:*

*A: "Kant" bəsit cövhərin, yaxud təqsim olmaz zərrənin varlığı və yoxluğu barədə "nəqqadi əql" ünvanlı nəhəng bəhsdə geniş izahlar aparmış*[1].

*B: Yunan alimləri xüsusilə Zimgratis bölünməz cüzi yaxud zərrəni bütün maddi kainatın əsli və cövhəri bilməklə "əsaləti-zərrə" ünvanlı geniş üfüqli bəhslər etmişlər.*

*C: İslami alimlərin bir çoxu, o cümlədən Mühyəddin Məhdi İlahi Qomşeyi "Hikməti-ilahi" ünvanlı kitabında, seyid Məhəmməd Hüseyn Əllamə Təbatəbai "bidayətül hikmə" və "nəhayətül hikmə" kitablarında, doktor seyid Cəfər Səccadi "Fərhəng ulumi-fəlsəfi və kəlami" adlı kitabında* [2] *və hənna Əlfaxuri "Tarixi-fəlsəfə dər cəhani-islami" kitabında, "əsaləti-zərrə" nəzəriyyəsini rədd etmək məqsədilə sübutlar göstərib izahlar etmişlər.*

*D: Layb Nits, "Monadoloji" kitabında modern fizika ilə paralel bölünməz cüzün enerjiyə çevrilməsi barədə məlumat vermişdir.*

*E: Fizik layətəcəzza cüzü, digər cüzlərlə birləşən daha narın zərrər bilmişdir. Əqli elmlər, fərz və ya xəyal baxımıyla, yaxud kəsrli və qəti hesabla, nəhayət, heç bir imkanla bölünməz cüzü "cohəri fərd" adı ilə tədqiq etmişlər.*

*Ə: Əşyaların həqiqətini dəlil və sübutlarıyla tədqiq edərkən şəriət ilə tətbiq edən "mütəkəllim" ünvanlı alimlər layətəcəzza cüzini qəbul*

---

[1] Məhəmməd Əli Furuği, Seyre-hikmət dər Orupa, c.2, səh 260 və 261

[2] Fərhəngi-ülumi-fəlsəfi və kəlami, səh. 236

*etmişlər. Ancaq bəziləri onu rədd etmişlər, bəzilər isə onu, mücərrəd mövcudlar bəhsindən kənarda bilmişlər. Çünki mücərrədlər hissi işarəyə sığmaz məkansız mövcudlardırlar, əksinə cüz layətəcəzza imkan və işarəyə sığışa bilir*[1].

**Nişanə** 4. "Əhli-dəqayiq": A: Dəqiqələr ünvanlı incə elmi fəlsəfi və irfani mərtəbələrdən xəbərdar şəxslərdən nişanədir.

B: Əhli-dəqayiq mücərrəd mövcudlarla tanış olmuş aşiqlərdən ibarətdir[2].

**Anlam: Maddi, yaxud təğyir edici vücud, qeyri maddi yaxud zavalsız vücudun özünü həm də ilham – işarəsini (gülüb-açılmaq) dərk etməkdən acizdir.**

Beyt 4: **Bağrımın parələrin gözlərin asmış müjələrdən,**
**Mərdümi – guşənişin, handanü handan bu əlayiq?**

Sözlük: Müjə – kiprik; Guşəneşin – xəlvət etmiş = kənarda oturmuş; Əlayiq = əlaqələr = bağlantılar

**Nişanə** 1. "Bağrı-parələr": Aşiqin sıxıntılarda – sınaqlarda hazırladığı sərmayədən, yaxud onun tərbiyə tapmasından və qurban məqamına istedad göstərməsindən nişanədir.

**Nişanə** 2. "Müjələrdən asılmaq": İstedad göstərici sifətdən nişanədir.

**Nişanə** 3. "Mərdümi-guşəneşin": Guşəneşinlik bədən hislərini unutmaq vəziyyətindən nişanədir.

**Qeyd** 1: *Can hisslərini mənəvi məlumatdan məhrum edən maneələr, bədən hislərindən ibarətdirlər.*

**Qeyd** 2: *Mövlana Cəlaləddinin nəzərincə:*

*A: Dünyəvi inkişaflar bədən hissi ilə əlaqədar olduğu kimi mənəvi inkişaflar da can hissi ilə bağlıdır:*

حس دنیا نردبان این جهان      حس عقبا نردبان اسمان[3]

*B: Bədən hissini təbib sağaldan kimi can hissini də məşuq sağaldır:*

صحت این حس بجویید از طبیب      صحت آن حس بخواهید از حبیب[4]

*C: Bədən hissləri zülmətdən, lakin can hissləri ilahi parlamalardan qidalanırlar.*

---

[1] Əli Əkbər Dehxoda, Fərhəngi-Dehxoda
[2] Qəzəl 49, beyt 2, nişanə 2 və 3
[3] Mövləvi, Məsnəvi, dəftər 1, beyt 303
[4] Göstərilən divan, dəftər 1, beyt 304

حس ابدان قوت ظلمت می خورد      حس جان از افتابی می چرد[1]

*D: Heyvanlar da bədən hissinə malikdirlər, amma can hissi yalnız insanlara aiddir:*

راه حس راه خرانست ای سوار      ای خران را تو مزاحم هوشدار[2]

**Nişanə** 4. “Əlayiq”: İlahi hədəf nailiyyətindən saxlayan dünyəvi ilgilərdən, yaxud məcazi ürəyə yatan şeylərdən nişanədir.

**Qeyd:** *“Fərdlik” məqamına nail olmağın ilk şərti əlayiqi unutmaqdan ibarətdir[3].*

**Anlam: Özünü bağrı parələri ünvanlı sərmayə sahibi bilmək maliklik əlamətidir, malik isə məmlüklük feyzindən məhrumdur[4].**

Beyt 5: **Gecələr şəm` yanar, əşk tökər sübh gəlincə,**
**Can verir sübh gələn dəmdə, zəhi aşiqi – sadiq.**

Sözlük: Əşk – göz yaşı;  Zəhi = afərin = əhsən

**Anlam: Aşiq vüsal tələbilə yox, şühud nuruna qarşı ilk cilvədə (sübh) fəda olmalıdır.**

**Qeyd:** *Beyt məcazi nümunə göstərməklə:*

*A: Mənəvi eşqi dəlilləşdirmək və hissiləşdirmək istəyir.*

*B: Pak və düzgün eşqi, məcazi və dünyəvi səviyyədə də müqəddəs göstərir[5].*

*C: Təbii yöndəmlərin səssiz təbliğatını, yaxud maddi kainat güzgüsündə mənəvi sirlər cilvəsini təlqin edir.*

Beyt 6: **Sibqət etmişdi cigər qanı, gözüm yaşına bir vəqt,**
**Eşq hökm etdi, yenə cari ola adəti – sabiq.**

Sözlük: Sibqət – qabaqlamaq

**Nişanə** 1: “Cigər qanı”: Məcazi mahiyyəti, xüsusilə mənəm – mənəmliyi yuyub batil edən nişanədən ibarətdir.

**Nişanə** 2: “Göz yaşı”: Dünyəvi əlaqələri, ilgiləri və məcazi mənliyi silib atmaqdan ibarətdir.

---

[1] Göstərilən divan, dəftər 2, beyt 51
[2] Göstərilən divan, dəftər 2, beyt 48
[3] Qəzəl 64, beyt 5
[4] Qəzəl 1, beyt 6
[5] Qəzəl 12, beyt 1

**Anlam: Eşq hökm edərkən dünyəvi ilgiləri batil etmək məqsədilə çalışdığım günlər kimi fiziki mahiyyət batilliyinə himmət etməli oldum.**

Beyt 7: **Ey Füzuli, özünü guşənişin et xümi – mey tək,**
**Ola nagəh olasan kaşifi - əsrari – həqayiq.**

Sözlük: Guşənişin = bax beyt 4; Xümi-mey – şərab küpü; Əsrar – sirrlər; Həqayiq – həqiqətlər = zatilə əlaqədar olmuşlar.

**Nişanə** 1. "Guşənişin": bax beyt 4, nişanə 3

**Nişanə** 2. "Xümi-mey": Bu beytdə mənəvi qələbələr ilə dünyəviliyi unutmuş qəlbdən nişanədir.

**Nişanə** 3. "Kaşifi-əsrari-həqayiq": Bütün əşyaların zatı ilə tanış olmuş arifə "kaşifi-əsrari-həqayiq" demişlər.

**Qeyd:** *İlahi mərifət və müşahidə məqamına nail olmuş aşiq maddi kainat güzgüsündə əks etdirilmiş mənəvi cəlaları dərk etməklə "* الا له الخلق و الامر تبارک الله رب العالمین *" ("Bilin ki, yaratmaq da, əmr etmək (idarə etmək) də Ona məxsusdur, aləmlərin rəbbi olan nə qədər ucadır[1]") ayəsindən, yaxud "əmr" ünvanlı aləmdən xəbərdar olaraq "* اللهم ارنی الاشیاء کما هی[2]*" ("Ey mənim məbudum, əşyaların həqiqətini (zatını) mənə göstər") deyə hər bir maddi yaranmışın mənəvi hissəsini, yaxud zatı ilə əlaqədar sirrini kəşf etməyə çalışqanlıq edir. Elə bu əhval – ruhiyyədir ki arif olan bir şəxsi "kaşifi-əsrari-həqayiq" etməklə qeyri arifdən ayırır.*

**Anlam: Bəsirət əhli[3] kimi əşyaların həqiqətindən xəbərdar olmaq (həqiqi mərifət) guşəneşin olmağa, yaxud bədən hisslərini unutmağa bağlıdır.**

---

[1] Quran, Ərad surəsi, 54 cü ayə
[2] Əli Səadətpərvər, Cəmali-afitab, c.2, səh.124
[3] Qəzəl 147, beyt 3, nişanə 2

## Q Ə Z Ə L 150

**(1) Gəl, ey rahət sanan əsbabi-cəm`in, qılma nadanlıq,**
**Təriqi – fəqr tut kim, fəqr imiş aləmdə sultanlıq.**

**(2) Murad ər səltənətdən kami – dildir, nəfsə tabesən,**
**Nə hasil səltənət adilə qılmaq bəndəfərmanlıq.**

**(3) Pərişanlıqdan, ey xəlqi – cahan, siz cəm edin xatir**
**Ki, mən cəm eylədim hər qanda vardır bir pərişanlıq.**

**(4) Nə tale`dir bu kim, aləmdə ağaz etmədim bir iş**
**Kim, ol işdən sərəncam etmədim, hasil peşimanlıq.**

**(5) Mənə zülmi – sərih ol kafər eylər, kimsə mən` etməz,**
**Füzuli, küfr olurmu gər desəm yoxdur müsəlmanlıq?**

Beyt 1: **Gəl, ey rahət sanan əsbabi-cəm`in, qılma nadanlıq,**
**Təriqi – fəqr tut kim, fəqr imiş aləmdə sultanlıq.**

Sözlük: Əsbab – səbəblər = vasitələr; Təriq – yol = hal = məzhəb = irfan yolu; Fəqr – fağırlıq = yoxsulluq

**Nişanə** 1. "Rahət": Bu beytdə zehn və xəyalın asudəliyindən nişanədir.

**Nişanə** 2. "Əsbab": Bu beytdə bütün ürək istəyən zahiri imtiyazlara və etibarlara çatmaqdan nişanədir.

**Qeyd** 1: *Dünyəvi əsbab mənəvi hədəflərə ən xətərnak maneədir.*

**Qeyd** 2: *Məscid, namaz, oruc, ibadət və riyazət kimi dini və mənəvi vasitələrə və imtiyazlara arxalanmaq da tənbehə layiq əsbab və hicablar hesaba alınır, çünki irfan panteist baxımından bəşəri fikirdən baş vermiş şəri əməllərin-ibadətlərin qəbulluğu, yaxud həqiqi bəhrə verməyi, təkcə hakim məbudu həmin ibadət – itaətə bais bilib özünü - əməlini arada görməməklə mümkün olmalıdır*[1]*. Beləliklə öz namazını – ibadətini təsdiq etmiş bir şəxs, həqiqətən öz fikrini təsdiq etmişdir. Aydındır ki, belə bir təsdiq, ikiliyi təsdiq etmək (bir öz fikri – ibadəti bir də hakim məbud) yaxud vəhdət ilə müxalif olmaqdan nişanədir. Bunun üçün də mövlana Füzuli digər arif şairlər kimi dönə-dönə məscid, namaz, təqva və digər beləcə müqəddəs kəlmələrə toxunubdur.*

**Qeyd** 3: *Həzrət mürşüd, yaxud həzrət Cəbrail kimi vasitəyə arxalanmaqda da ikilik hesaba alınıb məzəmmət olunmuşdur.*

**Qeyd** 4: *Hər aşiq, yaxud hər salik, səbəblərin (əsbab) işini səbəbkar məbuddan bilməsə, yaxud səbəb güzgüsündə səbəbkarı görməsə, vəhdaniyyətin inkarına, yaxud "şirk" kafirliyinə giriftar olur*[2]*. Mövləvi qüdsiyyət nurunda qəlb cəlalarından, özəl qüvvədən, yaxud bəsirət gözündən məhrum olmağı səbəblər məşğulluğunda bilib buyurmuşdur:*

چشم بند خلق جزاسباب نیست　　هر که لرزد بر سبب ز اصحاب نیست[3]

**Nişanə** 3. "Təriqi-fəqr": Dünyəvi etibarların əngəl yönünü göstərməklə onlardan əl çəkməyi təlqin edən nişanədir[4].

Mövləvi məsnəvini fəqr dükanı bilib buyurmuşdur:

هر دکانی راست سودائی دیگر　　مثنوی دکان فقر است، ای پسر
مثنوی ما، دکان وحدتست　　غیر واحد هرچه بینی آن بتست[5]

---

[1] دکتر قاسم غنی، تاریخ تصوف در اسلام، جلد 2، ص 417
[2] Qəzəl 28, beyt 7, nişanə "əsbab"
[3] مولوی، مثنوی، دفتر 6 ، بیت 2316
[4] Qəzəl 44, beyt 4
[5] مولوی، مثنوی، دفتر 6 ، بیت1528 ، 1531

**Nişanə** 4. “Sultanlıq”:A: Aşiqin qəlbinə daxil olmuş, mehriban məbudun istədiyi əhval – ruhiyyədən ibarətdir.

B: Bədən tərkibinə daxil olmuş “heyvani ruh” adlı lətifələr cövhərinə, yaxud cismdə yerləşmiş yararsız əxlaq mərkəzinə hakim olmaqdan nişanədir.

Mövləvi, şahlara hakimlik edən heyvani nəfsin boynuna yüyən vurmağı həqiqi sultanlıq bilib buyurmuşdur:

خشم بر شاهان شه و مارا غلام     خشم را من بسته ام زیر لگام[1]

**Qeyd:** *İrfan mədəniyyətində bütün mərtəbələr, məqamlar, hətta sözlər, məna cəhətindən deyildikdə şərab, meyxana, qumar və bir çox mənfi mənalı kəlmələr, müsbət mənalar kəsb eləmişdir. Özünü yoxsul (təriqi fəqr tutmuş) edən bir aşiq isə həqiqi varlıqla nailiyyət tapmışdır. Beləliklə, irfan baxımı fəqiri şah bilir və şahı fəqir. Elə bu mədəniyyət və bu baxımla şairlər sultanı Xaqani buyurmuşdur:*

پس از سی سال روشن گشت بر خاقانی این مطلب
که سلطانیست درویشی و درویشیست سلطانی

**Anlam: Ürək istəyən var – dövlət kimi zahiri etibarlara, həmçinin inam – ibadət kimi batini imtiyazlara razılıq göstərmək nadanlıqdır. Çünki:**

**A: Ətəş və tələb çalışqanlığını saxlaşdırar.**

**B: İkilik, yaxud bir neçəlik (kəsrət) hicabına giriftar etməklə vəhdət rayihəsindən məhrum edər.**

**C: Mənəm-mənəmlik və məğrurluq hissini canlandırmaqla, heyvani nəfs hakimliyini möhkəmləndirər.**

**D: Sadaladığımız hicablardan azad edən mərtəbə yalnız təriqi-fəqr, yaxud məmlüklük hissidir. Bunun üçün də “** راحه النفس کلها فی التسلیم[2]**”: (“Batini mükəmməl rahatlıq yalnız təslim olmaqdadır (məmlüklük) demişlər”).**

Beyt 2: **Murad ər səltənətdən kami – dildir, nəfsə tabesən,**
**Nə hasil səltənət adilə qılmaq bəndəfərmanlıq.**

Sözlük: Ər – əgər; Fərmanlıq – nökərçilik = xidmətkarlıq

**Nişanə** 1. “Səltənət”: Bu beytdə etibarsız dünyəvi izzətlər və üstün-

[1] مولوی، مثنوی، دفتر 1، بیت 3877
[2] اسرار توحید (غزل 37، بیت 1، نشانه 3)

lüklər nişanəsidir.

**Nişanə** 2. “Kami-dil”: Bax beyt 2, nişanə “rahət”

**Nişanə** 3. “Nəfs”: Bu beytdə bədəndə yerləşmiş batil işlər və yaramaz əxlaq mərkəzindən nişanədir.

**Anlam: Dünyəvi səltənət məğrurluğunda özünü hakim bilmiş xəyalpərvər, istər – istəməz heyvani nəfs adlı hakimin nökərçiliyini qəbul etmişdir.**

Beyt 3: **Pərişanlıqdan, ey xəlqi – cahan, siz cəm edin xatir**
**Ki, mən cəm eylədim hər qanda vardır bir pərişanlıq.**

**Nişanə** 1. “Pərişanlıq”: Bu beytdə sərgərdan və yoxsul aşiqin iztirab çəkmək və bədəhval olmağından nişanədir. Ancaq, vəhdət nurunun kəsrət güzgüsündə əks etdirilmiş çeşidləri ilə məşğul olmağa da işarə edir.

**Anlam: Füzuli, hər çeşid pərişanlığı (dünyəvi və mənəvi) alqışlamaqla bütün aşiqlərdən üstün olduğunu eyham edir.**

Beyt 4: **Nə tale`dir bu kim, aləmdə ağaz etmədim bir iş**
**Kim, ol işdən sərəncam etmədim, hasil peşimanlıq.**

Sözlük: Ağaz – başlama = başlanğıc

**Nişanə** 1. “Tale”: Bu beytdə alın yazısından ibarətdir.

**Qeyd:** *Keçmişlərdə ay – ulduz seyrini insanların alın yazısına təsir edici bilməklə Bəhram və Keyvan adlı iki nəhs ulduzun birləşdiyi vaxt dünyaya gəlmiş insanın alın yazısını qarmaqarışıqlıq və əldə etdiyini peşimanlıq bilmişlər[1].*

**Anlam: İşi axsamaq və peşiman olmaq mənim doğal qismətimdir.**

**Qeyd:** *Aşiqin hər işdə peşiman olduğunu, iki müsbət və yüksək nailiyyəti bildirir:*

*A: Təklif nailiyyəti: Aşiq, məşuqa qarşı öz həqirliyini aydın düşünərkən, heç bir qulluğu məşuqa layiq görməyib xidmətçilik acizliyindən, yaxud mümkünsüz vəzifə daşımaq xəcalətindən nalə ünvanıyla münacat edir[2].*

*B: Mərifət nailiyyəti: Mütəal məhbub ərəfəsində candan – başdan keçməyi ən həqir xidmətkarlıq bilmək, mənəvi mərifətin əlavə olduğuna*

---

[1] Qəzəl 71, beyt 4, nişanə 3, qeyd
[2] Qəzəl 51, beyt 7, nişanə 1, qeyd

*dəlalət edir.*

Beyt 5: **Mənə zülmi – sərih ol kafər eylər, kimsə mən` etməz,**
**Füzuli, küfr olurmu gər desəm yoxdur müsəlmanlıq?**

Sözlük: Sərih – açıq = aydın

**Nişanə** 1. “Zülm”: Dünyəvi və ya mənəvi məhbubun müsbət sifətlərindən nişanədir. Gözəl məhbub bu sifətlər ilə aşiqin istiqamət və istedadını üzə çıxarmaq istəyir.

**Nişanə** 2. “Kafir”: Kəlməsinin bir mənasıda “örtücü” olduğuna görə:

A: Bəşəri əql və idrak üstünü örtən məhbubun özünə yaxud vasitələrinə “kafir” demişlər.

B: Dini mədəniyyətdə camalın üstünü örtmək naməhrəm gözlərdən qorumaq vacib olduğuna görə camalını örtən gözəllərə kafir (örtücü) demişlər.

C: Aşiqi ətəş və tələb atəşində yandırmaq (tərbiyə) hədəfi ilə camalını örtüb gizlətməyə görə məşuqa kafir (örtücü) demişlər.

D: Mütəal məhbubun öz əzəməti özünə hicab və kafir (örtücü)dir.

E: Kafir və zalim kimi kəlmələrlə məhbub, ya mürşüd həzrətini xitab etmək, şəth ünvanıyla şərh olmuşdur[1].

**Nişanə** 3. “İkinci misra”: İkinci misra, zülm və kafir nişanələrinin mübət olduğunu təkid edir.

**Nişanə** 4. “Müsəlmanlıq”: Ariflər dediyi “الاسلام هو تسليم[2] ” müsəlmanlıq məqamından ibarətdir.

**Qeyd:** *Aşiqi ikilik, yaxud kəsrət həbsindən azad etməklə vəhdət günəşindən bəhrələndirən mərtəbə yalnız təslim mərtəbəsindən ibarətdir.*

**Anlam: Həkim olan məhbubun zülm və cəfasını onun lətif və rəhmətindən ayrı bilmək həqiqətən nadanlıq və kafirlikdir.**

---

[1] Qəzəl 24, beyt 1
[2] Qəzəl 37, beyt 1, nişanə 3, qeyd

## Q Ə Z Ə L 151

(1) Saqiya, mey sun ki, dami – qəmdürür huşyarlıq,
Məstlikdir kim, qılır qəm əhlinə qəmxarlıq.

(2) Var fikrin, yox qəmin çəkmək nədir, bir cam ilən,
Bixəbər qıl kim, mənə bir ola yoxluq, varlıq.

(3) Can məta`inin bəhasidir nə kim, dövran verir,
Türfə bu kim, sanıram şəfqətdir ol qəddarlıq.

(4) Məndən axır çün qılır bizarlıq əsbabi – dəhr,
Dəhr əsbabından ol yey kim, qılam bizarlıq.

(5) Tə`neyi - əğyar çəkməkdir işim bir yar üçün
Kim, olub əğyarə yar, eylər mənə əğyarlıq.

(6) Çəkmə zəhmət, çək əlin tədbiri – dərdimdən, təbib
Kim, degil sən bildigin mən çəkdigim bimarlıq.

(7) Ey Füzuli, eylərəm qət`i – tə`əllüq yardən,
Bu təriq içrə mənə tovfiq edərsə yarlıq.

Beyt 1: **Saqiya, mey sun ki, dami – qəm durur huşyarlıq,**
**Məstlikdir kim, qılır qəm əhlinə qəmxarlıq.**

Sözlük: Huşyarlıq – huşlu-başlı olmaq; Qəmxarlıq – qəmini çəkmək = qəminə ortaq olmaq

**Nişanə** 1. “Saqi”: Bu beytdə həzrət Cəbraildən, yaxud mənəvi qəbzlər bağışlayan digər ilahi vasitədən nişanədir.

**Nişanə** 2. “Mey”: Mey saliki maddi və mənəvi aləmlər arasında olan təxmini bir zolaq və sərhədin mənəvi hissəsinə qaldıran elə bir qüvvədir ki, onu (saliki) dünyəvi tələblərdən təmizləyir və dünyəvi hissədə seyr etdiyi yolun, həvəs, qərəz, təkəbbür, mal-dövlət, mənəm-mənəmlik və digər beləcə təhlükəli maneələrinə qalib gətirə bilir[1].

**Nişanə** 3. “Dami-qəm”: A: Bu beytdə qəbz sıxıntılarıyla paralel həsrət çətinliklərindən nişanədir.

B: Bu beytdə dünyəvi həyata qarşı təşvişə düşməkdən nişanədir.

**Nişanə** 4. “Huşyarlıq”: “Şükr” ünvanlı mərtəbədə özlüyünü unutmuş aşiqin dübarə özündən xəbərdar olmasına “səhv”, yaxud huşyarlıq demişlər.

**Qeyd** 1: *Bir sıra ariflər “səhv” mərtəbəsini, bəst əhvalatına uyğun olduğuna görə, “sukr” məqamından üstün bilmişlər. Ancaq “Əbu Yəzid” kimi bəzi ariflər isə onu (səhvi) daha böyük maneə hesaba almışlar*[2].

**Qeyd** 2: *Huşyarlıq zahid təbliğ etdiyi dünyaşünas əql tabeliyinə də işarə edir.*

**Nişanə** 5. “Məstlik”: Maddi mahiyyətin məğlub və məhv olmasından nişanədir.

**Nişanə** 6. “Qəmxarlıq”: Mütəal məhbubun kamal və mərifət bağışlayan özəl rəhmətindən nişanədir.

**Anlam: Huşyarlıq – maddi və mənəvi zərər – mənfəti tanımaqla:**

A: Neçəlik, yaxud kəsrət mənşəyidir.

B: Seyrdən saxlaşyan qorxu – iztirab mənşəyidir.

Beyt 2: **Var fikrin, yox qəmin çəkmək nədir, bir cam ilən,**
**Bixəbər qıl kim, mənə bir ola yoxluq, varlıq.**

**Nişanə** 1. “Cam”: Aşiqin qəlbini bəşəri ilgilərdən boşaldıb ilahi maraqlarla doldurmuş məhz mənəvi ziyalardan nişanədir.

---

[1] Qəzəl 1, beyt 2, nişanə “mey”

[2] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

**Nişanə** 2. “Bixəbər”: Bax beyt 1, nişanə 4, “məstlik”

**Anlam: A: Bəşərin başında olan əql, huş, əndişə, xəyal, fəlsəfi dəlillər və elmi nəzəriyyələr tovhid günəşinin qarşısında qeyri müstəqil kölgələr kimi həqir və heç olmalıdırlar. Elə buna görə də Mövlana Füzuli “اوجیت باظهور ظهور المکونات” buyurmuşdur[1].**

**B: Beyt, var-yox fikrindən yaxud dünyəvi etibarsız nemətlər təşvişindən azad olmağı şərif ayədən bəhrələnməklə mümkün bilir ki, buyurmuş: “ کل من علیها فان و یبقی وجه ربک ذوالجلال و الاکرام[2]” ((Yer üzündə olan hər kəs fanidir, yalnız əzəmət və kərəm sahibi olan Rəbbinin zatı baqidir”).**

Beyt 3: **Can məta`inin bəhasidir nə kim, dövran verir,**
**Türfə bu kim, sanıram şəfqətdir ol qəddarlıq.**

Sözlük: Türfə – əcibə = əcəb işdir

**Nişanə** 1. “Can mətai”: Dünyəvi həyat möhlətinə məhdud olmuş bədən canından ibarətdir.

**Qeyd:** *Bədən canı qurban məqamının sərmayəsi olduğuna görə əzizdir.*

**Anlam: Dünya (dövran) verdiyi nemətlərin əvəzində bir şey tələb etməsə də qurban məqamının ömür adlı sərmayəsini, yaxud bədən canının müsbət möhlətini dəmbədəm bərbad etməklə dayanmaz xəsarətə bais olur. Qəribə burasıdır ki, mən [bir çox şəxslər kimi] o xəsarəti, yaxud o düşmənliyi mənfəət götürməli mehribanlıq təsəvvür edirəm.**

**Qeyd:** *Lisanül-qeyb olan Hafiz də insanı dünyanın mənfəət cildinə girmiş zərərindən xəbərdar edərkən yalnız “dövlət” ünvanlı ilahi rəhməti əvəzsiz ehsan bilib buyurmuşdur:*

کام بخشی گردون عمر در عوض دارد
جهد کن که از دولت داد عیش بستانی[3]

Beyt 4: **Məndən axır çün qılır bizarlıq əsbabi – dəhr,**
**Dəhr əsbabından ol yey kim, qılam bizarlıq.**

---

[1] Qəzəl 40, beyt 5
[2] Quran, Ərrəhman surəsi, ayə 26, 27
[3] Müəllif bu beyti “Ta Qafe-əndişe” kitabının 4-cü cildində şərh etmişdir

Sözlük: Çün – nə üçün = nə üstə = nədənsə; Dəhr – zəmanə = ruzgar

**Anlam: Dünyəvi maraqlardan gördüyüm ziyanlara görə onlardan nifrət etməyim daha yaxşıdır. Nə desəm onlar mənə nifrət etməzlər?**

Beyt 5: **Tə`neyi - əğyar çəkməkdir işim bir yar üçün**
**Kim, olub əğyarə yar, eylər mənə əğyarlıq.**

**Nişanə** 1. "Təneyi-əğyar": Aşiqin təbii və qanuni ölçü- biçmələrə sığmaz əməllər və hərəkətlərinə qarşı dünyaşünas əql əhli göstərən sərkidanlaqdan ibarətdir.

**Qeyd:** *Sərkilər vücudun çöl üzünü və şəxsiyyətin zahiri və dünyəvi cəhətini təhqir etməklə, içəri vücudun canlanmasına və cilvə etməsinə bais olur. Buna görə də danlaq vuranlar yaxud əğyarlar istər – istəməz aşiqə xidmət edirlər*[1].

**Nişanə** 2. "Yar": Ariflər, şühud məqamına, yaxud mütəal məbud cəmalını müşahidə etməyə "yar" demişlər.

**Nişanə** 3. "Əğyara yar olmaq": Mehriban məbudun bütün vücudları bəhrələndirən feyz ünvanlı ümumi ehsanından nişanədir.

**Qeyd:** *Şərif ayə "*[2]كل يوم هو فى شان*" buyurmaqla Allah təalanın hər gün yaxud hər ləhzə kainatda olmasından, yaxud onların həyatını davam etdirən feyzdən xəbər verir.*

**Qeyd** 2: *Əvəzsiz daimi olan bir ehsana feyz demişlər.*

**Qeyd** 3*: Feyz ehsanından bəhrələnmək iki çeşidlə mümkündür:*

*A: Bütün mövcudları bərabər səviyyədə bəhrələndirən "rəhmani feyz", yaxud şərif ayə buyurduğu "*[3]ماترى فى خلق الرحمان من تفاوت*" və "*[4]رحمتى وسعت كل شى*" feyzi.*

*B: Eşq, iman və irfan zirvəsinə çatmışları mərifət, tohid və riza kimi məqamlardan fərqli bəhrələndirən rəhimi feyz*[5].

**Nişanə** 4. "Əğyarlıq": Yaxud feyz saxlanılması aşiqi tərbiyə edən və yetişdirən qəbzlərdən nişanədir.

---

[1] Qəzəl 1, beyt 5, nişanə "məlamət"
[2] Quran, Ərrəhman surəsi, 29-cu ayədən bir qismət: ("O hər gün (kainatda) təsərrüf etməkdədir")
[3] Quran, Mülk surəsi, 3-cü ayədən bir qismət: ("Rəhman (olan Allahın)yaratdığında heç bir uyğunsuz sözlük görməzsən)
[4] Quran, Əraf surəsi, 156-cı ayədən bir qismət: [Allah buyurdu] rəhmətim hər şeyi bürüyübdür.
[5] Şeyx Mahmud Şəbüstəri, Gülşəni-raz, səh. 132, 133

**Anlam: “Rəhimi-feyz” süfrəsindən bəhrələnmək şövqü ilə ümüm-xalqın? yaxud “rəhmani feyz” ehsanından faydalanmışların sərki-danlağını qəbul etdim.**

Beyt 6: **Çəkmə zəhmət, çək əlin tədbiri – dərdimdən, təbib**
**Kim, degil sən bildigin mən çəkdigim bimarlıq.**

**Nişanə** 1. “Təbib”: Bu beytdə eşq cilvələrindən xəbərsiz nəsihətçidən ibarətdir.

**Nişanə** 2. “Bimarlıq”: Yaxud dərd: A: Qəlbi günahlardan təmizləyən qəbz sıxıntılarından ibarətdir.

B: Şirinlikdən asılı acılıqdan ibarətdir.

**Anlam: Ey təbib, sən kimi əql və elm sahibi olanlar mənim tələb ünvanlı dərdimə tədbir etməkdən acizdirlər.**

Beyt 7: **Ey Füzuli, eylərəm qət`i – tə`əllüq yardən,**
**Bu təriq içrə mənə tovfiq edərsə yarlıq.**

Sözlük: Təəllüq – asılmaq = ürək bağlamaq = hər bir şey ki onunla əlaqə saxlamaq mümkündür; Təriq – yol = məzhəb = irfan yolu; Tovfiq – müvəffəq etmək= bəxti gətirmək = ilahi təsdiq; Yar – yardımçı

**Anlam: Ey Füzuli, Allah qoysa, həkim məhbubdan başqalarının yardımçılığını unudaram.**

**Qeyd:** *Dünyəvi yardımlardan hacətsiz olmaq:*

*A: Maddi vücudların acizliyini, yaxud məmlük olmaqlarını sübut edir.*

*B: Vəhdət günəşindən bəhrələnməyi kəsrət hicablarından azad olmağa şərt bilir.*

## Q Ə Z Ə L 152

**(1) Can verir rayiheyi – türbəti – pakin, ey tak,**
**Nəvvər – Əllahu ləkəl - ərzə, səq – Əllahu sərak.**[1]

**(2) Hörmət etdin meyə, təzim ilə tutdun, saqi,**
**Əzzəm – Əllahu ləkəl - əcrə ələllahi cəzak.**[2]

**(3) Səri – kuyində qəribiz, bizə bir munis yox,**
**Talə ma anəsənəl – qəlbu, cəəlnahu fədak.**[3]

**(4) Səfheyi – dildə bulunmaz əsəri – surəti – qeyr,**
**Hinəma həllə, nəfil – ğeyrə ənil – qəlbi həvak.**[4]

**(5) Rəhi – eşqində götür qeyrdən, ey dil, rəğbət,**
**Fəiza şi`tə rəfiqən, ələmül –eşqi kəfak.**[5]

**(6) Xabi – qəflətdə, könül, vəsldən oldum məhrum,**
**Fazə mən nalə ila vəslihi ma xabə sivak.**[6]

**(7) Ey Füzuli, nə bilir əhli – vərə mey zövqin,**
**Ənkərəl – hikmətə mən laməkə cəhlən və nəhak.**[7]

---

[1] Tərcüməsi: Allah yeri sənin üçün nurlu esin, Allah sənin torpağını suvarsın.
[2] Tərcüməsi: Allah əcrini çoxaltsın, Allah mükafatını versin.
[3] Tərcüməsi: Uzun müddət könül bizi munis etdi, onu sənə fəda etdik.
[4] Tərcüməsi: Sənin sevgin könülə yol tapdıqda özgələrini qəlbdən uzaqlaşdırdı.
[5] Tərcüməsi: Dost istəsən eşq dərdi sənə kiyafətdir.
[6] Tərcüməsi: Onun vəslinə nail olan məqsədinə çatdı, sənin tək heç kim müvəffəqiyyətsiz olmadı.
[7] Tərcüməsi: Səni cəhalət üzündən danlayıb eşqdən uzaqlaşdıranlar hikməti inkar etmiş oldu.

Beyt 1: **Can verir rayiheyi – türbəti – pakin, ey tak,**
**Nəvvər – Əllahu ləkəl - ərzə, səq – Əllahu sərak.**

Sözlük: Tak = üzüm ağacı; İkinci misra : İşıqlı eləsin Tanrı məzarın, rəhmət yağışıyla sirab eləsin.

**Nişanə** 1. "Tak": Vəhdət cilvələrini təzahür etdirən kəsrət güzgüsündən, yaxud saliki özündən xəbərsiz edən dünyəvi vasitədən nişanədir.

**Nişanə** 2. "İşıqlandırmaq, su çiləmək": Düzgün mərifət və həqiqi həyat bağışlayan nişanələrdən istiarələrdir.

**Anlam: A: Ey tak, yaxud ey vasitə, Allah-taala sənin düzgün mərifət və həqiqi həyat xəzinəsi olan vücudunu ehsanından kənar eməsin.**

**B: Ey mürşid, Allah-taaladan istəyirəm ki, səni mənəvi mərifət və ilahi həyat mənşəyindən qiyamətə qədər feyzyab etsin.**

Beyt 2: **Hörmət etdin meyə, təzim ilə tutdun, saqi,**
**Əzzəm – Əllahu ləkəl - əcrə ələllahi cəzak.**

Sözlük: Təzim = ehtiram etmək = baş endirmək = əyilmək; İkinci misra : Yaxşı cəza verisn Tanrı səninçün, ən böyük əcr ilə cəzalandırsın.

**Nişanə** 1. "Hörmət və təzim etmək": Eşq prinsiplərini inkar etmiş əql müdafiəçilərinin irad-etirazını qulaq ardına vurmaqdan nişanədir.

**Nişanə** 2. "Mey": Həm çöl vücud, həm də iç vücuda qələbə çalan ilahi cilvələr təzahüründən nişanədir.

**Nişanə** 3. "Saqi": Bu beytdə mənəvi feyzlər bağışlayan vasitədən nişanədir.

**Anlam: Ey saqi, sən ilahi əhval-ruhiyyədən müdafiə olunmaqla özünü daha böyük mükafata layiq etmisən.**

Beyt 3: **Səri – kuyində qəribiz, bizə bir munis yox,**
**Talə ma anəsənəl – qəlbu, cəəlnahu fədak.**

Sözlük: İkinci misra: Əskidən mənimlə yoldaşlıq edən, könlümü sənin üçün fəda etdim.

**Nişanə**1. "Səri-kuy": Mütəal məbudun hürriyyətpərvər ərəfəsində fiziki iradə - ixtiyarı aşiqin qəlbindən qoparmaqla onu dünyəvi bağlantılardan xilas edən bəndəlik məqamından nişanədir.

**Nişanə**2. “Qərib”: Öz ilahi əslinə müraciət etmək və qovuşmaq istəyən kəsrət atmosferində vəhdət havalı aşiqdən nişanədir.

**Nişanə** 3. “Bir munis yox”: Munissiz olmaq, zavalsız toxtaqlığı yalnız mütəal məhbub hüzurunda olmaqla mümkün bildirir.

**Anlam: Beyt, maddi ömür məhdudluğunda toxtamaz qəlbə mütəal məhbub hədiyyə etdiyi minnətə layiq bir can təlqin edir.**

Beyt 4: **Səfheyi – dildə bulunmaz əsəri – surəti – qeyr,**
**Hinəma həllə, nəfil – ğeyrə ənil – qəlbi həvak.**

Sözlük: İkinci misra: Ürəyimdə sənin sevgin yer tutmuş, səndən özgəsini danır, nəf` edir.

**Anlam: Allah-təaladan başqalarını inkar etmiş ürək ikilik yaxud kəsrət əngəllərinə məğlub olmaqdan saxlanılar.**

**Qeyd:** *Bu anlam bütün kainatın qeyri müstəqil olduğuna, yaxud “اوجيت بالظهور المكونات” buyurduğunu təkrar və təsdiq edir*[1].

Beyt 5: **Rəhi – eşqində götür qeyrdən, ey dil, rəğbət,**
**Fəiza şitə rəfiqən, ələmül –eşqi kəfak.**

Sözlük: Rəh = yol, ikinci misra : Hər zaman özünə yoldaş arasan, sevgi dərdi sənin üçün yetməzmi?

**Anlam: Bu beyt isə ötən beyt daşıyan mənanı təkrar və təkid edir.**

Beyt 6: **Xabi – qəflətdə, könül, vəsldən oldum məhrum,**
**Fazə mən nalə ila vəslihi, ma xabə sivak.**

Sözlük: Xabi-qəflət – qəflət yuxusu; İkinci misra : Yararlanır sənin vəslinə çatan, səndən ayrı düşən ümidsiz olar.

**Nişanə** 1. “Xabi-qəflət”: İnsanı öz ilahi həqiqətindən bəhrəsiz saxlayan şəraitdən ibarətdir.

**Nişanə** 2. “Könül”: Daxili vücuddan nişanədir.

**Nişanə** 3. “Vəsl”: Öz həqiqətini tapıb – tanımaqla, özünü bütün kainatın məbdə və məadını (əvvəl-axırını) dərk etmiş inasnın mövqeiyyətinə vəsl demişlər.

**Qeyd** 1: *Şəxsi, ümumi və zehni qatqılardan (təəllüqlər) safa çıxmaq*

---

[1] Qəzəl 40, beyt 5

*(səfa mərtəbəsi) aşiq ilə məşuq arasında olan fasiləni yox dərəcəyə çatdırmaqla onu vəsl məqamına nail edir. Beləliklə, vücudun qatsız – qatqısız şəraitinə vəsl demişlər.*

**Qeyd** 2: *İkindi vaxtı çaxmış nurun günəş mənbəyinə qayıtmağı kimi qatqısız vücud da "tovhid günəşinə"[1] qayıtmağa layiq olur. Elə buna görə də həzrət İmam Hüseynin (ə) şəhadəti barədə: "Düşmüşdü günün şəşəəyi divarə, çəkildi[2]" demişlər.*

**Anlam: Qatqı ləkəsindən vücudunu safa çıxarmış aşiqlər ilahi vətənlərinə qayıtmaq istedadını qazandılar, ancaq mən hələ də qəriblik məcburiyyətini davam etdirirəm.**

Beyt 7: **Ey Füzuli, nə bilir əhli – vərə mey zövqin,**
**Ənkərəl – hikmətə mən laməkə cəhlən və nəhak.**

Sözlük: Vərə = pəhrizkarlıq= xətalardan qorunmaq, ikinci misra : Səni qınayanlar, səni dananlar, hikməti danırlar söz qanmayırlar

**Nişanə** 1. "Vərə": Bu beytdə dünyaşünas əqlin məlum etdiyi xətalar və savablar qarşısında öz təklifini bilən insanın (zahid) eşq nemətlərinə hacətsizlik göstərməyindən nişanədir[3]

**Nişanə** 2. "Mey zövqü": Şühud nailiyyətinin ilk dərəcəsindən ləzzət alan qüvvədən ibarətdir.

**Anlam: Özünü əql məhdudluğunda həbs etmiş bir şəxs eşq prinsiplərinə irad – etiraz etməklə daha əxlaqsız olduğunu sübut edir.**

---

[1] Qəzəl 1, beyt 1
[2] Mərhum Beyzai-Ərdəbilinin misrasıdır
[3] Qəzəl 42, beyt 7, nişanə 1

## Q Ə Z Ə L 153

**(1) Bəqa mülkün dilərsən, varını yox eylə dünya tək**
**Ətək çək gördüyündən, afitabi – aləmara tək.**

**(2) Təəllüq zülmətin təcrid xurşidinə qıl mətlə`**
**Əgər aləmdə bir gün görmək istərsən Məsiha tək.**

**(3) Könül hər surəti – Şirinə vermə, iç meyi – mə`na,**
**Həzər qıl, daşə çalma şişəni Fərhadi – şeyda tək.**

**(4) Rəfiqin olsa dilsiz canəvər, həm saxla raz ondan**
**Saqın, sirrin düşürmə dillərə Məcnuni – rüsva tək.**

**(5) Yetər tavus tək ücbilə qıl arayişi – surət,**
**Vücudundan keçib, aləmdə bir ad eylə ənqa tək.**

**(6) Gühər tək qılma təğyiri – təbiət dəlsələr bağrın,**
**Qərar et, hər həvadən olma şurəngiz dərya tək.**

**(7) Füzuli, kainat əsbabının qıldım təmaşasin,**
**Nədamətsiz tənə`üm yox, təsərrüfsüz təmaşa tək.**

Beyt 1: **Bəqa mülkün dilərsən, varını yox eylə dünya tək**
**Ətək çək gördüyündən, afitabi – aləmara tək.**

Sözlük: Bəqa – axirət evi = əbədi həyat = əbədi; Afitab – günəş, aləm ara = dünyanı zinətləndirən

**Nişanə** 1. "Varını yox etmək": Ülvi cazibələr və mənəvi mərifətlər nailiyyətindən saxlaşdıran dünyəvi ilgi - əlaqələri xüsusilə fiziki mahiyyəti unutmaqdan istiarədir.

**Nişanə** 2. "Dünya": A: Dünya qeyri sabit və hərəkət edici olduğuna görə hər an köhnə vəziyyətini yox edərkən yeniləşmək məcburiyyətindədir.

B: Dünya maddi olduğuna görə zavala uğramaq məcburiyyətindədir.

**Qeyd:** *Axirət dünyası, yaxud qiyamət ərəfəsi qarşısında, maddi dünyanın yoxa çıxmağı ilahi qanun olduğundan maddi varlıq yoxluq hesaba alınır, çünki məqsud axırda əldə edilsə də, əvvəldə nəzərdə tutulur. Mövləvi meyvənin ağacdan əvvəl olduğunu təsdiq etməklə, maddi dünyanın yoxluğunun varlığından öncə bilib buyurmuş:*

گرچه میوه آخر آید در وجود     اولست اوزانکه او مقصود بود[1]

*C: 5-ci və 6-cı əsr miladdan öncə "Heroqlius" kimi bir çox filosoflar maddi vücudun yox olması barədə nəzəriyyəbazlıqlar etmişlər. Həmçinin "Kisinufanus" kimi digər filosoflar məcazi və zahiri vücudu etibarsız bilməklə vəhdət mövzusuna yaxınlaşaraq yalnız mütəal məbud sitayişini əsas bilmişlər[2].*

*D: Hissi və zahiri varlığı qeyri-həqiqi və fani tanıtdırmaq Əflatun hikmətinin əsas mövzusundan ibarətdir. O, bitki, heyvan və maddi mövcudların batinində həm də narınlıq, irilik, şücaət və ədalət kimi mənəvi əmrlərin içində hiss ilə idrak olunmaz gizli həqiqətə "misal" termini ilə işarə edərək, maddi mövcudların təmamilə qeyri-həqiqi (yox) olduqlarını sübut edir[3].*

**Nişanə** 3. "Ətək çəkmək": A: Günəş batmasına istiarədir.

B: Özünü saxlamağa (ictinab) istiarədir.

C: Yer mərtəbələrindən kənar gəzməyi təsəvvür etməklə, yarım ülvi hissəsi asimanda saxlanılmış insanı ayıq salıb asimana qaldırmaq istəyir[4].

**Qeyd:** *İkinci misra birinci misranı hissiləşdirir.*

---

[1] مولوی، مثنوی، دفتر 3، بیت 1139

[2] محمد علی فروغی، سیر حکمت در اروپا، جلد 1، ص. 13 و 14

[3] Göstərilən kitab, səh. 28

[4] Qəzəl 80, beyt 5, nişanə 1

**Anlam: Asimana qatılmaq istəyən yer adamı, dünyəvi bağlantılardan ictinab edərkən maddi hicablarını dəmbədəm yox etməlidir.**

Beyt 2: **Təəllüq zülmətin təcrid xurşidinə qıl mətlə`**
**Əgər aləmdə bir gün görmək istərsən Məsiha tək.**

Sözlük: Təəllüq – asılmaq = ürək bağlamaq = hər bir şey ki, onunla əlaqə saxlmaq mümkündür; Xurşid = günəş; Mətlə – tülu və zühur etmək mənşəyi; Məsiha – həzrət İsa peyğəmbər

**Nişanə** 1. "Təəllüq zülməti": Şühud nurundan məhrum saxlayan maddi hicablar təəllüq zülmətindən ibarətdir.

**Qeyd** 1: *Zülmət sözü, maddənin qara olduğuna işarə edir.*

**Qeyd** 2: *Zülmət sözü, qara zərrələrin qəlbində parlaq nur kəşfinə yönələn elmlərə işarədir edir.*

**Nişanə** 2. "Təcrid xurşidi": Fərdlik yaxud bəstlik[1] məqamına yönlədən şühud nurundan nişanədir.

**Nişanə** 3. "Məsiha": Mənəvi yüksəlişlərdən nişanədir.

**Qeyd:** *Şərif ayə[2] Məryəm oğlu İsanın mütəal məbud tərəfinə yüksəlməyini təsdiq etməklə bir çox ədəbi təbirlər və rəvayətlər mənşəyi olmuşdur. O cümlədən əfsanəvi hekayələr İsa peyğəmbərin yaxasına ilişib qalmış dünya malından təkcə bir iynənin, onun 4-cü səmada saxlanılmasına səbəb bilmişlər[3].*

*Şairlər sultanı Xaqani bu hekayələrə işarə etmək məqsədilə buyurmuş ki:*

من اینجا، پایبند رشته ماندم     چو عیسی، پایبند سوزن آنجا
چرا سوزن چنین دجال چشمست     که اندر چیب عیسی یافت ماوا

**Nişanə** 4. "Gün görmək": Dünyəvi ömür möhlətində mənəvi bəhrələnməyi, yaxud "الدنیا مزرعه الآخره[4]" ("dünya axirətin əkin yeridir") sözünü təlqin edərkən günəşin də 4-cü səmada olduğuna işarə edir.

**Anlam: A: Əbədi işıqlığa nail olmağın əsas şərti qara maddə ilə mübarizə aparmaqdır.**

B: Dünyəvi ömür möhlətində həqiqi bəhrələnmək təəllüqləri xid-

---

[1] Qəzəl 64, beyt 5
[2] Qəzəl 133, beyt 5
[3] دکتر محمد معین، فرهنگ معین، اعلام
[4] Qəzəl 76, beyt 7, qeyd 1

mətçilər kimi işə tapşırmaqla mümkündür.

Beyt 3: **Könül hər surəti – Şirinə vermə, iç meyi – mə`na,**
**Həzər qıl, daşə çalma şişəni Fərhadi – şeyda tək.**

Sözlük: Şeyda – divanə = aşiq = qarmaqarışıq

**Nişanə** 1. “Meyi-məna”: İkinci beytdə qeyd olunmuş dünyəvi təəllüqlərin qeyri müstəqil kölgələr kimi həqir və fani olduğunu tanıtdıran mənəvi qələbələrdən nişanədir.

**Nişanə** 2. “Şişə, könül”: A: Şişə və könül ürək adlı ülvi mərifətlər xəzinəsindən istiarədir.

B: Şişə şühud nurunu təzahür etdirən batindən ibarətdir.

**Anlam: Ey könül, özünü bəşəri gözəl simalar məğlubiyyətində (Fərhad) ilahi camal cəlalarından məhrum etmə.**

Beyt 4: **Rəfiqin olsa dilsiz canəvər, həm saxla raz ondan**
**Saqın, sirrin düşürmə dillərə Məcnuni – rüsva tək.**

Sözlük: Canəvər – canavar; Raz – sirr

**Nişanə** 1. “Sirr”: Bu beytdə əql çərçivəsinə sığmaz əhval-ruhiyyədən ibarətdir.

**Anlam: A: Bu beyt də ötən beyt kimi naqis cilvələr məşğulluğunda kamil cilvələrdən qəflət etməyi məzəmmət edir.**

**B: Bu beyt məcazi eşq səviyyəsində “aşiq baş verər sirr verməz” sözünün müqəddəs bir qanun kimi icra edilməsini təlqin edir[1].**

Beyt 5: **Yetər tavus tək ücbilə qıl arayişi – surət,**
**Vücudundan keçib, aləmdə bir ad eylə ənqa tək.**

Sözlük: Ücb – qürurlanmaq = xudbinlik = özünə nazlanmaq; Ənqa – boynu uzun qadın = əql = vəhm = xüsusi musiqi ahəngi = xüsusi saz = əfsanəvi quş

**Nişanə** 1. “Ənqa”: “Adı var özü yox” bir əfsanəvi quş olduğundan, fiziki mahiyyət hicabından azad olmuş aşiqin fanilik ərəfəsinə yaxın olduğundan nişanədir.

---

[1] Qəzəl 114, beyt 1 qeyd

**Qeyd** 1: *Ad mənlik yaxud ikilik əlaməti olduğuna görə kamil fanilik qarşısında dikəlmiş maneə hesaba alınır.*

**Qeyd** 2: *Ötən beytlər Məcnun və Fərhadı ad almaq xətası ilə məzəmmət etmişlər.*

**Qeyd** 3: *Mütəal məhbub ərəfəsinə, yaxud vəhdət mülkünə yönəldən ad müsbət qəbul olunmuş addır.*

**Anlam: A: Zahiri imtiyazlarla maraqlanmaq mənəvi mərifətdən xəbərsiz qalmaq əlamətidir (Tavus), əksinə bütün imtiyazları (təəllüqləri) unudub yalnız bir adı qənaətbəxş bilmək, kamal zirvəsinə yaxın düşməkdən nişanədir (Ənqa).**

B: Tavus kimi zahiri hüsnlərə maraqlanmaq daha bəsdir. Bir neçə gündə ənqa kimi bütün əlaqələri (təəllüqlər) unutmalısan.

Beyt 6: **Gühər tək qılma təğyiri – təbiət dəlsələr bağrın,**
**Qərar et, hər həvadən olma şurəngiz dərya tək.**

Sözlük: Gühər – gövhər; Şurəngiz – fitnəli = həyəcanlı

**Nişanə** 1. “Gühər”: İnsanın “cövhər” ünvanlı pak olan əslinə və nicatına işarə edir.

**Nişanə** 2. “Təbiət”: Bu beytdə insanın ruhani və həqiqi şəxsiyyətindən nişanədir.

**Nişanə** 3. “Dəlsələr bağrın”: Bağrın dəlinməyi bu beytdə müxtəlif əzabverici tənbehlərdən istiarədir.

**Nişanə** 4. “Qərar et”: Qərar etmək bu beytdə ilahi əhval-ruhiyyəni səbrlə saxlamaqdan nişanədir.

**Nişanə** 5. “Həva”: Yer kürəsi ilə əlaqədar alçaq əmrlərə həva demişlər.

**Anlam: Dünyəvi çətinliklər önündə mənəvi əhval və ruhani xarakteri təğyir etməkdən, yaxud məğlub olmaqdan saxlamalısan.**

Beyt 7: **Füzuli, kainat əsbabının qıldım təmaşasin,**
**Nədamətsiz tənə`üm yox, təsərrüfsüz təmaşa tək.**

Sözlük: Əsbab – səbəblər; Tənəüm – naz və nemət içində böyümək

**Nişanə** 1. “Əsbab”: Yaradıcı məbud ilə yaradılmış insanlar arasında mövcudluq göstərən vəsilələrdən ibarətdirlər. Bu vəsilələr o şeylərdir ki, fəlsəfə onların varlığını başqa bir varlıqla, yoxluğunu isə başqa bir

yoxluqla şərtləndirmişdir[1].

**Nişanə** 2. "Təmaşa": Bu beytdə ruhani əhval – ruhiyyə törənməsinə bais olmuş mənəvi müşahidəyə işarədir.

**Anlam: Dünyəvi və mənəvi müşahidələrin inasanın təbiətini bürüməsi qəti bir qanundur[2]. Bu hal haqda xəlvət ünvanlı mərtəbədə bəhs olunmuşdur.**

---

[1] Qəzəl 28, beyt 7, niaşnə 1

[2] 6 cı beyt, təbiət

## Q Ə Z Ə L  154

(1)  Ey könül, çox seyr qılma günbədi – dəvvar tək,
Sakin olmaq seyrdən yey, nöqteyi – pərgar tək.

(2)  Ün verir can riştəsi, xəm qamətimdən çəksəm ah,
Yel dəgib çəng üzrə bir avazə gəlmiş tar tək.

(3)  Sinəmi nay oxların dəldi dəm urduqca könül,
Ün verir hər bir dəlikdən nalə musiqar tək.

(4) Arizin üstə xəmi – zülfün anıb, dün ta səhər,
Dolanırdım hər tərəf odlarə düşmüş mar tək.

(5) Cismi – zarım tiği – bidadindən oldu çak – çak,
Təndə sudən rəxnələr peyda qılan divar tək.

(6) Bilməyib behbudimi cövründən etdim ictinab,
Təlx şərbətlərdən ikrah eyləyən bimar tək.

(7) Xatirin şad eylədin, əhli – vəfa könlün yıxıb,
Bir imarət yapmağa min ev yıxan me`mar tək.

(8) Bibəqadır nəş`eyi – mey zövqin etdim imtəhan,
Hiç zövqi – baqi olmaz nəş`eyi – didar tək.

(9) Ey Füzuli, xatiri - əhli – səfa ayinədir,
Çərx cövründən əsər, ayinədə jəngar tək.

Beyt 1: **Ey könül, çox seyr qılma günbədi – dəvvar tək,**
**Sakin olmaq seyrdən yey, nöqteyi – pərgar tək.**

Sözlük: Günbədi-dəvvar – fırlanan günbəz = fələk guzgar

**Nişanə** 1. “Seyr”: Bu beytdə dünyəvi və mənəvi nailiyyətlər məqsədilə çalışqanlıq etməkdən nişanədir.

**Qeyd** : *Bu beytdə qeyd olunmuş seyrə mənfi seyr demişlər, çünki:*

*A: Məqsədə çatmaq nailiyyətini nəzərə alıb cəhd etmək (seyr) şərtləşdirilmiş bir cəhddir. Aydındır ki, şərtləşdirilən şey xalis ola bilməz.*[1] *Həm də məmlükə (aşiqə) şərt qoymaq haqqı verilməmişdir.*

*B: Sərgərdanlıq şəraitində seyr etmək yaxud öz seyr və cəhdindən xəbərsiz olmaq müsbət seyrdən ibarətdir.*

**Nişanə** 2. “Günbədi-dəvvar”: Öz dövrəsinə dolanan insanın məqsədə çatmaz hərəkətini, yaxud bəşəri cəhdin nəticəsizliyini eyham edir.

**Nişanə** 3. “Sakin olmaq”: Mehriban məbudun hikmət və rəhmət sifətini yəqinliklə tanımış salikin qəlbini arxayın edən “səkinə” ünvanlı vüqar və razılıq əlamətidir. Elə buna görə də şərif ayədə buyurulmuşdur: “هوالّذی انزل السکینة فی قلوب المومنین”[2] (“Onların[möminlərin, saliklərin] qəlblərinə arxayınlıq nazil edən Odur (Allah-Təala)”).

**Qeyd:** *Sakin olmaq, yaxud “səkinə” sözü, “təvəkkül” ünvanlı xüsusi mərtəbədə də şərh olunmuşdur.*

**Nişanə** 4. “Nöqteyi – pərgar”: Bütün kainatı (kəsrəti) öz dözrünə dolandıran nöqtəyə, yaxud həqiqi vəhdət mərkəzinə işarə edir.

**Anlam: Batini vücudun qəbzlər təşvişindən, hətta şühud-vüsal ilə bağlı iztirablardan azad olmağı, yaxud ürəyin həqiqi toxtaqlığı mehriban məbudun rəhmət və hikmətinə arxayın olmaqla mümkündür.**

Beyt 2: **Ün verir can riştəsi, xəm qamətimdən çəksəm ah,**
**Yel dəgib çəng üzrə bir avazə gəlmiş tar tək.**

Sözlük: Xəm – ayılmış = bükülmüş

**Nişanə** 1. “Ün vermək”: Batini vücudun özəl münacatından nişanədir.

**Nişanə** 2. “Can riştəsi”: Dünyəvi təcrid nailiyyətinə hazırlaşmış

---

[1] Qəzəl 3, beyt 3, “müamilə”, “haşiyə”

[2] Qur`an, Fəth surəsi, 4-cü ayədən bir qismət

candan ibarətdir.[1]

**Nişanə** 3. “Xəm qamət”: Vəhdət nöqtəsindən hərəkət etmiş saliki dübarə həman nöqtəyə qaldıran seyr dairəsindən nişanədir.

**Nişanə** 4. “Ah”: Bu beytdə ürək saflığına, həm də mənəvi seyrə nail edən ilahi eşq şöləsindən ibarətdir.

**Anlam: Ürək münacatı ümumi, şəxsi və zehni qatqılardan[2] safa çıxmış batini təsdiq edir.**

**Qeyd:** *İkinci misra, mənəvi əhval – ruhiyyəni dünyəviləşdirib başa salmaq istəyir.*

Beyt 3: **Sinəmi nay oxların dəldi dəm urduqca könül,**
**Ün verir hər bir dəlikdən nalə, musiqar tək.**

Sözlük: Nay – 20 metr dövrələrində boy atmış xüsusi ney = müharibə meydanında çalınan dəlik – deşik bir alət = zurna; Musiqar – musiqi = ağız sazı = dəlik-deşik dimdiklə müxtəlif avazlar səsləndirən əfsanəvi bir quş

**Nişanə** 1. “Dəlinmiş sinə”: Dəlinmək ürəyin ülvi aləmə açılmış pəncərəsindən istiarədir.

**Nişanə** 2. “Nay oxları”: Qəbz bəlalərilə birləşmiş bəst ətəşlərindən nişanədir.

**Anlam: Bu beyt də ötən beyt daşıyan mənaları təkrar edir.**

Beyt 4: **Arizin üstə xəmi – zülfün anıb, dün ta səhər,**
**Dolanırdım hər tərəf odlarə düşmüş mar tək.**

Sözlük: Ariz – surət = camal; Xəm zülf – zülf buruğu; Mar = ilan

**Nişanə** 1. “Ariz üzrə xəm zülf”: Nur hicabının arxasından parlayan ikinci nurdan, yaxud mütəal məbudun özü təzahür etdiyi surətdə (güzgü) məxfi qalmağından nişanədir.[3]

**Nişanə** 2. “Anmaq”: Mütəal məhbub həqiqəti ilə tanış olmağı mümkünsüz bilməklə islam peyğəmbərinin “الهی ماعرفناک حقّ معرفتک”[4] (“Ey mənim ulu Tanrım, sənin həqiqətini tanımaqdan aciz oldum”) dediyini təsdiq edən nişanədir.

---

[1] Qəzəl 12, beyt 1, nişanə 1
[2] Qəzəl 142, beyt 1
[3] Qəzəl 138, beyt 4, qeyd 1
[4] Qəzəl 46, beyt 6, nişanə 1, qeyd

**Nişanə** 3. "İkinci misra": İkinci misra, aşiqi öz çalışqanlığından, yaxud birinci beytdə qeyd olunmuş seyrdən naümid etməklə şəxsi fəhm və fikir ünvanlı hicabdan azad edən sərgərdanlıqdan ibarətdir.

**Anlam: Dünən ilahi cəlalərin bəşəri əqldə sığmazlığını düşünərkən sübhə qədər özümdən xəbərsiz olmuşdum.**

Beyt 5: **Cismi – zarım tiği – bidadindən oldu çak – çak,**
**Təndə sudən rəxnələr peyda qılan divar tək.**

Sözlük: Çak – çak = yarıq – yarıq

**Nişanə** 1. "Tiği-bidad": Bax beyt 3, nişanə 2 (nay oxları)
**Nişanə** 2. "Çak - çak": Bax bayt 3, nişanə 1 (dəlinmiş sinə)

**Anlam: Bu beyt də ötən beytlər kimi maddi vücudun özünü, həm də onunla bağlı əql və cəhd tədbirlərini karsız və batil göstərmək istəyir.**

Beyt 6: **Bilməyib behbudimi cövründən etdim ictinab,**
**Təlx şərbətlərdən ikrah eyləyən bimar tək.**

**Nişanə** 1. "Behbud": Vücudu müxtəlif qatqılardan safa çıxarmaq müqəddiməsinə behbud demişlər.

**Anlam: Eşq mülkünün ən möhkəm və ilk tanınmış qanunlarından biri də qəbz (cövr) qanunudur. Beləliklə, aşiq olmuş bir şəxsin hicran atəşində yanması, cövr və cəfa görməsi həm təbiidir, həm də onun xeyrinə (yetkinliyinə) tamam olarkən onu minnətdar etməlidir. Beləliklə, vəfa görmək cəfa çəkməyə, bəstə və qəbzə bağlıdır.[1]**

Beyt 7: **Xatirin şad eylədin, əhli – vəfa könlün yıxıb,**
**Bir imarət yapmağa min ev yıxan me`mar tək.**

**Nişanə** 1. "Şad": Bbu beytdə mütəal məhbubun razılığından nişanədir.

**Nişanə** 2. "Vəfa": "Ələst" aləmində[2] qol çəkilmiş öhdəlik sənədinə diqqətlə əməl etməkdən nişanədir.

---

[1] Qəzəl 7, beyt 6
[2] Qəzəl 19, beyt 4

**Anlam: Viranlıq abadanlığın müqəddiməsi olduğundan, beyt könlü yıxılmış aşiqin minnətdarlığını eyham edir.**

Beyt 8: **Bibəqadır nəş`eyi – mey, zövqin etdim imtəhan,**
**Hiç zövqi – baqi olmaz nəş`eyi – didar tək.**

Sözlük: Bibəqa – davamsız; Didar = görüş

**Nişanə** 1. “Mey zövqü”: Şühud nailiyyətinin ilk dərəcəsindən ləzzət alan qüvvədən ibarətdir.

**Qeyd:** *Mey zövqü, yaxud şühud məqamının ilk cilvəsi şimşək kimidir, çaxar ancaq dayanmaq bilməz.*

**Nişanə** 2. “Didar”: İlahi parlamaların, yaxud həqiqət simasının ürək aləmində “fuad” [1] adlı mərtəbədə ardı-arası kəsilməz təzahüründən ibarətdir.

**Anlam: Beyt, “şürb” məqamının üstünlüyünü təsdiq edir.**

**Qeyd:** *Şürb, kamala çatmış, yaxud intəhasız zövqdən ibarətdir.*[2]

Beyt 9: **Ey Füzuli, xatiri - əhli – səfa ayinədir,**
**Çərx cövründən əsər, ayinədə jəngar tək.**

Sözlük: Jəngar – zəngar = pas = filizdən düzəlinmiş güzgünün pası

**Nişanə** 1. “Xatir”: Bu beytdə ilahi əhval – ruhiyyə ilə məşğul olmuş ürəkdən nişanədir.

**Nişanə** 2. “Əhli-səfa”: Asılılıqdan qurtulmuşlara, yaxud dünyəvi küdurətləri ürəkdən təmizləyən şəxslərə səfa əhli demişlər. [3] (Ümumi, şəxsi və zehni qatqılardan ayrılmışlar)

**Nişanə** 3. “Ayinə”: Özünü kamal zirvəsinə qaldırmış insanın qəlbinə ayinə demişlər.

**Nişanə** 4. “Çərx cövrü”: Bu beytdə mənəvi parlamalar davamına, yaxud əbədi nailiyyətlərə layiq olmayan dünyəvi ömür möhlətindən ibarətdir.

**Nişanə** 5. “Jəngar”: Dünyəvi ömrün maneəsindən, yaxud fiziki mahiyyət hicabından nişanədir.

---

[1] Qəzəl 13, beyt 1
[2] Qəzəl 1, beyt7
[3] Qəzəl 70, beyt 7

**Anlam: İlahi cəlaləri əksi etdirməyə layiq olan güzgü yalnız səfa əhlinin qəlbidir. Əfsus ki, dünyəvi ömür hicabından (jəngar) azad olmağa, yaxud ilahi cəlalərin həmişəlik təzahürünə nail olmaq imkanı tapa bilməyir.**

**Qeyd:** *2, 3, 6 və 7 – ci beytlərin ikinci misralarında, mənəvi əhval – ruhiyyəni başa salmaq məqsədilə məcazi misallardan istifadə olunmuşdur.*

## Q Ə Z Ə L 155

**(1) Var ümidim kim, görüb cövlanını olsam həlak,**
**Gərdi – nə`li – badpayin örtə cismim üzrə xak.**

**(2) Öldüyüm mənzildə dəfnim qılmağa sanman ləhəd,**
**Yer görüb qürbətdə əhvalım, giriban etdi çak.**

**(3) Məst can verdim, məzarım üzrə tə`zim eyləyib,**
**Qübbə yapıb daneyi - əngur, eyvan tutdu tak.**

**(4) Çün cəfa mö`tadiyəm, bilmən nədir mehrü vəfa,**
**Bilməsə mehrü vəfa rəsmin cəfakarım, nə bak.**

**(5) Hər küdurətdən məni pak etdi seyli – xuni – dil,**
**Şükr – lillah, atəşi – eşqin məni yandırdı pak.**

**(6) Ah, bilmən neyləyim, canımda rahət qalmadı,**
**Gözlərim nəmnak, sinəm çak, könlüm dərdnak.**

**(7) Qeyr nəqşin məhv qılmışdır Füzuli sinədən,**
**Ma ləhu fid – dəhri – mətlubun və məqsudün sivak.**

Beyt 1: **Var ümidim kim, görüb cövlanını olsam həlak,**
**Gərdi – nə`li – badpayin örtə cismim üzrə xak.**

Sözlük: Gərd – toz; Nə`l – nal; Badpa – yel ayaqlı (minik atı); Xak – torpaq

**Qeyd:** *Bu qəzəl tamamilə həyəcan məğlubiyyətində[1] (şəth) ilahi vasitənin, yaxud mütəal məbudun "istiğna"[2] məqamını vəsf edir.*

**Nişanə** 1. "Cövlan": İlahi cəlal qələbələrinin, yaxud qəhr sifətlərinin dəmbədəm zühur etməsindən nişanədir.

**Nişanə** 2. "Həlak olmaq": Bu beytdə fanilik məqamına, yaxud ilahi müraciətə hazırlaşmış aşiqin dünyəvi ömür həbsindən xilas olmaq nişanəsidir.

**Nişanə** 3. "Gərdi-nə`li-badpa": Aşiqin həqiranə məğlub olmasını göstərən nişanədir.

**Nişanə** 4. "Cismi torpaqla örtmək": A: Maddilik, yaxud ikilik xüsusiyyətini tamamilə məhv etməkdən nişanədir.

B: Lütfə çevrilmiş qəhrdən nişanədir.

**Qeyd:** *Maddi vücuddan yalnız ad, yaxud cism qalarsa, həqiqi canın, yaxud mənəvi ölməz vücudun vasitəsiz nurdan bəhrələnməyi mümkünsüz olur. Buna görə də lisan-əl-qeyb olan Hafiz mütəal məhbubdan aşiqlər külünün göyə sovrulmağını tələb edir:*

روی بنمای وجود خودم ازیادببر
خرمن سوختگان را همه گوباد ببر[3]

**Anlam: Aşiq mənəvi həyat ərəfəsində həkim məhbubun qəhrindən azad olmağı arzu edir.**

Beyt 2: **Öldüyüm mənzildə dəfnim qılmağa sanman ləhəd,**
**Yer görüb qürbətdə əhvalım, giriban etdi çak.**

Sözlük: Ləhdəd – qəbir = qəbirin cəsəd qoyulan hissəsi; Giribançak etmək – yaxa açmaq = yaxa cırmaq

**Nişanə** 1. "Qürbət": Ailəsi, övladı, əməkdaşları və bütün əql əhli ürfani əhval – ruhiyyəsini dərk etməyən bir aşiqin öz ölkəsində və öz evində "hal qürbəti" ünvanlı şəraitdə yaşamaq məcburiyyətindən

[1] Qəzəl 24, beyt 1
[2] Qəzəl 30 , beyt 3
[3] Müəllif bu beyti "Taqafe əndişe" kitabının 3-cü cildində şərh etmişdir.

nişanədir.[1]

**Anlam: Dəfn olduğum məkan qəbir deyil bəlkə:**

A: Qürbətkeş canımın qarşısında yerdən açılmış nicat qapısıdır.

B: Qürbətlik müsibətimə əza saxlamaq məqsədilə yaxası açılmış yerdir.

Beyt 3: **Məst can verdim, məzarım üzrə tə`zim eyləyib,**
**Qübbə yapıb daneyi - əngur, eyvan tutdu tak.**

Sözlük: Təzim – hörmət; Əngur – üzüm; Tak – üzüm ağacı

**Nişanə** 1. "Məst": Özünü eşq məğlubiyyətində unutmuş aşiq.

**Anlam: Məstlik halında can vermək hörmətinə məzarımı üzüm salxımlarilə ziynətləndirin.**

**Qeyd:** *İkinci misra: A: Mənəvi əhvali- ruhiyyəni məcazi nümunələrlə başa salmaq istəyir.*

*B: Hər bir şəxsin mərifət miqdarına uyğun hörmətini tələb edir.*

Beyt 4: **Çün cəfa mö`tadiyəm, bilmən nədir mehrü vəfa,**
**Bilməsə mehrü vəfa rəsmin cəfakarım, nə bak.**

Sözlük: Mö`tad – adətkərdə; Mehr – günəş = məhəbbət

**Nişanə** 1. "Cəfa": Ürəyi mənəvi maraq və müşahidədən məhrum edən tərbiyəvi qəhrlərdən nişanədir.

**Nişanə** 2. "Vəfa": Aşiqi şövqləndirən ilahi cazibələr uzantısından nişanədir.

**Nişanə** 3. "Cəfakar": "Şəth" şəraitində aşiqin gözünə görünmüş mütəal məhbub sifətindən nişanədir.[2]

**Anlam: Həkim məhbub mənə bəst nailiyyətimi məsləhət bilmədiyi üçün qəbz və qəhr sıxıntılarına adətkərdə olmuşam.**

Beyt 5: **Hər küdurətdən məni pak etdi seyli – xuni – dil,**
**Şükr – lillah, atəşi – eşqin məni yandırdı pak.**

Sözlük: Küdurət – qaranlıq = bulaşmaq = qəm = napaklıq; Xuni-dil – ürək qanı; Şükr lillah – Allaha şükür

---

[1] Qəzəl 34, beyt 3

[2] Qəzəl 129, beyt 1

**Nişanə** 1. “Küdurət”: Maddə qara olduğundan, maddi, yaxud dünyəvi əlaqələrə (təəllüqlər) ümumən küdurət demişlər.[1]

**Nişanə** 2. “Seyli-xuni-dil”: Dünyəvi əlaqələrə qələbə çalan və onları batilə çıxaran nişanədən ibarətdir.

**Nişanə** 3. “Şükr – lillah”: A: Şükr qəlb və dil adlı ilahi olan nemətləri etiraf etməkdən nişanədir.

B: Nemət bağışlayan vahid məbudu nemətlər güzgüsündə müşahidə etməkdən nişanədir.

C: Bağışlayan məbudun vücudunu, həmçinin bütün kainata malik və sahib olduğunu, yaxud “rəbb” ünvanlı sifətini etiraf etməkdən nişanədir. Bu etirafı sifariş etmək məqsədilə şərif ayədə buyurulmuş ki: “و اذ تادن ربّكم لأن شكرتم لازسدنكم”[2] (“Və yadınıza salın, o zaman rəbbiniz xəbərdar etdi ki: “Əgər şükr etsəniz [nemətinizi] qətiyyətlə artıracaqam”)

**Nişanə** 4. “Atəşi-eşq”: Atəşi eşq, maddi küdurətlərdən səfa çıxaran “nari-məhəbbət”dən ibarətdir.

**Anlam: Şükür Allaha ki, qəbzlər atəşində yanmaqla ümumi, şəxsi və zehni qatqılardan paka çıxarıldım.**

**Qeyd:** *Bu anlam “səfa” ünvanlı ürfani mərtəbə nailyyətini təlqin edir.*[3]

Beyt 6: **Ah, bilmən neyləyim, canımda rahət qalmadı,**
**Gözlərim nəmnak, sinəm çak, könlüm dərdnak.**

Sözlük: Nəmnak – nəmli; Çak – çat = yarıq; Dərdnak – dərdli

**Nişanə** 1. “Ah bilmən”: heyrət ünvanlı sərgərdanlıq mərhələsini təlqin edir.

**Nişanə** 2. “Birinci misra”: Birinci misra fiziki mahiyyətdən tamamilə azad olmağa hazırlayan qəbzlərin çətinliyini təlqin edir.

**Nişanə** 3. “İkinci misra”: İkinci misra fanilik məqamına hazırlayan nişanələri təlqin edir.

**Anlam: Bu beyt maddə ilə məna arasında sərgərdan qalmış aşiqin halını təlqin edir.**

Beyt 7: **Qeyr nəqşin məhv qılmışdır Füzuli sinədən,**

---

[1] Qəzəl 2, beyt 7, nişanə 2, qeyd 2
[2] Quran, İbrahim surəsi, 7-ci ayədən bir qismət
[3] Qəzəl 70, beyt 7, nişanə 3

**Ma ləhu fid – dəhri – mətlubun və məqsudün sivak.**

Sözlük: İkinci misranın tərcüməsi – dünya boyunca ona səndən başqa bir mətləb və bir istək yoxdur.

**Anlam: Füzuli dünyəvi əlaqələrdən (təəllüqlər) təmamilə azad olmağını gözə gəlimli bilməklə mənəvi əslinə qovuşmağını tələb edir.**

## Q Ə Z Ə L 156

**(1) Çərx hər ay başına salmış qaşından bir xəyal,**
**Bu cəhətdəndir hər ay başında olmaq bir hilal.**

**(2) Mahi – növ olmuş qaşın sevdasının sərgəştəşi,**
**Şəhrdən şəhrə gəzər avarələr tək mahü sal.**

**(3) Etdigiçün hüsnünə qarşu kəmal izharı gün**
**Bir gün olmaz kim, ona gərdun yetirməz bir zəval.**

**(4) Sübh qıldın cilvə, gün çəkdi özün bu guşəyə,**
**Şam ərz etdin, rüxün şəm`i əritdi infial.**

**(5) Qılma gözdən çöhrəvü xalın nihan kim, qılmaya**
**Dudi – ahim afitabi çöhreyi – gərdunə xal.**

**(6) Olmuyub məqbuli – xaki – dərgəhin mahi – təmam,**
**Zə`fi – tale` verdi gün – gündən ona təğyiri – hal.**

**(7) Ey Füzuli, mah nisbət məhv qıl varın təmam,**
**Gər dilərsən bulmaq ol xurşid ilə bir ittisal.**

Beyt 1: **Çərx hər ay başına salmış qaşından bir xəyal,**
**Bu cəhətdəndir hər ay başında olmaq bir hilal.**

**Nişanə** 1. "Qaş": Bütün vücudlara camal bağışlayaraq, mütəal məbudun həqiqətini pünhan etmiş "cəlal" ünvanlı sifətlərindən nişanədir.

**Qeyd:** *Nurun addımlayıb günəş həqiqətinə çatmaq imkansızlığı kimi, yaxud nur günəşə hicab olan kimi qaş da ilahi həqiqətin hicabıdır.*

**Anlam: Asiman aybaay ilahi cəlal iqtidarından yeni bir örnək təzahür etdirməklə ayı sıxıb hilala döndərir.**

**Qeyd** 1: *Ay dünyəvi hüsnlər məğrurluğundan nişanədir.*

**Qeyd** 2: *Hilala dönmək,can üstündə olmaqdan istiarədir.*

**Qeyd** 3: *Hilala döndərməklə onu tənbeh etməkdən nişanədir.*

**Qeyd** 4: *Füzuli ayın hilala dönməyinə qeyri həqiqi bir illət bəyan etməklə, "hüsnü tə`lil" adlı ədəbi sənətdən istifadə etmiş.*[1]

Beyt 2: **Mahi – növ olmuş qaşın sevdasının sərgəştəşi,**
**Şəhrdən şəhrə gəzər avarələr tək mahü sal.**

Sözlük: Mahi-növ = hilal = təzə ay; Sərgəştə – sərgərdan = heyran = avara; Sal – il

**Anlam: Bu beyt də ayın sabit olmadığını (seyrini) onun ilahi cəlal ardınca sərgərdan olmasından bilir (hüsnü tə`lil).**

Beyt 3: **Etdigiçün hüsnünə qarşu kəmal izharı gün**
**Bir gün olmaz kim, ona gərdun yetirməz bir zəval.**

Sözlük: Gərdun – çərx = asiman

**Anlam: Bu beyt də ötən beytlər kimi "hüsnü tə`lil" sənətindən istifadə edərək öz nuruna məğrur olmuş günəşi canan camalından xəbərsiz olduğuna görə günahkar bilib anu hər axşam başı qüruba çatdırmaqla tənbeh edir.**

Beyt 4: **Sübh qıldın cilvə, gün çəkdi özün bu guşəyə,**
**Şam ərz etdin, rüxün şəm`i əritdi infial.**

Sözlük: Rüx – surət = üz = camal; İnfial – təsirlənmək = xəcil olmaq

**Nişanə** 1. "Cilvə": Salikin qəlbinə daxil olan ilahi parlamalardan

---

[1] Qəzəl 133, beyt 5, haşiyə

ibarətdir.

**Qeyd:** *Müxtəlif surətlərdə zahir olmuş kainat tamamilə ilahi parlamalar cilvəsindən yaranmışlar.*

**Nişanə** 2. “Gün”: Bu beytdə dünyəvi etibarsız imtiyazlar cilvəsindən nişanədir.

**Nişanə** 3. “Bir guşəyə çəkilmək”: Öz həqirliyini etiraf etməkdən nişanədir.

**Nişanə** 4. “Rüx”: Özəl təcəllilər ehsan etmiş ilahi camaldan ibarətdir.

**Nişanə** 5. “Şəm”: Bax nişanə 2, “gün”

**Nişanə** 6. “İnfial”: Yaxud xəcalət çəkmək mərifət nailiyyətinə işarə edir.

**Anlam: Beyt canan camalının qarşısında bütün hüsnlərin etibarsız olduğunu təlqin etmək istəyir.**

**Qeyd:** *Bu beyt də “Hüsnü təlil” ünvanlı əbədi sənətdən bəhrələnmişdir.*

Beyt 5: **Qılma gözdən çöhrəvü xalın nihan kim, qılmaya**
**Dudi – ahim afitabi çöhreyi – gərdunə xal.**

Sözlük: Nihan – pünhan = gizli; Dud – tüstü; Aftab – günəş; Gərdun – asiman = səma = fələk

**Nişanə** 1. “Çöhrə”: Salikin aləminə sığışan təcəlli nurundan ibarətdir.

**Nişanə** 2. “Xal”: Birinci misrada vəhdət nöqtəsilə əlaqədar sözə - ibarəyə sığmaz hüsndən nişanədir.

**Nişanə** 3. “Dudi-ah”: Maddi etibarlara qələbə çalan ilahi eşq şöləsilə bağlı iqtidardan nişanədir.

**Nişanə** 4. “Aftabi-xal etmək”: Dünyəvi imtiyazları həqir etməkdən nişanədir.

**Anlam: Beyt ilahi eşqlə bağlı ürək iqtidarını (dua iqtidarı) nişan verməklə yanaşı mərifət nurunu, yaxud tovhid günəşilə müqayisədə dünya səmasında parlayan günəşi qara bir nöqtə kimi həqir təlqin edir.**

Beyt 6: **Olmuyub məqbuli – xaki – dərgəhin mahi – təmam,**
**Zə`fi – tale` verdi gün – gündən ona təğyiri – hal.**

Sözlük: Məqbul – qəbul olunmuş; Xaki dərgəh – astana torpağı; Zə`f = zəiflik; Mahi-təmam = tamam ay =dolğun ay

**Nişanə** 1. "Xaki-dərgəh": Vəhdət mülkünün ərəfəsindən nişanədir. Bu ərəfənin də yerini tanımaqdan ötrü candan keçmək lazım gəlir.

**Nişanə** 2. "Mahi-tamam": Bu beytdə dünyəvi yüksəliş və kamaldan nişanədir.

**Qeyd:** *Dünya səmasında olan gün və ay kəsrət nişanəsidirlər.*

**Anlam: Dünya səmasındaki ay, ilahi cəlalər önündə öz həqirliyindən xəcalət çəkməklə gün – gündən zəifləyir. (Hüsnü təlil)**

Beyt 7: **Ey Füzuli, mah nisbət məhv qıl varın təmam,**
**Gər dilərsən bulmaq ol xurşid ilə bir ittisal.**

Sözlük: Mah nisbət – ay kimi = aya həmahəng; Xurşid – günəş; İttisal – yapışma = ittihad

**Nişanə** 1. "Varı məhv etmək": Bədən adətlərindən kənarlaşmaqla ilahi əslə tərəf qaytaran ürək sifətlərindən xəbərdar olmağa məhvlik demişlər.

**Nişanə** 2. "Xurşid": Bu beytdə mütəal məbud camalından parlayan cəlalardan nişanədir.

**Nişanə** 3. "İttisal": A: "Şühudi ittisal": Həm dünyadan, həm də özlüyündən xəbərsiz olmuş batini vücudun müşahidə məqamında yalnız mütəal məhbub ilə məşğul olmağından ibarətdir.

B: "Vücudi-ittisal": Aşiqin zatını mütəal məhbubun sifətlərinə yaraşdıran mərtəbədən ibarətdir.

**Qeyd** 1: *"Vücudi-ittisal bəşəri iradəni ilahi iradəyə çevirən mərtəbədən ibarətdir."*

**Qeyd** 2: *"Vücudi-ittisal səmasında yüksəliş mərtəbələrinin daha axırı ilk mərtəbə hesab olunur. Çünki səmada olan mərtəbələrin sonu yoxdur. Allah Təalanın, ruhani merac məqamına yüksəlmiş xüsusi dostları (vəlilər), xüsusilə, islam peyğəmbəri, vücudi-ittisal mərtəbəsini nəhayətə çatdırmağa nail olmuşlar. Bu nailiyyəti təsdiq etmək məqsədilə şərif ayə buyurur ki: "*ثمّ دنا فتدلی و کان قاب قوسین اوادنی*"*[1]*: "İki yay qədəri, ya ondan daha yaxın oldu."*

**Qeyd** 3: *"Özünü fanilik məqamına çatdırmayan bir aşiqin ittisal*

[1] Quran, Nəcm surəsi, 8 və 9 –cu ayələr

*nailiyyəti mümkünsüzdür.”*[1]

**Anlam: Ey Füzuli, ittisal nailiyyəti istərsənsə, ay kimi gün – gündən incəlməlisən.**

**Qeyd:** *Beyt “riştə” ünvanlı mərtəbədə dünyəvi ilgiləri və büsbütün məcazi bağlantıları qat – qat soyub tökməklə təcrid məqamına hazırlaşmağı təbliğ edir.*

---

[1] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

## Q Ə Z Ə L 157

**(1) Ey rüxün qibleyi – can, xaki – dərin Kə`beyi – dil,**
**Rəhi – eşqində fəna sərhədi, əvvəl mənzil.**

**(2) Lalərəng etdi gözüm qan ilə xaki – dərini,**
**Kimyagərdir edər gördüyü torpağı qizil.**

**(3) Ol ki, yarın şəbi – hicrinə qiyamət günü der,**
**Xəlq arasında qiyamət günü olmazmı xəcil?**

**(4) Qatı müşküldür işim zülfi – giregirindən,**
**Səbr bu müşkili, derlər, açar, əmma müşkil.**

**(5) Etmək olmaz səni agah könül halından,**
**Yazıq ol kim, verə könlün sənə, səndən qafil.**

**(6) Sevirəm zahidi kim, guşeyi – mehrabı sevər,**
**Xəmi - əbrunə rəqibim olub-olmaz mail.**

**(7) Dəli dersəm nola üşşaqına gülçöhrələrin,**
**Özünü göz görə odlarə salarmı aqil?**

**(8) Səni canan sanıram, çıx bədənimdən, ey can!**
**Mənü cananım arasında çox olma hail.**

**(9) Ey Füzuli, yanıram kim, nə üçün ol üzü gül**
**Mənə yanar od olur, özgəyə şəm`i – məhfil.**

Beyt 1: **Ey rüxün qibleyi – can, xaki – dərin Kə`beyi – dil,**
**Rəhi – eşqində fəna sərhədi əvvəl mənzil.**

Sözlük: Rüx – surət = üz = camal; Xak – torpaq;  Dər – qapı; Kə`bə – Alah evi

**Nişanə** 1. “Rüx”: Özəl təcəllilər ehsan etmiş ilahi camaldan nişanədir.

**Nişanə** 2. “Qiblə”: Qiblə qəlbi, fikri və bütün vücudu yalnız mütəal məhbub ilə məşğul etməkdən ibarətdir.

**Qeyd** 1: *Bütün insanlar ilahi dostluq iddia etdiklərinə görə mütəal məhbub onları birbəbir qəhr və lütf ünvanlı bəlalarla sınağa çəkdi. Birini sərvət, birini məqam, birini övlad, birini ibadət və birini ad – san ilə məşğul edərək onların iddialarını aydın və dostluq yollarını xali etdi.*[1]

**Qeyd** 2. *Mütəal məhbub batinlərin qibləsi olduğu kimi, batin qəlbin qibləsi, qəlb bədənin qibləsi, bədən üzvlərin qibləsi, üzvlər isə dünyanın qibləsidir.*[2]

**Nişanə** 3. “Can”: Bu beytdə ilahi mərifətləri əxz etməyə layiq olan ikinci can, yaxud ürək canı, ya da həkim Nizami buyurduğu mənəvi və həqiqi candan ibarətdir:

زنده به جان خود همه حیوان بود
زنده به دل باش که جان آن بود

**Nişanə** 4. “Xaki-dər”: Aşiqi fanilik məqamına nail edən vəhdət ərəfəsindən nişanədir.

**Nişanə** 5. “Kə`beyi-dil”: Yaxud batin Kə`bəsi,  Allah-təalanın öz hüzuruna müraciət etdirən müşahidə qibləsindən ibarətdir.[3]

**Nişanə** 6. “Fəna sərhədi”: Bəşəri sifətlərdən tamamilə ayrılmaq müqəddiməsidir.

**Nişanə** 7. “Əvvəl mənzil”: Əvvəl mənzil aşiqi özlüyündən ayıran mərtəbədən ibarətdir.

**Qeyd:** *Əvvəl mənzildə mənliyini məhv etmiş aşiq 29 mənzil seyr edəndən sonra islamın təsdiq etdiyi irfan məqamında (sufilik) nailiyyət tapır.*[4]

---

[1] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی
[2] Göstərilən kitab
[3] Qəzəl 131, beyt 4, nişanə1
[4] Qəzəl 1, beyt 6, nişanə 2 (qeydlər)

**Anlam: Bütün vücudu mütəal məhbub ilə məşğul etmək həqiqi həyat əlaməti olduğu kimi, fanilik məqamına nail olmaq isə ilahi əslə tərəf qayıtmağın müqəddiməsidir.**

Beyt 2: **Lalərəng etdi gözüm qan ilə xaki – dərini,**
**Kimyagərdir edər gördüyü toprağı qizil.**

**Nişanə** 1. "Birinci misra": Mərifətlər nəticəsini əks etdirən möqeiyyətdən nişanədir.

**Nişanə** 2. "Göz qanı": Aşiqin daha xətərnak olan fiziki mahiyyətini batil edən nişanədir.

**Nişanə** 3. "Kimyagər": Qəlbi dünyəvi əlaqələrdən xalisləşdirən əhvala kimyagər demişlər.

**Nişanə** 4. "Torpaq": Bu beytdə zavala məruz qalmış həqir olan vücuddan nişanədir.

**Nişanə** 5. "Qızıl": Zavalsız varlığa qızıl demişlər.

**Anlam: Fiziki mahiyyətimi, yaxud dünyəvi bağlantılarımı yuyub batil etməklə zavalsız varlıq nailiyyətinə hazırlaşdım.**

Beyt 3: **Ol ki, yarın şəbi – hicrinə qiyamət günü der,**
**Xəlq arasında qiyamət günü olmazmı xəcil?**

Sözlük: Şəbi-hicr – hicran gecəsi

**Nişanə** 1. "Yar": şühud aləminə, yaxud mütəal məbudun "vəch" ünvanlı camalını müşahidə etməyə "yar" demişlər.

**Nişanə** 2. "Şəbi-hicr": Müşahidə məhrumluğundan, yaxud qəbzlər çətinliyindən nişanədir.

**Anlam: Hicran əzabını qiyamət çətinliyinə bənzətmiş bir aşiq:**

**A: Qiyamət günü xəcil olmaz, çünki o gün qiyamət dəhşətinin hicran dəhşətilə bərabərliyi sübut olur.**

**B: Qiyamət günü xəcil olar, çünki o gün, hicran əzabının qiyamət çətinliyindən üstün olduğu hamıya sübut olunur.**

Beyt 4: **Qatı müşküldür işim zülfi – girehgirindən,**
**Səbr bu müşkili, derlər, açar, əmma müşkil.**

Sözlük: Girehgir – qıvrım = çinli

**Nişanə** 1. "Zülfi-girehgir": A: Şühud saxlanılmasının, yaxud qəbz tənbehlərinin mübhəmliyindən nişanədir.

B: Dünyəvi ömür möhlətinə sığmaz, daimi şühud arzusundan

nişanədir.

**Nişanə** 2. “Səbr”: Bəlalər və çətinliklər önündə şikayətlənməyi tərk etməyə səbr demişlər.

**Anlam: Səbr ilə ətəş və tələb atəşindən xilas olmaq dünyəvi ömür möhlətində mümkün deyil.**

Beyt 5: **Etmək olmaz səni agah könül halından,**
**Yazıq ol kim, verə könlün sənə, səndən qafil.**

Sözlük: Agah – xəbərdar

**Nişanə** 1. “Agah”: Bu beytdə təsirlənməkdən nişanədir.

**Nişanə** 2. “Könül halı”: Ətəş və tələb iztirabından nişanədir.

**Nişanə** 3. “Qafil”: Özünü ülvi həqiətlərdən xəbərdar bilmiş xəbərsizə qafil demişlər.

**Qeyd:** *Qafillər həkim məbudun həlimliyi ilə, zikr əhli onun rəhməti ilə, ariflər onun lütfü ilə, sadiq insanlar onun “qürb” ünvanlı yaxınlığı ilə və xüsusi dostlar (vəlilər) onunla munis olaraq məişət keçirirlər.*[1]

**Anlam: Öz naqis mərifətini kamil təsəvvür etmiş aşiq daha çətin tənbehlərlə cəzalanmalıdır.**

Beyt 6: **Sevirəm zahidi kim, guşeyi – mehrabı sevər,**
**Xəmi - əbrunə rəqibim olub-olmaz mail.**

Sözlük: Mehrab – qiblə = imam camaatın məsciddə namaz qıldığı yer = məclisin, yaxud evin yuxarı başı; Xəm – əyri; Quşl – hilali

**Nişanə** 1. “Mehrab”: Namazın, yaxud digər ibadətlərin şər`i və zahiri adət-ənənəsinə məşğul olmaqla batini cilvələrdən xəbərsiz qalmaq mövqiyyətindən nişanədir.

**Nişanə** 2. “Xəm əbru”: Həzrət məhbubun həqiqətini örtən qələbə və əzəmət sifətlərindən nişanədir.

**Anlam: Zahid mənimlə rəqabətsiz olduğuna görə sevilməlidir.**

Beyt 7: **Dəli dersəm nola üşşaqına gülçöhrələrin,**
**Özünü göz görə odlarə salarmı aqil?**

Sözlük: Üşşaq – aşiqlər

---

[1] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

**Nişanə** 1. "Dəli": Dünyaşünas məhdud əqldən üstün mərifətlərə məğlub olmuş aşiqə "düvanə" demişlər.

**Qeyd** 1: *Fəlsəfə iki çeşid dəlilik barədə bəhs etmişdir:*

*A: Ruhi xəstəlik, yaxud məcazi dəlilik.*

*B: İlahi cazibələr önündə çevrilmiş əhvali-ruhiyyə*[1]*, yaxud mənəvi dəlilik.*

**Qeyd** 2: *Bir çox filosofların nəzərincə "əql" bəşəri bir nemət olsa da, divanəlik ilahi bir ehsandır.*[2]

**Nişanə** 2. "Gülçöhrə": Ürəyi bəst məqamına hazırlayan mənəvi vasitədən, yaxud bəşəri simada ilahi hüsnlər əks etdirmiş gözəldən nişanədir.

**Nişanə** 3. "Üz": Bu beytdə şühud mərtəbəsindən əvvəl şövq mənzilini dərk etmiş aşiq qəlbinə daxil olan ilk məhəbbətdən nişanədir. Bu məhəbbət ki, həzrət məbud ilgisindən başqa ilgiləri tamamilə yandırıb könlü şühud nəsiminə tapşırar və aşiqi "səfa" ünvanlı mərtəbəyə qaldırar, "nari-məhəbbət" adı ilə tanınmış irfani bir məqamdır.

**Nişanə** 4. "Aqil": Bu beytdə dünyəvi hadisələrin zahiri cəhəti ilə tanış olmağı kafi bilmiş şəxsdən ibarətdir.

**Qeyd:** *Hər şeyin, heç olmasa, iki yönü olduğuna görə dünyəvi adi hallar və zahiri ziyan və mənfəətlər iki yönlü məhdudluqdan kənar deyillər, beləliklə, bir çox hadisələrin dünyəvi obrazı, yaxud çöl üzü ziyanlı olsa da, içəri üzü və batin yönü xeyirli və qazanclıdır. Elə buna görə də şərif ayədə buyurulmuş ki: "و عسی ان تکر هو شیأ و هو خیر لکم"*[3] *("Sizin xoşlamadığınız bir çox şeylər var ki, sizin üçün xeyirlidir"). Həkim Nizami bu şərif ayəyə əsaslanaraq buyurmuş ki:*

سررشته ی غیب ناپدیدست　　　بس قفل چوبنگری کلیدست

*Ancaq, aqil olan şəxs ikinci, yaxud batini cəhəti görməkdən acizdir.*

**Anlam: Dünyəvi hadisələrin batin yönündən xəbərsiz olan aqil insan eşq atəşindən pəhriz etməlidir.**

Beyt 8: **Səni canan sanıram, çıx bədənimdən, ey can!**
**Mənü cananım arasında çox olma hail.**

Sözlük: Hail – hicab = iki şeyin arasında olan maneə

**Nişanə** 1. "Canan": Birinci misrada dünyəvi həyat bağışlayan

[1] Dövreyi-asari- Əflatun, tərcümə Mühəmməd Həsən Lütfi, səh.1257
[2] Göstərilən kitab, səh.1232
[3] Quran, Bəqərə surəsi, 216-cı ayə

səbəbdən nişanədir.

**Nişanə** 2. “Can”: Bax: “Canan”

**Nişanə** 3. “Mən”: Bu beytdə aşiqin həqiqi və batini mənindən[1], yaxud fəlsəfənin “istila`i-mən” ünvanlı izah etdiyi məndən əlamətdir.

**Nişanə** 4. “Canan”: Canan ikinci misrada, cəlal və camal ziyalarilə bütün mövcudları heyran və sərgərdan etmiş mütəal məbuddan nişanədir.

**Anlam: Zavalsız həyat nailiyyətindən və ləzzətindən məhrum edən maneə can ünvanlı dünyəvi həyat səbəbindən ibarətdir.**

**Qeyd:** *Dünyəvi əlaqələrdən (təəllüqlər) xilas olmaq mümkün olsa da, bədən içində yerləşmiş can hicabından azad olmaq mümkün olmayır. Elə buna görə də Hafiz öz canından şikayətlənərkən buyurur:*

میان عشق و معشوق، هیچ حایل نیست
توجودحجاب خودی حافظ از میان برخیز [2]

Beyt 9: **Ey Füzuli, yanıram kim, nə üçün ol üzü gül**
**Mənə yanar od olur, özgəyə şəm`i – məhfil.**

**Nişanə** 1. “Yanmaq”: Aşiqi bəndəlik məqamında kamala çatdıran mərhələdən nişanədir.

**Nişanə** 2. “Üzü gül”: Bax: beyt 7, gülçöhrə

**Nişanə** 3. “Şəm`i-məhfil”: İlahi parlamalar mərtəbəsindən nişanədir.

**Anlam: Özgələri şühud nurundan bəhrələndirmiş məhbub məni müşahidə ehsanından məhrum etmişdir.**

**Qeyd** 1: *Müşahidə məhrumluğu istedada əlavə olunan tərbiyəvi tənbehdən nişanədir.*

**Qeyd** 2: *Özgə, yaxud istedadsız aşiq, ilahi lütf məhrumluğunda öz aşiqini unutmaqla özünü günaha salacaqdır. Bunun üçün də o hələlik şəm`i-məhfil mərtəbəsindən faydalanır.*

**Qeyd** 3: *Özgələri ilahi lüftdən bəhrələndirmək həkim məbudun “rəhmani feyz” ünvanlı ümumi ehsanilə əlaqədardır.*[3]

---

[1] Qəzəl 10, beyt 2
[2] Müəllif bu beyti “Taqafe əndişe” kitabının 3-cü cildində şərh etmişdir.
[3] Qəzəl 151, beyt 5, qeyd 3

## Q Ə Z Ə L 158

(1) Hiç sünbül sünbüli – zülfün kimi mişgin degil,
Nafeyi – Çini saçın tək derlər, əmma çin degil.

(2) Var gül bərgində həm əlhəq, nəzakət birlə rəng,
Leyk, canpərvər ləbi – lə`lin kimi şirin degil.

(3) Mehriban derlər səni əğyarə, leykən mən ona
Bavər etmən kim, sənə mehr eyləmək ayin degil.

(4) Xublər mehrabi - əbrusinə qılmazsan sücud,
Dinini döndərgil, ey zahid, ki, yaxşı din degil.

(5) Ta Füzuli qamətü rüxsarına vermiş könül,
Maili – sərvü həvaxahi – gülü nəsrin degil.

Beyt 1: **Hiç sünbül sünbüli – zülfün kimi mişgin degil,**
**Nafeyi – Çini saçın tək derlər, əmma çin degil.**

Sözlük: Mişgin – müşkli (müşk, xətən[1] ahusunun göbəyindən alınan qara-qəhvəyi ətirli maddə); Nafə – müşk = göbək

**Nişanə** 1. "Sünbül": Dünyəvi ürək açan hüsnlərdən əlamətdir.

**Nişanə** 2. "Sünbüli-zülf": Hicab arxasından görünən vüsal rayihəsindən nişanədir.

**Nişanə** 3. "Mişgin": Müşgin olmaq, aşiqin ülvi ölməz aləmdə, yaxud ilahi vüsal sahəsində yaşayışını onun iç aləmdə, yaxud ürəyində, yaxud duyum – düşüncəsində yadına salan mütəal məhbubun özəl rayihəli yadigarından istiarədir.

**Nişanə** 4. "Nafeyi-Çin": Bax "mişk".

**Nişanə** 5. "Saç": Vəhdət rayihəli kəsrətdən nişanədir.

**Anlam: A: Xətən müşkü ətir saçmaqda zülfünə bənzərsə də onun kimi münəzzim deyil.**
**B: Xətən müşkünü zülfünə bənzətmək daha nadürüstdür.**

Beyt 2: **Var gül bərgində həm əlhəq, nəzakət birlə rəng,**
**Leyk, canpərvər ləbi – lə`lin kimi şirin degil.**

Sözlük: Bərg – yarpaq; Əlhəq = həqiqətən; Nəzakət – naziklik = lətafət; Leyk = lakin; Canpərvər – canı təzələyən = ruhpərvər

**Nişanə** 1. "Nəzakət": Təcrid məqamına hazırlaşmış qatsız – qatqısız vücuda işarə edən nişanədir.[2]

**Nişanə** 2. "Rəng": Bu beytdə dünyəvi hüsnü mənəvi hüsnə bənzətmiş səbəbdən nişanədir.

**Nişanə** 3. "Canpərvər": Canpərvərlik irfani əhvali-ruhiyyənin, həm də həqiqi can ünvanlı ilahi mərifətin dəmbədəm təzələnməyindən istiarədir.

**Nişanə** 4. "Ləb": Yoxu var edən əqlə sığmaz hikmətdən nişanədir.

**Nişanə** 5. "Lə`l": Qələbə çalmaqdan, yaxud əbədiyyətə qovuşmaqdan nişanədir.

**Anlam: Bu beyt də ötən beyt kimi:**

**A: Mənəvi hüsnlərin dünyəvi hüsnlərdən daha üstün olduq-**

---

[1] Xətən, yaxud Xəta, Çin Türküstanında yerləşmiş şəhərin adı

[2] Qəzəl 12, beyt 1, "riştə"

**larını təlqin edir.**
**B: Dünyəvi hüsnlərin qeyri müstəqil olduğunu təlqin edir.**
**C: Dünyəvi naqis hüsnlərin zavala məruz qaldığını təlqin edir.**

Beyt 3: **Mehriban derlər səni əğyarə, likən mən ona**
**Bavər etmən kim, sənə mehr eyləmək ayin degil.**

Sözlük: Likən – lakin; Mehr – məhəbbət = mehribanlıq

**Nişanə** 1. “Mehriban”: Mehribanlıq saliki tərbiyələndirən rəhmət feyzindən nişanədir.

**Nişanə** 2. “İkinci misra”: İkinci misranın zahiri yönü cəfakarlıq olsa da, batin yönü aşiqi yetkinliyə nail edən vəfadarlıq və xeyirxahlıq yönüdür.

**Qeyd:** *Eşq məktəbində sınaq – sıxıntı görməyən aşiqə vəfadarlıq etmək onun həmişəlik naqis və xam saxlanılmasına bais olur.*

**Anlam: Sınağa çəkməkdən əvvəl səadətə çatdıqmaq Allah-təalanın ayini deyil.**[1]

Beyt 4: **Xublər mehrabi - əbrusinə qılmazsan sücud,**
**Dinini döndərgil, ey zahid, ki, yaxşı din degil.**

Sözlük: Xub – gözəl = yaxşı = qəşəng; Mehrab – qiblə = məclisin yuxarı başı; Əbru – qaş; Sücud – səcdəyə düşmək

**Nişanə** 1. “Xublər”: Bəşəri simada ilahi hüsnlər əks etdirmiş gözəllərə, yaxud eşq aləminə hidayətedici mürşidlərə və vasitələrə xublər demişlər.

**Nişanə** 2. “Mehrabi-əbru”: Mütəal məhbubun camalını örtən cəlal və qələbə sifətlərindən nişanədir.

**Nişanə** 3. “Sücud”: Hörmət göstərməkdən, həm də başda olan məğrurluğu torpağa tapşırmaqdan nişanədir.

**Nişanə** 4. “Din”: Bu beytdə şəri hökmlərin zahirinə məşğul olmaqla onların batinindən xəbərsiz qalmaqdan nişanədir. Ancaq din təriqət və yol mənasına da işarə edir.

**Anlam: Ey zahid, dünya atmosferindən yüksək seyr etməyə mail olsan, onda xublardan söz eşidib, əql yolunu tərk etməlisən.**

---

[1] İlahi ayinə dini dildə “sünnət” demişlər

Beyt 5: **Ta Füzuli qamətü rüxsarına vermiş könül,**
**Maili – sərvü həvaxahi – gülü nəsrin degil.**

Sözlük: Rüxsar – camal = surət; Həvaxah – həvadar = tərəfdar; Nəsrin – sarı nərgiz

**Nişanə** 1. “Qamət”: İlahi maraq – müşahidə uzantısından nişanədir.

**Nişanə** 2. “Rüxsar”: Ürəyi işıqlandırıb iç aləmi nurani edən ilahi camal təcəllilərindən nişanədir.

**Nişanə** 3. “Sərv, gül, nəsrin”: Dünyəvi ürək açan hüsnlərdən nişanədir.

**Anlam: Füzuli mənəvi maraqlarla tanış olduğu andan dünyəvi cazibələri gözdən salmışdır.**

## Q Ə Z Ə L 159

**(1) Üzünü güzgüyə qeybətdə oxşadan qafil,**
**Toxunsa üz – üzə olmazmı ara yerdə xəcil.**

**(2) Burax niqab ki, bilsin kəmali – sün`i görüb,**
**Firiştə xilqəti – Adəmdə şübhəsin batil.**

**(3) Hədisi – vəhyvəşin zaye` etmə əğyarə,**
**Rəvamıdır edəsən qədrin ayətin nazil.**

**(4) Hərimi – kuyini göstər nümunə, eylə səvab**
**Kim, ola cənnət üçün xəlq taətə mail.**

**(5) Səni qoyub, bütə eylər ibadətin kafir,**
**Əzabi – duzəxə ol vəchdən olur qabil.**

**(6) Həkimə nəfyi – qiyamət xətasını bildir,**
**Qiyam göstər ona, etiqadın et zail.**

**(7) Qərəz Füzuliyə ancaq əlində ölməkdir,**
**Vəli məhaldır ol həm, sən olıcaq qatil.**

Beyt 1: **Üzünü güzgüyə qeybətdə oxşadan qafil,**
**Toxunsa üz – üzə olmazmı ara yerdə xəcil.**

**Qeyd:** *Bu qəzəl tamamilə mürşid həzrətini, yaxud bəşəri simada ilahi cilvələr əks etdirmiş dilbərə xitab edilir. Ancaq aşiqin şəth məğlubiyyətini nəzərə alaraq mütəal məhbuba xitab edilməsi də mümkündür.*

**Nişanə** 1. "Üz": Mütəal məhbubun "vəch" ünvanlı gizli surətindən ibarətdir.[1]

**Qeyd:** *Bütün kainatın varlığı gizli surətin aşkar parlamalarına bağlıdır.*

**Nişanə** 2. "Güzgü": Bu beytdə ilahi camal cəlalərini əks etdirən elmi, zehni və xarici gözəl vasitədən ibarətdir.

**Nişanə** 3. "Üz – üzə toxunmaq": Üz – üzə toxunmaq, vasitəsiz tanışlıqdan, yaxud düzgün mərifətdən nişanədir.

**Anlam: Mütəal məhbub hüsnünü dünyəvi hüsnlərlə müqayisə etmək xəcalətli qafillikdən nişanədir. Buna görə də şərif ayələrdə buyurulmuş ki:**

**A: "ليس كمثله شيئٌ"[2] ("Onun bənzəri heç nə yoxdur")**

**B: "سبحان الله عمّا يصفون"[3] (ÜAllah onların tosif etdiklərindən pak və müqəddəsdir").**

Beyt 2: **Burax niqab ki, bilsin kəmali – sün`i görüb,**
**Firiştə xilqəti – Adəmdə şübhəsin batil.**

Sözlük: Sün`i = yaratma = ehsan etmək, firiştə = mələk

**Nişanə** 1. "Niqab": Aşiq ilə məşğul arasında olan hicaba niqab demişlər.

**Anlam: Beyt şərif ayədə "** و اذ قالَ ربّكَ للكة انّى جاعلٌ فى الارض خليفة قالو اتجعلُ فيها من يُفسدُ فيها و يسفكُ الدّمآء مآء ونحنُ نُسبّحُ بحمدك و نقدّسُ لكم قال انّى اعلمُ ما لا تعملون **"[4]("[ya Məhəmməd], sənin rəbbin mələklərə: "mən yer üzündə xəlifə yaradacağam" deyən vaxtda mələklər: "Biz sənə sitayiş etdiyimiz və sənin təqdisinə məşğul olduğumuz halda, aya yer üzündə fəsad törədəcək**

---

[1] Qəzəl 99, beyt 3, nişanə 4
[2] Quran, Şura surəsi, 11-ci ayə
[3] Quran, Muminun surəsi, 91-ci ayə
[4] Quran, Bəqərə surəsi, 30-cu ayə

**və qan tökəcək bir kəsi yaratmaq istəyirsənmi?” söylədilər.[Allah] buyurdu: “Həqiqətən mənim bildiyimi siz bilmirsiniz". Buyurduğuna əsaslanaraq öz ilahi həqiqətini yaxud “ələst” ünvanlı aləmdən”[1] gətirdiyi şəxsiyyətini sağ-salamat saxlamış mürşid həzrətinin məlaikədən üstün olduğunu təkid edərək yalnız eşqə təslim olmuş insanları şərif ayədə: “و لقد کرمنابنی آدم”[2]: (“Biz adəm övladını şərəfli etdik”) buyurduğuna layiq bilir.**

Beyt 3: **Hədisi – vəhyvəşin zaye` etmə əğyarə,**
**Rəvamıdır edəsən qədrin ayətin nazil.**

Sözlük: Hədis – söz = xəbər = həzrət peyğəmbər və imamların buyurduqları xəbərlər; Vəhyvəş – vəhyə oxşar, nazil – həqir = ucuz

**Nişanə** 1. “Hədisi-vəhyvəş”: Şəri hökmlər kimi ürəyə yatan xeyirli təlimat və rəftardan nişanədir.

**Nişanə** 2. “Ayət”: Hədisi-vəhyvəşi təkrar edən nişanədir. Ancaq Qurani-kərimin nazil olunmuş ayələrinə də işarə edir.

**Anlam: Heç bir şeyə bənzənilməz canan simasını güzgüyə oxşadan mərifətsiz əğyar onun hədisinin qədrini dərk edə bilməz.**

Beyt 4: **Hərimi – kuyini göstər nümunə, eylə səvab**
**Kim, ola cənnət üçün xəlq taətə mail.**

Sözlük: Taət – itaət

**Nişanə** 1. “Hərimi kuy”: Mütəal məhbubun, yaxud mürşid həzrətinin hürriyyətpərvər ərəfəsində fiziki iradə - ixtiyarı aşiqin qəlbindən qoparmaqla onu dünyəvi bağlantılardan xilas edən “bəndəlik”, yaxud “ixlas” məqamından nişanədir.

**Qeyd:** *Allah-təaladan başqa hər bir şeydən üryan olub bəstləşmiş əməl ixlasdan nişanədir.*

**Nişanə** 2. “Cənnət”:

A: İlahi adları – sifətləri əks etdirən mərtəbəyə “sifət cənnəti”, yaxud “ürək cənnəti” demişlər.

B: “İlahi camal cəlalərini vasitəsiz (fiziki vasitə) müşahidə etməyə

[1] Quran, İsra surəsi, 70-ci ayə
[2] Qəzəl 59 ,beyt 1, nişanə 2

“zat cənnəti”, yaxud “ruh cənnəti” demişlər”.

C: “Peyğəmbərlər tabeliyində gözəl əxlaq qazanmaq mərtəbəsinə “nəfs cənnəti”, yaxud “vərasət cənnəti” demişlər”.

T: “Zahiri cənnət adlı yemək – içmək cənnətinə “əməllər cənnəti” demişlər”[1]

**Anlam: Beyt zahiri cənnətə daxil olmağı, şəri və əqli ibadətlərə şərt bilərkən “sifət cənnətinə” daxil olmağı da aşiqanə itaətlərə bağlı təlqin edir.**

Beyt 5: **Səni qoyub, bütə eylər ibadətin kafir,**
**Əzabi – duzəxə ol vəchdən olur qabil.**

Sözlük: Duzəx – cəhənnəm; Vəch – cəhət = səbəb = yol

**Qeyd** 1: *Bütpərəst həqiqi pərəstişin üstünü örtməklə kafir olur. Çünki kafir sözünün bir mənası da örtücüdür (mənfi kafirlik).*

**Qeyd** 2: *Bütpərəst öz əqlinin üstünü örtməklə kafir olur. Çünki əql, bütpərəstliyi qəbul etməmişdir(mənfi kafirlik).*

**Qeyd** 3: *Aşiq əql qanunlarını tərk etməklə kafir olur. Ancaq o dünyada əql əhlinin sərki danlağıyla cəzalanır və axirət cəzasından azad olur (müsbət kafirlik).*

**Anlam: Bütpərəst-mənfi kafirliyi müsbət kafirlikdən üstün bildiyinə görə axirət günü duzəx əzabilə cəzalanmalıdır (hüsni təlil)**

Beyt 6: **Həkimə nəfyi – qiyamət xətasını bildir,**
**Qiyam göstər ona, etiqadın et zail.**

Sözlük: Nəfi qiyamət = qiyamət gününü inkar etmək, zail = zavala uğramış

**Nişanə** 1. “Həkim”: Bu beytdə əql və dəlil tabeliyindən nişanədir.

**Nişanə** 2. “Qiyam”: Daxili vücud ilə dərk olunmuş ilahi parlamalar uzantısından nişanədir.

**Anlam: Daxili cansız vücudları, camal cələlərilə canlandırmaqla əql və hikmət əhlini (həkim) həqiqi qiyamətdən xəbərdar et.**

**Qeyd:** *Həkim maddi mahiyyəti öldürüb mənəvi mahiyyəti dirildən eşqə bağlı iqtidarı inkar etməklə həqiqi qiyaməti inkar etmək xətasına*

---

[1] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

*giriftar olmuşdur.*

Beyt 7: **Qərəz Füzuliyə ancaq əlində ölməkdir,**
**Vəli mahaldır ol həm, sən olcaq qatil.**

**Nişanə** 1: “Ölmək”: Ölmək bu beytdə qurban məqamına nail olmaqdan, yaxud dünyəvi həyat sərmayəsini məşuq həzrətinə fəda etməkdən nişanədir.

**Qeyd:** *Qurban, ikilik fasiləsini (iddə) yox dərəcəsinə (iddəsizlik) çatdırmaqdan ibarətdir (ittihad).*

**Anlam: A: Ölmək “qürb”, yaxud “qurban” məqamının əsas şərti olduğuna görə mənəvi sərmayə hesab olunur. Belə bir sərmayə istedadını ələ gətirmədən əvvəl ölüm (qətl) məqamına çatmaq məhaldır.**

**B: Məhbub həzrətinə qatil demək məhaldır.**

## Q Ə Z Ə L 160

**(1) Mülki – hüsnün böylə zalim padişahi olmagil**
**Kim, sənə zalim desə adil güvahi olmagil.**

**(2) Qəmzə tiğin çəkmə hər saət könül yəğmasinə,**
**Hökmə tabe, mülkə qarətgər sipahi olmagil.**

**(3) Ahını, ey mah, üşşaqin yetirmə göylərə,**
**Dərd əhlinin nişani – tiri – ahi olmagil.**

**(4) Gər dilərsən şəm` tək qeyrət oduna yanmayım,**
**Şamlər əğyar şəm`i – bəzmgahi olmagil.**

**(5) Adət etmək xoş degil bidadə, rəhm et, Tanrıçün,**
**Gahi olsan maili – bidad, gahi olmagil.**

**(6) Aşiqi rusva görüb, mən` etmə, ey naseh, məni,**
**Münkiri – asari – təqdiri – ilahi olmagil.**

**(7) Ey Füzuli, eyləmə, taət riyayi, tərkin et,**
**Tövbə qıl minbə`d, məşğuli – mənahi olmagil.**

Beyt 1: **Mülki – hüsnün böylə zalim padişahi olmagil**
**Kim, sənə zalim desə adil, güvahi olmagil.**

Sözlük: Güvah – şahid

**Nişanə** 1: Hüsn:

A: Hüsn bütün kamalların bir vücudda cəmləşdirilməsi.

B: Hüsn hər bir vücudun zahirində, yaxud batinində olan tənasüblər.

**Nişanə** 2. “Zalim”: Mənəvi həqiqətləri istedadsız aşiqdən gizli saxlayan vasitə. (müsbət zülm)

**Qeyd:** *Bir çox hal baş verə bilər ki aşiq “şəth” vəziyyətində mürşüdün özünə hətta mütəal məhbuba da zalim və cəfakar deyib xitab edir*[1].

**Nişanə** 3. “Padşah”: Ariflər, nəbz vurmaq və nəfs çəkməyə ehtiyacı olmayan, ilahi eşq və məhəbbətlə ayaq tutub həyat sürən “vəli” ünvanlı rəhbərə padşah demişlər.

**Nişanə** 4. “Adil güvah”: Adil güvah olmaq, bir cəfanı digər cəfa ilə təsdiq etməkdən ibarətdir (dübarə cəfa etmək).

**Anlam: Ey məhbub, tələb və həsrət atəşində alovlanmış aşiqi məhrumluq məcburiyyətində dönə - dönə sınağa çəkmə. Həmçinin qəbzlər cəfasından şikayətlənmiş aşiqin şikayətini dübarə tənbih etməklə təsdiq etmə.**

Beyt 2: **Qəmzə tiğin çəkmə hər saət könül yəğmasinə,**
**Hökmə tabe, mülkə qarətgər sipahi olmagil.**

Sözlük: Yəğma – çapma = qarət; Sipah – qoşun

**Nişanə** 1. “Qəmzə tiği”: Qəhr burulğanı ilə lütf nəsiminin birlikdə ürəyi çulğalamaq nişanəsi.

**Anlam: Ey gözəl, öz tabeliyində olan mülkü, qarət qoşunu, yaxud qəmzə tiği ilə çapıb – talamaqdan çəkin.**

Beyt 3: **Ahını, ey mah, üşşaqin yetirmə göylərə,**
**Dərd əhlinin nişani – tiri – ahi olmagil.**

Sözlük: Üşşaq – aşiqlər

**Nişanə** 1. “Ah”: Bu beytdə mənəvilik həsrəti ilə biqərarlıq etməkdən

---

[1] Qəzəl 24, beyt 1

nişanədir.

**Nişanə** 2. “Mah”: Qara maddədə ağ nurunu əks etdirməkdən əsirgəyən dilbərdən nişanədir.

**Nişanə** 3. “Dərd əhli”: Yarı yer hissəsini, yarı göy hissəsini qovuşdurmaq məqsədilə (vəhdət) çalışıb taqətdən düşmüş aşiqlər.

**Nişanə** 4. “Tiri-ah”: Vəhdət mülkünə qəribsəmiş ürəyin özəl şikayətindən nişanə.

**Anlam: Taqətdən düşmüş, yaxud müdafiəsiz insanların ahından sığınmaq daha gərəklidir. Çünki onların müdafiəçisi Allah təala özüdür.**

Beyt 4: **Gər dilərsən şəm` tək qeyrət oduna yanmayım,**
**Şamlər əğyar şəm`i – bəzmgahi olmagil.**

Sözlük: Gər – əgər; Bəzmgah – ziyafət məclisi = şadlıq məclisi

**Nişanə** 1. “Qeyrət”: Bu beytdə vəhdətin kəsrət ilə həmçinin kəsrətin vəhdət ilə əlaqədar olduğunu qəbul edə bilməzlik nişanəsidir.

**Nişanə** 2. “Şam”: Bu beytdə şühud nurunu əks etdirən kəsrət (qara maddə) güzgüsündən ibarətdir.

**Nişanə** 3. “Şəm”: İkinci misrada təcəlli ünvanlı parlamalardan nişanədir.

**Anlam: Ey gözəl məhbub, başqalarını təcəlli nurundan bəhrələndirib məni məhrumluq və həsrət atəşində yandırma.**

Beyt 5: **Adət etmək xoş degil bidadə, rəhm et, Tanrıçün,**
**Gahi olsan maili – bidad, gahi olmagil.**

**Nişanə** 1: “Bidad”: bax beyt 1 (zalim)

**Anlam: Bu beyt isə “şəth” mövqeiyyətində şikayət edərkən, ictimai nəsihətlər və sifarişlərə də işarə edir.**

Beyt 6: **Aşiqi rusva görüb, mən` etmə, ey naseh, məni,**
**Münkiri – asari – təqdiri – ilahi olmagil.**

Sözlük: Mən – mane olmaq; Naseh – nəsihətçi; Təqdiri ilahi – ilahi əmrlərin cərəyan tapması

**Nişanə** 1. “Rüsva”: Vəhdət rayihəsilə mənaşünaslığa nail olmaqla məcazi etibarlara nifrət edən, beləliklə də dünyaşünasların sərki – danlağını qəbul etmiş aşiq.

**Nişanə** 2. "Naseh": Dünyaşünas əqli (məişət keçirmək əqlini) kamal sirvəsinə yüksəlməyin qənaətbəxş olduğunu bilmiş şəxs[1].

**Nişanə** 3. "Təqdiri-ilahi": Mənəvi fəzanın ilahi yazısı və qanununa təqdiri-ilahi demişlər.

**Anlam: Eşq ərəfəsində ilahi əmrlə müəyyən olan qanunların biri də rüsvalıqdır (məlamət). Buna görə də rüsvalıqdan çəkinmək, mütəal məbudun əmrindən çıxmaq, ərəfəsindən qaçmaq, yaxud ilahi əmri tənqid etməkdir. Bu tənqid aşiqi kafir edən bir günahdır[2].**

Beyt 7: **Ey Füzuli, eyləmə, taat riyayi, tərkin et,**
**Tövbə qıl minbə`d, məşğuli – mənahi olmagil.**

Sözlük: Taat = itaətlər; Minbəd = bundan sonra; Mənahi – qadağan edilmişlər

**Anlam: Ey Füzuli, bundan sonra riyakarcasına ibadət etməyi ilahi qadağan bilib tərk etməlisən.**

**Qeyd:** *Yuxarıda dediyimiz riyakarlıq özünü, ibadətini arada görməkdən ibarətdir. Demək özünü, namazını, ibadətini və digər xeyir işlərini arada görmək özü – özünü göstərmək baxımıyla özəl riyakarlıqdan nişanədir*[3].

---

[1] Qəzəl 64, beyt 3
[2] Qəzəl 1, beyt 5
[3] Qəzəl 150, beyt 1, qeyd 2

## Q Ə Z Ə L 161

**(1) Bəs ki, zə`fi – ruzədən hər gün bulur təğyiri – hal,**
**Olacaqdır eyd üçün mahi – təmamim bir hilal.**

**(2) Qıldı mahi – ruzə xurşidimi gün – gündən zəif,**
**Zərrə - zərrə ayə, san gün nuri eylər intiqal.**

**(3) Bir xəyal etmişmi zə`fi – ruzə yarı, bilməzəm,**
**Yoxsa yarı görməyib, mən gördügümdür bir xəyal.**

**(4) Tuta bilsəydim, su içməzdim, qılırdım dəf`ini,**
**Ruzənin kim, göz görə xurşidinə istər zəval.**

**(5) Ay tutulsun, ruzə əyyamında gün düşsün yerə**
**Kim, bu ay, gündən bulubdur mehriban mahim məlal.**

**(6) Qanımı içmək dilər ol lə`li – meygun hər gecə,**
**Ruzə tutmuş qaliba, iftar içün istər həlal.**

**(7) Yemək – içmək fikrin əhli – ruzədən kəs, ey günəş,**
**Bir səvab et, sübhlər ta şam qıl ərzi – cəmal.**

**(8) Ruzə təklifin Füzulidən götür, ey möhtəsib,**
**Natəvandır, onda bu təklifə yoxdur ehtimal.**

Beyt 1: **Bəs ki, zə`fi – ruzədən hər gün bulur təğyiri – hal,**
**Olacaqdır eyd üçün mahi – təmamim bir hilal.**

Sözlük: Zəf – zəiflik; Ruzə – oructutma = orucluq; Eyd – bayram; Mahi-tamam – tamam ay

**Nişanə** 1. “Zəf”: Aşiq ilə məşuq arasında dikəlmiş maneələri, xüsusilə fiziki mahiyyət hicabını aradan qaldıran və aşiqi təcrid məqamına daxil edən nişanədən ibarətdir[1].

**Nişanə** 2. “Ruzə”: Dünyəvi maraqları tərk etməklə içəri vücudu saflaşdırmağa “ruzə” demişlər.

**Qeyd:** *İrfan icmalçıları iki çeşid oruca işarə etmişlər:*

*A: Bədən orucu: Özünü yemək – içməkdən saxlamaq – bədən orucu;*

*B: Ürək orucu: Batini vücudu bütün ilgilərdən boşaltmaq – ürək orucu;*

**Qeyd** 1: *Gün uzunu yemək – içməyi tərk etmək – bədən orucu, yaxud ümumi oruc adlanır”.*

**Qeyd** 2: *Ömür boyu kainatı tərk etmək irfan ilgilərinin orucu yaxud xüsusi orucdur*[2].

**Nişanə** 3. “Eyd”:A: Ürəyə aid olmuş təcəlli nuruna eyd demişlər.

B: İlahi əslə tərəf müraciət etdirən mərhələyə eyd demişlər.

**Nişanə** 4. “Mahi-tamam”: Bəşəri təbiətə ilahi həqiqəti qalib etmiş mürşüdə mahi-tamam demişlər.

**Anlam: A: Həzrəti mürşüd hər gün, yaxud hər an öz mənəvi mərifətini təzələndirməklə yeni bir aləmə qapı açır.**

**B: Həzrəti mürşüd dəmbədəm dünyəvi təəllüqlərini məhv etməklə (zəf) mənəvi mərtəbəsini ucaldır.**

Beyt 2: **Qıldı mahi – ruzə xurşidimi gün – gündən zəif,**
**Zərrə - zərrə ayə, san gün nuri eylər intiqal.**

Sözlük: Mahi-ruzə = orucluq ayı; Xurşid – günəş

**Nişanə** 1. “Mahi ruzə”: Bax beyt 1, “ruzə”

**Nişanə** 2. “Xurşid”: Bəşəri təbiətini ilahi həqiqətə çevirmiş mürşüd.

**Qeyd:** [3]كل يوم هو فی شان *buyurmuş mütəal məhbub hər an bütün kainatda onların dünyəvi həyatını davam etdirdiyi kimi* “ رحمتی وسعت کل

---

[1] Qəzəl 12, beyt 1, “riştə”

[2] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی

[3] Quran, Ərrəhman surəsi, 29-cu ayədən bir qismət: O, hər gün [kainatda] olmaqdadır

[1]*شی" buyurmaqla öz "vəli" və "mürşüd" ünvanlı dostlarının xüsusi olan həyatını (iç həyat, mənəvi həyat) davam etdirir. Belə bir xüsusi həyat nailiyyətinə çatmış mürşüdə "xurşid" demişlər.*

**Anlam: A: Bir an əlaqəsini günəşdən qət etməyən ay kimi mürşüd həzrəti də hər an mütəal məhbub ilə əlaqədardır.**

**B: Öz nurunu təmamilə günəşdən əxz etmiş ay kimi həzrəti mürşüd də bütün sifətlərini, hətta əməllər və ibadətlər mənşəyi olan iradəsini dəmbədəm mütəal məbuddan əxz etməkdədir. Beləliklə, onun əli yədullah, gözü eynullah, vücudu ayətullah olduğuna görə bütün əməllərinin mənşəyi mütəal məbudun öz istək – iradəsi olacaqdır[2].**

Beyt 3: **Bir xəyal etmişmi zə`fi – ruzə yarı, bilməzəm,**
**Yoxsa yarı görməyib, mən gördügümdür bir xəyal.**

**Nişanə** 1. "Xəyal": A: Birinci misrada mürşüd həzrətinin ilahi obrazından nişanədir.

B: İkinci misrada öz maddi vücudunu, mənəvi duyğular səmasına qaldıran aşiqdən nişanədir.[3]

C: İkinci misrada, hissi qüvvələrə sığmaz bir vücudu zehndə təcəssüm etdirən mərtəbədən nişanədir.

**Nişanə** 2. "Yar": Mürşüd həzrətindən nişanədir.

**Anlam: Həzrəti mürşüd öz şəxsiyyətini hissi təcrübədən üstün mərtəbələrdə təzahür etdirir, yoxsa mən qeyri hissi vücudu təcəssüm edirəm?**

**Qeyd:** *Bu anlam bədən ilə ruh arasında sərgərdan qalmış aşiqin əhvalını vəsf etmək istəyir.*

Beyt 4: **Tuta bilsəydim, su içməzdim, qılırdım dəf`ini,**
**Ruzənin kim, göz görə xurşidinə istər zəval.**

Sözlük: Su içmək – dərhal = fövrən

**Anlam: Oruc adlı olan mərhələ əlimə keçsəydi, dərhal onu dəf edərəm çünki o, gözəl mürşüdü gözümdən qayib etmişdir.**

---

[1] Quran, Əraf surəsi, 156-cı ayədən bir qismət: [Allah buyurdu]: Rəhmətim hər şeyi bürüyübdür.
[2] Qəzəl 63, beyt 2, nişanə 3
[3] Qəzəl 21, beyt 2, nişanə 3

**Qeyd:** *Oruc mürşüdi göylərlə məşğul olduğundan yerdən qayib edir. Beləliklə aşiq mürşüd ziyarətindən məhrum olur.*

Beyt 5: **Ay tutulsun, ruzə əyyamında gün düşsün yerə**
**Kim, bu ay, gündən bulubdur mehriban mahim məlal.**

**Anlam: Beyt mürşüd, yaxud məbud ilə aşiq arasında hicab olmuş maddi qurğunu, yaxud ruzə əyyamında mürşüdün qayibliyinə bais olmuş ay günü nifrin edir.**

Beyt 6: **Qanımı içmək dilər ol lə`li – meygun hər gecə,**
**Ruzə tutmuş qaliba, iftar içün istər həlal.**

Sözlük: Meygun – qırmızı

**Nişanə** 1. "Gecə": Dünyəvi işləri saxlamaqdan beləliklə dünyəvi bağlantıları qırıb – tökməklə qurban məqamına, yaxud fanilik mərtəbəsinə hazırlaşmaqdan nişanədir.

**Nişanə** 2. "Qan içmək": Qurbanlıq məqamına hazırlayan nişanədir.

**Nişanə** 3. "Ləl": Bu beytdə yoxu var edən mənəvi qələbədən nişanədir.

**Anlam: Fiziki mahiyyəti, yaxud dünyəviliyi mükəmməl halda unutmaq, irfan igidlərinin, yaxud xüsusi oruc tutmuşların iftarından ibarətdir.**

Beyt 7: **Yemək – içmək fikrin əhli – ruzədən kəs, ey günəş,**
**Bir səvab et, sübhlər ta şam qıl ərzi – cəmal.**

**Nişanə** 1. "Günəş": Bu beytdə ilahi parlamalar əks etdirən mürşid simasından, yaxud mütəal məhbub camalından nişanədir.

**Anlam: Maddi dünya istəyindən (iftar etmək) insanı xəbərsiz edən məstlik yalnız şühud cəlalərilə (ərzi-camal) mümkündür.**

Beyt 8: **Ruzə təklifin Füzulidən götür, ey möhtəsib,**
**Natəvandır, onda bu təklifə yoxdur ehtimal.**

Sözlük: Möhtəsib – dini hökmlər nəzarətçisi = şəri qadağan işlər əncamından insanı saxlayan idarə adamı; Ehtimal – taqət gətirmək

**Anlam: Oruc ünvanlı əqli və şəri təklif əncamı ilahi bir hökm olduğuna görə, şəri və əqli boşlayıb, eşq cazibələri ilə məşğul olmaq ilahi hökmü tərk etmək, yaxud açıq-aşkar**

**kafirlikdir. Ancaq Füzuli də digər ariflər kimi eşq ilə əqli vahidləşdirməkdən aciz (natəvan) olduğuna görə, ruzə təklifindən azad olmağı istəməklə orucu tərk etmək istəməyir, bəlkə o imamlara hədiyyə verilmiş əql ilə eşqi vahidləşdirən qüvvədən bir rayihə qədər bəhrələnmək istəyir. Lisanül- ğeyb Hafiz şəri müvəffəqiyyətlərə, o cümlədən orucluq ayına hörmət göstərmək məqsədilə "qədəh" ünvanlı aşiqanə əməllər tərkini gərəkli bilib buyurmuşdur:**

ساقی بیار باده که ماه صیام رفت
در ده قدح که موسم ناموس و نام رفت[1]

[1] Müəllifin bu beyti "Ta Qafe-əndişe" kitabının 1-ci cildində şərh olunmuşdur.

## Q Ə Z Ə L 162

**(1) Öylə müstəsna gözəlsən kim, sənə yoxdur bədəl,**
**Səndən, ey can, münqəte` qılmaz məni illa əcəl.**

**(2) Necə surət bağlasın könlüm xilasi – eşqdən,**
**Eşqdir bir hal kim, ol halə könlümdür məhəl.**

**(3) Eşqimə nöqsan gətirməz görməmək ol arizi,**
**Cövhərə təğyiri – asari - ərəz verməz xələl.**

**(4) Eylədi rüsva könül çaki – giribani - ədəb,**
**Gör nə əhli – elmdir, adab ilə eylər cədəl.**

**(5) Halimi gördükcə mən`i - əhli-eşq eylər fəqih,**
**Höccəti – məqtui yox, eylər qiyas ilən əməl.**

**(6) Mədrəsə içrə müdərris verdigi min dərsdən,**
**Yeydürür meyxanədə bir cam vermək bir gözəl.**

**(7) Ey Füzuli, mən dəm urmuşdum səfayi – eşqdən**
**Mətləi – xurşid icad olmadan sübhi - əzəl.**

Beyt 1: **Öylə müstəsna gözəlsən kim, sənə yoxdur bədəl,**
**Səndən, ey can, münqəte` qılmaz məni illa əcəl.**

Sözlük: Münqəte` = ayrılmaq

**Nişanə** 1. Müstəsna gözəl: Şərif ayənin "ليس كمثله شى[1]" ("Onun bənzəri heç bir şeyə yoxdur"), buyurduğu ilahi camaldan nişanədir.

**Nişanə** 2. "Münqəte` olmaq": Bu beytdə son dərəcəyə çatmış tələbdən nişanədir.

**Anlam: Ey bənzəri olmayan gözəl məbud, mənim eşq nəğmələrimi tərənnüm edən tələbkar vücudumu ölümdən başqa bir şey sakit edə bilməz.**

Beyt 2: **Necə surət bağlasın könlüm xilasi – eşqdən,**
**Eşqdir bir hal kim, ol halə könlümdür məhəl.**

Sözlük: Surət bağlamaq – təsəvvür etmək = mümkün bilmək

**Nişanə** 1. "Hal": Keçmiş və gələcəkdən yaxud zamandan xəbərsiz və xilasedici, əql və təcrübədən üstün ürək səmasında çaxmış şimşəklərdən ibarətdir[2]

**Nişanə** 2. "Halə məhəl": Bir kəlməni qeyri həqiqi mənada ifadə etmək, yaxud "məcaz" ünvanlı ədəbi sənətdən bəhrələnmək, "əlaqə" adlı müxtəlif tənasüblərlə mümkün olur. O tənasüblərdən biri "halə məhəl" adlı əlaqədən ibarətdir. Bu əlaqəyə əsaslanaraq, hal əvəzinə məhəl kəlməsindən istifadə edib, "camaatdan soruşun" yerinə "şəhərdən soruşun" demişlər. Həmin sənət yaxud həmin münasibətlə şərif ayə cənnət əvəzinə rəhmət buyurmuşdur[3]. و اما الذين ابيضت وجوههم ففى رحمه الله فيها خاليدو ن[4]: ("Üzləri ağaranlar isə Allahın rəhməti içində daimi qaralacaqlar").

**Anlam: Öz məhəlindən ayrılmaz hal kimi aşiqin də ürəyi tələb və atəş atəşindən ayrılmazdır.**

Beyt 3: **Eşqimə nöqsan gətirməz görməmək ol arizi,**
**Cövhərə təğyiri – asari - ərəz verməz xələl.**

---

[1] Quran, Şura surəsi 11-ci ayə
[2] Qəzəl 3, beyt 3
[3] غلام حسين آهنى، معانى بيان، ص 156
[4] Quran, Ali-İmran surəsi, 107 ci-ayə

Sözlük: Ariz – camal = üz; Ərəz – məta = illət = zavala uğrayan şey; Xələl – rəxnə = fəsad

**Nişanə** 1. "Ariz": Bu beytdə vasitələr güzgüsündə təzahür edən ilahi camaldan nişanədir.

**Nişanə** 2. "Cövhər": A: Hər bir şeyin əslinə, yaxud həqiqətinə cövhər demişlər.

B: Öz varlığını özündən əxz etmiş zavalsız vücuda cövhər demişlər.

C: İslam peyğəmbərinin həqiqi vücuduna, yaxud müqəddəs nuruna birinci cövhər demişlər[1].

**Nişanə** 3. "Ərəz": A: Qeyri-müstəqil vücuda ərəz demişlər. Məsələn bir şeyin ağ, yaxud qara olması onun ərəzindən ibarətdir.

B: Öz varlığını özgədən əxz etmiş zavala uğrayan vücuda ərəz demişlər[2].

**Anlam: Eşq cövhər olduğuna görə sərki, danlaq, hicran, qəbz və qəhr ilə zaval görməz.**

Beyt 4: **Eylədi rüsva könül çaki – giribani - ədəb,**
**Gör nə əhli – elmdir, adab ilə eylər cədəl.**

Sözlük: Çak – çat = rəxnə = parlamaq; Cədəl – cidal = müharibə

**Nişanə** 1. "Rüsva könül": Xarici aləm etibarlarını, yaxud əql və təcrübə tanıtdırdığı imtiyazları unutmuş batini vücuddan ibarətdir.

**Nişanə** 2. "Ədəb": Bu beytdə əxlaq, əqidə və mərasim hörmətini gözləmək və tanınmış xətalardan pəhriz etmək elmini öyrənməkdən ibarətdir.

**Nişanə** 3. "Elm": Bu beytdə xarici təcrübələrdən, müstəqil mərifətdən, yaxud ruh içində maddi vücuda daxil olmuş həqiqi elmdən ibarətdir[3].

**Nişanə** 4. "Adab": Bu beytdə ədəb mənasını təkrar edərkən şəri hökmlər zahirini diqqətlə izləməyə və onların batinindən xəbərsiz qalmağa işarə edir.

**Anlam: A: Rüsva könlüm, yaxud batini vücudum xarici təcrübələrdən müstəqil mərifətə nail olduğundan dünyəvi maraqlara etinasızlıq edir.**

---

[1] دکتر سید جعفر سجادی، فرهنگ لغات و اصطلاحات و تعبیرات عرفانی
[2] Fəlsəfi mənbələrə müraciət olunsun
[3] Qəzəl 107, beyt 1, nişanə 7 "xurşid"

B: Elm əhli ümumən ədəb görməyi təsdiq edərsə, əksinə mənim alim könlüm onu tənqid edir.

Beyt 5: **Halimi gördükcə mən`i - əhli-eşq eylər fəqih,**
**Höccəti – məqtui yox, eylər qiyas ilən əməl.**

Sözlük: Mən` – qadağan etmək = maneə törətmək; Fəqih – şəri hökmlər alimi; Məqtu – qəti = sabit

**Nişanə** 1. “Hal”: Bax beyt 2, nişanə 1

**Nişanə** 2. “Fəqih”: Bu beytdə məişətşünas əql çərçivəsində məhdud olmuş zahiddən ibarətdir.

**Anlam: Zahid qəti bir hüccəti olmadan xəyalat, yaxud təxmin ilə eşq prinsiplərini inkar edir.**

**Qeyd** 1: *Qiyas bu beytdə məntiq elmi bəhs etdiyi “qiyas”, istiqra, təmsil adlı hüccət növlərinə işarə edir.*

**Qeyd** 2: *Hüccət, üç müəyyən çeşidlə tanınmışdır:*

*A: Təxmini faydası olan “qaneedici hüccət”.*

*B: Mübahisədə qalib gələn “ilzami hüccət”.*

*C: Qəti faydalı “məqtu hüccət”.*

Beyt 6: **Mədrəsə içrə müdərris verdigi min dərsdən,**
**Yeydürür meyxanədə bir cam vermək bir gözəl.**

Sözlük: Müdərris – müəllim = dərs verən

**Nişanə** 1. Birinci misra zehn, yaxud əql cəhdilə qazanılmış dünyəvi və zahiri elmə, yaxud həqiqi elmə qabığına razılıq göstərməkdən nişanədir (mərifətsiz elm).

**Nişanə** 2. “Meyxanə”: Mütəal məhbub eşqində məğlub olmuş birüzlü dostlar əncümənindən ibarətdir.

**Qeyd:** *Rəziəddin Ərtimani demişkən meyxanə aşiqin özünə özü vasitəsilə nicat verən mərtəbədən ibarətdir:*

به میخانه آی و صفا را ببین     مبین خویشتن خدا را ببین[1]

**Nişanə** 3. “Cam”: Bu beytdə həzrət mürşüdün mənəvi təlimatından nişanədir.

**Nişanə** 4. İkinci misra ürək cəhdilə qazanılmış “mərifət” adlı həqiqi elmdən, yaxud elmin məğzindən ibarətdir.

---

[1] Qəzəl 91, beyt 1

**Anlam: Bir səhifə mənəvi elm qazancımın kitabı dünyəvi elm mənfəətindən üstündür.**

Beyt 7: **Ey Füzuli, mən dəm urmuşdum səfayi – eşqdən**
**Mətləi – xurşid icad olmadan sübhi - əzəl.**

Sözlük: Mətləi xurşid – gündoğan; Sübhi-əzəl – başlanğıcı olmayan zaman

**Nişanə** 1. “Səfayi-eşq”: İlahi məcnunluq, yaxud mənəvi xalis eşqdən ibarətdir.

**Nişanə** 2. “Mətləi-xurşid”: Yaranışın başlanışını mümkün edən ilahi parlamadan nişanədir.

**Nişanə** 3. “Sübhi-əzəl”: Maddə müddətdən üstün bir məna yağdıran ilahi ziyalar başlanğıcından ibarətdir.

**Anlam: Ey Füzuli, mən hələ kainat yaranmazdan əvvəl ilahi eşq ilə tanış olmuşdum.**

**Qeyd:** *Bütün kainat, “inna lillah” nöqtəsindən parlayan nurdan yaranmışdır*.

## Q Ə Z Ə L 163

(1) Canə basdım gönçəvəş peykanını, ey tazə gül,
Dözmək içün hicrinə düzdüm dəmirdən bir könül.

(2) Vəh nə sahirsən ki, oddan su çıxardın, sudan od,
Tərlədib rüxsarını gül – gül qılanda tabi – mül.

(3) Yandırıb əczayi – tərkibim, külüm versən yelə,
Yox yolundan dönməgim, varım sənindir cüzvü küll.

(4) Mərdümi – çeşmim yığar navəklərin mümkün sanır,
Ol ağaclar birlə tutmaq əşk dəryasinə pül.

(5) Ey könül, lövhi - əməl nəqşi – bəqadən sadədir,
Fani etmə ömrün ol sevdadə kim, baqi degül.

(6) Surətara olma, təhsili – kəmali – mə`ni et
Kim, bəhayim növ`ün etməz adəmi zərbəft cül.

(7) Nola dersəm qədr ilə əfzun Məsihadən səni,
Yerü göy mizan olub fərq olmuş ağırdan yünül.

(8) Atəşi – dil öylə suzandır ki, basmaz hiç kim,
Rəhm edib navəklərindən özgə zəxmim üzrə kül.

(9) Hasilin əvvəl qəmi – canandır, axir tərki – can,
Bu imiş qismət, Füzuli, xah ağla, xah gül.

Beyt 1: **Canə basdım gönçəvəş peykanını, ey tazə gül,**
**Dözmək içün hicrinə düzdüm dəmirdən bir könül.**

Sözlük: Qönçəvəş – qönçə kimi = qönçəyə bənzər;  Peykan – ox ucu

**Nişanə** 1. “Qönçə”: Bu beytdə ürək açan ilahi ilhamlara işarə edən nişanədən ibarətdir.

**Nişanə** 2. “Peykan”: İstedadsız aşiqin qəlbini yaralamaq ilə onu kamal mərtəbəsinə yönəldən qəmzə satmaqdan ibarətdir.

**Nişanə** 3. “Tazə gül”: Bu beytdə aşiqi ürək açan şühud nurundan məhrum saxlamış mütəal məhbubdan nişanədir.

**Nişanə** 4. “Hicr”: Canan cazibələri qəlbində mühafizə olmuş aşiqin müşahidə nurundan məhrumluq nişanəsidir.

**Nişanə** 5. “Dəmir könül”: Aşiqin cövrü cəfa vasitəsilə, yaxud qəbzlər tərbiyəsi ilə istedad qazandığından nişanədir.

**Anlam: Ey həkimi-məhbub, mən hicran hikmətini düşünürkən qəbzlər çətinliyini səbr ilə qəbul etmişəm.**

Beyt 2: **Vəh nə sahirsən ki, oddan su çıxardın, sudan od,**
**Tərlədib rüxsarını gül – gül qılanda tabi – mül.**

Sözlük: Vəh – afərin = alqış = əcəba; Sahir – cadugər = əfsunkar; Ruxsar – özəl = camal; Tab – şöləl103nmiş = nur; Mül – şərab

**Nişanə** 1. “Sahir”: Aşkar hüsn ilə ürəklərdə təsərrüf edən gizli məhbubdan nişanədir.

**Nişanə** 2. “Tərki-rüxsar”: İlahi lütflər əks etdirən hüsndən nişanədir.

**Nişanə** 3. “Gül – gül tab qılmaq”: Aşiqin qəlbini “nari-məhəbbət[1]” qələbəsi ilə safa çıxaran hüsndən nişanədir.

**Nişanə** 4. “Mül”: Bu beytdə həzrəti mürşüdün zahirə qalib gəlmiş batinindən, yaxud şühud nurunun qələbələrindən nişanədir.

**Anlam: Bu beyt xüsusi ilə ikinci misra, çöl həyatın əkslər barışığından hasil olduğuna[2], işarə edərək daxili, yaxud həqiqi həyat nailiyyətini də ilahi lütf ilə qəhr barışığı ilə bağlı təlqin edir.**

---

[1] Qəzəl 54, beyt 7
[2] زندگانی آشتی ضدهاست      مرگ آن کاندر میانشان چنگ خاست
مولوی، مثنوی، دفتر 1، بیت 1324

Beyt 3: **Yandırıb əczayi – tərkibim, külüm versən yelə,**
**Yox yolundan dönməgim, varım sənindir cüzvü küll.**

Sözlük: Kül – bütövü

**Nişanə** 1: "Varım sənindir cüzvi küll": Aşiq, bir cüz qədəri vücuduna malik olsa belə, onda iki malik olmalıdır: Bir aşiq – bir məşuq. Beləliklə:

A: İkilik – vəhdət məqamı ilə tuş və uyğun gələn anlayış deyildir.

B: Məmlükün malik olmağı təzadlı bir anlayış və mümkünsüz bir xəyaldır.

C: Aşiq varlığını büsbütün məşuquna qurban etməlidir. O, bir cüz qədəri mənliyini və özlüyünü saxlasa bir o qədər də fədakarlıqdan uzaqdır[1]

**Anlam: Eşq daxili yaxud həqiqi ölməz vücud ilə bağlı olduğuna görə intəhasız və zavalsızdır.**

Beyt 4: **Mərdümi – çeşmim yığar navəklərin mümkün sanır,**
**Ol ağaclar birlə tutmaq əşk dəryasinə pül.**

Sözlük: Mərdümi-çeşm – göz bəbəyi; Navək – ox = nazik məxsus ağac ucuna nəsb edilmiş ox ucu; Əşk – göz yaşı; Pol – körpü

**Nişanə** 1. "Navək": Bu beytdə vəfa rayihəli cəfadan, yaxud qəbz ünvanlı ilahi əlaqədən gizli istifadə etmək nişanəsidir.

**Nişanə** 2. "Əşk": Bu beytdə aşiqin səbrini yuyub – aparan biqərarlıqdan nişanədir.

**Anlam: Bəst rayihəli qəbz vasitəsilə biqərarlıqdan azad olmaq mümkünsüzdür.**

Beyt 5: **Ey könül, lövhi - əməl nəqşi – bəqadən sadədir,**
**Fani etmə ömrün ol sevdadə kim, baqi degül.**

Sözlük: Lövh – səhifə; Bəqa – əbədi = axirət evi; Baqi – sabit = möhkəm

**Nişanə** 1. "Lövhi-əməl": Bu beytdə dünyəvi ilgilər məğlubiyyətində mənəvi istəklər təsirindən məhrum qalmış ürəkdən ibarətdir.

**Nişanə** 2. "Nəqşi-bəqa": Zavalsız nəqş və əsərdən ibarətdir.

---

[1] Qəzəl 1, beyt 6, nişanə 2

**Anlam: A: Ey könül, lövhi-əməldə (ürəyində) rəsm etdiyin zavala məruz qalmış dünyəvi istəklərdən özünü azad etməlisən.**

**B: Ey könül dünyəvi istəklər məşğulluğunda lövhi-əməli ilahi istəklər təzahüründən aciz etmisən.**

Beyt 6: **Surətara olma, təhsili – kəmali – mə`ni et**
**Kim, bəhayim növ`ün etməz adəmi zərbəft cül.**

Sözlük: Surətara = üz bəzətmək = rəssam; Məni – məna; Bəhayim = dörd ayaqlılar, zərbəft = zərli, Cül – çöl

**Nişanə** 1. Surətara = Zavala məruz qalmış zahiri hüsnlər məşğulluğundan nişanədir.

**Nişanə** 2. "Məni": İlahi məqsud və batini inkişafdan nişanədir.

**Anlam: Qızıl çöldə yaşasa da, heyvan insan olmaz, beləliklə sərvət, qüdrət və mal – dövlət sahibi olsa belə. Dünyəvi imtiyazlarla insana bənzər şəxsin insanlıq məqamına nail olması mümkünsüzdür.**

**Qeyd:** *Beyt, mənəvi imtiyazların yaxud batini vücudun əzəmətini təkid edərkən ötən beytdə qeyd olunmuş lövhi-əməli təhqir etmək istəyir.*

Beyt 7: **Nola dersəm qədr ilə əfzun Məsihadən səni,**
**Yerü göy mizan olub fərq olmuş ağırdan yünül.**

Sözlük: Əfzun – çox; Məsiha – İsa peyğəmbər

**Anlam: Beyt mürşüd həzrətinin yer üzərində hidayətedici və təlimatçı olduğunu göylərə yüksəlməkdən üstün təlqin edir.**

**Qeyd** 1: *Beyt İsa peyğəmbərin dördüncü göyə yüksəlməyinə işarə edir*[1].

**Qeyd** 2: *Beyt yüngülün göyə yüksəlməyini və ağırın yerdə qalmağını, "hüsni-təlil" sənəti ilə dəlilləşdirir*[2]

Beyt 8: **Atəşi – dil öylə suzandır ki, basmaz hiç kim,**
**Rəhm edib navəklərindən özgə zəxmim üzrə kül.**

Sözlük: Suzan – yandırıcı = yanar; Zəxm – yara

---

[1] Qəzəl 133, beyt 5
[2] Qəzəl 133, beyt 5

**Anlam: “Nari-məhəbbət” atəşində biqərar olmuş qəlbin dərmanı yalnız həzrət məhbubun vəfa rayihəli cəfalarından (navəklər) ibarətdir. Buna görə də heç kim yarama dəva etməyir.**

Beyt 9: **Hasilin əvvəl qəmi – canandır, axir tərki – can,**
**Bu imiş qismət, Füzuli, xah ağla, xah gül.**

Sözlük: Xah – istər

**Nişanə** 1. “Qəmi canan”: Bu beytdə həsrət atəşində alovlanmış ürəyin “çırpıntı” adlı biqərarlığından nişanədir.

**Nişanə** 2. “Tərki-can”: Bu beytdə mükəmməl fədakarlıqdan nişanədir.

**Anlam: Eşq, dünyəvi ömür möhlətində ürək çırpıntısıyla başlayaraq candan keçməklə sona çatır.**

## Q Ə Z Ə L 164

**(1) Degilsən çoxdan, ey gərdun, cəhan seyrində yoldaşım,**
**Nola xəm olsa qəddin, səndən artıqdır mənim yaşım.**

**(2) Tərazuyi - əyari – möhnətəm bazari – eşq içrə,**
**Gözüm hər dəm dolub, min daşə hər saət dəgər başım.**

**(3) Sirişkim al, bağrım parə, bir kuhi – bəlayəm kim,**
**Həmişə laləvü lə`l ilə rəngindir içim, daşım.**

**(4) Mənə manənd bir divanə surət bağlamaz, guya**
**Qələm sındırdı təsvirim çəkəndən sonra nəqqaşım.**

**(5) Füzuli, xazini – gənci – vəfayəm, ol səbəbdəndir,**
**Gühərlər tökdü israf ilə bu çeşmi – gühərpaşım.**

Beyt 1: **Degilsən çoxdan, ey gərdun, cəhan seyrində yoldaşım,**
**Nola xəm olsa qəddin, səndən artıqdır mənim yaşım.**

Sözlük: Gərdun – fələk = zəmanə; Xəm – ayrı = qövs = hilali

**Nişanə** 1. "Gərdun": Bu beytdə insanların alın yazısına təsir edici ay – ulduz seyrindən nişanədir[1]

**Nişanə** 2. "İkinci misra": A: İnsanların yaranış mənşəyi həzrəti peyğəmbərin nuru olduğundan onlar bütün kainatdan, o cümlədən göylərdən öncə yaranmışlar. Bu mənanı təlqin etmək məqsədilə demişlər: "ان الله تبارک و تعالا خلق نور محمد...، قبل خلق السماوات،....،": ("Həqiqətən Allah-təala göylərin, yerin,..., və həzrəti Adəmin yaranmasından əvvəl həzrət Məhəmmədin (s) nurunu yaratdı[2]").

B: Yerin və göylərin insan xatirinə yaranmasına görə, yaxud məqsəd və nəticə axırda zahir olsa da əvvəlcə nəzərdə tutulduğundan[3], aşiqin ömrü göylərin ömründən artıqdır.

C: Mənəvi aləm maddi dünyadan əvvəl yaranmaqla, insanın mənəvi həyatını onun yadına salaraq, ömründə maddi asimanlar ömründən artıq təlqin edir.

**Anlam: Aşiq, "hüsni-təlil"[4] sənətinə əsaslanaraq bükülmüş qəddi artıq ömür əlaməti bildirir.**

Beyt 2: **Tərazuyi - əyari – möhnətəm bazari – eşq içrə,**
**Gözüm hər dəm dolub, min daşə hər saət dəgər başım.**

**Nişanə** 1. "Möhnət": Möhnət və məhəbbət qədimi qoşa yoldaşdırlar. Məhəbbətdən dəm vuran bir şəxsin qəlbini – canını sınaqlara çəkməklə, onun naqisliyini, yaxud kamilliyini üzə çıxarıb aydınlaşdıran yalnız möhnətdir.

**Nişanə** 2. "Bazari-eşq": İlahi əhvali-ruhiyyə başlanışından xəbərdar olmuş aşiqin mövqeiyyətindən nişanədir.

**Nişanə** 3. "Gözün dolmağı": Gah təcəlli nuru ilə, gah şühud saxlanılması ilə əxz edilmiş ülvi mərifətlərdən nişanədir.

**Nişanə** 4. "Daşa baş demək": Qəbz sıxıntılarıyla əxz edilmiş mənəvi təcrübələrdən istiarədir.

---

[1] Qəzəl 71, beyt 4, nişanə 3
[2] Qəzəl 136, beyt 2
[3] Qəzəl 153, beyt 1
[4] Qəzəl 133, beyt 5

**Anlam: Eşqdən dəm vuran şəxslərin naqisliyini yaxud kamilliyini üzə çıxaran xüsusi əyar qabı mənim eşqimdən ibarətdir.**

Beyt 3: **Sirişkim al, bağrım parə, bir kuhi – bəlayəm kim,**
**Həmişə laləvü lə`l ilə rəngindir içim, daşım.**

Sözlük: Sirişk – göz yaşı; Kuh – dağ

**Nişanə** 1. "Sirişki-al": Dünyəviliyini yuyub batil edən nişanədən ibarətdir.

**Nişanə** 2. "Parə bağır": Mənəvi vüsala maneələr törətmiş dünyəvi həyat istiqamətini təlqin edən nişanədir.

**Qeyd:** *Bağrın paralanması şühud nailiyyətini yaxud mənəvi görüşləri mümkün edən müqəddiməyə eyham edir. Elə buna görə də Mövləvi ilahi görüşü ürəkdən açılmış qapıya əsas şərt bilib buyurmuşdur:*

هر که را از سینه باشد فتح باب       اوز هر شهری ببیند آفتاب[1]

**Nişanə** 3. "Kuhi-bəla": Ətəş və həsrət mənşəli münacatlar ilə əxz edilmiş mənəvi istedaddan istiarədir.

**Nişanə** 4. "Lalə": Aşiqin qəlbini ətəş atəşilə dağlayan ilahi camal qələbələrindən nişanədir.

**Nişanə** 5. "Ləl": Bu beytdə vasitəsiz eyhamlar məğlubiyyətində fiziki mahiyyətini batil etməyə hazırlaşmış aşiqdən nişanədir.

**Anlam: Bu beyt də aşiqin müxtəlif sınaq – sıxıntılar ilə fanilik məqamına hazırlaşdığını təlqin edir.**

Beyt 4: **Mənə manənd bir divanə surət bağlamaz, guya**
**Qələm sındırdı təsvirim çəkəndən sonra nəqqaşım.**

Sözlük: Manənd – bənzər; Surət bağlamaq – xəyala gəlmək = təsvir etmək = mümkün olmaq = fikrindən keçmək

**Nişanə** 1. "Divanə": Həyəcanla biqərar olmuş aşiqdən ibarətdir[2].

**Nişanə** 2. "Qələm sındırmaq": Bir işi tərk etməkdən, yaxud işi başqa bir şəxsə tapşırmaqdan nişanədir.

**Nişanə** 3. Nəqqaş: A: Bu beytdə qadir Allahın "müsəvvər"[3] adlı surət verən sifətinə işarə edir.

B: Nəqqaş insanın alın yazısına təsir edən ulduz və ayı təlqin edir.

---

[1] مولوی، مثنوی، دفتر 1 ، بیت 1435

[2] Qəzəl 145, beyt 3

[3] هو الله الخالق الباری المصور،...: ("O yaradan, yoxdan var edən, surət verən Allahdır"): Quran, Həşr surəsi, 24-cü ayə

C: Nəqqaş mütəal məbud hökmü ilə insanın alın yazısını yazan mələkdən istiarədir.

**Anlam: Mənim alın yazımı şərif ayədə "**[1]**ليس كمثله شيى" ("Onun bənzəri yoxdur) buyurulduğu həzrəti məhbub kimi heç bir şeyə bənzətmək mümkün ola bilməz.**

Beyt 5: **Füzuli, xazini – gənci – vəfayəm, ol səbəbdəndir,**
**Gühərlər tökdü israf ilə bu çeşmi – gühərpaşım.**

Sözlük: Xazin – xəzinəçi = güdükçü; Gənc – xəzinə; Gühər – gövhər; Çəşm – göz; Gühərpaş – gühər yağdıran = gövhər səpən

**Nişanə** 1. "Gənc": Bu beytdə pərəstiş, yaxud bəndəlik məqamından nişanədir.

**Nişanə** 2. "Vəfa": Bu beytdə "ələst" aləmində qol çəkilmiş öhdəlik sənədinə dəqiqliklə əməl etməkdən nişanədir[2].

**Nişanə** 3. "Gühər": Bu beytdə kamil bir insanın həqiqətini üzə çıxaran biqərarlıqdan nişanədir.

**Anlam: Ey Füzuli əhd sənədinə vəfadar olmağa görə bir belə biqərarlıq edirəm.**

---

[1] Quran, Şura surəsi, 11-ci ayə

[2] Qəzəl 19, beyt 4

## **Q Ə Z Ə L 165**

**(1) Tənimdə zəxmi – tiğin çeşmi – xunəfşanə bənzətdim,**
**Oxun kim, səf – səf ətrafındadır, müjganə bənzətdim.**

**(2) Bəqayi – ruhimi bildim zülali – lə`li – nabindən,**
**Həyatımdaır dedim, bağrıma basdım, qanə bənzətdim.**

**(3) Sökülmüş köksümü kim, doludur qəmzən xəyalilə,**
**Həramilər yatağı mənzili – viranə bənzətdim.**

**(4) Tənimdən incinib çıxmış rəvan can kimi peykanın,**
**Neçün incinməsin, yetdikdə zövqün, canə bənzətdim.**

**(5) Gözümdə bəslənib, qiymət bulan peykanını gördüm,**
**Sədəfdə gövhər olan qətreyi – baranə bənzətdim.**

**(6) Füzuli, öldürər hər dəm məni əhli – nəzər tə`ni**
**Ki, neyçün yar lə`lin çeşmeyi – heyvanə bənzətdim.**

Beyt 1: **Tənimdə zəxmi – tiğin çeşmi – xunəfşanə bənzətdim,**
**Oxun kim, səf – səf ətrafındadır, müjganə bənzətdim.**

Sözlük: Zəxm – yara; Çeşm – göz; Xunəfşan – qan ağlayan = qan tökən; Müjgan – kipriklər

**Nişanə** 1. "Yaranmış tən": Mücərrədlik məqamına hazırlaşmış vücuddan nişanədir.

**Nişanə** 2. "Çeşmi-xunəfşan": Dünyəviliyi yuyub batil etməklə şühud uzantısını mümkün edən nişanədir.

**Nişanə** 3. "Ox": Aşiqi kamal mərtəbəsinə hazırlayan ilahi qəmzələrdən nişanədir.

**Nişanə** 4. "Müjgan": Bu beytdə həzrəti məhbubun əhatə edici xüsusi sifətindən nişanədir. Bu nişanəni təlqin etmək məqsədilə şərif ayədə buyurulmuşdur: "انه یکل شی محیط[1]"("Allah hər şeyi əhatə edəndir"). Beləliklə, kəsrətin vəhdət güzgüsü olduğu, yaxud yaradıcı məbudun hər bir yaranmışda cilvə etməsi açıq-aşkar məlum olur, elə buna görə də digər şərif ayədə buyurulur: "فاینما تولو فتم وجه الله[2]" ("Hər hansı tərəfə üz tutsanız [əslində] Allaha tərəf üz tutubsunuz"). Ulu Şeyx Sədi bütün kainatda ilahi camal cilvəsini görməklə onları aşiqanə tərzlə əzizləyir:

به جهان خرم از آنم که جهان خرم از اوست
عاشقم بر همه عالم که عالم ازوست

**Anlam: Qəmzə satmaqlar əhatəsində olduğumu vüsal məqamına bənzədirəm.**

Beyt 2: **Bəqayi – ruhimi bildim zülali – lə`li – nabindən,**
**Həyatımdaır dedim, bağrıma basdım, qanə bənzətdim.**

Sözlük: Bəqa – əbədi = əbədi həyat = əbədilik; Nab – xalis

**Nişanə** 1. "Ruh": Bu beytdə şərif ayədə: ویسئلونک عن الروح. قل الروح من امر ربی و ما اوتیتم من العلم الا قلیلا[3]: ("Səndən ruh haqqında soruşurlar. De, ruh mənim Rəbbimin əmrindədndir və sizə o barədə yalnız az bir məlumat verilibdir"). Buyurulan, lətif, həqiqi və müdrik olan insanı ruhdan ibarətdir.

**Nişanə** 2: "Zülali-ləli-nabin": Ölməz həyat bağışlayan ilahi ilham – işarədən nişanədir.

---

[1] Quran, Füssilət surəsi, 54-cü ayə
[2] Quran, Bəqərə surəsi 115-ci ayə
[3] Qəzəl 111, beyt 2

**Nişanə** 3. “Qan”: A: Qırmızı olduğundan fiziki əngəl mahiyyətini batil edən nişanədən istiarədir.

B: Cismi həyatın qan dövranına bağlı olduğundan batini həyatı da qan nişanəsi ilə təmsil etmişlər.

**Anlam: Fiziki əngəl mahiyyətini məğlub etməklə mən həqiqi ölməz həyat bağışlayan ilham – işarələri alqışlayıram.**

Beyt 3: **Sökülmüş köksümü kim, doludur qəmzən xəyalilə,**
**Həramilər yatağı mənzili – viranə bənzətdim.**

**Nişanə** 1. “Sökülmüş köks”: İlahi görüşü mümkün edən ürəkdən açılmış qapını təlqin edir.

**Qeyd:** *Ürək çatı (sökülmüş) ürəyin içi dolu təzyiqinə də işarə edir.*

**Nişanə** 2. “Qəmzə xəyali”: Ürəyin “fuad” adlı 4-cü mərtəbəsilə idrak olunmuş qəmzələrdən ibarətdir[1].

**Nişanə** 3. “Həramilər”: Eşq səmasında zahir olunmuş müxtəlif cilvə və vasitələrə, həmçinin aşiqin batinində dəmbədəm peyda olan yeni hallar və maraqlara “həramilər” demişlər. Çünki onlar, aşiqin əqlini, elmini və ad – sanını ard-ardınca qarət edirlər. Lisanülqeyb Hafiz bu həramiləri “luli”, “şux” və “rahzən” (“yolkəsən”) ünvanı ilə təlqin etmişdir:

فغان کاین لولیان شوخ شیرین کار شهر آشوب
چنان بردند صبر ار دل که ترکان خوان یغمارا[2]

------------

شد رهزن سلامت زلف تو وین عجب نیست
گر راهزن تو باشی صد کاروان توان زد

**Nişanə** 4. “Yataq”: İlahi əhvali-ruhiyyə uzantısını təlqin edən nişanədir.

**Anlam: Şühud uzantısının əlaməti ürəkdən açılmış qapıdır.**

Beyt 4: **Tənimdən incinib çıxmış rəvan can kimi peykanın,**
**Neçün incinməsin, yetdikdə zövqün, canə bənzətdim.**

Sözlük: Çıxmış rəvan – rahat çıxmış = asanlıqla çıxmış

**Nişanə** 1. “Zövq”: Mənəvi dadını aşiqə dadızdıran ilahi qəmzə satmaqlardan yaxud şühud məqamının ilk mərtəbəsindən nişanədir.

---

[1] Qəzəl 13, beyt 1
[2] Müəllif bu beytləri “Ta Qafe-əndişe” kitabının 1-ci və ikinci cildində şərh etmişdir

**Nişanə** 2. “Peykan”: Bu beytdə qəbz və qəmzə ilə sınağa çəkmək nişanəsidir.

**Anlam: Candan daha əziz olan qəbzlər və qəmzələr əzabını, yaxud şühud ləzzətini cana bənzətməklə qədrbilməzlik və mərifətsizlik göstərdim. Buna görə də onlar (qəbzlər və qəmzələr) məndən uzaqlaşdılar.**

**Qeyd:** *Qəbz və qəmzə mənşəli cəfa da vəfa kimi sözə - ibarəyə sığmaz bir lütfdür.*

Beyt 5: **Gözümdə bəslənib, qiymət bulan peykanını gördüm,**
**Sədəfdə gövhər olan qətreyi – barənə bənzətdim.**

Sözlük: Peykan – ox = ox ucu (dəmir); Baran – yağış

**Anlam: Yağış damlasından mirvari düzəldən sədəf kimi, aşiqin gözündən axan qan yaş qəmzələr oxunu qızıla döndərir.**

**Qeyd:** *Beyt, mütəal məhbub məsləhət bildiyi ziyanları uğurlu və xeyirli tanıtdırmaq istəyir.*

Beyt 6: **Füzuli, öldürər hər dəm məni əhli – nəzər tə`ni**
**Ki, neyçün yar lə`lin çeşmeyi – heyvanə bənzətdim.**

Sözlük: Tən = tənə; Çeşmeyi heyvan – dirilik suyu (rəvayətlərdə deyildiyi kimi çeşmeyi-heyvan “zülmət” adlı qaranlıq bir məntəqədə özəl bir çeşmədən ibarətdir ki, guya İsgəndər onu çox axtardı, ancaq tapa bilmədi, lakin Xızır peyğəmbər ona çatarkən suyundan içib əbədi bir həyata nail oldu[1].)

**Nişanə** 1. “Əhli-nəzər”: Bu beytdə zəngin fikirli mənəviyyətşünaslardan nişanədir.

**Nişanə** 2. “Ləl”: Bu beytdə bütün yaranmışlara hətta “cövhər” adlı iç aləmə həyat, yaxud varlıq bağışlayan “rəhmani nəfəs” ünvanlı ilahi feyzdən ibarətdir.

**Nişanə** 3. “Çeşmeyi-heyvan”: Bədən həyatını davam etdirən imtiyaz – iqtidardan nişanədir.

**Anlam: Bu beyt isə 4-cü beyt kimi heç bir şeyə bənzər olmaz məhbubu bəşəri bənzətmələr ilə vəsf etmiş aşiqi tənqid və mühakimə edir.**

---

[1] Doktor Məhəmməd Moin, Fərhənge-Moin, Əlam

## Q Ə Z Ə L 166

(1) Eşqdən canımda bir pünhan mərəz var, ey həkim!
Xəlqə pünhan dərdim izhar etmə, zinhar, ey həkim!

(2) Var bir dərdim ki, çox dərmandan artıqdır mənə,
Qoy məni dərdimlə, dərman eyləmə, var ey həkim!

(3) Gər basıb əl nəbzimə, təşxis qılsan dərdimi,
Al əmanət, qılma hər bidərdə izhar, ey həkim!

(4) Gəl mənim tədbiri – bihudəmdə sən bir səy qıl
Kim, olam bu dərdə artıqraq giriftar, ey həkim!

(5) Gör təni – üryan ilə əhvalımı hicran günü,
Var imiş ruzi – qiyamət, qılma inkar, ey həkim!

(6) Gəkməyincə çareyi – dərdimdə zəhmət bilmədin
Kim, olur dərmani – dərdi – eşq düşvar, ey həkim!

(7) Rənc çəkmə, sihhət ümmidin Füzulidən götür
Kim, qəbuli – sihhət etməz böylə bimar, ey həkim!

Beyt 1: **Eşqdən canımda bir pünhan mərəz var, ey həkim!**
**Xəlqə pünhan dərdim izhar etmə, zinhar, ey həkim!**

Sözlük: Zinhar – aman

**Nişanə** 1. “Mərəz”: Tanrı və təbiət ünvanlı iki başlanğıcdan yaranmış mürəkkəb insanı Tanrıya qovuşdurmaq məqsədilə təbiətdən ayrılmağa hazırlayan müqəddiməyə “mərəz” demişlər.[1]

**Nişanə** 2. “Pünhan dərd”: Yarı vücudu göydə saxlanılmış insanın yer sakinliyində, yaxud dünyəvi həyat hissədində toxtaqlıq tapa bilməyən acı – şirin qərarsızlığından nişanədir.

**Anlam: Eşq xəstəliyi ilahi sirr ilə bağlı olduğundan onu gizli saxlamaq vacibdir.**

Qeyq 1: Mənsur Həllac deyirdi ki,eşq siriirni faş etmiş aşiqlər ölümə məhkum olmuşlar.

Qeyq 2: Kafir edam olunmaqla cəhənnəmə yollanır.

Qeyq 3: Arif edam olunmaqla behiştə yollanır.

Beyt 2: **Var bir dərdim ki, çox dərmandan artıqdır mənə,**
**Qoy məni dərdimlə, dərman eyləmə, var ey həkim!**

**Anlam: Aşiqi öz camalı ilə xəstələndirib ona öz müşahidəsilə dərman edən yalnız vahid məhbub olduğundan demişlər ki: “ الطّبيبُ امرضنى”[2] (“Həkim olan məhbubum məni xəstələndirmiş”). Buna görə də beyt eşq dərdindən xəbərsiz olan həkim ünvanlı aciz nəsihətçini tənqid edir.**

Beyt 3: **Gər basıb əl nəbzimə, təşxis qılsan dərdimi,**
**Al əmanət, qılma hər bidərdə izhar, ey həkim!**

Sözlük:  Təşxis – ayırd etmək = tanımaq; Al əmanət = əmanət = amandır

**Nişanə** 1. “Nəbz”: Batini əhvali-ruhiyyənin zahiri vücudda təzahür etmək nişanəsidir.

**Nişanə** 2. “Bidərd”: Dünyaşünas əql məhdudluğunda eşq aləmindən xəbərsiz qalmış şəxsdən ibarətdir.

**Nişanə** 3. “Həkim”: Bu beytdə eşq müqəddiməsindən xəbərdar olmuş alimdən nişanədir.

---

[1] Qəzəl 81, beyt 6

[2] Əli Səadətpərvər, Cəmali-aftab, cild 2. səh.290

**Anlam: Ey alim, batini əhvalımdan xəbərdar olsan da, əql əhlinə, yaxud naməhrəm olan şəxslərə onu faş etməkdən çəkinmək məsləhətdir.**

**Qeyd:** *Bu anlam, yaxud bu beyt, Mövləvi qeyd etdiyi şah ilə kəniz hekayəsinə işarə edir.*[1]

Beyt 4: **Gəl mənim tədbiri – bihudəmdə sən bir səy qıl**
**Kim, olam bu dərdə artıqraq giriftar, ey həkim!**

Sözlük: Bihudə – batil = hədər = faydasız; Səy – cəhd = çalışqanlıq

**Anlam: Eşq dərdi ilahi bir hədiyyə olduğuna görə aşiq onun daha artıq olmasını dua və münacat ilə tələb edir.**

Qeyq : Bu beyt Məcnunun Kəbədə öz atasının kənarında Allah-təaladan daha artıq dərd tələb etməsinə işarə edir.[2]

Beyt 5: **Gör təni – üryan ilə əhvalımı hicran günü,**
**Var imiş ruzi – qiyamət, qılma inkar, ey həkim!**

Sözlük: Ruzi-qiyamət – qiyamət günü

**Nişanə** 1. “Təni-üryan”: Əqli, elmi ad-sanı qarət edilmiş vücuddan nişanədir.

**Nişanə** 2. “Əhval”: Bu beytdə qəbz mərhələsində hasil olmuş ürəksıxan hədiyyədən ibarətdir.

**Nişanə** 3. “Qiyamət”: “İxtiyari ölüm” ünvanlı mərtəbədə bir ölü kimi bəşəri sifətləri karsız edib ilahi sifətləri canlandırmağa “qiyamət” demişlər. Mövləvi, ölü cismin dəniz üzündə qalmağını bəşəri sifətlərini öldürmüş insanın tüğyanlı təhlükələr qarşısında məğlub olmaz vücudundan örnək göstərmək məqsədilə buyurmuşdur:

اب دریا، مرده را بر سرنهد          وربود زنده زدریاکی رهد
[3] چون بمردی توزاوصاف بشر          بحراسرارت نهد برفرق سر

**Nişanə** 4. “Həkim”: Bu beytdə qiyamət günü barədə özü şübhəyə düşməyini dəlilləşdirən şəxsdən nişanədir.

**Anlam: Aşiqi bəşəri iradə - ixtiyardan üryan edən hicran əyyamı qiyamət gününə aid bir örnəkdir.**

---

[1] Mövləvi, Məsnəvi, I dəftər, beyt 101-143
[2] Nizami, “Leyli və Məcnun”
[3] Mövləvi, Məsnəvi, I dəftər, beyt 2904,2905

Beyt 6: **Gəkməyincə çareyi – dərdimdə zəhmət bilmədin**
**Kim, olur dərmani – dərdi – eşq düşvar, ey həkim!**

Sözlük: Düşvar – çətin

**Anlam: Beyt eşq dərdinin çətinliyini təcrübədən keçirmək istəyir.**

Beyt 7: Rənc çəkmə, sihhət ümmidin Füzulidən götür
Kim, qəbuli – sihhət etməz böylə bimar, ey həkim!

Sözlük: Rənc – zəhmət = dərd = cəhd

**Anlam: Bu beyt də aşiqin bəşəri elm və dünyəvi təcrübələrlə sağalmaz dərdini vəsf etməklə onun qeyri maddi şəraitdə yaşamağını təlqin edir.**

## Q Ə Z Ə L 167

**(1) Qəmindən başə dün həsrət əlilə ol qədər urdum**
**Ki, sübh olunca mürdə cismimi torpağə tapşurdum.**

**(2) Büküldü qəddim, ahim yetdi xurşidə, saqın, ey məh**
**Ki, möhnət oxunu peykanladım, qəm yayını qurdum.**

**(3) Demin Məcnunə aşiq kim, başında quş yuva tutmuş,**
**Mənəm aşiq ki, seyli – əşkimi başımdan aşurdum.**

**(4) Gümanından mürəttib eylədi bürhani – isbatın,**
**Nə sahib kəşfə kim, dürci – dəhanın sirrini sordum.**

**(5) Təcərrüd seyrinə sayəmdən özgə bulmadım həmrəh,**
**Təriqi – eşq içində çoxlarilə durdum, oturdum.**

**(6) Həvayi – eşq sərgərdanı olmuş girdibadəm kim,**
**Savurdum göylərə torpağımı hər yerdə kim, durdum.**

**(7) Füzuli, eşqə mühlik derdim, ol məhvəş inanmazdı,**
**Bihəmdillah ki, can vermək təriqilə inandurdum.**

Beyt 1: **Qəmindən başə dün həsrət əlilə ol qədər urdum**
**Ki, sübh olunca mürdə cismimi torpağə tapşurdum.**

Sözlük: Mürdə – ölü

**Nişanə** 1. "Qəm": Bu beyt də fiziki mahiyyət tükəntisilə islam peyğəmbəri buyurduğu "موتو قبل ان تموتو" mərtəbəsindən, yaxud "ixtiyari ölüm" nailiyyətindən məhrum yaşamaq əzabından ibarətdir.

**Qeyd** 1: *Əcəlin gəlişindən əvvəl özünü ixtiyari ölüm ilə öldürmək intihar deyil, bəlkə bəşəri sifətləri məhv etməklə ilahi sifətlərə nail olmaqdan ibarətdir.*[1]

**Qeyd** 2: *Mövləvi seyr yolunun dünyəvi tərəfində insana qarşı çıxan qəddar yolkəsənlər, yırtıcı heyvanlar və yüzlərlə belə fırtınalar və uçurumlar sədəməsindən amanda qalmağı ixtiyari ölümə bağlı bilib buyurmuş:*

مرگ پیش از مرگ امتست ای فتی
این چنین فرمود مارا مصطفی[2]

**Nişanə** 2. "Baş": Əql, fikir, anlam və təcrübə kimi insanı məğrurlandıran səbəblərə "baş" demişlər.

**Nişanə** 3. "Sübh": Aşiqi dünyəvi məşğuliyyətdən kənar olmuş halda təcrid xəlvətinə hazırlayan vəziyyətə işarə edən nişanədən ibarətdir.

**Nişanə** 4. "Mürdə cism": "موتو قبل ان تموتو" mərtəbəsinə nail olmaqdan istiarədir.

**Nişanə** 5. "Torpağa tapşırmaq": Fiziki mahiyyətdən tamamilə azad olmaqdan nişanədir.

**Anlam: Özümü tənbeh və məhv etməklə ilahilik sifətlərindən bəhrələnməyə nail oldum.**

Beyt 2: **Büküldü qəddim, ahim yetdi xurşidə, saqın, ey məh**
**Ki, möhnət oxunu peykanladım, qəm yayını qurdum.**

Sözlük: Meh – mah = ay

**Nişanə** 1. "Bükülmüş qəd": "Məstdir" "hərəkət"[3] nailiyyətini, yaxud ilahi əslə tərəf qayıtmağı təlqin edən istiarədən ibarətdir.

**Nişanə** 2. "Ahım yetdi xurşidə":Ahın xurşidə yetməyi:

A: Dünyəvi maneələrə qalib gəlməkdən nişanədir.

---

[1] Qəzəl 166, beyt 5
[2] Mövləvi, Məsnəvi, dəftər 4, beyt 2291
[3] Qəzəl 1, beyt 1, nişanə "Salik"

B: Ürək münacatını mütəal məhbub ərəfəsinə çatdırmaqdan nişanədir.

**Nişanə** 3. “Məh”: A: Maddə qaranlığında aşiqi şühud nurundan feyziyab edən mürşiddən nişanədir.

B: Maddə ilə məna arasında maneə törətmiş dünyəvi hüsndən nişanədir.

**Nişanə** 4. “İkinci misra”: İkinci misra fiziki mahiyyəti məhv edən əhatəedici bəlalara istedad və alqış göstərməkdən nişanədir.

**Anlam: A: Ey həzrəti-mürşid, bəlalar əhatəsini qəbul etmiş aşiqdən öz təlimat feyzinizi müzayiqə etmə.**

**B: Bəlalar əhatəsində istedadlanmış vücudum dünyəvi maneələrə qalib gəlməlidir.**

Beyt 3: **Demin Məcnunə aşiq kim, başında quş yuva tutmuş,**
**Mənəm aşiq ki, seyli – əşkimi başımdan aşurdum.**

**Nişanə** 1. “Quş”: Bu beytdə aşiqin başındakı fikir və təcrübəyə eyham edən nişanədir.

**Nişanə** 2. “İkinci misra”: İkinci misra fiziki əngəl mahiyyətini tamamilə yuyub məhv etməkdən nişanədir.

**Anlam: Beyt, huşu başından tamamilə uçmayan aşiqi tənqid edir.**

Beyt 4: **Gümanından mürəttib eylədi bürhani – isbatın,**
**Nə sahib kəşfə kim, dürci – dəhanın sirrini sordum.**

Sözlük: Dürc – sandıqça = cəvahir və ətir sandıqçası; Dəhan – ağız

**Nişanə** 1. “Bürhani-isbat”: Fəlsəfi və əməli sübutlardan ibarətdir.

**Nişanə** 2. “Sahib kəşf”: A: “Mükaşifə”[1] ünvanlı irfani mərtəbədə hicablar arxasındakı həqiqətlərdən xəbərdaredici şəxslərə “sahib kəşf” demişlər.

B: Elmi və fəlsəfi sübutlarla qeyri hissi həqiqətlərdən dəm vuran alimə sahib kəşf demişlər.

**Nişanə** 3. “Dürci-dəhan”: Yoxu var edən ilahi işarələlər mənbəyindən istiarədir.

**Anlam: Alim və arif öz zənnincə mütəal məhbubun yoxu var edən feyzini vəsf edir.**

---

[1] Qəzəl 1, “Salik” nişanəsi, haşiyə

**Qeyd:** *Mütəal məhbubun sifətlərini heç bir vəsf çərçivəsinə sığışdırmaq mümkün deyildir.*

Beyt 5: **Təcərrüd seyrinə sayəmdən özgə bulmadım həmrəh,**
**Təriqi – eşq içində çoxlarilə durdum, oturdum.**

Sözlük: Təcərrüd – üryanlıq = mücərrədlik = xəlvət; Həmrəh – həmsəfər = müvafiq; Təriq – yol = təriqət = məzhəb = iş

**Nişanə** 1. "Təcərrüd seyri": İç vücudu da çöl vücud ilə vahid paraleldə üryan edərkən mücərrədlik məqamına nail edən seyrdən ibarətdir.

**Nişanə** 2. "Sayə": Qabığa bürünmüş həqiqətdən nişanədir.

**Anlam: Füzuli, öz yerə - göyə sığmayan həqiqətini yada salaraq, hər bir istəyi özündən tələb edir.**

**Qeyd:** *Peyğəmbərlər və imamlar oda –suya qalib gəlmiş ilahi iqtidar və möcüzəni öz batinlərindən hasil etmiş, onudin və irfanla yanaşı fəlsəfədə alqışlamışlar. "Henri Broksin" adlı bir filosof zənn etmişdir ki: "... həqiqi idrak idrak edən ilə idrak olanın birləşməsindən (vəhdət) ibarətdir (aqil ilə məqulun birliyi) ki bu hal "təsəvvür" və "təsdiq" ilə yox, bəlkə başqa bir elm və qüvvə ilə hasil olar ki, ... bu qüvvənin Broksinin bəyan etdiyi istilaha yaxın tərcüməsi "batin gözü" yaxud "can gözü"dür, beləliklə, batini görmək, özündə görmək və nəhayət vəhdətə nail olmaqdan nişanədir.Elə bu mərtəbəni sifariş etmək məqsədilə şərif ayədə buyurulmuşdur: "نحنُ اقربُ اليه من حبل الوريد"[1]: ("Biz ona [insana] şah damarından daha yaxınıq"[2]).*

Beyt 6: **Həvayi – eşq sərgərdanı olmuş girdibadəm kim,**
**Savurdum göylərə torpağımı hər yerdə kim, durdum.**

Sözlük: Girdibad – burulğan = üzbəüz toqquşub tozanaq qoparan yellər

**Nişanə** 1. "Sərgərdan": İlahi əzəmətlər önündə əql və idrakını quru ağac kimi karsız hiss edib heyran olmuş aşiqdən ibarətdir.

**Nişanə** 2. "Girdbad": Mənəvi seyrlərə maneçilik törətmiş dünyəvi əngəl bağlantılarını qıran – qoparan şəraitdən nişanədir.

---

[1] Quran, Qaf surəsi, 16-cı ayədən bir qismət

[2] Qəzəl 32, beyt 7

**Anlam: Batini ölməz vücudumu zahiri əngəl vücud həvəsindən azad etmək məqsədilə özüm özümlə mübarizə edirəm.**

Beyt 7: **Füzuli, eşqə mühlik derdim, ol məhvəş inanmazdı,
Bihəmdillah ki, can vermək təriqilə inandurdum.**

Sözlük: Mühlik – həlak edici = ölümcül; Məhvəş – aybəniz = gözəl; Bihəmdillah – Allaha şükür

**Nişanə** 1. "Mühlik": Aşiqin özünü özündən azad edən, yaxud qətl ünvanlı qurbanlıq məqamına hazırlayan mərtəbədən nişanədir.[1] Elə buna görə də buyurmuş ki:

**Verməyən canı sənə bulmaz həyati-cavidan
Zəndeyi-cavid ona derlər ki, qurbandır sana.**

**Nişanə** 2. "Can vermək": Qurbanlıq məqamına nail olmaqdan nişanədir.

**Nişanə** 3. "Məhvəş": A: Bəşəri camalda ilahi hüsnlər əks etdirmiş dilbərdən nişanədir.

B: Mənəvi rayihədən bəhrələndirən ilahi vasitələrdən yaxud mürşid həzrətindən ya da mütəal məhbubun özündən nişanədir.

**Nişanə** 4. "İnandurdum": Qurban məqamına nail olmaq istedadını nişan verməkdən ibarətdir (fədakarlıq göstərmək).

**Anlam: Fiziki mahiyyətimi bərbad etməklə fədakarlıq istedadımı nişan verdim.**

---

[1] Qəzəl 7, beyt 2

## Q Ə Z Ə L 168

(1) Dəhənin şövqünü cansuz güman etməz idim,
Yoxsa bir dəm onu mən munisi – can etməz idim.

(2) Vəsfi – xali – ləbini bilsə idim naməqdur,
Arizusunda qara bağrımı qan etməz idim.

(3) Xublər aşiqə meyl etmədigin bilsə idim,
Özümü eşq ilə rüsvayi – cəhan etməz idim.

(4) Düşməsəydi gözümün yaşinə feyzi – nəzərin,
Onu hər sərvin əyağinə rəvan etməz idim.

(5) Salmasaydım dili – viranə imarət tərhin,
Onda gənci – gühəri – eşqi nəhan etməz idim.

(6) Sitəmi – təneyi – əğyarə degildim vaqif,
Yoqsa yarın səri-kuyində məkan etməz idim.

(7) Etməsəydi sitəmi – yar, Füzuli, məni – zar,
Bunca fəryad çəkib, ahü fəğan etməz idim.

Beyt 1: **Dəhənin şövqünü cansuz güman etməz idim,**
**Yoxsa bir dəm onu mən munisi – can etməz idim.**

Sözlük: Dəhən – ağız; Cansuz – canı yandıran = yandırıcı

**Qeyd:** *Bu qəzəl başdan-başa maddi varlıq və cismi duyğulardan təmamilə ayrılmadan, yaxud istedad qazanmadan əvvəl məşuq ərəfəsinə yaxınlaşmış aşiqin öz nalayiqliyindən şikayətlənməyini və istedadsızlığına etiraf etməyini təlqin edir.*

**Nişanə** 1. "Dəhən şövqü": Yoxu var edən ilahi ilhamlar mənbəyindən feyzyab olandan sonra yenidən feyz saxlanılmasına giriftar olmuş aşiqin ləzzətlə dolu əzab çəkməyindən nişanədir.

**Nişanə** 2. "Cansuz": Bəşəri aciz vücudunun taqətsizliyini təlqin edən nişanədən ibarətdir.

**Nişanə** 3. "Munisi-can etmək": Bu beytdə safa çıxmayan batin ilə kamal ləzzətini dadmaqdan nişanədir.

**Anlam: Yoxu var edən ilahi, feyzdən düzgün tanışlığım olsaydı, istedad qazanmadan əvvəl (mərifətsiz) onu tələb etməkdən çəkinərdim.**

Beyt 2: **Vəsfi – xali – ləbini bilsə idim naməqdur,**
**Arizusunda qara bağrımı qan etməz idim.**

Sözlük: Naməqdur – mümkünsüz

**Nişanə** 1. "Xali-ləb": Yaranış dairəsinin bəşəri idraka sığmaz mərkəz nöqtəsindən yaxud ilahi gizli sirrdən nişanədir.

**Nişanə** 2. "Qara bağır": Şəxsi və zehni qatmalardan safa çıxmayan batindən nişanədir[1].

**Nişanə** 3. "Qara bağrı qan etmək": İstedadsız cəhd etməkdən, yaxud nəticəsiz çalışqanlıqdan nişanədir.

**Anlam: Beyt bütün kamalların mərifət ilə bağlı olduğunu təlqin edərək, mərifətsiz aşiqin cəzalanmağını qəti bir qanun kimi təlqin etmək istəyir. Elə buna görə də Füzuli buyurmuş ki:**

**Gözüm kim bağrımın qanın tökər pərkalə - pərkalə,**
**Dəmadəm arizuyi-ləli canan, etdigimdəndir.**

---

[1] Qəzəl 142, beyt 1, qeyd 2, 3, 4 və 5

Beyt 3: **Xublər aşiqə meyl etmədigin bilsə idim,**
**Özümü eşq ilə rüsvayi – cəhan etməz idim.**

Sözlük: Xub – gözəl = qəşəng = bəyənilmiş

**Nişanə** 1. “Xublər”: A: İlahi eşq aləminə yönəldən vasitələrdən ibarətdir.

B: Bəşəri simada ilahi hüsnlər əks etdirmiş gözəllərdən nişanədirlər.

**Nişanə** 2. “Rüsvayi-cəhan”: A: “Rüsvayi” ağlı azmaq məhkumluğuna giriftar olmuş aşiqdən nişanədir.

B: Mərifətsizlik xəcalətinə giriftar olmuş aşiqdən nişanə.

**Anlam: Fiziki mahiyyət məhvliyindən əvvəl aşiqdən dəm vurmaq günahından xəbərdar olsaydım, özüm özümü xəcil etməzdim.**

Beyt 4: **Düşməsəydi gözümün yaşinə feyzi – nəzərin,**
**Onu hər sərvin əyağinə rəvan etməz idim.**

**Nişanə** 1. “Göz yaşı”: İçərini paklandırmaqla mənəvi ətəş və tələbi əlavələndirən biqərarlıqdan nişanədir.

**Nişanə** 2. “Feyzi-nəzər”: Bu beytdə ilahi kamal rayihəsindən nişanədir.

**Nişanə** 3. “Sərv”: Bax beyt 3, nişanə 1

**Anlam: Mənəvi kamal rayihəsindən xəbərdar olmasaydım, ilahi vasitələr tənbihinə səbr edə bilməzdim.**

Beyt 5: **Salmasaydım dili – viranə imarət tərhin,**
**Onda gənci – gühəri – eşqi nəhan etməz idim.**

Sözlük: Tərh – nəqşə = sərmək; Gənc – xəzinə

**Nişanə** 1. “Dili-viran”: Nəfəs almaqla canlanmış ürəkdən, yaxud fiziki mahiyyətə bağlı batindən nişanədir.

**Nişanə** 2. “İmarət”: Maddi dünyaya diqqət yetirməkdən nişanədir.

**Nişanə** 3. “Gənci-gühər”: İnsanı öz kamil olan gizli həqiqətindən xəbərdar edən “bəndəlik” məqamından nişanədir.

**Anlam: Maddi mahiyyətə bağlı olmasaydım mənəvi həqiqətimi pünhan etməzdim.**

**Qeyd:** *Fiziki mahiyyətə bağlı şəxsin mənəvi həqiqətdən dəm vurmağı xəcalətdən başqa bir nəticə verməyəcəkdir.*

Beyt 6: **Sitəmi – təneyi – əğyarə degildim vaqif,**
**Yoqsa yarın səri-kuyində məkan etməz idim.**

**Nişanə** 1. “Yar”: Şühud mərtəbəsinə “yar” demişlər.

**Nişanə** 2. “Səri kuy”: Fiziki iradə - ixtiyarı qəlbdən qoparan bəndəlik məqamından nişanədir.

**Anlam: Bəşəri sifətlərdən tam ayrılmazdan əvvəl bəndəlik eşqindən dəm vuran aşiq əql və eşq əhlinin tənələrinə taqət gətirməkdən aciz olur.**

Beyt 7: **Etməsəydi sitəmi – yar, Füzuli, məni – zar,**
**Bunca fəryad çəkib, ahü fəğan etməz idim.**

**Nişanə** 1. “Sitəmi-yar”: Bu beytdə “vəch” ünvanlı ilahi camal müşahidəsindən məhrum edən mərhələdən nişanədir.

**Anlam: Dönə - dönə feyzyab olduğum şühud nurundan məhrum olmasaydım bir belə biqərarlıq etməzdim.**

## Q Ə Z Ə L 169

**(1) Bir qul öğlunu könül mülkünə sultan etdim,**
**Misr idi, padişəhin Yusifi – Kən`an etdim.**

**(2) Dil ki, bir dilbərə sərmənzil idi, ahim ilə**
**Yelə verdim, adını təxti – Süleyman etdim.**

**(3) Eşq tərki, dilü candan görünürdü müşkil,**
**Tərki – eşq eylə dedin, tərki – dilü can etdim.**

**(4) Can qəmin çəkmiş idi, var idi boynumda həqi**
**Bu onun əcri idi kim, sənə qurban etdim.**

**(5) Rəhi – eşqin tutub, etdim qəmü dərdim dəf`in,**
**Görə nə cəm`i bu təriq ilə pərişan etdim.**

**(6) Sənə tapşırdığım oxlarını yaxdın, ey dil,**
**Zaye` etdin nə qədər kim, sənə, ehsan etdim.**

**(7) Səbzə tək qıldı Füzuli, çıxarıb əşk əyan,**
**Tən qübarində oxun hər necə pünhan etdim.**

Beyt 1: **Bir qul öğlunu könül mülkünə sultan etdim,**
**Misr idi, padişəhin Yusifi – Kən`an etdim.**

**Nişanə** 1. "Qul oğlu": A: Məcazi hüsnlər, yaxud cismi tənasüblər sahibindən ibarətdir.

B: Qul qara olduğuna görə maddi bədəndən doğulmuş xal nöqtəsinə də işarə edir. Həmin mənanı təlqin etmək məqsədilə buyurmuş ki:

**Dəhanın dürcünü xali-ləbin gözdən nihan etmiş,**
**Əmanət gör ki, hindu məxzəni-lölöyə xazəndır.**

Elə buna görə də xal nöqtəsinə "hindu", yaxud "hindu bəçҫe"(körpə hindu) demişlər.

C: Hindu mənasını eyham edən qul oğlu, pir və mürşiddən də istiarədir.

**Nişanə** 2. "Könül mülkü": Könül mülkü, aşiqin ülvi aləm ilə əlaqədar batinindən ibarətdir.

**Nişanə** 3. "İkinci misra": Quranın 12-ci surəsində bəyan olmuş Yəqub oğlu Yusif hekayəsini təlqin edən nişanədir.

**Qeyd:** *Yəqub oğlu Yusifin qardaşları dedilər: "Yusif atamızın daha sevimlisidir. Bizim atamız sözsüz ki, açıq – aydın bir zəlalətdə (səhvdə)dir"*[1]*,... "Onu [çölə] apardıqda hamılıqla onu bir quyunun təkinə salmaq qərarına gəldilər*[2] *", ... "Bir karvan gəldi suçular göndərdilər, su qabını salladı, dedi: müjdə, bu bir oğlandır"*[3]*, ..., "Misir əhlindən biri onu satın aldı*[4] *", nəhayət, o (Yusif), Misirin hökmranı (əzizi) oldu".*

**Anlam: A: Beyt mürşid həzrətinin hökumətinə layiq olan ürək mülkünü vəsf edir.**

**B: Beyt bəşəri hüsn, yaxud məcazi mahiyyət qulluğunda, mənəviyyatdan xəbərsiz qalmış bir gözəli tərbiyələndirən aşiq iqtidarını vəsf edir.**

**C: Aşiq "müfaxirə" ünvanlı ədəbi və irfani mərtəbədə[5], məcazi məşuqun əqlində və fikrində təsərrüf etməyinə,**

---

[1] Quran, Yusif surəsi 8-ci ayə
[2] Quran, Yusif surəsi 15-ci ayə
[3] Quran, Yusif surəsi 19-cu ayə
[4] Quran, Yusif surəsi 21-ci ayə
[5] Qəzəl 68, beyt 1

**yaxud zahir məmlükünü batin məmlükünə[1] çevirməyə qadir olan eşqi ilə iftixar edir.**

Beyt 2: **Dil ki, bir dilbərə sərmənzil idi, ahim ilə**
**Yelə verdim, adını təxti – Süleyman etdim.**

Sözlük: Sərmənzil – mənzil = məskən = məqam = dünya; Təxti Süleyman = yel, yaxud divlər vasitə ilə havada hərəkət edən Davud oğlu Süleymanın oturduğu təxt

**Nişanə** 1. "Del": Bu beytdə, denyəvi enerjilərini məhvlik dərəcəsinə yaxınlatmış mənəvi qüvvələr almağa səy edən ürəkdən nişanədir.

**Nişanə** 2. "Dilbər": Bu beytdə bəşəri hüsn və kamal sahibindən, yaxud mütəal məhbub ilə aşiq arasındakı vasitədən ibarətdir.

**Nişanə** 3. "Ah": Aşiqin istedadını yeniləçdirən və artıran biqərarlıqdan nişanədir.

**Nişanə** 4. "Yelə verdim": Eşq cilvələri ilə məşğul və məğlub olmuş aşiqin dünyaşünas əql qüvvələrini təmamilə unutmağından nişanədir.

**Anlam: Mütəal məhbubdan başqalarının (vasitələrin) yardımından bəhrələnmək fikrini başımdan atdım.**

**Qeyd** 1: *Bu anlam aşiqin "bəşəri istiğna" ünvanlı mərtəbədə yerdən əl üzüb əlçatmaz göylərə əl tapmaq iqtidarına işarə edir.*[2]

**Qeyd** 2: *Aşiq bəzi kainatda təsərrüf edici xalis ürəyini vəsf etməklə ötən beytdə qeyd etdiyi eşq iqtidarı ilə iftixar edir. Beləliklə:*

*A: Qan dövranıyla canlanmış məcazi qəlbinin faniliyini təlqin edir.*

*B: İlahi əhvali- ruhiyyə ilə canlanmış həqiqi qəlbi ilə fəxr edir.*

Beyt 3: **Eşq tərki, dilü candan görünürdü müşkil,**
**Tərki – eşq eylə dedin, tərki – dilü can etdim.**

**Anlam: A: Məcazi eşq xəzinəsi olan ürəyi və canı tərk etdim.**

**B: Həqiqi eşq bazarında, yaxud qurbanlıq ərəfəsində can və ürəyi bir sərmayə kimi təmamilə xərclədim.**

Beyt 4: **Can qəmin çəkmiş idi, var idi boynumda həqi**
**Bu onun əcri idi kim, sənə qurban etdim.**

---

[1] Qəzəl 1, beyt 6
[2] Qəzəl 21, beyt 1, nişanə 1, qeyd

Sözlük: Əcr – ücrət = muzd = mükafat

**Nişanə** 1. “Can”: Bu beytdə qətl, yaxud qurbanlıq bazarına hazırlamaq məqsədilə mühafizə olmuş cismi sərmayədən ibarətdir.[1]

**Qeyd:** *Cismi sərmayə bədənin hər yerinə yayılmış fiziki həyat bağışlayan gizli qüvvədən ibarətdir.*[2]

**Nişanə** 2. “Qəm”: Məşuq tələbində çalışqanlıq etməkdən nişanədir.

**Nişanə** 3. “Qurban”: İkilik fasiləsini yox dərəcəyə çatdırmaq məqsədilə dünyəvi həyatını məşuq həzrətinə fəda etməkdən nişanədir.

**Anlam: Məşuq tələbində çalışqanlıq etmiş canımı qurban etməklə mükafatlandırdım.**

**Qeyd:** *Qurban olmaq əl çatmaz yüksəkliyə nail olmaqdan ibarətdir.*

Beyt 5: **Rəhi – eşqin tutub, etdim qəmü dərdim dəf`in,**
**Görə nə cəm`i bu təriq ilə pərişan etdim.**

Sözlük: Rəh – yol; Təriq – yol = hal = iş

**Nişanə** 1. “Rəhi-eşq”: Rəngini saraldıb yarpaqlarını tökmüş ağac kimi bəşəri vücud qüvvələrini qurudub karsız edən mərhələyə “rəhi-eşq” demişlər.

**Nişanə** 2. “Qəmü dərd”: Bu beytdə dünyəvi çətinliklər və cismi iztirablardan, yaxud aşiqin həqirliyini sübut edən hicran qəmindən ibarətdir (mənfi qəm).

**Qeyd:** *Canan ərəfəsinə yaxınlaşmaqla peyda olmuş dərd müsbət dərddən ibarətdir.*

**Nişanə** 3. “Cəm”: Bu beytdə, aşiqin qəlbini bürüyən qəmlər və dərdlər birləşməsindən ibarətdir.

**Nişanə** 4. “Pərişan”: Cəm nişanəsinin, yaxud birləşmiş qəmlərin dağılış mərtəbəsindən nişanədir.

**Qeyd:** *“Cəm” və “pərişan” bu beytdə irfani mənalara da işarə edir.*[3]

**Anlam: Bəşəri enerjilərimi unutmaqla qəm və dərd qələbəsindən azad oldum**

Beyt 6: **Sənə tapşırdığım oxlarını yaxdın, ey dil,**
**Zaye` etdin nə qədər kim, sənə, ehsan etdim.**

---

[1] Qəzəl 7, beyt 2
[2] Qəzəl 112, beyt 2
[3] Qəzəl 89, beyt 4

**Nişanə** 1. “Oxları yaxdın”: Oxları yaxmaq aşiqin qəlbini ardıcıl yaralayan qəbzlər qədrini bilmədən istedadsızlıq göstərmək nişanəsidir. Çünki, hər bir yaralanmış üzvün fziki enerjidən ayrılmağı:

A: Onu maddi qüvvələrdən ayırıb mənəvi qüvvələrə mindirmə müqəddiməsidir.

B: Onu təhlükəyə məruz edərkən qurbanlıq məqamına hazırlayan müqəddimədən ibarətdir.

**Nişanə** 2. “Ehsan”: Bu beytdə aşiqin fəqirliyini – məmlüklüyünü özünə bildirərkən onun ixtiyar və tədbirini yox dərəcəsinə yaxınladan “rəhmət bəlası” ünvanlı cəfalardan nişanədir. Elə buna görə də buyurmuşdur ki:

**Eylə üşşaqə cəfalar ki, vəfalar görəsən,**
**Anma kim, zaye olur eylədiyin ehsanlar.**

**Anlam: Ey dil bəlalar qədrini bilmədən özünü qurbanlıq nailiyyətindən məhrum etmişsən.**

Beyt 7: **Səbzə tək qıldı Füzuli, çıxarıb əşk əyan,**
**Tən qübarində oxun hər necə pünhan etdim.**

Sözlük: Əşk – göz yaşı; Əyan – əyani = aşkar

**Nişanə** 1. “Səbzə”: A: “İnnəllah” mərkəzinə bağlı həyat uzantısından nişanədir.

B: Səbzə, irfani əhvali-ruhiyyənin, həm də ilahi tanışlıqların dəmbədəm təzələnməyinə işarə edən nişanədir.

C: Bəşəri səviyyədən ilahi mərtəbəyə yüksəldən mənəvi bou atmaq və dikəlmək nişanəsidir.

Ç: Yaxud yaşıllıq mütəal məbud xəlifəsi olmuş insanın əbədilik əlamətidir.

**Nişanə** 2. “Əşk”: Tən qubarı ünvanlı fiziki mahiyyət ləkəsini paklayan yuyucu nişanədən ibarətdir.

**Anlam: Alov yandırıcı olduğuna görə onu gizli saxlamaq imkansız olduğu kimi, batini təsirləndirən ardıcıl qəbzlər sirrini də ört – basdır etmək mümkünsüzdür. Elə buna görə də Sədi buyurmuşdur ki:**

در سوخته پنهان نتوان داشتن آتش
ماهیچ مگفتیم و حکایت بدر افتاد

**Qeyd:** *İkinci misra, yaxud toxumun torpaq altından baş qaldırması birinci misrada bəyan olmuş mənəvi anlamı hissiləşdirmək istəyir.*

## Q Ə Z Ə L 170

**(1) Nurini mah mehri – rüxündən alır müdam,**
**İnkar edərsə, şəhr güvahımdurur təmam.**

**(2) Mehrab imiş qaşın ki, ona qarşu kirpigin**
**Səf – səf durur qiyamə qılıb qəmzəni imam.**

**(3) Ol hur vədəsinə behişti – vüsal üçün,**
**Qur`anca etibar edübəm hasili – kəlam.**

**(4) Əksi – rüxün oğurladığıçün dönə - dönə,**
**Asıldı güzgü şəhrdə, eldən sürüldü cam.**

**(5) Dəşt üzrə girdbadımı, ya gəldigim görüb,**
**Məcnun qubarıdır ki, durub eylər ehtiram.**

**(6) Durğuzma, yolların yügürüb tutma, ey sirişk,**
**Ol sərv edəndə naz ilə bizdən yana xüram.**

**(7) Həmsöhbət oldu daneyi - əngur zahidə,**
**Əsli budur ki, oxudular badəni həram.**

**(8) Meyxanədir cahanda, Füzuli, məqami - əmn,**
**Cəhd et bir ev hübab kimi, onda tut məqam.**

Beyt 1: **Nurini mah mehri – rüxündən alır müdam,**
**İnkar edərsə, şəhr güvahımdurur təmam.**

Sözlük: Mah – ay; Mehr – günəş = məhəbbət; Rüx – camal = surət, güvah = şahid, müdam = daimi = həmişə = ardı-arası kəsilməyən şərab

**Qeyd:** *Bu qəzəl təmamilə "camali-vilayət" ünvanlı mərtəbə rüxsətilə mütəal məbudu bir gözəl insana bənzədərsə, onu vəsf etmək istəyir. Beləliklə: Mehri-rüx, qaş, qəmzə, sərv və digər bənzətmələr və sifətləriN həzrəti-məbudun həqiqi vəsfi kimi düşünülməsi nadanlıq və kafirlikdən ibarətdir*[1].

**Nişanə** 1. "Nur": Büsbütün varlığa, xüsusilə bitki, heyvan və insan həyatına saçaraq varlıqlarını davam etdirməklə əlverişli şərait yaradan ilahi ehsandan nişanədir, bu ehsan kəsilərsə təkcə həyat deyil, bütün varlıq öz davamını itirər[2].

**Nişanə** 2. "Mah": A: Bəşəri simada ilahi nur əks etdirən gözəl dilbərdən nişanədir.

B: Bütün maddi varlığın, ilahi sirlər əks etdirmiş "güzgü" ünvanlı yönündən nişanədir.

C: Vəhdət nurunu təzahür etdirən kəsrətdən nişanədir.

**Nişanə** 3. "Mehri-rüx": Könüllərə saçaraq batinləri işıqlandıran "tovhid günəşi" ünvanlı ilahi camal cilvələrindən ibarətdir[3].

**Anlam: Bütün kainatın mövcudluğu, həyatı və hüsnü, tovhid günəşindən saçan ilahi cilvələrə bağlıdır.**

**Qeyd:** *İkinci misra, kəsrətin vəhdətdən nişanə olduğunu*[4]*, yaxud yaradıcı iqtidarın yaranmışlarda təzahür etməyini əyani elmi və fəlsəfi misallarla dəlilləşdirir.*

Beyt 2: **Mehrab imiş qaşın ki, ona qarşu kirpigin**
**Səf – səf durur qiyamə qılıb qəmzəni imam.**

Sözlük: Mehrab – qiblə = imam camaatın məsciddə namaza durduğu yer = məclisin yuxarı başı

**Nişanə** 1. "Qaş mehrabı": Həzrəti məbudun həqiqətini örtən

---

[1] Qəzəl 21, beyt 3, qeydlər
[2] Qəzəl 1, beyt 1, nişanə "Ənarə"
[3] Qəzəl 1, nişanə 1
[4] Qəzəl 4, beyt 3, nişanə 2, qeyd "kəsrət"

müqəddəs qələbə sifətlərindən nişanədir.

**Nişanə** 2. “Kiprik”: Aşiqin qəlbini özəl münacat ünvanlı nalələrə vadar edən müxtəlif qəhrlər və qələbələrdən nişanədir.

**Nişanə** 3. “Qəmzə”: Bu beytdə ilahi qəhr ilə birləşmiş lütf qələbəsindən nişanədir. Bu qələbə məhəbbətdən dəm vuran bir şəxsin qəlbini, canını sınaqlara çəkməklə onun naqisliyini, yaxud kamilliyini üzə çıxarıb aydınlaşdıran mərtəbədən nişanədir.

**Anlam: Qəhr, lütf, feyz, qəmzə və digər belə ilahi sifətlər öz xüsusi dilləri ilə mütəal məbudu vəsf etməklə məşğuldurlar.**

**Qeyd:** *Mehrab, qiyam və imam kəlmələri namazı yada salmaqla aşağıdakı irfani, dini və fəlsəfi mərtəbələri eyham etmək istəyir:*

*A: “*[1]سبح لله مافى السموات و الارض و هو العزيز الحكيم*” (“Göylərdə və yerdə olan hər şey Allahı təsbih edir. O, izzət sahibidir”*[2]*).*

*B: Bütün yaranmışlar şəkilcə namazın zahiri surətlərini bildirməklə onunla bağlı hikmətli bir üzv hesaba alına bilir. Beləliklə, onları (mövcudlar) şəkilcə: “Namaza durmuş (qiyam, ayaq üstə) şəxslərə, yaxud rüku etmişlərə (başı aşağı), yaxud səcdəyə düşmüşlərə (sürünənlər), ya da “qaid” ünvanlı oturmuşlara bənzədə bilmişlər*[3]

Beyt 3: **Ol hur vədəsinə behişti – vüsal üçün,**
**Qur`anca etibar edübəm hasili – kəlam.**

Sözlük: Hur = huri

**Anlam: Quranın vəsf etdiyi hurilər hüsnünü, yalnız əql çərçivəsində yerləşmiş bir hüsn kimi qəbul etmişəm.**

**Qeyd:** *Bu anlam yaxud beyt: A: Behişt gözəlliklərini bəşəri hüsnlər kimi məhdud təlqin etmək istəyir.*

*B: “Rəhman behişti” ünvanlı ilahi hüzurdan, yaxud Tanrıya qovuşmaq nemətindən xəbərdar bir aşiqin “Rizvan behişti” adlı axirət nemətlərinə, yaxud məşuq həzrətindən başqalarına rəğbətsiz olduğunu təlqin etmək istəyir*[4]*.*

---

[1] Quran, Hədid surəsi, 1-ci ayə
[2] Qəzəl 4, beyt 1, haşiyə
[3] Doktor seyid Cəfər Səccadi, Fərhənge loğat və istilahat və təbirat irfani
[4] Qəzəl 111, beyt 1, qeyd 1 və 2

Beyt 4: **Əksi – rüxün oğurladığıçün dönə - dönə,**
**Asıldı güzgü şəhrdə, eldən sürüldü cam.**

Sözlük: Rüx – üz = camal

**Nişanə** 1. "Əksi-rüx": Mütəal məbudun camalından əks etdirilmiş cilvələrdən nişanədir. Bu cilvələr bütün mövcudların varlığını davam etdirərkən salik, yaxud arif olan bir şəxsi fikirdə yandıran heyranlığa giriftar edir[1].

**Nişanə** 2. "Oğurlamaq": Özünü əksi-rüx tələbinə layiq bilməkdən nişanədir.

**Nişanə** 3. "Güzgü, cam": Bu beytdə özünü ilahi cilvələr əks etdirməyə layiq bilmiş maddi, yaxud məcazi vücudlardan nişanədir.

**Nişanə** 4. "Asılmaq": A: Maddi varlığı məhv edən cəzalanmaya işarə edir.

B: Tərbiyə və tənbihdən nişanədir.

**Nişanə** 5. "Sürülmək": Şəhərdən qovulmaq tənbehindən nişanədir. Bu tənbeh aşiqi özündə seyr etdirən və onu öz naqisliyindən, həm də kamilliyindən xəbərdar edən mərhələdən ibarətdir.

**Anlam: Güzgü və cam özünü əksi-rüx tələbinə layiq bilməklə:**

**A: Biri şəhərdə asıldı, biri də şəhərdən qovuldu.**

**B: Güzgü havada saxlanıldı və cam yerə qoyuldu.**

**Qeyd:** *Havada saxlanılmaq və yerə qovulmaq fəaliyyət imkanından məhrum olaraq karsız qalmaqdan nişanədir.*

Beyt 5: **Dəşt üzrə girdbadımı, ya gəldigim görüb,**
**Məcnun qubarıdır ki, durub eylər ehtiram.**

Sözlük: Dəşt – çöl; Girdibad – üz-üzə toqquşub tozanaq qoparan yellər = burulğan

**Anlam: Çöl üzrə qopmuş tozanaq burulğan deyil, bəlkə də mənə ehtiram etmək məqsədilə ayaq üstə duranlar kimi dikəlmiş torpağa çevrilən məcnundan ibarətdir.**

**Qeyd:** *Bu beyt Füzulinin Məcnundan üstün olduğunu təlqin edir.*

Beyt 6: **Durğuzma, yolların yügürüb tutma, ey sirişk,**
**Ol sərv edəndə naz ilə bizdən yana xüram.**

---

[1] Qəzəl 115, beyt 6

Sözlük: Sirişk – göz yaşı; Xüram – nazlana-nazlana addım atmaq= nazlanmaq

**Nişanə** 1. “Durğuzma yolları”: Ürək açan maraq – müşahidələri davam etdirmiş mərtəbədən nişanədir.

**Nişanə** 2. “Sirişk”: Bu beytdə aşiqin özünü – dünyasını bərbad etmiş selləmə biqərarlıqdan nişanədir.

**Nişanə** 3. “Sərv”: Bu beytdə davam etdirilmiş ilahi təcəllilərdən, yaxud şühud nurunun dalbadal yeniləşib çaxmağından nişanədir.

**Nişanə** 4. “Naz”: Aşiqi gah qüvvətləndirən, gah qüvvətsiz edən gah da ona bərk məstlik verən cilvələrdən nişanədir.

**Nişanə** 5. “Xüram etmək”: Qəhr ilə lütfü birləşdirməkdən nişanədir.

**Anlam: Beyt, müşahidə möhlətini tənglәşdirən şiddətli biqərarlıqdan şikayət edir.**

Beyt 7: **Həmsöhbət oldu daneyi - əngur zahidə,**
**Əsli budur ki, oxudular badəni həram.**

Sözlük: Daneyi-əngur – üzüm dənəsi

**Nişanə** 1. “Daneyi-əngur”: Zavala uğramış zahiri maraqları zahidin gözünə etibarlı göstərən və onu qaydaiqanun və ənənə məşğulluğunda ibadət və itaətin batinindən (həqiqətindən) xəbərsiz saxlayan qürur şərabından nişanədir.

**Nişanə** 2. “Badə”: İlahi parlamalar önündə qəlbi silkələyən eşq bolluğundan ibarətdir.

**Anlam: Zahid batini əhavli-ruhiyyədən xəbərsiz olduğuna görə badəni həram bilmişdir.**

**Qeyd** 1: *Üzüm dənəsi (daneyi-əngur) zahid kimi öz içərisindən, yaxud çevrilmişindən xəbərsizdir. Buna görə də zahid ilə həmsöhbət olmuşdur.*

**Qeyd** 2: *Daneyi-əngur, çevrilmiş əzabına taqət gətirməkdən badəni həram bilmişdir.*

**Qeyd** 3: *Yuxarıdakı qeydlər, dünyəvi maraqları yaxud cismi imtiyazları fəda etməkdən aciz olan insanı kinayə ilə məzəmmət edir.*

Beyt 8: **Meyxanədir cahanda, Füzuli, məqami - əmn,**
**Cəhd et bir ev hübab kimi, onda tut məqam.**

Sözlük: Əmn – rahatlıq = arxayınlıq; Hübab = köpük

**Nişanə** 1. "Meyxanə": A: Aşiqi özündən xəbərsiz edən mürşüd məktəbinə "meyxanə" demişlər.

B: Aşiqi təbii vücuduna bağlı sifətlərdən ayıran və ona qeyri təbii və səmavi sifətlər bağışlayan mərtəbəyə "meyxanə" demişlər[1].

**Nişanə** 2. "Məqami-əmn": İnsanın həqiqi vücudunu üzə çıxaran "zat və sifati-cəhani" adı ilə tanınmış təğyirsiz cahana "məqami-əmn" demişlər[2].

**Nişanə** 3. "Hübab": Məcazi varlığı soyunub mənəvi varlığa söykənmək mərtəbəsindən ibarətdir.

**Anlam: Ey Füzuli, təğyir edici məcazi dünyada həqiqi vücudun üzə çıxmağı mümkünsüz olduğuna görə, "məqami-əmn" ünvanlı təğyirsiz olan həqiqi aləmi bir aman evi kimi ixtiyar etməlisən.**

---

[1] Qəzəl 27, beyt 7, nişanə 2 "meyxanə"

[2] Doktor Məhəmməd Moin, Fərhəngi-Moin

## Q Ə Z Ə L 171

(1) Pənbeyi – daği – cünun içrə nihandır bədənim,
Diri olduqca libasım budur, ölsəm kəfənim.

(2) Canı canan diləmiş, verməmək olmaz, ey dil!
Nə niza` eyləyəlim, ol nə sənindir, nə mənim.

(3) Daş dələr ahim oxu şəhdi – ləbin şövqindən,
Nola zənbur evinə bənzəsə beytül – həzənim.

(4) Tövqi – zənciri – cünun daireyi – dövlətdir,
Nə rəva kim, məni ondan çıxara zə`fi – tənim.

(5) Eşq sərgəştəsiyəm, seyli – sirişk içrə yerim,
Bir hübabəm ki, həvadən doludur pirəhənim.

(6) Bülbüli – qəmzədəyəm, bagü bəharım sənsən,
Dəhənü qəddü rüxün qönçəvü sərvü səmənim.

(7) Edəmən tərk, Füzuli, səri – kuyin yarın,
Vətənimdir, vətənimdir, vətənimdir, vətənim.

Beyt 1: **Pənbeyi – daği – cünun içrə nihandır bədənim,**
**Diri olduqca libasım budur, ölsəm kəfənim.**

Sözlük: Pənbə – pambıq; Cünun – məcnunluq = divanəlik; Nihan – gizli = pünhan

**Nişanə** 1. "Pənbeyi-daği-cünun": A: Dünyəvi ömür möhlətində aşiqin sağalmaz tələb və ətəş ünvanlı dərdini bildirən istiarədir.

B: Pənbeyi daği cünun, yaxud başdan ayağa dağlanmaq bədən üzvlərini təmamilə (fiziki əngəl mahiyyəti) fəaliyyətsiz edən mücərrədlik, yaxud bəstlik müqəddiməsindən nişanədir.

C: Keçmişlərdə pambıqdan düzəldilmiş bir kasaya isti piy töküb divanənin başına çevirməklə məcnunluq havasını onun başından çıxarmağı təlqin edir.

**Nişanə** 2. "Kəfən": Aşiqin məzar aləmində hətta qeyri maddi axirət dünyasında eşq dərdindən azad ola bilmədiyini bildirən nişanədir.

**Anlam: Dünyəvi ömür möhlətini, hətta axirət dünyasını fəda etməyən bir aşiqin ətəş və tələb dərdindən azad olması, yaxud vüsal toxtaxlığına nail olması mümkünsüzdür.**

**Qeyd:** *Vüsal aşiq ilə məşuq arasındakı fasiləni yox dərəcəyə çatdırmaqdan ibarətdir*[1].

Beyt 2: **Canı canan diləmiş, verməmək olmaz, ey dil!**
**Nə niza` eyləyəlim, ol nə sənindir, nə mənim.**

Sözlük: Niza – düşmənlik = mehrabə = hədəfdə vahid olaraq sözdə ixtilaflı olmaq

**Nişanə** 1. "Can": Məcazi vücudun, irfani halı idrak edən həqiqi ölməz hissəsindən ibarətdir.

**Nişanə** 2. "Canan": Mütəal məbudun "qəyyum" ünvanlı sifətindən, yaxud bəşəri tədbiri ilahi tədbirə çevirən xüsusi cazibələrindən ibarətdir.

**Anlam: Bu beyt xüsusilə "canı canan diləmək" nişanəsi, aşiqin "ələst" aləmindən gətirdiyi şəxsiyyətinin sağlam olduğunu[2] təsdiq etməklə onun yaranış dairəsinin mərkəzi nöqtəsinə (vəhdət mərkəzinə) qayıtmaq istedadını təlqin etmək istəyir.**

---

[1] Qəzəl 142, beyt 1
[2] Qəzəl 19, beyt 4

Beyt 3: **Daş dələr ahim oxu şəhdi – ləbin şövqindən,**
**Nola zənbur evinə bənzəsə beytül – həzənim.**

Sözlük: Şəhd – bal; Zənbur – bal arısı; Zənbur evi – şan = arı pətəyi; Beytül həzən – hüzn evi = Yusifdən ayrı düşmüş Yəqubun sakin olduğu ev

**Nişanə** 1. "Ah oxu": Beytdə ürəkdən ülvi aləmə pəncərə açan, yaxud görünməz mərtəbələri göstərən və şühud məqamına nail edən səbəbdən nişanədir.

**Nişanə** 2. "Ləb": Yoxu var edən "rəhmani-feyz" adlı ehsan mərtəbəsindən nişanədir.

**Nişanə** 3. "Zənbur evi": Ah oxu göz – göz etmiş ürəkdən nişanədir.

**Qeyd:** *Göz-göz olmaq, qəlbin maddi cəhətinin fanilik müqəddiməsinə işarə edir.*

**Nişanə** 4. "Beytül həzən": Qəm – qüssənin bürüdüyü qəlbdən nişanədir.

**Qeyd:** *Beytül həzən qəlbin ixtiyarsız olduğunu bildirir.*

**Anlam: A: Şühud şövqü qəlbimin maddi cəhətini məhvlik müqəddiməsinə çatdırmışdır.**

**B: Qəlbimin hər zərrəsi ilahi camal nurunu əks etdirən bir güzgüyə çevrilmişdir.**

Beyt 4: **Tövqi – zənciri – cünun daireyi – dövlətdir,**
**Nə rəva kim, məni ondan çıxara zə`fi – tənim.**

Sözlük: Tövq – boyunbağı = göyərçin, yaxud "tuqi" adlı quşun boynundakı halqaya bənzər xətt

**Nişanə** 1. "Töqi-zənciri-cünun": Eşq qələbələrindən asılı məstlik əlamətindən ibarətdir.

**Nişanə** 2. "Daireyi-dövlət": Xüsusi rəhmətdən, yaxud ilahi əvəzsiz ehsan əhatəsindən nişanədir.

**Qeyd:** *Heç bir dünyəvi nailiyyət əvəzsiz mümkün deyil. Çünki dünya zahirən müftə bir dövlət bağışlarsa, onun məşğulluğunda hər bir şeydən baha olan ömür adlı ibadət, itaət və fədakarlıq möhlətini, yaxud qurbanlıq sərmayəsini əldən almaqda əsirgəməyir. Bunun üçün də həqiqi, yaxud əvəzsiz dövlət yalnız cünun dövlətindən ibarətdir. Çünki bu dövlət mənəvi olduğuna görə zaman qələbəsindən azaddır. Hafiz belə bir zavalsız dövləti təbliğ etmək məqsədi ilə buyurmuşdur:*

کام بخشی گردون، عمر در عوض دارد

جهد کن که از دولت داد عیش بستانی[1]

**Nişanə** 3. “Zəfi-tən”: Bu beytdə istedadsızlığı təlqin edən naqis vücud sərmayəsindən nişanədir.

**Anlam: A: Eşq və irfana biganə olan şəxslərin sərkilər ilə dünyəvi etibarlardan azad olmağı (cünun) onun mənəvi ilgilər ilə dolmağının müqəddiməsidir.**

**B: Məcazi vücud məğlubluğu (zəfi-tən) mənəvi nailiyyətin müqəddiməsidir.**

Beyt 5: **Eşq sərgəştəsiyəm, seyli – sirişk içrə yerim,**
**Bir hübabəm ki, həvadən doludur pirəhənim.**

Sözlük: Sərgəştə – sərgərdan = avara = heyran; Sirişk – göz yaşı; Hübab – köpük; Pirahən – köynək

**Nişanə** 1. “Sərgəştə”: ilahi əzəmətlər önündə əqlini, idrakını quru ağac kimi karsız hiss etməklə heyran olmuş aşiqdən ibarətdir.

**Nişanə** 2. “Seyli-sirişk”: fiziki əngəl mahiyyətini təmamilə yuyub məhv etmək mərtəbəsindən nişanədir.

**Nişanə** 3. “Hübab”: bu beytdə məcazi varlığını soyunub mənəvi varlığa söykənmək müqəddiməsindən ibarətdir.

**Nişanə** 4. “Həva”: yaxud ikinci misra dünyəvi həyat ilgilərindən boşalmış vücudun mənəvi ölməz həyata dübarə malik olmaq müqəddiməsindən nişanədir.

**Anlam: Mənəvi əslə tərəf qayıtmaq məqsədilə bəşəri idrak və dünyəvi təmayülatdan azad olmuşam.**

Beyt 6: **Bülbüli – qəmzədəyəm, bagü bəharım sənsən,**
**Dəhənü qəddü rüxün qönçəvü sərvü səmənim.**

Sözlük: Qəmzədə – qəmli = hüznlü; Dəhən – üz = camal; Səmən – yasəmən

**Nişanə** 1. “Bülbüli-qəmzədə”: Fiziki mahiyyətini unutmuş aşiqin ilahi əslə qovuşmaq həsrətində qüssələnməyindən ibarətdir.

**Nişanə** 2. “Bağ”: Bu beytdə bəst məqamından nişanədir.

**Nişanə** 3. “Bəhar”: Bu beytdə aşiqin içəridən dəyişməsini və yeni bir heyət və həyat tapmasını, yaxud ilahi əsl rayihələrindən bəhrələn-

[1] Müəllif bu beyti “Ta Qafe-ənişe ” kitabının 4-cü cildində şərh etmişdir

məyini təlqin edən nişanədir.

**Nişanə** 4. “Dəhən”: Bu beytdə ilahi işarə - intibahdan, yaxud qəlbi dirçəldən ilham, ehsandan ibarətdir.

**Nişanə** 5. “Qədd”: Bu beytdə maddə ilə məna arasındakı ilahilik uzantısından ibarətdir.

**Nişanə** 6. “Rüx”: İlahi camaldan parlayan təcəllilərdən nişanədir.

**Nişanə** 7. “Qönçə”: Bu beytdə ürəkaçan ilahi ilhamlardan nişanədir.

**Nişanə** 8. “Sərv”: Mütəal məhbubun təcəllilərinin davam etməyindən, yaxud şühud nurunun dalbadal yeniləşib çaxmağından nişanədir.

**Nişanə** 9. “Səmən”: Ürək açan bəst məqamından nişanədir.

**Anlam: Ey gözəl məbud, mənə mənəvi mahiyyət, yaxud həqiqi həyat bağışlayan sənin ilham – ehsanınla bağlı mənəvi hüsnlər rayihəsi, yaxud ilahilik uzantısıdır.**

Beyt 7: **Edəmən tərk, Füzuli, səri – kuyin yarın,**
**Vətənimdir, vətənimdir, vətənimdir, vətənim.**

**Nişanə** 1. “Səri-kuy”: Mütəal məbudun hürriyyətpərvər ərəfəsində fiziki iradə - ixtiyarı aşiqin qəlbindən qoparmaqla onu dünyəvi bağlantılardan xilas edən “bəndəlik” məqamından nişanədir.

**Nişanə** 2. “Yar”: Ariflər, şühud aləminə yaxud mütəal məbudun “vəch” ünvanlı camalını müşahidə etməyə “yar” demişlər.

**Nişanə** 3. “Vətən”: Vəhdət mərtəbəsində, yaxud ölməz aləmdə “İnnəllah” ünvanlı mənəvi əsl rayihəsindən, yaxud öz yaranmasının başlanış nöqtəsindən feyzyab edən vəziyyətə “vətən” demişlər.

**Anlam: Ey Füzuli, insana layiq olan həqiqi tükənməz vətən – bəndəlik məqamı, yaxud fanilik ərəfəsindən ibarətdir.**

## Q Ə Z Ə L 172

**(1) Faş qıldın qəmim, ey dideyi – xunbar, mənim!**
**Eylədin mərdümə nəm olduğun izhar mənim.**

**(2) Dəhənin istərəm, ey eşq, yox et varlığımı**
**Ki, yox olmaqda bu gün bir qərəzim var mənim.**

**(3) Çıxmış əğyar ilə seyr etməyə ol mərdümi – çeşm,**
**Bu əcəb, mərdümi çıxmış gözüm ağlar mənim.**

**(4) Bu təmənnadə ki, ol şəm` ilə həmsöhbət olam,**
**Dudi – ah etdi dünüm tək günümü tar mənim.**

**(5) Mövc ilə könlümü, ey əşk, qopar yanımdan,**
**Nalə ilə başım ağrıtdı bu bimar mənim.**

**(6) Çıxmış ol şux bu gün tökməyə qanın görənin,**
**Girmə ey göz, kərəm et, qanıma, zinhar mənim.**

**(7) Ey Füzuli, dərü divarə qəmim yazmaqdan**
**Şahidi – hali – dilimdir dərü divar mənim.**

Beyt 1: **Faş qıldın qəmim, ey dideyi – xunbar, mənim!**
**Eylədin mərdümə nəm olduğun izhar mənim.**

Sözlük: Dide = göz; Xunbar – qan yağdıran; Mərdüm – insan = gözünün bəbəyi

**Nişanə** 1. "Qəm": Bu beytdə ətəş və tələb hasilindən, yaxud batini çalışqanlıqlardan nişanədir.

**Nişanə** 2. "Dideyi-xunbar": Çöl vücuda, yaxud ictimai prinsiplərə bağlı etibarları şühud şövqü ilə yuyub batil etməyə cəhd etməkdən nişanədir.

**Nişanə** 3. "Nəm olmaq": A: Öz mənəvi kökünü sağlam saxlamış insanın irfani əhvalatdan dad almağına işarə edən nişanədir.

B: İlahi kamal, yaxud mənəvi mərtəbələr tanışlığını əql çərçivəsindən xaric bilmiş aşiqin ümumxalq nəzərincə xətakarlığa məhkum olmasına işarə edən nişanədir[1].

**Anlam: Qəbz və bəst ilə bağlı şövq və iztirab, yaxud şühud şövqü ilə əlaqədar tələb və ətəş əql çərçivəsinə sığmaz gizli əhvalatımı faş etməklə:**

**A: Əql əhlinin sərki – danlağına bais oldu (mərdüm).**

**B: Gözün bəbəyini bəsirət məqamına hazırlaşması üçün xəbərdar etdi.**

Beyt 2: **Dəhənin istərəm, ey eşq, yox et varlığımı**
**Ki, yox olmaqda bu gün bir qərəzim var mənim.**

Sözlük: Dəhən – ağız

**Nişanə** 1. "Dəhən": Yoxu var edən ilahi intibahlar feyzindən nişanədir.

**Nişanə** 2. "Yox et varlığımı": A: Yoxu var etmək ülvi cazibələr və mənəvi mərifətlər nailiyyətindən saxlamaqdan, dünyəvi ilgi əlaqələri, xüsusilə fiziki mahiyyəti unutmaqdan istiarədir. Bunun üçün də şair "Bəqa mülkün dilrəsən varını yox eylə dünya tək" buyurmuşdur.

B: Bəqa mülkünü, yaxud intəhasız mənəvi dünyanı duyub – düşünmək, məcazi varlığı unutmaqla mümkündür.

C: Maddi dünyada varını yox edən bir bəndə mənəvi dünyada ikinci

---

[1] Qəzəl 63, beyt 3

varlıq ünvanlı real ölümsüz ilahi olan varlığını tapmalıdır[1].

**Nişanə** 3. "Bir qərəzim var": Qərəz, ikinci varlığa nail olmaqdan ibarətdir.

**Anlam: Mənəvi real varlığa nail olmaq məqsədilə məcazi əngəl varlığını unutmağa cəhd edirəm.**

Beyt 3: **Çıxmış əğyar ilə seyr etməyə ol mərdümi – çeşm,**
**Bu əcəb, mərdümi çıxmış gözüm ağlar mənim.**

Sözlük: Mərdümi-çeşm – göz bəbəyi

**Nişanə** 1. "Əğyar": Bu beytdə şühud nurundan istedadsız feyzyab olmuş şəxslərdən ibarətdir.

**Qeyd:** *İstedadsız tələbkar adamları şühud ehsanından mütəmadi məhrum saxlamaq onların sınaqdan çıxmaqlarına bais olur. Bunun üçün də hakim olan məhbubun "rəhmani feyz"[2] adlı ehsan sifəti onları çətin sınaqlardan müvəqqəti xilas etməklə əbədi məhrumluqdan azad edər. Nəhayət, onlara kamal süfrəsindən mükəmməl surətdə bəhrələnmək, yaxud xüsusi aşiqlər səfinə qoşulmaq mümkün ola bilməz. Ancaq qəbzlərə giriftar olmuş istedadlı aşiq belə bir şühud hikmətini, yaxud nəticəsini duyub – düşünməkdən aciz olar və:*

*"هر که در این بزم مقربتر است   جام بلا بیشترش می دهند" sirrini idrak edə bilməz.*

**Nişanə** 2. "Mərdümi-çeşm": A: Bu beytdə əğyarı müşahidə məqamından, yaxud rəhmani feyzdən bəhrələndirən məhbubdan nişanədir.

B: Daha əziz olan bir vücuda "mərdümi-çeşm" demişlər.

C: İnsana batini ərdəm və həqiqi kəramət bağışlayan feyz mənşəyinə "mərdümi-çeşm" demişlər.

D: Bədən gözünü qamaşdırıb karsız etməklə can gözünü işıqlandıran[3] təcəlli feyzinə "mərdümi-çeşm" demişlər.

**Anlam: Müşahidə nurundan, yaxud göz bəbəyindən ayrılmış halda ağlamağım daha təəccüblüdür, çünki gözsüz ağlamaq imkan və idrak dairəsindən xaricdir.**

Beyt 4: **Bu təmənnadə ki, ol şəm` ilə həmsöhbət olam,**

---

[1] Qəzəl 1, beyt 6, qeydlər
[2] Qəzəl 151, beyt 5
[3] Qəzəl 4, beyt 1

**Dudi – ah etdi dünüm tək günümü tar mənim.**

Sözlük: Dud – tüstü = qurum

**Nişanə** 1. "Şəm`": Bu beytdə aşiqin qəlbini irfan nurundan feyzyab edən ilahi camaldan istiarədir.

**Nişanə** 2. "Həmsöhbət": Bu beytdə vəhdətə söykənmiş kəsrətdən nişanədir.

**Nişanə** 3. "Dudi-ah": Vəhdət həsrətilə alovlanmış kəsrətdən, yaxud biqərarlıqla qatqı mərifətindən nişanədir.

**Nişanə** 4. "Tar": Günü tar olmaq kəsrət təsirindən azad olmaq müqəddiməsindən nişanədir.

**Qeyd** 1: *Kəsrət nişanəsi olan müxtəlif rənglərin qaranlıq gecədə qara vahid rəngə çalmaqları vəhdət müqəddiməsindən istiarədir.*

**Qeyd** 2: *Quranda şərif ayədə "...بان الله يولج الليل فى النهار،" ("Bu Allahın gecədən kəsib gündüzə artırması,..."[1]) buyurulduğu kimi nurun zülmətdən doğulması, yaxud hər şeyin öz ziddi ilə bağlılığı[2] tarlanmış günün isə tovhid günəşindən parlayan həqiqi işıqlığa müqəddimə olduğuna işarə edilir.*

**Qeyd** 3: *İnsanı tovhid günəşinə[3] yaxınlaşdıran sübh ünvanlı üryanlıq və mücərrədlik mərtəbəsi "gecə" ünvanlı kəsrət əngəllərindən azad edən mərtəbədən doğulmalıdır[4].*

**Qeyd** 4: *Bütün rənglərin qaraya çalmağı onların, yaxud kəsrətin etibarsız olduğundan nişanədir.*

**Anlam: Kəsrət ünvanlı dünyəvi mərtəbələri (rənglər), dudi-ah mərhələsindən etibarsız etməklə mən vəhdət nurundan feyzyab olmağa hazırlaşmışam.**

Beyt 5: **Mövc ilə könlümü, ey əşk, qopar yanımdan,**
**Nalə ilə başım ağrıtdı bu bimar mənim.**

Sözlük: Əşk – göz yaşı

**Nişanə** 1. "Mövc": Mütəal məbudun maddi vücudlarda əmanət qoyduğu mənəvi cilvələr zühuruna "mövc" demişlər[5].

---

[1] Quran Həcc surəsi, 61 ci ayə
[2] Qəzəl 7, beyt 6, nişanə 2, qeydlər
[3] Qəzəl 1, beyt 1
[4] Qəzəl 25, beyt 1
[5] Doktor Seyid Cəfər Səccadi, Fərhəngi-loğat və istilahat və təbirati-irfani

**Nişanə** 2. “Könül”: Bu beytdə zahir ilə əlaqədar batindən nişanədir.

**Nişanə** 3. “Əşk”: Dünyəvi istəklər ləkəsini könüldən yuyub onu şəffaflandırmaqla güzgü məqamına çevirən mərtəbədən nişanədir.

**Nişanə** 4. “Nalə”: Bu beytdə mənəvi tələbləri dünyəvi istəklərdən təcrid edə bilməyən münacatdan nişanədir.

**Nişanə** 5. “Başım ağrıtdı”: “Baş ağrıma” bu beytdə mənəvi idrak qarşısında maneə törətməkdən istiarədir.

**Nişanə** 6. “Bimar”: Bu beytdə dünyəvilik sədəmələrindən təmamilə azad ola bilməyən batindən nişanədir.

**Anlam: Batini tələblərimi təcrid etmək məqsədilə zahirimlə batin arasındakı əlaqələri yox dərəcəyə çatdırmaq istəyirəm.**

Beyt 6: **Çıxmış ol şux bu gün tökməyə qanın görənin,**
**Girmə ey göz, kərəm et, qanıma, zinhar mənim.**

Sözlük: Zinhar – aman = möhlət = zaminlik

**Nişanə** 1. “Şux”: A: İlahi gözəl vasitədən nişanədir.

B: Şıdırğı şühud cəlalərindən nişanədir.

**Nişanə** 2. “Qan tökmək”: A: Layiqsiz aşiqi tənbih etməkdən nişanədir.

B: Layiqli aşiqi “qurub” ünvanlı özəl mərtəbəyə, yaxud vəhdət səmasına qaldırmaqdan ibarətdir.

**Anlam: A: Qanın tökülməyi, yaxud fədakarlıq “qürb”, yaxud “qurban” məqamının əsas şərti olduğuna görə zəngin istedad, yaxud nəhəng mənəvi sərmayə tələb edir. Yersiz deyil ki belə bir sərmayəni ələ gətirməzdən əvvəl öz qanının tökülməyinə, yaxud öz qətlinə boyun əyən bir aşiq məşuq hüzurunda məhkəməyə məruz qalmalıdır. Bunun üçün də şair buyurur: “Girmə ey göz kərəm et qanıma zinhar mənim”.**

**B: Fədakarlıq sərmayəsini, yaxud qurbanlıq istedadını hazırlamış aşiq öz qanının tökülməsini möhlətsiz və şərtsiz tələb edir. Bunun üçün də buyurur: “Gəzmə ey göz kərəm et qanıma zinhar mənim”.**

Beyt 7: **Ey Füzuli, dərü divarə qəmim yazmaqdan**
**Şahidi – hali – dilimdir dərü divar mənim.**

Sözlük: Dər – qapı; şahed = şahid

**Nişanə** 1. “Dərü divar”: bütün cansız vücudlardan yaxud bütün varlıqdan nişanədir.

**Nişanə** 2. “Qəm”: bu beytdə qəbz sıxıntılarıyla paralel tələb və həsrət çətinliklərindən nişanədir.

**Nişanə** 3. “Hali-dil”: Bax “qəm”

**Anlam: A: Müqəddəs eşq atəşində alovlanmış qəlbimin özəl zikri bütün varlığa o cümlədən cansız yaranmışlara təsir etmişdir.**

**Qeyd:** *Bir çox Quran icmalçıları, ariflər və filosoflar kimi “Jan Mari Giyu” zənn etmişdir ki, bütün cansız – hərəkətsiz fenomenlərin zəif və məxsus canları vardır və onlara nitqli insanlar kimi yaradıcı mütəal məbudu təsdiq etmək məqsədilə zikr edirlər*[1]*. Beləliklə, onlar (cansız mövcudlar) batini səssiz münacatları, yaxud ürək dilini duyub – düşünməkdən aciz deyillər. Bunun üçün də Füzulinin dam – divar ilə dərdləşməyi, əql çərçivəsində dilini, gözünü, qulağını və bütün vücudunu məhdud və aciz saxlamış insanları tənqid etməklə bərabərdir.*

*B: “Nari-məhəbbət”*[2] *atəşində yanmağıma yaxud “Ələst” aləmində qol çəkdiyim təahhüdnamələrə*[3] *icraçı olduğuma bütün kainat (dərü divar) şahiddirlər.*

**Qeyd:** *Dər, divar, yer, göy və büsbütün kainat xüsusi göz – qulaq, sahibi olduqlarına görə şahidlik təklifini də ifa etməlidirlər. Bunun üçün də bir çox ariflər və alimlər qiyamət gününə müxtəlif şahid və vasitə hazırlamaq məqsədilə ziyarətgahların və Allah evinin müxtəlif yerlərində namaz qılıb dua etmişlər.*

---

[1] Qəzəl 4, beyt 1, haşiyə, qeyd 2

[2] Qəzəl 54, beyt 7, nişanə 2

[3] Qəzəl 19, beyt 4

## Q Ə Z Ə L 173

(1) Ol mah vüsalilə xoş et bir gecə halim,
Ey əxtəri – tale` qoma boynunda vəbalim!

(2) Fəryad ki, bər vermədi bidaddan özgə,
Göz yaşı ilə bəslədigim türfə nihalim.

(3) Sınmış müjə tək, xəlq gözündən axıdır yaş,
Nəzzareyi – zə`fi – bədəni – muyməsalim.

(4) Ol şəm` xəyalilə xoşam, ola ki, daim,
Bu surət ilə cizginə fanusi – xəyalim.

(5) Suzandır odumdan tənimə sancılan oxlar,
Pərvanəyəm, ey şəm`, tutuşmuş pərü balim.

(6) Saqi, qəmi – dövran ilə qayətdə məluləm,
Bir cami – fərəhbəxş ilə dəf` eylə məlalim.

(7) Lütf eylə, Füzuli, mənim əhvalımı ərz et
Ol sərvə ki, söyləşməyə qalmadı məcalim.

Beyt 1: **Ol mah vüsalilə xoş et bir gecə halim,**
**Ey əxtəri – tale` qoma boynunda vəbalim!**

Sözlük: Mah – ay; Əxtər – ulduz; Tale – bəxt = alın yazısını bəyan edən = fal; Vəbal – günah = əzab

**Nişanə** 1. "Mah": Bu beytdə qara maddədə ağ nurunu təzahür etdirən canan camalından nişanədir.

**Nişanə** 2. "Vüsal": Aşiq ilə məşuq arasında olan hicabları yaxud fasiləni yox dərəcəyə çatdırmağa "vüsal" demişlər[1].

**Nişanə** 3. "Xoş": Qəbz arxasındakı bəstdən ibarətdir.

**Nişanə** 4. "Gecə": Bu beytdə dünyəvi bağlantıları qırıb – tökməkdən və xəlvət bir şəraitdə əngəlsiz vücud ilə bəstlik məqamına nail olmaqdan nişanədir[2].

**Nişanə** 5. "Əxtəri-tale": İnsanın alın yazısına təsir etməklə onun dualarını qəbul etdirib arzularına nail edən ulduza əxtəri-tale, yaxud "bəxt ulduzu" demişlər[3].

**Nişanə** 6. "Vəbal": Mənəvi vadilərdə, yaxud eşq və məhəbbət sahələrində əl – ayağı yerdən üzülmüş aşiqlərə etinasızlıq göstərmək, dünyəvi çətinliklər önündə yazıq – yazıq giriftar olanlara yardım etmək kimi "vəbal" hesaba alınmışdır.

**Anlam: Ey bəxt ulduzu, möhtac qalmış aşiqi nur ehsanından (şühud) məhrum etməklə rəhmsizlik günahını boynuna almaqdan qaçmalısan.**

Beyt 2: **Fəryad ki, bər vermədi bidaddan özgə,**
**Göz yaşı ilə bəslədigim türfə nihalim.**

Sözlük: Bər – meyvə = fayda; Türfə – təzə bir şey = qəribə məşuq; Nəhal – pöhrə = körpə ağac

**Nişanə** 1. "Bidad": Bu beytdə "göz yaşı" mərhələsində dünyəvi xarakter ilə rəhmsiz – amansız mübarizə etməkdən nişanədir.

**Nişanə** 2. "Göz yaşı": Mənəvi bazara hazırlanmış fədakarlıq sərmayəsindən nişanədir.

**Nişanə** 3. "Türfə nihal": Qəbz çətinliklərindən xəbərsiz aşiqin xəyalında canlanmış məşuq cilvələrindən nişanədir.

---

[1] Qəzəl 152, beyt 6
[2] Qəzəl 20, beyt 1
[3] Qəzəl 71, beyt 4, nişanə 3

**Anlam: Əfsuslar ki, eşq bazarına hazırladığım sərmayə qəbzlər həbsindən azad olmağıma kifayət etmədi.**

Beyt 3: **Sınmış müjə tək, xəlq gözündən axıdır yaş,**
**Nəzzareyi – zə`fi – bədəni – muyməsalim.**

Sözlük: Müjə – kirpik; Nəzarə – nəzər etmək = tamaşa edənlər; Zəf – zəiflik; Muymisal – tükə bənzər = incə

**Nişanə** 1. "Zəfi-bədən": Aşiq ilə məşuq arasındakı fiziki mahiyyət ünvanlı ən xətərnak maneəni məğlub etməklə aşiqi təcrid ərəfəsinə daxil edən nişanədən ibarətdir[1].

**Nişanə** 2. "Muymisal": Yaxud muyi-miyan, həm özündən həm də özgədən nəzər diqqətini qət etmiş salikdən istiarədir.

**Anlam: Xarici pozgun vücudum ümumxalqı vaysınmaq və ağlamağa vadar etmişdir.**

**Qeyd** 1: *Zahiri pərişanlığın batini inkişaf ilə bağlılığı xalqa aydın olsaydı, əfsus edib ağlamaq əvəzinə şadlıq etməkdən dayanmazdılar.*

**Qeyd** 2: *Həqiqi etibarlar dünyəvi imtiyazların əksindən doğulur.*

Beyt 4: **Ol şəm` xəyalilə xoşam, ola ki, daim,**
**Bu surət ilə cizginə fanusi – xəyalim.**

**Nişanə** 1. "Şəm`": Aşiqin qəlbini irfan nurundan feyzyab edən ilahi camal cəlalarından istiarədir.

**Nişanə** 2. "Xəyal": Ucu-bucağı görünməz geniş üfüqlü irfani bir yöndəmə qapı açan, yaxud özünü Tanrıya çatdırmaq istəyən yer adamını göylərə qaldıran özəl bir qüvvədən ibarətdir. Maddi vücudu mənəvi duyğular səmasına qaldırmaq və görünməz məqamları göstərmək bu nəhəng güclü qüvvə ilə bağlıdır.

**Anlam: Bəşəri hiss ilə üzbəüz olmayan ilahi camal nurunun xəyal gücgüsündə ardıcıl təzahür etməyini arzu edirəm.**

Beyt 5: **Suzandır odumdan tənimə sancılan oxlar,**
**Pərvanəyəm, ey şəm`, tutuşmuş pərü balim.**

Sözlük: Suzan – yanar = dağ = isti = qovrulan

**Nişanə** 1. "Suzan oxlar": Aşiqin məcazi və cismi bağlantılarını ard-

---

[1] Qəzəl 12, beyt 1 "riştə"

ardınca məhv etməklə onu “bəndəlik” ünvanlı mərtəbədə kamala çatdıran və mənəvi nişanlı edən səbəblərdən ibarətdirlər.

**Qeyd** 1: *Oxların yanar olması iç vücudun çöl vücuda təsir etməyini, yaxud batin qabiliyyətini bildirir.*

**Qeyd** 2: *Heç bir şeyə öz canına, malına, ixtiyar və iradəsinə malik ola bilməzliyini düşünmüş aşiqin mütəal məbud ünvanlı həqiqi malikə qul (məmlük) olmuş halına – bəndəlik məqamı demişlər*[1].

**Nişanə** 2. “Pərvanə”: Özlüyündən xaric olmaqla qeyb atmosferinə daxil olmağa hazırlaşmış salikə, yaxud “nari və nuri-məhəbbət”[2] sahəsində ən yüksək mərtəbəyə çatmış aşiqə “pərvanə” demişlər.

**Nişanə** 3. “Şəm`”: Bax beyt 4, nişanə 1

**Anlam: Özümdən xaric olmaqla qeyb səmasına daxil olmağa hazırlaşmışam.**

Beyt 6: **Saqi, qəmi – dövran ilə qayətdə məluləm,**
**Bir cami – fərəhbəxş ilə dəf` eylə məlalim.**

Sözlük: Qayət – qayə = daha çox; Fərəhbəxş – fərəhləndirici; Məlal – qəm = hüzn = zara gəlmək = kefsizlik

**Nişanə** 1. “Saqi”: Bu beytdə mənəvi feyzlər bağışlayan ilahi vasitələrdən nişanədir.

**Nişanə** 2. “Qəmi-dövran”: Bu beytdə bəst nailiyyətinə mane olmuş məcazi əngəl bağlantılardan ibarətdir.

**Nişanə** 3. “Cam”: Bu beytdə, aşiqin vücudunu bəşəri ilgilərdən boşaldıb ilahi maraqlarla dolduran mənəvi məlumatdan nişanədir.

**Nişanə** 4. “Fərəhbəxş”: Ürəkaçan (bəst) ilahi rayihələrdən nişanədir.

**Anlam: Ey mürşüd, məcazi əngəl bağlantıların əlindən zinhara gəlmiş vücudumu yenidən fərəhləndirmək yalnız sənin təlimatın ilə mümkündür.**

Beyt 7: **Lütf eylə, Füzuli, mənim əhvalımı ərz et**
**Ol sərvə ki, söyləşməyə qalmadı məcalim.**

**Nişanə** 1. “Əhval”: Bax beyt 6, qəmi-dövran

---

[1] Qəzəl 1, beyt 6
[2] Atəş su kimi paklayan bir maddə olduğuna görə “nari-məhəbbət” mərhələsi qəlbin müxtəlif qatmacalarını (dünyəvi həvəsləri) yandırıb, onu xalis və pak etməklə “nuri-məhəbbət” adlı mərtəbədə cəlalanmaq rütbəsinə nail edər.

**Nişanə** 2. “Sərv”: Bu beytdə camal təcəllilərini davam etdirməkdən əsirgəmiş mənəvi vasitədən, yaxud mürşüd həzrətindən ya da mütəal məhbubun özündən ibarətdir.

**Nişanə** 3. “Söyləşmək”: İç vücudun “sübbuh” ünvanlı mərtəbədə mütəal məhbub ilə vasitəsiz dərdləşməyindən ibarətdir.

**Anlam: Füzuli yarı göy sakini olmuş vücudundan[1] istəyir ki, onun tələb və ətəşini mütəal məhbub hüzuruna çatdırmağa cəhd etsin.**

---

[1] Qəzəl 80, beyt 5, nişanə 1

## Q Ə Z Ə L 174

**(1) Hər hübabi - əşkimə bir əks salmış peykərim,**
**Şahi – mülki – möhnətəm, tutmuş cəhani ləşkərim.**

**(2) Əhli – qədrəm yanalı eşq oduna pərvanəvəş,**
**Sürmeyi – çeşm eyləmişlər şəm`lər xakistərim.**

**(3) Cismimi yaxdınsa pamal etmə könlümdən, saqın,**
**Külxənəm, əskik degil xakistərimdə əxgərim.**

**(4) Eşq sərgərdaniyəm, köksümdə min – min dağlər,**
**Bir sipehri – sayerəm, sabit cəmii - əxtərim.**

**(5) Çşşm tari – cismimə düzmüşdü əşkim gövhərim,**
**Ah kim, çərx üzmüş ol tari, dağılmış gövhərim.**

**(6) Nola hər saət od üstündə durarsam dud tək,**
**Udi – bəzmi – eşqəm, atəşdir büsatü bəstərim.**

**(7) Ey Füzuli, çox məlamətdən məni mən` etmə kim,**
**Mən nihali – gülşəni – dərdəm, məlamətdir bərim.**

Beyt 1: **Hər hübabi - əşkimə bir əks salmış peykərim,**
**Şahi – mülki – möhnətəm, tutmuş cəhani ləşkərim.**

Sözlük: Hübab – köpük; Əşk – göz yaşı

**Nişanə** 1: "Hübabi-əşk": Dünyəvi ilgi - əlaqələri, xüsusilə bəşəri sifətləri yuyub, iç aləmi "ney"[1] ünvanlı boş mənzilə çevirmiş mərtəbədən nişanədir.

**Qeyd:** *İlahi sifətlər ilə dolmağın ilk şərti içi boşluqdur.*

**Nişanə** 2. "Əks salmaq": "Alət - ust" ünvanlı irfani mərtəbə nailiyyətindən nişanədir.

**Qeyd:** *İrfan mədəniyyətində bütün mərtəblər məqamlar, hətta şərab, meyxana və qumar kimi mənfi mənalı kəlmələrdə "əks" ünvanlı mərhələdə müsbət mənalar kəsb etmişlər. Beləliklə, zavala məruz qalmış "peykər" də "əks salmaq", yaxud "alət - ust" olmaqla, özünü təbiətin zaval qanunundan azad edər. Elə bu mənanı təlqin etmək məqsədilə lisanül qeyb Hafiz buyurmuşdur:*

بنیاد هستی تو چو زیر و زبر شود    در دل مدار هیچ که زیر و زبر شوی[2]

**Qeyd:** *Alət – ust olmuş peykər, zavalsız dünyəvi ömür yox, bəlkə zavalsız dəyər və etibar kəsb edir.*

**Nişanə** 3. "Şahi-mülki-möhnət": Bəşəri ixtiyarını bərbad etməklə ilahi ixtiyara nail olmuş bəlakeş aşiqə "möhnət mülkünün şahı" demişlər.

**Nişanə** 4. "Tutmuş cəhani ləşkərim": Hakim olan məbuddan onun qəflətdə saxladığı şeylərə qələbə əldə etməyindən nişanədir.

**Anlam: Aşiq ilə məşuq arasında dikəlmiş maneələrə qalib gəlməyim, vücudumu dünyəvi sifətlərdən boşaldıb onu mənəvi sifətlər ilə dolduran feyz ilə mümkün olur.**

Beyt 2: **Əhli – qədrəm yanalı eşq oduna pərvanəvəş,**
**Sürmeyi – çeşm eyləmişlər şəm`lər xakistərim.**

Sözlük: Pərvanəvəş – pərvanə kimi; Çəşm – göz; Xakistər – kül

**Nişanə** 1. "Əhli-qədr": Vəhdət məqamına tərəf yönəldən mənəvi etibarlarla tanış olmuş şəxslərə "əhli-qədr" demişlər.

**Qeyd** 1: *Qədr nişanəsi Qurani-Kərim buyurduğu min aydan daha*

---

[1] Qəzəl 1, beyt 2
[2] Qəzəl 11, beyt 5, qeyd

*yaxşı olan Qədr gecəsinə də işarə edir*[1].

**Qeyd** 2: *Ariflər vəhdət mülkünə yönəldən yanğı zamanına, günorta çağı olsa da, Qədr gecəsi demişlər.*

**Nişanə** 2. “Pərvanəvəş yanmaq”: Pərvanəvəş yanmaq, “nari məhəbbət”[2] mərhələsində mənlik – mənəmlikləsini paklamaqla özlüyündən xaric olub qeyb ərəfəsinə daxil olmaq nailiyyətindən nişanədir.

**Nişanə** 3. “Sürmə”: Sürmə bu beytdə məcazi üstünlüklərə mənəvi rəng və rayihə bağışlayan nişanədən ibarətdir.

**Nişanə** 4. “Şəm`”: Şəm` bu beytdə dünyəvi etibarsız inkişaflardan nişanədir.

**Nişanə** 5. “Xakistər”: Xakistər bu beytdə maddi vücudun mənəvi rayihəli töküntüsündən ibarətdir.

**Anlam: Dünyəvi təcəllilər öz cəlalarını mənim “nari məhəbbət” nailiyyətində özlüyündən xilas olmuş vücudumun tör – töküntüsündən kəsb etməyə çalışqanlıq edirlər.**

Beyt 3: **Cismimi yaxdınsa pamal etmə könlümdən, saqın,**
**Gülxənəm, əskik degil xakistərimdə əxgərim.**

Sözlük: Pamal – paymal =ayaq altına düşmüş; Gülxən – zibil yeri = tulanbar; Xakistər – kül; Əxgər – quru = qığılcım

**Nişanə** 1. “Pamal”: Dünyəvi ömür möhlətində ilahi feyzlərin həmişəlik saxlanılmasından, yaxud aşiqin qurban olmaq sərmayəsini dəf etməkdən nişanədir.

**Nişanə** 2. “Könlümdən saqın”: İlahi vədələrin həqiqi, həm də sabit olmasını bilməklə ədəbsizlik etməkdən nişanədir. Belə ədəbsizlik mərifət ilə bağlı bir cəsarəti nişan vermək istəyir.

**Qeyd:** *Yanar vücudun mənəvi mükafatdan bəhrələnməyi ilahi bir vədədir*[3].

**Nişanə** 3. “Külxən”: Mənəvi sınayıcı qəbzlərə və müşküllərə işarə edən dünyəvi həqarətlər və məhrumluqlar nişanəsidir.

**Nişanə** 4. “Xakistər”: Bax beyt 2, nişanə 5

**Nişanə** 5. “Əxgər”: Bu beytdə gizli həyəcanlardan nişanədir.

---

[1] :انا انزلناه فی لیله القدر، و ما ادراک ما لیله القدر، لیله القدر خیر من الف شهر “Biz onu (Quranı) Qədr gecəsində nazil etdik. Sən nə bilirsən ki. Qədr gecəsi nədir? Qədr gecəsi min aydan daha yaxşıdır”. Quran, Qədr surəsi, 1, 2 və 3-cü ayə

[2] Qəzəl 54, beyt 7

[3] Qəzəl 61, beyt 1, nişanə 4, qeydlər

**Anlam: Aşiq zavala məruz qalmış həqir olan maddi vücudunun təcrid etibarı ilə zavalsız məqama yaxınlaşmağını təlqin etmək istəyir.**

Beyt 4: **Eşq sərgərdaniyəm, köksümdə min – min dağlər,**
**Bir sipehri – sayerəm, sabit cəmii - əxtərim.**

Sözlük: Sipehr – səma asiman = bəxt = “Rast pəncgah”a məxsus bir nəğmə; Sair – seyr edici = rəvan = hami; Cəmi – hami = cəmaət = mərdom; Əxtər – ulduz

**Nişanə** 1. “Sərgərdan”: Sərgərdanlıq, əqlin – idrakın ilahi qələbələr önündə bərbad olmağından nişanədir.

**Nişanə** 2. “Dağ”: “Nari-məhəbbət” mərhələsində aşiqin qəlbinə girmiş ilahi nişanədən ibarətdir.

**Nişanə** 3. “Sipəhri-sair”: Sipehri-sair, ibtida ilə intəha arasında sərgərdan qalmış aşiqdən istiarədir.

**Nişanə** 4. “Əxtər”: Bu beytdə “dağ” nişanəsini təkrar edən istiarədən ibarətdir.

**Anlam: Cismim sərgərdan olsa da qəlbimə girmiş ilahi nişanlar sabitdirlər.**

**Qeyd:** *Bu anlam, içəri vücudun zavalsız olduğun işarə edir.*

Beyt 5: **Çeşm tari – cismimə düzmüşdü əşkim gövhərim,**
**Ah kim, çərx üzmüş ol tari, dağılmış gövhərim.**

Sözlük: Tar – riştə = nazik məftil; Əşk – göz yaşı

**Nişanə** 1. “Tari-cism”: incəlmiş və naziklənmiş vücuddan nişanədir. Arif və aşiq “tari-cism” mərhələsində dünyəvi ilgilərini, yaxud büsbütün məcazi bağlantılarını qat – qat soya – soya öz vücudunu elə nazikləndirir ki, əgər daha bir qat soysa, o vücud paralanarkən məhv olur. Bu qədər incəlmək aşiqi dünyəvi təcrid mərtəbəsinə nail edər və ona mənəvi təcrid aləmi ilə həmcins olduğu üçün mücərrəd, yaxud mənəvi vücudlarla qovuşmaq imkanı bağışlar.

**Nişanə** 2. “Əşk gühəri”: Bu beytdə maddi vücudu mənəvi rayihələr ilə zinətləndirən səbəblərdən nişanədir.

**Nişanə** 3. “İkinci misra”: Fanilikdən asılı maddi vücuddan nişanədir.

**Anlam: Beyt maddə ilə məna arasındakı sərgərdanlığı təlqin etmək istəyir.**

Beyt 6: **Nola hər saət od üstündə durarsam dud tək,**
**Udi – bəzmi – eşqəm, atəşdir büsatü bəstərim.**

Sözlük: Dud = tüstü = duda; bəzm = ziyafət məclisi – xeymə; Büsat – fərş = süfrə = sərmayə = dəsgah; Bəstər – düşmək = yataq

**Nişanə** 1. "Od üstündə dud tək durmaq": Bu istiarə mütəal məhbubdan başqalarından hətta öz fikir – xəyalını unutmuş aşiqin maddə ilə məna arasındakı alatoranlıqda bəşəri mərifətlərə sığmaz mübhəm mövqeyindən nişanədir.

**Nişanə** 2. "Ud": Maddə ilə məna arasındakı alatorranlıqda sərgərdan qalmış aşiqin ilahi ilhamlar və ülvi rayihələrdən bəhrələnmək nişanəsidir.

**Anlam: Mövqeyim mübhəm olsa da mənəvi rayihələrdən bəhrəsiz deyiləm.**

Beyt 7: **Ey Füzuli, çox məlamətdən məni mən` etmə kim,**
**Mən nihali – gülşəni – dərdəm, məlamətdir bərim.**

Sözlük: Mən` – qadağan etmək = maneə törətmək; Nəhal – pöhrə = körpə ağac; Bər – meyvə = fayda

**Nişanə** 1. "Məlamət": A: Bütün hörmətlərdən çəkinmək və dünyəvi xarakteri sındırmaqdan nişanədir.

B: Mənfi kəsrət ünvanlı cəmaət etibarını aşiq nəzərincə həqir edərək onu "təfrid", yaxud fərdlik məqamına hazırlayan önəmli bir mərhələdən ibarətdir[1].

**Qeyd:** *Aşiq öz zahiri xarakterini yaddan çıxarmasa məlamətlər önündə müqavimət edə və duruş gətirə bilməz. Beləliklə məlamət, həyatın dünyəvi cəhətini yaddaşdan silərkən mənəvi cəhətini yüksəldir[2].*

**Nişanə** 2. "Nihali-gülşəni-dərd": Qəbzlər həbsində bəst rayihəsilə bəslənmiş aşiqdən ibarətdir.

**Anlam: Bəst dövlətinin qəbz arxasında olduğu kimi "təfrid" nailiyyəti də məlamət mərhələsilə bağlıdır.**

---

[1] Qəzəl 64, beyt 6
[2] Qəzəl 1, beyt 5, nişanə 1

## Q Ə Z Ə L 175

(1) Əql yar olsaydı, tərki – eşqi – yar etməzmidim?
İxtiyar olsaydı, rahət ixtiyar etməzmidim?

(2) Ləhzə - ləhzə surətin görsəydim ol şirinləbin,
Sən kimi, ey Bisütun, mən həm qərar etməzmidim?

(3) Nişə məhrəm eylədin şəm`i, məni məhrum edib,
Mən sənin bəzmində can nəqdin nisar etməzmidim?

(4) Dərdimi aləmdə pünhan tutduğum naçardır,
Uğrsaydım bir təbibə aşikar etməzmidim?

(5) Yar ilə ağyarı həmdəm görməgə olsaydı səbr,
Tərki – qürbət eyləyib, əzmi – diyar etməzmidim?

(6) Vaizin bəzmin mənim rüsvalığımdan qıl qiyas,
Onda sidq olsaydı, mən təqva şüar etməzmidim?

(7) Ol güli – xəndanı görmək mümkün olsaydı mənə,
Sən tək, ey bülbül, gülüstanə güzar etməzmidim?

(8) Ey Füzuli, daği – hicran ilə yanmış könlümü,
Laləzar açsaydı, seyri – laləzar etməzmidim?

Beyt 1: **Əql yar olsaydı, tərki – eşqi – yar etməzmidim?**
**İxtiyar olsaydı, rahət ixtiyar etməzmidim?**

**Nişanə** 1. "Əql": A: Təfəkkür və dəlillərlə əşyalar həqiqətini araşdıran başda yerləşmiş xüsusi qüvvəyə "dünyaşünas əql" yaxud "məaş əqli" demişlər.

B: Ürək içində yerləşmiş mənaşünas, yaxud həqiqətşünas qüvvəyə "məad əqli", yaxud "həqiqi əql" ya da "tam mərifətə nail edən əql" demişlər[1].

**Qeyd:** *Həqiqi əql müstəqil və mücərrəd olan cövhərdən ibarətdir*[2].

**Nişanə** 2. "Tərki-eşq": Bu beytdə: A: Maddi dünya üzərində həm də cism evində yaşamaq məcburiyyətində "bədən xəlvətindən[3]" məhrum olmaq nişanəsidir.

B: Bəşəri iradə xıltından ziyan görmək ləhzələrini təlqin edən nişanədir[4].

**Qeyd:** *Nur, rövnəq, naxış və başqa yöndəmlər, göz, qulaq, dəri və digər hissi üzvlər vasitəsilə ürək ünvanlı Allah evinin işğalçıları olduqları kimi, dünyaya bağlı yaşayış, cismi sağlıq və bədəndən xəbərdar olmaq da mənəvi vüsal maneələri kimi hesaba alınmışlar. Beləliklə, içmək, yatmaq və nəfəs çəkmək ləhzələri müəyyən miqdar eşq tərki ilə bağlıdır.*

**Nişanə** 3. "Birinci ixtiyar": Hər bir ürək "ələst" ünvanlı yuxarı aləmdən gətirdiyi xarakterini sağlam saxlayıbsa, onun ixtiyarsızlığı məcburiyyət yox, bəlkə təbii və qanuni bir prinsipdir[5].

**Nişanə** 4. "Rahət": A: Bəlalara giriftar olmuş cismi üzvlər qurban məqamına çatdıran sərmayə hesaba alınmışlar[6]. Buna görə də aşiq bəlasızlıq, yaxud rahatlıqdan şikayət edir.

**Qeyd:** *Aşiq hər bir üzv mübtəlalığı ilə bir dərəcə qürb məqamına yaxınlaşa bilir.*

*B: Mübtəlalıq ilahi lütflər və cazibələrin qəti olmasından əlamət olduğuna görə aşiq rahatlıqdan şikayət edir.*

*C: Mübtəlalıq ilahi rəhmət və razılıq nişanəsi olduğundan aşiq rahatlıqdan şikayət edir.*

---

[1] Qəzəl 108, beyt 2, nişanə 2
[2] Doktor Məhəmməd Moin, Fərhənge-Moin
[3] Qəzəl 69, beyt 4
[4] Qəzəl 63, beyt 2, nişanə 3
[5] Qəzəl 19, beyt 4
[6] Qəzəl 7,  beyt 2

**Anlam: A: Tam mərifət nailiyyətinə layiq olsaydım (məad əqli) dünyəvi və cismi həyat maneəsindən azad olardım.**

**B: Məad əqlinə tabe və bəşəri iradəyə təslim olsaydım, aşiqliyi tərk etməklə özümü rahat edərdim.**

Beyt 2: **Ləhzə - ləhzə surətin görsəydim ol şirinləbin,**
**Sən kimi, ey Bisütun, mən həm qərar etməzmidim?**

Sözlük: Bisütun – Daryuş padşahın (Dara) kətibələri – daş yazmaları ilə məşhur olan İran Kirmanşahında "Pamçal" kəndinə yaxın bir dağ

**Nişanə** 1. "Surət": Mütəal məbudun "vəch" ünvanlı surəti vardır, amma onun surətini bəşəri surətlə müqayisə etmək olmaz, çünki bəşəri surət zaman keçdikcə solğunlaşıb fani olmalıdır, lakin ilahi surət şərif ayədə "[1]كل من عليها فان و يبقى وجه ربک ذوجلال و الاكرام" ["Yer üzərində" olan hər kəs fanidir. Ancaq əzəmət və kərəm sahibi olan Rəbbinin zatı baqidir) buyurduğu kimi zaman qələbəsindən, yaxud solğunluqdan və fanilikdən üstündür.

**Nişanə** 2. "Şirin-ləb": Mütəal məbudun yoxu var edən ilahmlarını təcəssüm etdirən nişanədən ibarətdir.

**Nişanə** 3: "Bisütun": A: Öz bəşəri iqtidarına məğrur olmuş qafil insandan istiarədir.

B: Öz bəşəri zəifliyini etiraf etmiş arif insandan istiarədir.

**Anlam: Dayanmaz şühud cəlalarından bəhrələnsəydim: A: Bisütun kimi iztiraba düşməzdim (dağın yarılmamağı).**

**B: Bisütun kimi iztiraba düşərdim (dağın yarılmağı).**

**Qeyd:** *Bisütun dağını yarmaq Fərhadın müəyyən vüsal şərti imiş.*

Beyt 3: **Nişə məhrəm eylədin şəm`i, məni məhrum edib,**
**Mən sənin bəzmində can nəqdin nisar etməzmidim?**

Sözlük: Bəzm – ziyafət məclisi = xeymə; Nəqd – pul = sərvət; Nisar – şabaş = gəlin, yaxud digər şəxsin başına ya da ayağına səpilmiş cəvahir

**Nişanə** 1. "Şəm`": Bu beytdə "nari-məhəbbət"[2] atəşində faniliyə

---

[1] Quran,Ərrəhman surəsi, 26 və 27-ci ayələr
[2] Qəzəl 54, beyt 7

nail olmayan aşiqdən istiarədir.

**Nişanə** 2. "Can nəqdini nisar etmək": Nari-məhəbbət atəşində tam yanmağı, yaxud fani olmağı, ya da "qurban" məqamına hazırlaşmağı təlqin edən nişanədir.

**Anlam: Məhrəmlik öz taqətsizliyini təlqin edən kimi, məhrumluq da yetkinliyini və layiqli olmağını bildirir.**

**Qeyd:** *Məhrəmlik rayihəsindən bəhrələnməyən layiqsiz aşiq, əbədi məhrumluğa giriftar olmalıdır. Çünki o, məhrumluq atəşində yanmaq ləyaqətinə sahib deyil.*

Beyt 4: **Dərdimi aləmdə pünhan tutduğum naçardır,**
**Uğrsaydım bir təbibə aşikar etməzmidim?**

**Nişanə** 1. "Dərd": Bu beytdə təbii ömür boyu aşiqi biqərar etmiş tələb qürbətindən ibarətdir.

**Nişanə** 2. "Təbib": Bu beytdə ülvi aləm ilə əlaqədar kamallardan, həm də onların bəlalarından xəbərdar edən, yaxud batini tərbiyələndirən mürşid həzrətindən nişanədir.

**Anlam: Mənaşünas mürşid həzrətindən başqa heç bir şəxsin eşq dərdindən yaxud tələb atəşindən söz açmağı yersiz və faydasızdır.**

Beyt 5: **Yar ilə əğyarı həmdəm görməgə olsaydı səbr,**
**Tərki – qürbət eyləyib, əzmi – diyar etməzmidim?**

**Nişanə** 1. "Yar": Bax beyt 1, nişanə 3

**Nişanə** 2. "Əğyar": Bax beyt 3, nişanə 1

**Nişanə** 3. "Qürbət": Bu beytdə "hal qürbəti" ünvanı ilə tanınmış xüsusi qəriblikdən nişanədir.

**Qeyd:** *Ailəsi, övladı əməkdaşları bütün əql əhli, irfan əhvali-ruhiyyəsini dərk etməyən hər bir aşiq öz ölkəsində və öz evində də hal qürbətində yaşamağa məcburdur*[1].

**Nişanə** 4. "Diyar": Bu beytdə təbiət aləmindən və fiziki mahiyyətdən nişanədir.

**Anlam: Təbiət aləmində giriftar olmağımın əsas səbəbi əğyardan çəkinməkdir.**

---

[1] Qəzəl 34, beyt 3

**Qeyd:** *Əğyarı gözə almaq ikilik nişanəsi olduğundan (bir əğyar, bir canan) vəhdət dənizində kamil fani olmamaqdan nişanədir.*

Beyt 6: **Vaizin bəzmin mənim rüsvalığımdan qıl qiyas,
Onda sidq olsaydı, mən təqva şüar etməzmidim?**

Sözlük: Sidq – sadiqlik = xalislik; Təqva – pəhrizkarlıq = zöhd

**Nişanə** 1. "Vaiz": Birinci beytdə xatırladığımız məaş əqlini üzə çəkib, məad əqlini inkar edən nəsihətçidən ibarətdir.

**Nişanə** 2. "Küfr": Küfr sözünün bir mənası örtük olduğundan məaş əqlini məad əqlinə hicab etməklə öz eşq ünvanlı həqiqi əqlini örtüb - basdıran "vaizi küfrə uğramış" demişlər.

**Nişanə** 3. "Rüsva": Məad əqlindən bəhrələnmiş bir insan dünyəvi dəyərlərin baş – ayaq olduğunu bilməklə ümumxalq ixtiyar etdiyi dəyərlərin əksini seçər, beləliklə də dünyaşünas əqli kafi bilən camaat nəzərində bir xətakar kimi rüsvay olunar.

**Nişanə** 4. "Sidq": Çöl vücudun iç vücud ilə müvafiqət etməyindən, yaxud məaş əqlinin məad əqlinə tabe olmağından nişanədir.

**Nişanə** 5. "Təqva": Təqva bu beytdə zahiri qanun-qayda və rəftarı diqqətlə gözləməkdən nişanədir.

**Anlam: Vaiz beynindəki əqli qənaətbəxş bilərkən qəlbindəki əqlindən xəbərsiz qalmasaydı, yaxud onun batini ilə zahiri həmahəng ola bilsəydi, mən də onunla həmahəng deyib – danışardım.**

Beyt 7: **Ol güli – xəndanı görmək mümkün olsaydı mənə,
Sən tək, ey bülbül, gülüstanə güzar etməzmidim?**

Sözlük: Güzar – yollanmaq = get-gəl = getmək

**Nişanə** 1. "Güli-xəndan": Ürəyi bəst məqamına nail edən ilahi cilvələr uzantısından istiarədir.

**Nişanə** 2. "Görmək": Şərif ayədə "ماكذب الفواد مارا ى[1]" ("ürək gördüyünü yalan bilmədi") buyurduğu yeddi mərtəbəli ürəyin "fuad" adlı dördüncü mərtəbəsi ilə ilahi camal cəlalarını müşahidə etməkdən ibarətdir.

**Nişanə** 3. "Bülbül": Bu beytdə məcazi maraqlara məğlub olmaqdan

---

[1] Qəzəl 34, beyt 3

istiarədir.

**Nişanə** 4. “Gülüstan”: Bu beytdə dünyəvi ürək açan şəraitdən nişanədir, amma şad və geniş olan ruhani aləmə də eyham edir.

**Anlam: Mənəvi maraqlardan bəhrələnmək mərtəbəsinə nail olsaydım, dünyəvi şəraitdə yaşamağı tərk edərdim.**

Beyt 8: **Ey Füzuli, dağı – hicran ilə yanmış könlümü,**
**Laləzar açsaydı, seyri – laləzar etməzmidim?**

**Nişanə** 1. “Birinci misra”: Həkim Füzulini “rəhi-eşqində fəna sərhədi əvvəl mənzil” buyurduğu mərtəbə nailiyyətinə tərbiyə edən tələb və həsrət atəşindən, yaxud məhrumluqdan asılı məhrəmlikdən istiarədir.

**Nişanə** 2. “Laləzar”: Bu beytdə naqis mərifətə nail edən məcazi təravətdən istiarədir.

**Anlam: A: Beyt mənəvi mərtəbəyə istiqamətləndirən məcazi şəraiti alqışlayır.**

**B: Məhz mənəvi şəraiti alqışlayır. (Laləzar açsaydı, seyri-laləzar etməzmidim)**

## Q Ə Z Ə L 176

**(1) Eşigin daşini qan ilə yudu çeşmi – tərim,**
**Bəs ki pakəm, daşi ləl eylədi feyzi – nəzərim.**

**(2) Cigərim dağinə mərhəm bulamadım səndən,**
**Necə ah eyləməyim, ah, yanıbdır cigərim.**

**(3) Dedi ol yar: Səhər vəqti gəlim, leyk nə sud,**
**Vəqt məlum degil, şam ilə birdir səhərim.**

**(4) Ey xoş ol şam ki, bixud gedəm ol kuyə və sübh:**
**Neylədim onda? – deyə qeyrdən alam xəbərim.**

**(5) Düşməzəm könlünə, yəni olubam öylə zəif,**
**Dərdi – eşqinlə ki, güzgudə görünməz əsərim.**

**(6) Neçə min aşiqə ancaq bir ox atdın, demədin**
**Ki, düşər bir – birinə bir neçə üftadələrim.**

**(7) Ey Füzuli, dura məndən ala təlimi – vəfa,**
**Nagəh ər mərqədi – Məcnunə düşərsə güzərim.**

Beyt 1: **Eşigin daşini qan ilə yudu çeşmi – tərim,**
**Bəs ki pakəm, daşi ləl eylədi feyzi – nəzərim.**

Sözlük: Çəşmi-tər – yaşlı göz

**Nişanə** 1. “Eşigin daşı”: İrfan nəsimindən təsirlənməyən maddi çöl vücuddan istiarədir.

**Nişanə** 2. “Çəşmi-tər”: Çəşmi tər bu beytdə dünyəvi əlaqələri – ilgiləri yuyub – təmizləməklə xarici vücudu daxili vücud ilə həmcins edib, onu “məzhəriyyət” ünvanlı irfani mərtəbəyə qaldıran, nəhayət mənəvi tələb atəşində iç vücudu alovlanmış aşiqin ilahi obrazlaşmasına bais olan səbəbdən nişanədir[1].

**Nişanə** 3. “Pak”: Dünyəvi küdurətləri ürəkdən təmizləyən səfa ünvanlı mərtəbədə[2] ümumi, şəxsi və zehni qatmalardan durulmuş vücuddan nişanədir[3].

**Nişanə** 4. “Ləl”: Zavala məruz qalmış maddi vücudun mənəvi çevrilişindən yaxud yenidən özünün zavalsız obrazını əldə etməyindən nişanədir.

**Nişanə** 5. “Feyzi-nəzər”: İrfan nəsimindən təsirlənmiş vücudun əşyalar həqiqətini müşahidə edən qüvvəsindən, yaxud kainatdakı mənəvi inkişafından nişanədir.

**Anlam: “Səfa” adlı irfani mərtəbədə durulmaqla mən daş ünvanlı fiziki – fani vücudu, “ləl” adlı mənəvi ölməz vücuda təbdil etmişəm.**

Beyt 2: **Cigərim dağinə mərhəm bulamadım səndən,**
**Necə ah eyləməyim ah, yanıbdır cigərim.**

**Nişanə** 1. “Cigər dağı”: Aşiqin qəlbini ilahi nişan taxmağa tərbiyə edən atəşdən ibarətdir.

**Nişanə** 2. “Mərhəm”: Maddi həyatına sədəmə vurmuş vücudu mənəvi yaşayışa nail edən səbəbdən nişanədir. Bu səbəbi təlqin etmək məqsədilə şair buyurmuşdur:

**Cigər dağına mərhəm oldu peykanın, bihəmdillah,**
**Səadət kövkəbinə əxtəri-bəxtim müqarindir.**

**Nişanə** 3. “Ah”: Bu beytdə qatmalar tör-töküntüsünü qəlbdən pak-lamaqla mənəvi istedadı yeniləşdirən həsrət və tələb atəşindən nişanədir.

---

[1] Qəzəl 103, beyt 2, qeyd 2
[2] Qəzəl 70, beyt 7, nişanə 3
[3] Qəzəl 142, beyt 1

**Anlam: Maddi həyatıma sədəmə vurmaqla mənəvi surətinə yenidən nail olmuşam. Ancaq hələ də müşahidə uzantısından, yaxud daimi vüsaldan məhrumluqda yaşayıram.**

Beyt 3: **Dedi ol yar: səhər vəqti gəlim, leyk nə sud,**
**Vəqt məlum degil, şam ilə birdir səhərim.**

Sözlük: Leyk – lakin; Sud – fayda = bəhrə

**Nişanə** 1. "Birinci səhər": Aşiqi tovhid günəşindən bəhrələndirən üryanlıq və mücərrədlik şəraitindən nişanədir[1].

**Nişanə** 2. "Vəqt": Aşiqi öz keçmişindən və gələcəyindən, yaxud zaman adlı maddi maneədən azad edən ilahi cilvələrə "vəqt" demişlər. Lisanülqeyb Hafiz bu mərtəbəni təlqin etmək məqsədilə belə buyurmuşdur:

وقت را غنیمت دان، آن قدر که بتوانی
حاصل از حیات ای جان این دمست تادانی[2]

**Qeyd** 1: *Vəqt, "rəhman behişti" ünvanlı[3] ülvi aləmə, yaxud mütəal məbud hüzuruna çatmaqdan ibarət olduğuna bir çox irfani mərtəbədən üstündür. Beləliklə vəqt məqamına nail olmuş bir şəxsə:*

*A: Keçmiş günləri xatırlamaq dəyərsiz alçaq olan bir vəziyyət həsrətini çəkməklə bərabər olduğundan batildir.*

*B: Gələcəyi yada salıb arzu etmək ilahi vüsaldan üstün bir vəziyyət arzusu ilə bərabər olduğundan batildir.*

*Nəticə: Həqir və alçaq olan keçmiş və gələcəyi arxada buraxmış bir şəxs "vəqt" məqamına nail olaraq maddi dünyanın zaman adlı əngəl bir cəhətindən azad olur. Beləliklə o, məcazi dünyada vardır, amma yox kimidir. Demək o, dünyəvi ömür möhlətində kəsrət, yaxud camaat içində vəhdət ilə məşğuldur.*

**Qeyd** 2: *İrfani hallar mənşəyi olan vəqt kitab, sinif, məktəb və müəllim gücünə yaranmadığına görə, yaxud eşq məşq ilə qazanmağın yersiz bir iddia mümkünsüz bir iş olduğundan[4], beyt "vəqt məlum degil" anlamında başa düşülür.*

**Nişanə** 3. "Şam": Bu beytdə şühud məhrumluğuna işarə edən bəxtsizlik vəziyyətindən nişanədir.

---

[1] Qəzəl 25, beyt 1
[2] Müəllif bu beyti "Ta Qafe-əndişe" kitabının 4-cü cildində şərh etmişdir
[3] Qəzəl 111, beyt 1, nişanə 1
[4] Qəzəl 3, beyt 3

**Anlam: Nailiyyət zamanı məlum olmayan “vəqt” həsrətində qara günə qalmışlar kimi yaşayıram.**

Beyt 4: **Ey xoş ol şam ki, bixud gedəm ol kuyə və sübh:**
**Neylədim onda? – deyə qeyrdən alam xəbərim.**

**Nişanə** 1. “Şam”: Şam, yaxud gecə alqı – satqıların və ümum ictimai çalışqanlıqların dayanmaz zamanı olduğuna görə aşiqi kəsrət əngəllərindən kənar edərək vəhdət aləmindən rayihələndirən mücərrədlik və bəstlik məqamından nişanədir.

**Nişanə** 2. “Bixud”: Aşiqi kəsrət şəraitindən xüsusilə fiziki mahiyyətindən, yaxud “məcazi xud” adlı çöl vücudundan xəbərsiz edən əhvaldan ibarətdir[1]

**Nişanə** 3. “Sübh”: A: Vəhdət rayihəsindən bəhrələnmiş aşiqin kəsrət ərəfəsinə daxil olmağından nişanədir.

B: Gündüzün doğuş çağı olduğuna görə hər bir insanın doğum günü günahsız olduğuna işarə edərək aşiqin məsumanə həyat ərəfəsinə daxil olmağını təlqin edir.

**Nişanə** 4. “Qeyrdən alam xəbərin”: Qeyrdən xəbər almaq bixudluq mərhələsini təsdiq etməkdən əlamətdir.

**Anlam: Kəsrət həbsindən azad olaraq vəhdət ərəfəsinə daxil olmuş vücud əhvalatını qeyrdən sormaq daha xoşdur.**

**Qeyd** 1: *Şam əhvalını sübhdən sormaq gözəldir (sübh = qeyr).*

**Qeyd** 2: *Şam və sübh əhvalını qeyrdən sormaq gözəldir (Özündən xəbərsiz aşiq özgələr baxımıyla).*

Beyt 5: **Düşməzəm könlünə, yəni olubam öylə zəif,**
**Dərdi – eşqinlə ki, güzgudə görünməz əsərim.**

**Nişanə** 1. “Zəif”: Bu beyt də qəbzlər həbsində tam məğlub olmaqdan nişanədir.

**Nişanə** 2. “Dərdi-eşq”: Aşiqi ilahi aləmə yönəldən batini rəhbərdən nişanədir.

**Qeyd** 1: *Həzrəti Məryəmi bəxt ağacına yönəldən rəhbər onun doğum dərdi olduğundan şərif ayədə: “[2]فاجاء ها المخاض الى جذع النخله” (“Doğmaq sancısı onu bir xurma ağacının gövdəsinə (söykənməyə) çəkib – gətirdi”) buyurulduğu kimi qurumuş ağac meyvələndi. Hər bədən öz*

---

[1] Qəzəl 87, beyt 4, nişanə 1

[2] Quran, Məryəm surəsi, 23-cü ayədən bir hissə

*batinində bir körpə İsa gəzdirən "məryəm kimidir ki, bu gizli İsanın üzə çıxmağı o vücudun dərdilə tam bağlıdır. Dəmək dərdi peyda olmayan şəxsin körpə İsası, gəldi və gizli yol ilə dübarə qayıdıb öz əl çatmaz əslinə intiqal olmalıdır*[1]. *Ulu şeyx Sədi xatırladığımız İsanı yada salmaq məqsədilə buyurmuşdur:*

همی میردت عیسی از لاغری    تو در بند آنی که خرپروری[2]

**Qeyd** 2: *Xər (uzunqulaq) – öz gizli İsasından xəbərsiz bədəndən nişanədir.*

**Nişanə** 3. "Güzgüdə görünməz əsərim": – Aşiqin mənəviliklə məcazilik arasında mübhəm və qaranlıq vəziyyətindən nişanədir.

**Anlam: Beyt, dünya ilə məna arasında sərgərdan qalmış aşiq əhvalını təlqin etmək istəyir.**

Beyt 6: **Neçə min aşiqə ancaq bir ox atdın, demədin**
**Ki, düşər bir – birinə bir neçə üftadələrim.**

**Nişanə** 1. "Ox": Aşiqin bəşəri mahiyyətinə sədəmə vurmaqla onu qurban məqamına hazırlayan qəbzlər və qəmzələrdən nişanədir.

**Anlam: Bütün aşiqləri məğlub etməyə təkcə bir ilahi qəmzə kafidir.**

Beyt 7: **Ey Füzuli, dura məndən ala təlimi – vəfa,**
**Nagəh ər mərqədi – Məcnunə düşərsə güzərim.**

Sözlük: Nagəh – nagah; Ər = əgər; Güzər – yollanmaq; Get-gəl – getmək

**Nişanə** 1. "Vəfa": "Ələst" aləmində qol çəkilmiş öhdəlik sənədinə dəqiqliklə əməl etməkdən nişanədir[3].

**Anlam: Beyt Məcnun adı ilə (kinayə) öz bəşəri sifətlərini və mərifətlərini təmamilə tərk edə bilməyən aşiqi məlamət edir.**

---

[1] مولوی، فیه ما فیه، ص 33 و 34

[2] سعدی، بوستان، باب 6 ، قناعت

[3] Qəzəl 19, beyt 4

## Q Ə Z Ə L 177

**(1) Zülfi kimi ayağın qoymaz öpəm nigarım,**
**Yoxdur onun yanında bir qılca etibarım.**

**(2) İnsaf xoşdur, ey eşq, ancaq məni zəbun et,**
**Ha böylə möhnət ilə keçsinmi ruzigarım?**

**(3) Bildi təmami – aləm kim, dərdməndi – eşqəm,**
**Yarəb, hənuz halım bilməzmi ola yarım?**

**(4) Vəslindən ayrı nola qanim tökülsə gül – gül,**
**Mən qülbini- fəraqəm bu fəsldir bəharım.**

**(5) Təsvir edən vücudim yazmış əlimdə sağər,**
**Rəf olmağa bu surət yox əldə ixtiyarım.**

**(6) Dur istəmən zəmani mey həvəsin başımdan,**
**Torpaq olanda, yarəb, dürdi – mey et qübarım.**

**(7) Rüsvalərindən ol məh saymaz məni, Füzuli,**
**Divanə olmayımmı dünyadə, yoxdu arım?**

Beyt 1: **Zülfi kimi ayağın qoymaz öpəm nigarım,**
**Yoxdur onun yanında bir qılca etibarım.**

**Nişanə** 1. “Zülf”: Bu beytdə vəhdət rayihəli kəsrətdən nişanədir.

**Qeyd** 1: *Zülf telləri saya gəlməz olduğuna görə kəsrətdən (çoxluqdan) istiarədir.*

**Nişanə** 2. “Ayaq öpmək”: Ziyarət etmək əlamətidir.

**Nişanə** 3. “Nigar”: Aşiqin batini vücudunda təsərrüf edən mürşid həzrətindən ibarətdir. Ancaq bir çox yol “məzhəriyyət”, yaxud “cəmali-vəlayət”[1] ünvanlı irfani mərtəbədə mütəal məhbubun özünə də “nigar” adı ilə xitab etmişlər.

**Nişanə** 4. “Yoxdur etibarım”: Özünü “Zülmət-qəm iztirabın çəkməz ol azadə kim, Hər təəllüqdən ola xurşid tək aləmdə fərd” buyurduğu “fərdlik” məqamına qaldıra bilməyən, yaxud özü ilə məşuq arasında dikəlmiş təllüq ünvanlı hicabları, xüsusilə ən xətərnak tanınmış mənlik hicabını təmamilə aradan qaldırmayan aşiqə etibarsız demişlər.

**Anlam: İlahi vasitələr ziyarətindən məhrum olmağımın ümdə baisi öz etibarsızlığımdan ibarətdir.**

Beyt 2: **İnsaf xoşdur, ey eşq, ancaq məni zəbun et,**
**Ha böylə möhnət ilə keçsinmi ruzigarım?**

Sözlük: Zəbun – həqir = zəif = aciz = məğlub = xar

**Nişanə** 1. “Mən”: Bu beytdə daxili vücud ilə şühud cəlaları arasında maneə törətmiş maddi zahiri vücuddan, yaxud fiziki əngəl mahiyyətindən nişanədir.

**Nişanə** 2. “Zəbun etmək”: İç vücudun, yaxud batini xarakterin dirçəlməyinin və canlanmağının ilk şərti çöl vücudun, yaxud zahiri şəxsiyyətin məğlub (zəbun) olmasından ibarətdir.

**Qeyd:** *Peyğəmbərlər və imamlar hazırlıqla qayibliyi vahidləşdirmək iqtidarına malik olduqlarına görə zəbunluq qanunundan müstəsnadırlar. Onlar vücudun çöl üzünü içəri üzlə həmcins etməklə, zahir və batini, maddə və mənanı bir – birinə qatıb – qatışdırıblar.*

**Nişanə** 3. “Möhnət”: Bu beyt də zahiri vücud məğlubiyyətindən hasil olmuş ictimai xarlıq və cismi pərişanlıqdan nişanədir.

**Anlam: Zahiri vücud ilə barışıqsız mübarizə etmək cayiz bir mübarizədir.**

---

[1] Qəzəl 21, beyt 3

**Qeyd:** *Bir çox düşmən ilə barışmaq igidlik əlaməti olsa da fiziki əngəlli mahiyyət kimi şühud hicabları ilə barışıq başqa igidlikdir.*

Beyt 3: **Bildi təmami – aləm kim, dərdməndi – eşqəm,**
**Yarəb, hənuz halım bilməzmi ola yarım?**

Sözlük: Hənuz – hələ

**Nişanə** 1. "Dərməndi-eşq": Öz batinindəki "İsa" adlı mənəvi rəhbər hidayətindən bəhrələnmiş aşiqdən ibarətdir[1]

**Nişanə** 2. "İkinci misra": Həzərt məhbub "istiğna", yaxud "səmədiyyət" məqamında aşiqin nalələrinə baxmayaraq, onu müxtəlif bəlalar ilə mənlik bəlalarından, yaxud mənfi sağlığından ayırır. Ancaq aşiqə elə gəlir ki, həkim məhbub onun nalələrinə diqqətsizdir.

**Anlam: Dünyəvi və cismani ölçü – biçimlərə sığmaz əhval və rəftarım bütün xəlqi mənim kamil aşiq olduğumdan xəbərdar etdi, amma hələ də mütəal məhbub eşqimin naqis olduğundan ürək münacatıma (nalələrimə) diqqət etməyir.**

Beyt 4: **Vəslindən ayrı nola qanim tökülsə gül – gül,**
**Mən gülbini-fəraqəm bu fəsldir baharım.**

Sözlük: Gülbin = gül butası, gül-gül = çox-çox = naxış-naxış = ləkə-ləkə

**Nişanə** 1. "Vəsl": Aşiq ilə məşuq arasındakı fasilənin yox dərəcəsinə çatmasına "vəsl" demişlər[2].

**Nişanə** 2. "Qanım tökülsə gül-gül":Gül-gül qan tökülmək vüsal yolunda dikəlmiş maneələri addım – addım yuyub – batil etməkdən, yaxud qurban məqamının müqəddiməsindən nişanədir.

**Nişanə** 3. "Gülbini-fəraq": Fəraq aşiqin tərbiyə tapmasında və məna şirinliyini dadmağında gərəkli bir mərtəbə olduğundan onun (aşiqin) özəl baharı hesaba alınmışdır[3].

**Nişanə** 4. "Fəsli-bəhar": Bu beytdə aşiqi içəridən dəyişilməyə və yeni bir həyat və heyət tapmağa hazırlayan şəraitdən nişanədir.

**Anlam: Fəraq möhnəti vüsal dövlətindən asılı olduğuna görə daha əziz və ürəyə yatandır.**

---

[1] Qəzəl 176, beyt 5, nişanə 2
[2] Qəzəl 142, beyt 1
[3] Qəzəl 10, beyt 4

Beyt 5: **Təsvir edən vücudim yazmış əlimdə sağər,**
**Rəf olmağa bu surət yox əldə ixtiyarım.**

Sözlük: Sağər – cam = piyalə

**Nişanə** 1. "Təsvir edən": Şərif ayədə "...هو الله الخالق البارى المصور،" ("O, yaradan, yoxdan var edən, surət verən Allahdır[1]") buyurulduğu kimi, mütəal məhbubun "müsəvvir" ünvanlı adından, yaxud sifətindən ibarətdir.

**Qeyd** 1: *Allah-təalanın iznilə hər bir mövcudun, yaxud hər bir şeyin özəl surətini rəsm edən rəhmət mələkinə "qüdrət müsəvviri" demişlər:*

**Qeyd** 2: **"Külli əqllərə "müsəvvir" demişlər".**

**Qeyd** 3: **"Külli nəfslərə "müsəvvər" demişlər"[2].**

**Qeyd** 4: **"Əla fələk adlı bütün dünyanı əhatə etmiş aləmə, yaxud daha yüksək asimandan yer kürəsinə qədər "kəbir aləm" adlanmış dünyanın vahid ruhuna "külli nəfs" demişlər[3]"**

**Qeyd** 5: **"İslamın ulu peyğəmbərinə "külli nəfs" demişlər"[4]**

**Qeyd** 6: **Şərif ayədə "[5]...اولئک کتب فی قلوبهم الیمان،" ("Allah) onların qəlblərinə iman yazıbdır") buyurulan yeddi mərtəbəli ürəyin[6] qəlb ünvanlı ikinci mərtəbəsinə, yaxud heç bir təcrübəyə sığmaz mənəvi tanışlıq mərkəzinə əql demişlər.**

**Qeyd** 7: **"İnsanın batinində yerləşmiş ilahi lətifəyə, yaxud onun həqiqi zatına "külli nəfs" demişlər[7]"**

**Nişanə** 2. "Sağər": Mənəvi görünməz aləmin nurunu əks etdirən vücuddan nişanədir.

**Nişanə** 3. "İkinci misra": İnsanlar maddi dünyaya gəlməzdən əvvəl mənəvi dünyada, yaxud "ələst" aləmində Allah-təala hüzurunda əql və məntiq ilə bağlı əhd etdikləri kimi (şərafət və sədaqətlə yaşamaq) eşq və məhəbbət ilə əlaqədar öhdəlik sənədlərinə də qol çəkmişlər. Beləliklə sağər əldə yaşamaq imzası olunmuş sənədə əməl etmək, yaxud sağlam batinin qanunu əməldən ibarətdir. Demək görmək qüvvəsini gözdən ayırmaq qeyri qanuni olduğu kimi (əql qanunu) sağəri əldən buraxmaq

---

[1] Quran, Həşr surəsi, 24-cü ayə
[2] Doktor Seyyid Cəfər Səccadi, Fərhəngi-lüğat və istilahat və təbirati-irfani
[3] Göstərilən kitab
[4] Göstərilən kitab
[5] Quran, Mücadilə surəsi, 22-ci ayədən bir qismət
[6] Qəzəl 13, beyt 1, nişanə 2
[7] Doktor Qasim Qəni, Tarixe-təsəvvüf dər İslam, c.2, səh. 412

da qanun dairəsindən xaricdir[1] (eşq qanunu).

**Anlam: Öz ələsti xarakterini, yaxud batini şəxsiyyətini sağlam saxlamış bir insana eşq və məhəbbəti tərk etmək mümkünsüzdür.**

Beyt 6: **Dur istəmən zəmani mey həvəsin başımdan,**
**Torpaq olanda, yarəb, dürdi – mey et qübarım.**

Sözlük: Dur – uzaq; Dürd – camın təkinə çökən yağın, yaxud şərabın qaraya çalan maddəsi

**Nişanə** 1. "Mey nəşəsi": Eşq qələbləri ilə hasil olmuş mənəvi xəyallara və ilahi cazibələrə isinişməkdən nişanədir.

**Nişanə** 2. "Dürdi-mey": Bu beytdə aşiqi məğlubiyyət uzantısı ilə özündən ayrılmağa hazırlayan təcrid rayihəsindən, yaxud eşq iqtidarından nişanədir.

**Anlam: Aşiq (Füzuli) bu beytdə öz dürdi-meyə çevrilmiş qubarı ilə digər aşiqləri qiyamətə qədər təcrid aləminə istiqamətləndirmək tələb edir.**

Beyt 7: **Rüsvalərindən ol məh saymaz məni, Füzuli,**
**Divanə olmayımmı dünyadə, yoxdu arım?**

**Nişanə** 1. "Rüsva": Vəhdət rayihəsilə mənaşünaslığa nail olmuş aşiqin məcazi etibarlardan nifrət etməyindən, beləliklə dünyapərəstlərin sərki – danlağını alqışlamağından nişanədir.

**Nişanə** 2. "Divanə": Həyəcan məğlubiyyətində özündən getməklə dünyaşünas əql həbsindən azad olmağa "divanəlik" demişlər.

**Anlam: Rüsvalıqdan çəkinmək, dünyaşünas əql tabeliyindən əlamətdir və aşiq belə bir əlaməti arsızlıq və nalayiqlik nişanəsi bilir.**

---

[1] Qəzəl 19, beyt 4

## Q Ə Z Ə L 178

**(1) Dürdvəş sərgəşteyi – camü xərabi – badəyəm,**
**Etibarım yox, ayaq torpağı bir üftadəyəm.**

**(2) Hiç rəng ilə mənə abadlıq mümkün degil,**
**Mən xərabi – badeyi – safü üzari – sadəyəm.**

**(3) Deməzəm dəgməz mənə qəmzən xədəngi, ya dəyər,**
**Deymə qeydi çəkməzəm, aləmdə bir azadəyəm.**

**(4) Abi – çeşmim cizginir kuyində, əmma qədri yox,**
**Deməsin bu dövrdə kimsə ki, mərdümzadəyəm.**

**(5) Zahida, məndən nə hasil kim, oxursan məscidə,**
**Məndə taət yox, haman alayişi – səccadəyəm.**

**(6) Çərx dövründən nə hasil kim, verir təğyiri – zövq,**
**Durmadan zövq artırır miskini – dövri badəyəm.**

**(7) Zövq istərsən, Füzuli, tərki – dünya qıl ki, mən**
**Bulmadım bir zövq bundan qeyr ta dünyadəyəm.**

Beyt 1: **Dürdvəş sərgəşteyi – camü xərabi – badəyəm,**
**Etibarım yox, ayaq torpağı bir üftadəyəm.**

Sözlük: Dürdvəş – dürd kimi (camın təkinə çökən yağın yaxud şərabın qaraya çalan maddəsinə dürd demişlər); Sərgəştə – heyran = sərgərdan = avara

**Nişanə** 1. “Dürd”: Bu beytdə qəmginliyi şadlıq ilə qatıb – qatışdıran irfani bir vəziyyəti eyham edir.

**Nişanə** 2. “Sərgəşteyi-cam”: Məhz mənəvi ziyalar önündə məğlub və heyran olmaq nişanəsidir.

**Nişanə** 3. “Xərab badə”: Eşq qələbəsilə bəşəri sifətlərini, yaxud cismi vücudunu unutmuş aşiqdən nişanədir.

**Nişanə** 4. “Etibarım yox”: Etibarı olmamaq: A: Məlamət mərhələsində bütün hörmətlərdən çəkinmək və dünyəvi xarakteri sındırmaqdan istiarədir[1] (dünyəvi etibarsızlıq).

B: Aşiqi dünya və məna arasındakı sərhəddə saxlayan məcazi vücud tör-töküntüsünü tənqid etməkdən nişanədir (mənəvi etibarsızlıq).

Beyt 2: **Hiç rəng ilə mənə abadlıq mümkün degil,**
**Mən xərabi – badeyi – safü üzari – sadəyəm.**

Sözlük: Üzar = camal = üz = üzün narın tük bitən yeri

**Nişanə** 1. “Rəng”: A: Bəşəri təcrübə və dünyaşünas əqlə bağlı siyasətbazlıqdan əlamətdir.

B: İnsanın zavalsız zatını, yaxud İsa ünvanlı məsum həqiqətini[2] örtüb – basdıran cismi iradə və bəşəri sifətlərindən əlamətdir.

**Qeyd:** *Mehriban məbud bütün insanlara, o cümlədən, Firon padşaha da Musa peyğəmbərə hədiyyə etdiyi məsum və ilahi bir zat bağışlamışdır. Ancaq o, (Firon) rəng ünvanlı bəşəri sifətlər əhatəsində öz məsum zatını məğlub və gizli saxlamış həzrət Mövləvi bütün insanlara hədiyyə olmuş məsum zatı təlqin etmək məqsədilə buyurmuşdur:*

چون که بیرنگی اسیر رنگ شد
موسیی با موسیی در جنگ شد[3]

**Nişanə** 2. “Abadlıq”: Bu beytdə bəşəri sifətlər və təbii ölçülər tabeliyindən, yaxud birinci beytdə qeyd olmuş etibarsızlıq ləkəsini silib – təmizləməkdən nişanədir.

---

[1] Qəzəl 1, beyt 5, nişanə 1
[2] Qəzəl 174, beyt 5
[3] Mövləvi, Məsnəvi, dəftər 1, beyt 2525

**Nişanə** 3. “Xərab”: Bax: Beyt 1, nişanə 3.

**Nişanə** 4. “Badeyi-saf”: Aşiqin qəlbinə vasitəsiz daxil olmuş ilahi feyzlərdən nişanədir.

**Nişanə** 5. “Üzari-sadə”: Nəhayətə çatmış qürb məqamında, yaxud vasitəsiz vəziyyətdə təcəlla nurundan bəhrələnmək nişanəsidir.

**Anlam: “Badeyi-saf” və “üzari-sadə” mərtəbəsinə nail olmuş aşiqin yenidən bəşəri sifətlər və dünyəvi etibarlara rəğbət göstərməsi mümkünsüzdür.**

Beyt 3: **Deməzəm dəgməz mənə qəmzən xədəngi, ya dəyər,**
**Deymə qeydi çəkməzəm, aləmdə bir azadəyəm.**

Sözlük: Xədəng – süngü = ox

**Nişanə** 1. “Qəmzə xədəngi”: Ürəyi yarıb onu özəl münacata vadar edən cazibələrdən nişanədir.

**Nişanə** 2. “Azadə”: İkinci beytdə qeyd olunmuş rəngsiz, yaxud təlüqsüz vəcd ilə yaşayan aşiqdən istiarədir. Belə bir aşiqi vəsf etmək məqsədi ilə şair buyurmuşdur:

**Zülməti-qəm istirabın çəkməz ol azadə kim**
**Hər təəllüqdən ola aləmdə çün xurşid fərd.**

**Anlam: Beyt, fərdlik yaxud təcrid məqamında iztirabsız yaşamağı təlqin etmək istəyir.**

Beyt 4: **Abi – çeşmim cizginir kuyində, əmma qədri yox,**
**Deməsin bu dövrdə kimsə ki, mərdümzadəyəm.**

Sözlük: Abi-çeşm = göz yaşı, mərdümzadə = insan oğlu = adam övladı

**Nişanə** 1. “Abi-çeşm”: Bu beytdə tələb ətəşini əlavələndirən biqərarlıqdan nişanədir.

**Nişanə** 2. “Kuy”: Mütəal məhbubu, özünün bütün varlığına, hətta elminə və iradəsinə malik bilmiş aşiqin bəndəlik məqamından ibarətdir.

**Nişanə** 3. “Mərdümzadə”: Olmaq yarı yer – yarı göy sakini insanın göy hissəsinə qovuşmağını, yaxud ədəbiyyatın vəsf etdiyi yarı bəşər, yarı mələk insanın bəşəri həbsdən (maddə aləmindən) xilas olaraq, öz mələki əslinə çatmağını təlqin edən nişanədir.[1] Elə buna görə də demişlər:

ادمیزاده طرفه معجونیست        کز فرشته سرشته وز حیوان

[1] Qəzəl 80, beyt 5

گر کند میل این شود به از این     ورکند میل آن شود کم از آن

**Qeyd:** *Məşhur ariflər və şairlər yuxarıda xatırladığımız göy hissəsinə qovuşmağı, yaxud insanın ülvi həyatını onun yadına salmaq məqsədilə cürbəcür ürək silkələyən dərin mənalı sözlər demişlər, o cümlədən Hafiz Şirazi buyurmuşdur:*

من ملک بودم و فردوس برین جایم بود
آدم آورد در این دیر خراب ابادم[1]

**Anlam: Göz yaşımın təsirsiz olduğu mərdümzadə olmağımdan əlamətdir.**

**Qeyd:** *Özü məğlub olmuş vücudun təzahüratı, o cümlədən gözünün yaşı təsirsiz olmalıdır.*

Beyt 5: **Zahida, məndən nə hasil kim, oxursan məscidə,**
**Məndə taət yox, haman alayişi – səccadəyəm.**

Sözlük: Taət – itaət; Alayeş – bulaşmaq = napaklıq

**Nişanə** 1. “Zahid”: Dünyəvi həyat hissəsində yalnız əql və məntiq hökmünü qəbul edib eşq hidayətini yerli – dibli inkar etmiş müddəidən ibarətdir.

**Nişanə** 2. “Taət yox”: A: Zahidin nəzərincə aşiqin itaətdən çıxmağını, yaxud onun qəbulə keçməyən itaətini təlqin edir.

B: İmamlar və peyğəmbərlər kimi bir çox ariflər də məərifət zirvəsində olduğlarından ömür boyu gecə - gündüz etdikləri ibadət və itaəti mütəal məhbub əzəməti ilə müqayisədə həqir bilib itaətsiz şəxslər kimi üzrxahlığ etmişlər.

**Nişanə** 3. “Səccadə”: İbadət və itaətin şəriət, təriqət və həqiqət ünvanlı mərtəbələrindən bəhrələnmiş şəxsə “səccadi” demişlər.[2]

**Nişanə** 4. “Alayişi-səccadə”: A: Zahid nəzərincə alayiş-səccadə öz ibadətini ləkədar etmiş aşiqdən əlamətdir.

B: Özü öz ibadətinin naqis və həqir olduğundan xəcalət çəkmiş arifdən nişanədir.

**Anlam: A: Aşiq səccadə mərtəbəsinə layiq olmayan ibadətinə etiraf edir.**

**B: Zahidin etirazını bir zarafat kimi qəbul etməklə onu başdan eləmək istəyir.**

---

[1] Müəllif bu beyti “Ta Qafe-əndişe” kitabının 4-cü cildində şərh etmişdir.
[2] Doktor Seyyid Cəfər Səccadi, Fərhəngi-lüğati- estelahat və təbirati-irfani

Beyt 6: **Çərx dövründən nə hasil kim, verir təğyiri – zövq,**
**Durmadan zövq artırır miskini – dövri badəyəm.**

**Nişanə** 1. “Zövq”: A: Mənəvi zövq: Mənəvi zövq şühud məqamının ilk mərtəbəsindən nişanədir. Bu mərtəbəni dərk etmiş aşiq şühud nemətlərinin dadını – tamını düşünərkən dəmbədəm özünün tələbini və ətəşini əlavə edir və nəhayət “hal” səmasının şıdırğı parlamalarından bəhrələnir.

B: “Məcazi zövq”: Ürəyə yatan dünyəvi gözəllikləri dərk edən cismi qüvvədən ibarətdir.

**Nişanə** 2. “Dövri-badə”: “Rəhmani nəfəslər” ünvanlı ilahi feyzlərin dəmbədəm yeniləşməyindən nişanədir.

**Anlam: Zəmanə dövrü maddi vücudu qocaldıb zəifləndirən kimi onun meyl, həvəs və şövq kimi təzahür etdiyini də zəifləndirir. Amma badə dövr etdikcə daxili, yaxud həqiqi həyatı təzələndirib, onu zövq və şövq kimi təzahür etdiyində yeniləşdirir.**

Beyt 7: **Zövq istərsən, Füzuli, tərki – dünya qıl ki, mən**
**Bulmadım bir zövq bundan qeyr ta dünyadəyəm.**

**Nişanə** 1. “Dünya”: Saliklər, insanı həkim məbuddan qəflətdə saxlamış şeyə dünya demişlər.

**Qeyd:** *İkinci misrada qeyd olunmuş dünya məcazi ömür möhlətindən nişanədir.*

**Anlam: Mənəvi yaşayış zavala uğramış maddi mərtəblərdən çəkinməklə mümkün olur.**

## Q Ə Z Ə L 179

(1) Canlar verib, sənin kimi canana yetmişəm,
Rəhm eylə kim, yetincə sənə canə yetmişəm.

(2) Şükraneyi – vüsalinə can verdigim bu kim,
Çox dərd çəkmişəm ki, bu dərmanə yetmişəm.

(3) Halım deyib, muradıma yetsəm əcəb degil,
Bir bəndəyəm ki, dərgəhi – sultanə yemişəm.

(4) Muri – mühəqqərəm ki, sərasimə çox gəzib,
Nagah barigahi – Süleymanə yetmişəm.

(5) Bir bülbüləm ki, gülşən olubdur nəşimənim,
Ya tutiyəm ki, bir şəkəristanə yetmişəm.

(6) Dövri – fələk müyəssər edibdir muradımı,
Guya ki, talibi – gühərəm, kanə yetmişəm.

(7) Miskin Füzuliyəm ki, səna tutmuşam üzüm,
Ya bir kəminə qətrə ki, ümmanə yetmişəm.

Beyt 1: **Canlar verib, sənin kimi canana yetmişəm,**
**Rəhm eylə kim, yetincə səna canə yetmişəm.**

**Nişanə** 1. “Canlar verib”: Dönə-dönə ölüb-dirilməkdən, yaxud dəfələr bəst arxasındakı qəbzlərə giriftar olmaqdan nişanədir.

**Nişanə** 2. “Canan”: Bütün mövcudlara “qiyam” ünvanlı mərtbədə həyat və hərəkət bağışlayan mütəal məhbubdan nişanədir[1].

**Nişanə** 3. “Cananə yetmişəm”: Özünü “hal” məqamına çatdırmış ürəyin ülvi aləm seyrinə nail olmağı və ilahi vüsal rayihəsindən bəhrələnməyi cananə yetməkdən əlamətdir.

**Qeyd:** *“Müəyyən bir mənzilə çatmaq istəyən şəxsin, əvvəlcə ürəyi o mənzilə gedir, o yerin əhvalından xəbərdar olur, sonra qayıdıb bədəni də özü ilə həmin mənzilə çəkib – aparır, ... demək Allah-təalanın peyğəmbərləri və “övliya” ünvanlı xüsusi dostları əvvəlcə dəridən, ətdən, nəhayət, bəşəri vücuddan kənara çıxdılar və mücərrəd qəlb ilə ülvi aləmi seyr edərək o aləm və bu aləmin (dünya və mənanın) alt – üstünü mütaliə etdilər və mənzillər sovuşdular. Beləliklə əvvəlcə necə yol getməkdən xəbərdar oldular, sonra bütün xalqı dəvət etmək məqsədilə: “Bu əsl aləmə tərəf gəlin ki yer aləmi (maddi aləm) fanilik və viranlıq dünyasıdır” dedilər*[2].

**Nişanə** 4. “Canə yetmişəm”: Canə yetmək daha şiddətli olan çətinlikdən istiarədir, ancaq bəşəri mahiyyətin yaxud mənəm – mənəmliyin ölməsini, yaxud islam peyğəmbəri buyurduğu “موتو قبل ان تموتو” (“təbii ölümdən əvvəl”) ixtiyari ölüm ilə ölünüz) sözünü eyham etmək istəyir.

**Anlam: Ey mehriban məbud, vüsal rayihəsindən bəhrələndirən bəndəlik ərəfəsinə daxil olmadan əvvəl mən müxtəlif təhlükəli hadisələr və can alıcı qəbzlər giriftarlığını təcrübə etmişəm ancaq sənin lütfün olmasa yenidən həmin təhlükələrə giriftar olmalıyam.**

**Qeyd:** *Aşiq hər halda, hətta vüsal nailiyyətində də öz ehtiyacını etiraf etməlidir.*

Beyt 2: **Şükraneyi – vüsalinə can verdigim bu kim,**
**Çox dərd çəkmişəm ki, bu dərmanə yetmişəm.**

---

[1] Doktor Seyyid Cəfər Səccadi, Fərhəngii-lüğati-estelahat və təbirati-irfani

[2] مولوی، فیه ما فیه،ص 191

Sözlük: Şükranə – şükür etmək

**Nişanə** 1. "Şükranə": Bir insan, yaxud bir bəndə nə qədər yaradıcı məhbubun özünü və ehsanını yaxından tanıyıb – düşünsə bir o qədər də şükrünü əlavə etməlidir. Beləliklə şükranə "qurb" ünvanlı yaxınlığa bağlı olan bir mərtəbədir[1]. Demək vüsal ünvanlı nəhayətə çatmış yaxınlıqdan (müqərrəblik) təşəkkür etmək üçün, can mətaini qurban etmək lazım gəlir.

**Nişanə** 2. "Vüsal": Birinci beytdə qeyd olunmuş "cananə yetmişəm" mərtəbəsini təkrar edən nişanədir.

**Nişanə** 3: "Can verdiyim": Can vermək ötən beytdə qeyd olunmuş "cananə yetmişəm" nişanəsini təkrar etmək istəyir.

**Nişanə** 4. "Dərd": Ötən beytdə (anlam) bəyan olunmuş təhlükələr və qəbzlərdən nişanədir.

**Nişanə** 5: "Dərmanə yetmişəm": Bax "cananə yetmişəm"

**Anlam: Can vermək məqamına layiq olmaq sınayıcı qəbzlər ilə bağlıdır.**

**Qeyd:** *Canı hədiyyə etmək yüksək bir məqam və önəmli bir nailiyyət olduğundan:*

*A: Xüsusi ləyaqət və qabiliyyət ilə bağlıdır. Bu ləyaqəti ələ gətirməzdən əvvəl canını hədiyyə etmiş aşiq məşuq hüzurunda məhkəməyə məruz qalmalıdır*[2].

*B: Hər bir məqama çatmaq xüsusi sınaqlardan çıxmağa şərt olan kimi can vermək məqamına nail olmaq da, can alıcı mənzilləri (qəbzlər, təhlükələr) sovuşmaqla şərtlənir.*

Beyt 3: **Halım deyib, muradıma yetsəm əcəb degil,**
**Bir bəndəyəm ki, dərgəhi – sultanə yemişəm.**

Sözlük: Dərgəh – ərəfə = qapı = qəsr

**Nişanə** 1. "Murad":A: Bəşəri iradəsini təmamilə tərk edib, özünü mənəvi məqamların nəhayətinə çatdırmış arifə murad demişlər.

**Qeyd:** *Öz iç aləmini dünyəvi ilgi - əlaqələrdən boşaldarkən "ney" məqamına*[3] *nail olmuş aşiqin boş vücudu (iradəsiz vücudu) ilahi iradə ilə dolmalıdır. Demək, onun əli yədullah, gözü eynullah, vücudu ayətullah*

---

[1] Qəzəl 4, beyt 7, nişanə 2
[2] Qəzəl 7, beyt 2, qeyd 3
[3] Qəzəl 1, beyt 2

*olduğuna görə bütün əməllərinin mənşəyi mütəal məbudun öz istək – iradəsi olacaqdır*[1].

*B: "İmam və peyğəmbər kimi rəhbərə murad demişlər".*

*C: "İrfani mərhələləri təmamilə seyr etmiş, yaxud mənəvi tərbiyədən mükəmməllənmiş arifə murad demişlər".*

*D: "Ruh və qəlbi ilə qanad aça bildiyi mənəvi cazibələr səmasından yüksəkdə olan "kəşf" və "yəqin" ünvanlı mərtəbəyə çatmış arifə murad demişlər."*[2]

**Nişanə** 2. "Bəndə": Allahdan başqasını xüsusilə özünü məmlük[3] və möhtac görməklə şərif ayədə "ایاک نعبد و ایاک نستعین[4]" ("[Pərvərdigara!]) Biz təkcə Sənə ibadət edirik və təkcə Səndən kömək diləyirik.) buyurduğu kimi təkcə mütəal məbuda baş endirib heç bir insana, yaxud heç bir iqtidara yaltaqlıq etməyən baş endirməz aşiqə bəndə demişlər.

**Nişanə** 3. "Sultan": Bu beytdə bəşəri iradəni ilahi iradəyə çevirən qadir olan məbuddan ibarətdir.[5]

**Anlam: Murad məqamına nail olmağın əsas şərti həqiqi bəndəlikdən ibarətdir.**

Beyt 4: **Muri – mühəqqərəm ki, sərasimə çox gəzib,**
**Nagah barigahi – Süleymanə yetmişəm.**

Sözlük: Mur – qarışqa; Mühəqqər – həqir = xar olmuş

**Nişanə** 1. "Muri-mühəqqər": Öz məmlüklüyünü düşünmüş aşiqdən istiarədir.

**Nişanə** 2. "Sərasimə çox gəzib": Sərasimə gəzmək seyr mənzillərinin can alıcı təhlükələrinə işarə edən istiarədir.

**Nişanə** 3. "Bargahi-Süleyman": Bax beyt 3 (dərgəhi-sultan)

**Anlam: Müxtəlif təhlükəli hadisələr və maneələr qarşısında özlüyümdən üryan olmaqla bəndəlik ərəfəsinə daxil olmuşam.**

**Qeyd** 1: *Mənəvi bazar sərmayəsi yaxud bəndəlik məqamı kimi ilahi mənsəblərə çatmaq sərmayəsi aşiqin öz vücudu, yaxud özlüyüdür*[6].

---

[1] Qəzəl 63, beyt 2
[2] Doktor Seyyid Cəfər Səccadi, Fərhəngi-lüğati-estelahat və təbirati-irfani
[3] Qəzəl 1, beyt 6, nişanə 2
[4] Quran, Fatihə surəsi, 5-ci ayə
[5] Qəzəl 98, beyt 1, nişanə 3
[6] Qəzəl 3, beyt 3

**Qeyd** 2: *İnsanı özlüyündən azad edən, yaxud mənliyini xərc etməyə hazırlayan vasitə, xalisanə ibadət və itaətdən ibarətdir.*

Beyt 5: **Bir bülbüləm ki, gülşən olubdur nəşimənim,**
**Ya tutiyəm ki, bir şəkəristanə yetmişəm.**

Sözlük: Nəşimən – oturacaq; Tuti – tutuquşu; Şəkəristan – şəkər qamışı əkilən yer = şəkər bazarı

**Nişanə** 1. "Bülbül": Bu beytdə ürək münacatı (nalə) məşğulluğunda fiziki mahiyyətini unutmuş aşiqdən istiarədir.

**Nişanə** 2. "Gülşən": Bəşəri sifət və maddi təbiətdən xəbərsiz edən ilahi camal parlamalarına, yaxud ruhani aləmə ya da vəhdət dünyasına "gülşən" demişlər[1]

**Nişanə** 3. "Tuti": Sözündə - əməlində mənəvi vasitələri təqlid yaxud ilahi ilhamları təkrar edən arifə "tuti" demişlər. Hafiz Şirazi tuti məqamına nail olmuş sözünü ilahi ilhamın təkrarı bilib buyurmuşdur:

در پس اینه، طوطی صفتم داشته اند
آنچه استاد ازل گفت بگو می گویم[2]

**Qeyd** 1: *Bir çox işləri xüsusilə sözü – söhbəti qeyri ixtiyari olmuş aşiq axirət dünyasında mühakimə olunmaqdan azaddır. Çünki məhkəmə, ixtiyarsız bir şəxsə cəza müəyyən etməmişdir.*

**Qeyd** 2: *Tuti ünvanlı aşiqi tənqid etmiş vaiz ilahi iradəni tənqid etməklə öz fikrinin batil olduğunu sübut etmişdir.*

**Nişanə** 4. "Şəkəristan": Aşiqin həyatını dəmbədəm təzələyən ilahi isinməkdən istiarədir.

**Anlam: Ülvi həyat ləzzətindən bəhrələnmək bəşəri adətləri tərk etməklə mümkün ola bilir.**

Beyt 6: **Dövri – fələk müyəssər edibdir muradımı,**
**Guya ki, talibi – gühərəm, kanə yetmişəm.**

Sözlük: Müyəssər – mümkün = hazırlanmış; Güհər – gövhər; Kan – mədən

**Nişanə** 1. "Dövri-fələk": Müqəddəratı təyin edən təbii qüvvələrdən üstün iqtidardan nişanədir.

**Nişanə** 2. "Murad": Bu beytdə mənəvi hədəflər nailiyyətindən

---

[1] Şeyx Mahmud Şəbüstəri, Gülşəni-raz, səh. 532
[2] Müəllif bu beyti "Ta Qafe-əndişe" kitabının 3-cü cildində şərh etmişdir

ibarətdir.

**Nişanə** 3. “Talib”: Həmişə tələb halında olan arifə tələb demişlər.

**Qeyd** 1: *Məhbub həzrətini tanıyıb – tapandan sonra hasil olmuş ətəş və xahişə tələb demişlər.*

**Qeyd** 2: *Mütəal məhbubu tanıyıb – tapmaqdan əvvəl onu tələb etmək yalnız alçaqlıq və ləyaqətsizlik nişanəsidir. Beləliklə, tələb aşiqi biqərarlıq səbəbilə ilahi məqsəd yoluna yönəldən nişanədir.*[1]

**Nişanə** 4. “Gühər”: Salikin tələb etdiyi mənalar və mərifətlərdən yaxud əşyaların həqiqətindən nişanədir.

**Nişanə** 5. “Kan”: Mənəvi feyzlər mənşəyinə işarə edən dünyəvi etibarlar mənbəyindən nişanədir.

**Anlam: Təbiətə bağlı qanun və təcrübədən üstün olan ülvi iqtidardan bəhrələnərkən ilahi istəyimə nail olmuşam.**

**Qeyd:** *İkinci misra yuxarıda xatırladığımız mənəvi nailiyyəti hissiləşdirmək istəyir.*

Beyt 7: **Miskin Füzuliyəm ki, səna tutmuşam üzüm,**
**Ya bir kəminəı qətrə ki, ümmanə yetmişəm.**

Sözlük: Kəminə – daha kəm = həqir insan

**Nişanə** 1. “Sənа tutmuşam üzüm”: Üz tutmaq:

A: “انه بكل شيى محيط[2]” (“Allah hər şeyi əhatə edəndir”) ayəsini, yaxud mütəal məhbubun əhatə edici sifətini təsdiq etməkdən istiarədir.

B: “كل يوم هو فى شان[3]” (“O, hər gün [kainatda] təsərrüf etməkdədir”) ayəsini, yaxud bütün mövcudlara dəmbədəm varlıq bağışlayan ilahi feyzi, ya da Füzuli buyurduğu:

**Dəmadəm əks alır mirat aləm qəhrü lütfündən,**
**Onunçun gəh küdurət zahir eylər gəh səfa peyda**

beytini duyub – düşünməkdən istiarədir.

C: “رحمتى وسيعت كل شى[4]” (“rəhmətim isə hər şeyi bürüyübdür”) ayəsini, yaxud mütəal məbudun “rəhmani feyz”[5] ünvanlı varlıq bağışlayan rəhmətini təlqin edən istiarədir.

---

[1] Qəzəl 32, beyt 7
[2] Quran, Fussilət surəsi, 54-cü ayə
[3] Quran, Ərrəhman surəsi 29-cu ayə
[4] Quran, Əraf surəsi, 156-cı ayə
[5] Qəzəl 151, beyt 5

D: “فاينما تولو فتم وجه الله[1]” (“Hər hansı tərəfə üz tutsanız əslində Allaha tərəf üz tutubsuz”) ayəsinə işarə edən istiarədir.

**Nişanə** 2. “Kəminə qətrə”: Bu beytdə aşiqin məmlüklüyünə işarə edən nişanədir.

**Nişanə** 3. “Ümman”: Bu beytdə “qeybül-qeyb” ünvanlı gizli aləmdə gizlənmiş xüsusi mərtəbədən nişanədir.

**Anlam: Beyt aşiq ünvanlı həqir məmlükün məbud ünvanlı əziz malik ərəfəsinə daxil olmaq illətini və hikmətini təlqin edir.**

---

[1] Quran, Bəqərə surəsi, 115 ci ayə

**Q Ə Z Ə L 180**

**(1) Yar hali – dilimi zar bilibdir, bilibəm,**
**Dili – zarimdə nə kim var, bilibdir, bilibəm.**

**(2) Yari əğyar bilibdir ki, mənə yar olmaz,**
**Mən dəxi ani ki, əğyar bilibdir, bilibəm.**

**(3) Zülfünü əhli – vəfa seydinə dam eyləyəli,**
**Məni ol damə giriftar bilibdir, bilibəm.**

**(4) Mən nə hacət ki, qılam dərdi – dilim yarə əyan.**
**Qamu dərdi – dilimi yar bilibdir, bilibəm.**

**(5) Yar həmsöhbətim olmazsa, Füzuli, nə əcəb,**
**Özünə söhbətimi ar bilibdir, bilibəm.**

Beyt 1: **Yar hali – dilimi zar bilibdir, bilibəm,**
**Dili – zarimdə nə kim var, bilibdir, bilibəm.**

**Nişanə** 1. “Yar”: Arifləri şühud aləmindən, yaxud öz “vəch” ünvanlı camalının nurundan feyzyab edən mütəal məhbubdan ibarətdir.

**Nişanə** 2. “Zar”: Əzabverici qəbzlər sınağında dünyəvi mahiyyətini qat – qat soyub incəlmiş, təcrid şəraitinə hazırlaşmış, yaxud “dəqiqə”[1] ünvanlı irfani məqama nail olmuş vücuddan nişanədir.

**Nişanə** 3. “Zar bilibdir”: Zar bilmək, yaxud zar olmaq mütəal məbudun aşiqin tərbiyə və inkişafına məsləhət bildiyindən ibarətdir.

**Nişanə** 4. “İkinci misra”: Şərif ayədə “انک انت علام الغيو ب[2]” (“Həqiqətən qeybləri bilən ancaq sənsən”) buyurduğuna əsaslanaraq mütəal məhbubun bütün qeyblər, o cümlədən ürəklər içindəki əhvali-ruhiyyədən xəbərdar olduğunu təlqin edən nişanədir.

**Anlam: Qəlbimin qəbzlər əzabına giriftar olmağı mütəal məhbubun məsləhəti olduğundan şirin və xeyirlidir.**

Beyt 2: **Yari əğyar bilibdir ki, mənə yar olmaz,**
**Mən dəxi ani ki, əğyar bilibdir, bilibəm.**

**Nişanə** 1. “Əğyar”: Aşiqin giriftar olduğu qəbzlər (zarlıq) hikmətindən xəbərsiz camaatdan nişanədir.

**Nişanə** 2. “Yar olmaz”: Özünü təmamilə unutmayan aşiqi qəbzdən azad etməyən məhbubun qəhr sifətindən nişanədir. Bu nişanə aşiqi maddi vücud tör – töküntüsündən xilas etmək istəyir, çünki həmin tör – töküntü dedikdə vasitəsiz müşahidə məqamından məhrum edən maneə nəzərə alınır.

**Anlam: Fani olmadan əvvəl qəbzlərdən azad olmağımın mümkünsüz olduğunu əğyar bilibdir. Mən ancaq onların bildiyini təsdiq edirəm.**

Beyt 3: **Zülfünü əhli – vəfa seydinədam eyləyəli,**
**Məni ol damə giriftar bilibdir, bilibəm.**

Sözlük: Seyd – şikar etmək = şikar

**Nişanə** 1. “Zülf”: Bu beytdə yaradıcılıq nöqtəsinə yönəldən vəhdət rayihəli kəsrətdən nişanədir.

---

[1] Qəzəl 12, beyt 1
[2] Quran, Maidə surəsi, 109-cu ayədən bir qismət

**Nişanə** 2. “Əhli-vəfa”: “Ələst”[1] aləmində qol çəkilmiş öhdəlik sənədinə dəqiqliklə əməl etmiş, yaxud məhbubdan başqasını xüsusilə özünü təmamilə unutmuş aşiqlərdən nişanədir.

**Nişanə** 3. “Seyd”: A: İlahi cazibələr nailiyyətinə “seyd” demişlər.

B: Hicran giriftarlığına “seyd” demişlər.

**Anlam: Mehriban məbud gah kəsrət güzgüsündə təzahür etdirdiyi vəhdət cazibələri ilə, gah da hicran əzabına giriftar etməklə məni özümdən ayırma, yaxud həqiqət nailiyyətinə çatdırmaqla tərbiyə edir.**

Beyt 4: **Mən nə hacət ki, qılam dərdi – dilim yarə əyan.**
**Qamu dərdi – dilimi yar bilibdir, bilibəm.**

Sözlük: Əyan – əyani = aşkar

**Anlam: Bu beyt isə birinci beytdə qeyd olunmuş 40-cü nişanə kimi mütəal məbudun “علّام الغيوب” ünvanlı sifətini təlqin etmək istəyir.**

Beyt 5: **Yar həmsöhbətim olmazsa, Füzuli, nə əcəb,**
**Özünə söhbətimi ar bilibdir, bilibəm.**

Sözlük: Həmsöhbət – həmdəmlik = söhbət = oturuşmaq

**Nişanə** 1. “Söhbət”: Şərif ayədə “ فلما اتاها تودى من شاطى الوادالايمن فى البقعه المباركه من الشجره ان يا موسى انّى انا الله رب العالمين[2]” (“Oraya [Tur dağının yanına] çatdığı zaman, vadinin sağ tərəfindən və o mübarək məqamdan ağacdan səs gəldi ki: Ya Musa! Mənəm! Mən, aləmlərin rəbbi [olan] Allaham”) buyurulduğu kimi məlaikə aləmindən, yaxud təbiət dünyasından arifləri nida edən səsə, yaxud ilahi olan dəvətə “söhbət” (kəşf) demişlər.

**Qeyd:** *Söhbət məqamında peyda olmuş səs işarəli dili ilə deyir ki: “Ey aşiq dəlil, məntiq və əql göstərdiyi yol sən tələb etdiyin məşuq həzrətindən daha uzaq olan uzun – uzadı bir yoldur. Bunun üçün də əql və məntiqə bağlı dəlilləri arxada buraxıb, dünyəvi istəklər ləkəsindən silinmiş öz iç aləmindən məşuq həzrətini tələb qılsan onda Musa peyğəmbər kimi “fuad”[3] ünvanlı ürək gözü ilə və batindən açılmış qulaq*

[1] Qəzəl 19, beyt 4
[2] Quran, Qəsəs surəsi, 30-cu ayə
[3] Qəzəl, beyt 1

*istedadı ilə pak olan ağacdan [mütəal məşuq cilvəsini] görüb və içərindən "انی انا الله" səsləyən dəvəti dinləyərsən.*[1]

**Nişanə** 2. "Ar bilmək": Ar bilmək, aşiqin söhbət ünvanlı məqam nailiyyətinə layiq olmadığını bildirən nişanədir.

**Anlam: Söhbət məqamına layiqsiz olduğumu etiraf edirəm.**

---

[1] Şeyx Mahmud Şəbüstəri, Gülşəni-raz, səh. 156

## Q Ə Z Ə L 181

**(1) Xoş ol zaman ki, hərimi – vüsalə məhrəm idim,**
**Nə mübtəlayi – bəla, nə müqəyyədi – qəm idim.**

**(2) Gəzərdim itlərin içrə fəzayi – kuyində,**
**Yerim behişti – bərin idi, mən bir Adəm idim.**

**(3) Həmişə səcdəgəhim xaki – asitanın idi,**
**Bu etibar ilə bir sərbüləndi – aləm idim.**

**(4) Gədayi – kuyin idim, böylə zillətim yox idi,**
**Səriri – səltənəti – qürbdə müəzzəm idim.**

**(5) Zaman – zaman əsəri – pərtöyi – cəmalindən**
**Müalici – dili – pürdərdü çeşmi – pürnəm idim.**

**(6) Ziyadə qəmzədəyəm hicr ilə, xoş ol günlər**
**Ki, mən bu qəmzədəlikdən ziyadə xürrəm idim.**

**(7) Füzuli, olmaz imiş möhnəti – fərağə müfid,**
**Bu zövqi – zikr ki, bir vəqt yarə həmdəm idim.**

Beyt 1: **Xoş ol zaman ki, hərimi – vüsalə məhrəm idim,**
**Nə mübtəlayi – bəla, nə müqəyyədi – qəm idim.**

**Qeyd** 1: *Bu qəzəl təmamilə maddi dünyaya gəlməzdən əvvəl ülvi aləmdə mənəvi yaşayışın qəbzsiz və hicransız olduğunu xatırlayaraq öz mənəvi keçmişindən xəbərdar salik mərtəbəli aşiqin halını – həsrətini vəsf edir.*

**Qeyd** 2: *Öz ülvi intəhasız vətənindən xəbərdar olmaqla maddi dünyaya xüsusilə bədən tərkibinə sığmaz insana "salik" demişlər.*

**Nişanə** 1. "Hərimi-vüsal": Bu beytdə "İnna lillah" ünvanlı yaranış nöqtəsinin ətrafından, yaxud qeyb aləmindən nişanədir.

**Anlam: Aşiq qeyb aləmində daimi şühud sahəsində yaşamağını xatırlamaqla maddi darısqal aləmdən həm də batini vücudunu həbs etmiş xarici əngəl vücudun şikayət etmək istəyir.**

Beyt 2: **Gəzərdim itlərin içrə fəzayi – kuyində,**
**Yerim behişti – bərin idi, mən bir Adəm idim.**

Sözlük: Bərin – əla

**Nişanə** 1. "İt": Məhbub ərəfəsində öz həqirliyindən xəbərdar olmuşlardan nişanədir.

**Nişanə** 2. "Fəzayi-kuy": Məhbub ərəfəsindən nişanədir.

**Nişanə** 3. "Behişti-bərin": Bax: Fəzayi-kuy

**Nişanə** 4. "Adəm ": Bu beytdə qeyri maddi aləmdə yaşamış ruhani vücuddan ibarətdir.

**Anlam: Həqiqi adamlıq, bəndəlik ərəfəsi ünvanlı özəl behiştdə yaşamaqdan ibarətdir.**

Beyt 3: **Həmişə səcdəgəhim xaki – asitanın idi,**
**Bu etibar ilə bir sərbüləndi – aləm idim.**

Sözlük: Səcdəgəh – səcdəyə düşmək yeri; Xak – torpaq; Astan – astana, sərbülənd – başı uca

**Nişanə** 1. "Səcdəgəh": Bu beytdə şühud nurunda itib – batmaqdan nişanədir.

**Nişanə** 2. "Xaki-asitan": Mənəvi vücudun bəndəlik məqamından ibarətdir

**Anlam: Etibar və izzət səmasında parlamaq mütəal məbud hüzurunda səcdəyə düşməklə mümkündür.**

**Qeyd:** *Hündür – alçaq, gizli – açıq, nazik - qalın və yüzlərcə digər nümunələr, o cümlədən, şərif ayədə "* ذالک بان الله یولج الیل فی النهار و یولج النهار فی الیل و ان الله سمیع بصیر[1]*" ("Bəli! Belədir. Necə ki, Allah gecəni gündüzə qatar və gündüzü də gecəyə qatar, həqiqətən, Allah eşidən və görəndir") buyurulduğu kimi gecənin gündüz ilə əlaqəsi hər şeyin öz ziddi (əksi) ilə bağlılığını sübut edir. Beləliklə göylərə ucalmağın torpağa düşməklə (səcdə) bağlılığı məlum olur. Elə buna görə də şəriət namazı bütün ibadətlərdən üstün buyurmuşdur. Demək mənəviyyat səmalarını qədəm ilə yox, bəlkə baş ilə seyr etmək mümkündür. Bu mənəvi qanunu təlqin etmək məqsədilə müəllif (Ə.Şahi – red.) bir qəzəldə demişdir:*

***O baş ki meyli tac edir onu dolandır et ayaq,***
***Sora həman ayaq ilən üruc edib xudayə bax.***

Beyt 4: **Gədayi – kuyin idim, böylə zillətim yox idi,**
**Səriri – səltənəti – qürbdə müəzzəm idim.**

Sözlük: Gəda – dilənçi; Sərir – təxt; Qürb – yaxınlıq = mərtəbə = dərəcə; Müəzzəm – büyük = hesaba alınmış = əzəmətli

**Nişanə** 1. "Gədayi-kuy": Öz ehtiyacını yalnız mütəal məbud ərəfəsindən istəməklə ilahi feyzlərdən bəhrələnmiş bəndədən ibarətdir.

**Nişanə** 2. "Zillət": Bu beytdə maddi vücud, yaxud həqir vasitələrdən asılı həyat möhtaclığından nişanədir.

**Nişanə** 3. "Qürb": Aşiq ilə məşuq arasındakı vasitəsiz əlaqədən ibarətdir.

**Anlam: Həqiqi əzəmət nailiyyəti yalnız mütəal məhbubdan hacət diləməklə mümkündür. Elə buna görə də şərif ayədə "** یسئله من فی السماوات و العرض[2] **" ("Göylərdə və yerdə olan hər kəs (və hər şeyi - öz hacətini ondan istər") buyurmuşdur. Bu daha önəmli əsli ya da salmaq məqsədilə "** ایاک نعبد و ایاک نستعین[3] **"([Pərvərdigara] biz təkcə Sənə ibadət edirik və təkcə Səndən kömək diləyirik") ayəsi hər namazda təkrar olunur.**

---

[1] Quran, Həcc surəsi, 61 ci-ayə
[2] Quran, Ərrəhman surəsi, 29-cu ayədən bir qismət
[3] Quran, Fatihə surəsi, 5-ci ayə

Beyt 5: **Zaman – zaman əsəri – pərtöyi – cəmalindən**
**Müalici – dili – pürdərdü çeşmi – pürnəm idim.**

Sözlük: Müalic – əlac edən; Çeşmi-pürnəm – yaşlı göz = ağlar göz

**Nişanə** 1. “Pərtöyi-camal”: “Vəch” ünvanlı ilahi surətdən parlayan şühud cəlalərindən nişanədir.[1]

**Anlam: Hər ləhzə şühud nurundan bəhrələnməklə dərd və qəmdən, yaxud hicran əzabından xəbərsiz idim.**

Beyt 6: **Ziyadə qəmzədəyəm hicr ilə, xoş ol günlər**
**Ki, mən bu qəmzədəlikdən ziyadə xürrəm idim.**

Sözlük: Qəmzədə – qəmli = hüznlü; Xürrəm – şad

**Anlam: Maddi dünyaya süqut etmək, yaxud hicran ilə yaşamaq ən yüksək dərd olsada, ülvi aləmdə, yaxud canan hüzurunda yaşamaq şadlığından böyük ola bilməz.**

Beyt 7: **Füzuli, olmaz imiş möhnəti – fərağə müfid,**
**Bu zövqi – zikr ki, bir vəqt yarə həmdəm idim.**

**Anlam: Şühud nailiyyətini, yaxud ülvi aləmi xatırlamaqla (zövq zikri) hicran dərdinə dərman etmək mümkün olmayır.**

**Qeyd:** *Bu anlam, zövq zikri əvəzinə maddi hicablarla mübarizə etməyə işarə edir.*

---

[1] Qəzəl 99, beyt 3

## Q Ə Z Ə L  182

**(1) Ney kimi hər dəm ki, bəzmi – vəslini yad eylərəm,**
**Ta nəfəs vardır quru cismimdə, fəryad eylərəm.**

**(2) Ruzi – hicrandır, sevin, ey mürği – ruhim kim, bu gün**
**Bu qəfəsdən mən səni, əlbəttə, azad eylərəm.**

**(3) Vəhm edib ta salmaya sən mahə mehrin hiç kim,**
**Kimə yetsəm, zülmü cövründən ona dad eylərəm.**

**(4) Qan yaşım qılmaz vəfa, giryan gözüm israfına,**
**Bunca kim, hər dəm cigər qanından imdad eylərəm.**

**(5) İncimən hər necə kim, əğyar bidad eyləsə,**
**Yar cövriçün, könül, bidadə motad eylərəm.**

**(6) Bilmişəm bulman vüsalın, leyk bir ümmid ilə**
**Gah - gah öz xatiri – naşadımı şad eylərəm.**

**(7) Lövhi – aləmdən yudum əşk ilə Məcnun adını,**
**Ey Füzuli, mən dəxi aləmdə bir ad eylərəm.**

Beyt 1: **Ney kimi hər dəm ki, bəzmi – vəslini yad eylərəm,**
**Ta nəfəs vardır quru cismimdə, fəryad eylərəm.**

Sözlük: Bəzm – ziyafət məclisi = xeymə

**Nişanə** 1. "Ney": Mənəvi həyatdan ayrı düşən və gördüyü səmavi uca məqam və ilahi yaşayış həsrətində yanan alovlu ürəkdən haray qoparan yer adamından nişanədir.[1] Mövləvi bu əhvalı təlqin etmək məqsədilə buyurmuşdur:

بشنو از نی چون حکایت می کند
از جدایی ها شکایت می کند

**Nişanə** 2. "Bəzmi vüsal": Yuxarıda xatırladığımız mənəvi həyatdan yaxud ülvi vətəndən ibarətdir.

**Nişanə** 3. "İkinci misra": Dünyəvi ömür möhlətində həqiqi və daimi vüsal nailiyyətini mümkünsüz təlqin edən nişanədir.

**Anlam: Beyt mütəal məhbub ərəfəsindən, yaxud nurani olan vəhdət aləmindən maddi dünyaya süqut etmək dərdinə dərman etməyin yalnız fanilik vasitəsilə mümkün olacağını bildirmək istəyir.**

Beyt 2: **Ruzi – hicrandır, sevin, ey mürği – ruhim kim, bu gün**
**Bu qəfəsdən mən səni, əlbəttə, azad eylərəm.**

Sözlük: Ruzi hicran = hicran günü, mürğ = quş

**Nişanə** 1. "Ruzi-hicran": A: Hicran aşiqi ən xətərnak olan mənəm-mənəmlik hicabından azad edib fanilik nailiyyətinə müqəddimə olduğu üçün daha əziz və sevməlidir.

B: Hicran "məruf" ünvanlı mütəal məbud mülkünə səfər etmək müqəddiməsi olduğundan daha sevməlidir.[2]

C: Daxili vücudu xarici vücud həbsindən azad etmək, bədəni hicran əzabı ilə unutmaqla mümkün olur.

**Nişanə** 2. "Mürği-ruh": Bədən adlı qəfəsdə həbs olmadan əvvəl müşahidə səmasında seyr ilə məşğul olmuş daxili, yaxud həqiqi vücuddan istiarədir.

**Anlam: Hicran əzabının şiddətlənməyi vüsal məqamına nail olmağın müqəddiməsidir.**

---

[1] Qəzəl 1, beyt 2
[2] Qəzəl 122, beyt 5

**Qeyd:** *Hafiz Şirazi qəfəs ünvanlı maddi bədən tərkibindən azad olmaqdan əvvəl müşahidə səmasında seyr etməyi mümkünsüz bilib buyurmuşdur:*

چگونه طوف کنم در فضای عالم قدس     چو در سراچه ترکیب تخته بندتنم[1]

Beyt 3: **Vəhm edib ta salmaya sən mahə mehrin hiç kim,**
**Kimə yetsəm, zülmü cövründən ona dad eylərəm.**

Sözlük: Mah – ay; Mehr – məhəbbət = günəş

**Nişanə** 1. "Mah": Bu beytdə qara maddə təzahür etdirilmiş Allah təala nurundan, yaxud təbiət güzgüsündə həqiqəti nişan verən rəhmani feyzdən ibarətdir.

**Anlam: Vəhdət sözü aşiqin idrakına sığmaz olduğundan, o (aşiq) canan ərəfəsində hər bir mövcudu, hətta digər aşiqləri, hətta mənəvi vasitələri rəqib hesab edir.**

Beyt 4: **Qan yaşım qılmaz vəfa, giryan gözüm israfına,**
**Bunca kim, hər dəm cigər qanından imdad eylərəm.**

**Nişanə** 1. "Qan yaş": Bu beytdə fiziki mahiyyəti yuyub – batil etməyə qadir olmayan bəlakeşlikdən nişanədir.

**Nişanə** 2. "Cigər qanı": Bu beytdə daxili vücudu zahiri vücud zəbtindən azad edən bəlalardan nişanədir.

**Anlam: Məcazi əngəl vücudunu yuyub – batil etməyə, yaxud kəsrət hicabından azad olmağa qan yaş kafi deyil. (Aşiqi kamala çatdıran bəlalar əqlə - təcrübəyə sığmazdırlar.)**

Beyt 5: **İncimən hər necə kim, əğyar bidad eyləsə,**
**Yar cövriçün, könül, bidadə motad eylərəm.**

Sözlük: Mötad – adətkərdə

**Nişanə** 1. "Əğyar": Bu beytdə dünyaşünas əqli, mərifət və kamal nailiyyətinə kafi bilməklə eşq səviyyəsini yerli – dibli inkar edən məlamətçilərdən ibarətdir.

**Anlam: (Eşq atəşinə alovlanmış) qəlbimi məlamətçilərin tənə - danlağını diləməyə adətkərdə etmişəm.**

---

[1] Müəllif bu beyti Ta Qafe-ənişe kitabının 3-cü cildində şər etmişdir.

**Qeyd:** *Məlamət edib tənə vuranlar, aşiqin ən xətərnak hicab sayılmış dünyəvi xarakterini sındırmaqla ona xidmət edirlər. Buna görə də vücudun içəri üzünün, yaxud batini həyatın dirçəlməyinin və canlanmağının ilk şərti çöl vücudun, yaxud zahiri şəxsiyyətin incəlməyi və ufaq olmasıdır.*[1]

Beyt 6: **Bilmişəm bulman vüsalın, leyk bir ümmid ilə**
**Gah - gah öz xatiri – naşadımı şad eylərəm.**

Sözlük: Leyk = lakin, gah-gah = hərdənbir, naşad = pərişan = şadlanmayan

**Anlam: Dünyəvi ömür möhlətində, yaxud fiziki mahiyyət məhdudluğunda, həqiqi vüsal nailiyyətinin mümkünsüz olduğundan xəbərdaram. Ancaq "badə" ünvanlı ilahi cilvələr təcəssümüylə fəraq günləri ilə mübarizə edirəm.**

Beyt 7: **Lövhi – aləmdən yudum əşk ilə Məcnun adını,**
**Ey Füzuli, mən dəxi aləmdə bir ad eylərəm.**

**Anlam: A: Ey Füzuli, mən Məcnundan daha üstün bir aşiq olduğumdan onun adını eşq səhifəsindən silmişəm.**

**Qeyd:** *Bu anlam "Məndə Məcnundan füzun aşiqlik istedadı var" misrasını təkrar və təsdiq edir.*

*B: Vahid olan məhbuba vahid aşiq yararlıdır. Buna görə də Füzuli görünərkən Məcnun qürub etməlidir.*

*C: Məcnundan üstün olmaqla özümü cahanda birinci məşhur aşiq edərəm.*

---

[1] Qəzəl 1, beyt 5

## Q Ə Z Ə L 183

**(1) Şəm`i – şami – firqətəm, sübhi – vüsali neylərəm?**
**Bulmuşam yanmaqda bir hal, özgə hali neylərəm?**

**(2) Qeyrə ərz et hər nə əsbabın ki, var, ey dəhri – dun!**
**Mən bir əhli – zövqəm, əsbabi, məlali neylərəm?**

**(3) Yox əcəb, gər malə rəğbət, mülkə qılman iltifat,**
**Mən gədayi – kuyi – eşqəm, mülkü mali neylərəm?**

**(4) Əhli – haləm, demə büt vəsfin mənə, ey bütpərəst,**
**Hal bilməz dilbəri – sahibcəmali neylərəm?**

**(5) Ehtimali – hicr təşvişinə dəyməz zövqi – vəsl,**
**Vəsl kim, var onda hicran ehtimali, neylərəm?**

**(6) Nəxli – qəddin istərəm, kandan bəladır hasilim,**
**Baxmazam şümşadə, bər verməz nihali neylərəm?**

**(7) Sən Füzuli, qıl kəmali – fəzl kəsbin, yoxsa mən**
**Kamili – eşqəm, dəxi özgə kəmali neylərəm?**

Beyt 1: **Şəm`i – şami – firqətəm, sübhi – vüsali neylərəm?**
**Bulmuşam yanmaqda bir hal, özgə hali neylərəm?**

**Nişanə** 1. "Şəm`i-şami-firqət": Maddi aləmdə mənəvi rayihələr ilə məst olmuş aşiqə, yaxud hicrandan asılı vüsal cazibələrindən bəhrələnmiş salikə istiarədir.

**Nişanə** 2. "Sübhi-vüsal": Sübhi-vüsal, bu beytdə arasında hicran dayanmış vüsaldan ibarətdir.

**Nişanə** 3. "Yanmaqda hal bilmək": Aşiqi öz keçmiş və gələcəyindən, yaxud zaman ünvanlı maddi maneədən, nəhayət, özlüyündən xəbərsiz edən atəşdən ibarətdir.

**Anlam: A: Hicran zamanı müvəqqəti vüsal müddəti ilə müqayisədə daha uzun olduğundan, aşiq firqət şamını alqışlayır.**

**B: Hicranda vüsal ümidi və vüsalda hicran qorxusu olduğuna görə ümidi qorxudan, hicranı vüsaldan üstün bilmişlər.**

**D: Hicran – mütəal məhbubun istəyi və məsləhət bildiyi olduğundan vüsaldan, yaxud aşiq istəyindən üstündür.**

**C: Hicran – aşiqi tərbiyə edən və yetişdirən mərhələ olduğuna görə əzizdir.**

Beyt 2: **Qeyrə ərz et hər nə əsbabın ki, var, ey dəhri – dun!**
**Mən bir əhli – zövqəm, əsbabi, məlali neylərəm?**

Sözlük: Əsbab – səbəblər; Dəhr – zəmanə = ruzgar; Dun – həqir = alçaq; Məlal – ğəm = zara gəlmək = kefsizlik

**Nişanə** 1. "Əsbab": Yaxud dünyəvi mal – dövlət, "təəllüq" adlı maneələr olduğundan tənqid edilmişdir. Buna görə də şair "hər təəllöqdən ola xurşid tək aləmdə fərd" buyurmuşdur.

**Qeyd:** *Dünyəvi ömür möhlətində təfəkkür xəlvəti ilə camaat yaxud kəsrət içində vəhdətlə məşğul olmuş yaxud hazırlıqla qayibliyi vahidləşdirmiş imamlar, peyğəmbərlər və ariflər əsbab təsirindən azaddırlar.*

**Nişanə** 2. "Əhli-zövq": A: Dünya həqiqətlərini zövq vasitəsilə kəşf və idrak etmiş bəhs və mücadilə müxaliflərinə "əhli-zövq" demişlər.

**Qeyd:** *Şühud məqamının dad – tamını düşünməyə qadir olan*

*qüvvəyə "zövq" demişlər.*[1]

B: "Şəkər" ünvanlı mənəvi məstliklərdən xəbərdar şəxslərə zövq demişlər.

**Anlam: Beyt dünyəvi mal – dövlət məşğulluğunda, mənəvi məqamlardan qəflətdə qalmış şəxsləri tənqid edir.**

Beyt 3: **Yox əcəb, gər malə rəğbət, mülkə qılman iltifat,**
**Mən gədayi – kuyi – eşqəm, mülkü mali neylərəm?**

Sözlük: Gəda – dilənçi

**Nişanə** 1. "Gədayi-kuyi-eşq": Bütün ehtiyaclarını yalnız mütəal məbud ərəfəsindən tələb etməklə ilahi feyzlərdən bəhrələnmiş bəndədən ibarətdir.

**Anlam: Bu beyt isə ötən beyt təlqin etdiyi mənanı təkrar edir.**

Beyt 4: **Əhli – haləm, demə büt vəsfin mənə, ey bütpərəst,**
**Hal bilməz dilbəri – sahibcəmali neylərəm?**

**Nişanə** 1. "Əhli-hal": Maddi dünyada mənəvi aləmin ətrini alanlara yaxud həm keçmiş həm də gələcəyi unutmuş və nəhayət, maddi dünyanın zaman adlı güclü bir cəhətindən xilas olmuşlara, "əhli-hal" demişlər.

**Nişanə** 2. "Büt": Əsasən daşdan yonulmuş ilahə olduğuna görə batini və mənəvi qüvvələri daş kimi qurumuş zahiri gözəl insandan istiarədir.

**Nişanə** 3. "Bütpərəst": Məcazi hüsnləri kamil bilməklə mənəvi hüsnlərdən qəflətdə qalmış insana "bütpərəst" demişlər.

**Anlam: Beyt bəşəri gözəllikləri kafi və kamil bilməklə ilahi gözəlliklərdən qəflətdə qalmış insanları tənqid edir.**

Beyt 5: **Ehtimali – hicr təşvişinə dəyməz zövqi – vəsl,**
**Vəsl kim, var onda hicran ehtimali, neylərəm?**

Sözlük: ehtimal (birinci misra) – taqət gətirmək = ehtimal

**Anlam: Bax beyt 1, anlam B.**

---

[1] Qəzəl 9, beyt 5

Beyt 6: **Nəxli – qəddin istərəm, kandan bəladır hasilim,**
**Baxmazam şümşadə, bər verməz nihali neylərəm?**

Sözlük: Nəxl – xurma ağacı = ağac; Bər – bar = meyvə; Nihal – körpə ağac = pöhrə

**Nişanə** 1. "Nəxli-qəd": Aşiqi acı hallardan şirin – şirin səmərələr aparmağa tərbiyələndirən ilahilik uzantısından istiarədir.

**Nişanə** 2. "Bəla": Fəqirliyini və məmlüklüyünü özünə bəlləndirərkən onun ixtiyar və tədbirini yox dərəvcəsinə yaxınladan qüvvətsizlikdən və onu mənlik tərkilə məbud dərkinə nail edən əhvaldan nişanədir.[1]

**Nişanə** 3. "Şümşad": Bu beytdə davam etdirilmiş dünyəvi hüsnlərdən nişanədir.

**Nişanə** 4. "Bər verməz nihal": Dünyəvi həqir hüsnlərdən nişanədir.

**Anlam: Beyt, mənəvi qəbzlərin dünyəvi bəstlərdən üstün olduğunu təlqin edir.**

Beyt 7: **Sən Füzuli, qıl kəmali – fəzl kəsbin, yoxsa mən**
**Kamili – eşqəm, dəxi özgə kəmali neylərəm?**

**Nişanə** 1. "Əql": Məcazi həyat möhlətində necə məişət keçirməyə, dünyəvi kamala çatmağa tədbir edən başda yerləşmiş "məaş əqli" ünvanlı qüvvədən ibarətdir.

**Nişanə** 2. "Eşq": Ürək içində yerləşmiş "məad əqli" adlı həqiqətşünas qüvvədən ibarətdir.[2]

**Anlam: A: Füzuli həzrət mürşüdün yaxud öz batini vücudunun məaş əqlindən üstün olan məad əqlinə sahib olduğuna görə iftixar edir.**

**B: Füzuli, özünü dünyaşünas əql tabeliyinə dəvət etməklə, eşq mərtəbəsini inkar etmiş nəsihətçini kinayəli etiraz ilə tənqid edir.**

---

[1] Qəzəl 23, beyt 1
[2] Qəzəl 108, beyt 2

## Q Ə Z Ə L 184

**(1) Bagə girdim, səri – kuyin anıb əfğan etdim,**
**Gül görüb, yadın ilə çaki – giriban etdim.**

**(2) Baxuban nərgisə, əyyar gözün qıldım yad,**
**Nərgisi naləvü əfğanıma heyran etdim.**

**(3) Qönçəvü lalə demə, dağ qarasın qoparıb,**
**Alu alayə sarıb səbzədə pünhan etdim.**

**(4) Güli – tər üzrə düşən şəbnəmə düşdü nəzərim,**
**Gözümü şövqi – cəmalında dürəfşan etdim.**

**(5) Bərgi – gül sanma ki, xunabə tökən dəmdə gözüm,**
**Neçə yarpağə cigər qanı silib, qan etdim.**

**(6) Görücək sünbülü, andım şikəni – kakilini,**
**Sünbüli giryəvü ah ilə pərişan etdim.**

**(7) Ey Füzuli, rəvişi - əql məlul etdi məni,**
**Səhv qıldım ki, cünun dərdinə dərman etdim.**

Beyt 1: **Bagə girdim, səri – kuyin anıb əfğan etdim,**
**Gül görüb, yadın ilə çaki – giriban etdim.**

Sözlük: Çaki-giriban – yaxa çmaq; Əfğan – fəğan

**Nişanə** 1. “Səri-kuy”: A: İnsanın həqiqət ünvanlı ülvi vətənindən nişanədir.

B: İnsanın təbiət dünyasında nail olduğu “bəndəlik” məqamından nişanədir.

**Anlam: A: Mütəal məbud cəmalından parlayan hüsnlər gah mürşüdün vücudunda, gah bəşəri gözəl simada, gah da gül və sünbül kimi lətif mövcudlarda özünü təzahür etdirməklə onların “məzhər” ünvanlı güzgü mərtəbəsini sübut edir. Elə buna görə də şərif ayədə “فاينما تولو فتم وجه الله” buyurulmuş.**[1]

**Qeyd** 1: *Yaranmışlar güzgüsündə təzahür etdirilmiş yaradıcı məbud cilvəsini ürəyin “fuad” ünvanlı mərtəbəsinə hədiyyə olunmuş bəsirət gözü ilə müşahidə etmək mümkün olur.*[2]

**Qeyd** 2: *Həkim olan məbud öz qəhr sifətləri ilə bağlı cilvələrini də sel, sazaq, şoranlıq və digər beləcə dəhşətli güzgülərdə təzahür etdirir.*

**B: Hər bir yaranmış zəban-hal ilə öz yaradıcı məbudunu vəsf etməklə:**

1: Öz “təsbih” ünvanlı ilahi təklifinə əməl edir[3].

2: Öz qeybi əslinə qayıtmaq istəyir.

3: İnsanları ülvi aləm ünvanlı həqiqi vətənlərinə qayıtmağa dəvət edir.

Beyt 2: **Baxuban nərgisə, bimar gözün qıldım yad,**
**Nərgisi naləvü əfğanıma heyran etdim.**

Sözlük: Nərgis – nərgiz

**Nişanə** 1. “Bimar göz”: Fiziki mahiyyəti fəaliyyətsizliyə hazırlayan şühud cəlalarından nişanədir.

**Nişanə** 2. “Nərgisi heyran etdim”: A: Nərgizin heyranlığı təbii illətlər ilə bağlıdırsa, Füzuli onu “hüsni-təlil” ünvanlı ədəbi sənət rüxsəti ilə öz naləsinə bağlı bəyan edir.[4]

---

[1] Quran, Bəqərə surəsi, 115-ci ayə
[2] Qəzəl 13, beyt 1
[3] Qəzəl 4, beyt 1
[4] Qəzəl 133, beyt 5

**Qeyd:** *Mütəal məbud xəlifəsi olan insan da şərif ayədə "كل يوم هو شان" ("O, hər gün [kainatda] təsərrüf etməkdədir"[1]) buyurulduğu kimi bir çox kainatda təsərrüf etməyə qadirdir. Peyğəmbərlər və imamlar, oda –suya qalib gəlmiş ilahi iqtidar və möcüzəni deyilən xəlifəlik məqamından əxz etmişlər.*

**Anlam: Bu beyt də ötən beyt kimi yaranış güzgüsündə təzahür etdirilmiş yaradıcı məbud hüsnünü təlqin edir.**

Beyt 3: **Qönçəvü lalə demə, dağ qarasın qoparıb,**
**Alu alayə sarıb səbzədə pünhan etdim.**

**Anlam: Hər bir lalə öz qəlbində məxfi etdiyi qara nöqtəyə oxşar dağ ünvanlı qanlı ləkələri mənim alovlu ürəyimdən qoparmışdır (hüsni təlil).**

**Qeyd:** *Bu anlam: A: Ürəyin 6cı mərtəbəsində "suveyda" ünvanlı qara nöqtədə yerləşmiş nur mərkəzinə işarə edir.*[2]

*B: Dağ sözü atəşdən və atəş sözü nurdan əlamətdir.*

Beyt 4: **Güli – tər üzrə düşən şəbnəmə düşdü nəzərim,**
**Gözümü şövqi – cəmalında dürəfşan etdim.**

Sözlük: Dürəfşan = dürr səpən

**Anlam: Bu beyt də ötən beytlər kimi kəsrət güzgüsündə təzahür etdirilmiş vəhdət cilvəsini vəsf edərkən, hər bir yaranmışı xüsusi bir rəhbər və hər rəhbərliyi yeni bir təşəkkür və hörmətə layiq bilir. Bu təşəkkürün əzəməti qarşısında insanın aciz olduğunu təlqin etmək məqsədilə ulu şeyx Sədi belə buyurmuşdur:**

از دست و زبان که بر آید     کز عهده ی شکرش بدر آید[3]

Beyt 5: **Bərgi – gül sanma ki, xunabə tökən dəmdə gözüm,**
**Neçə yarpağə cigər qanı silib, qan etdim.**

Sözlük: Bərg – yarpaq; Xunabə = qan yaş

**Nişanə** 1. "Qan etdim": Qan etmək: A: Qurban məqamına hazırlaş-

---

[1] Quran,Ərrəhman surəsi, 29-cu ayədən bir qismət
[2] Qəzəl 13, beyt 1
[3] Sədi, Gülüstan, müqəddimə

maqdan istiarədir.

B: Bərgi-gülün təbii heybətini batil etməklə ona yeni heybət bağışlayan iqtidardan nişanədir.

**Anlam: Gül öz rəngini mənim gözümdən yağmış isə qan-yaşdan götürmüşdür.**

**Qeyd:** *Süsə, bənövşə, və yasəmən gülü kimi hər gülün xüsusi adı vardır. Təkcə qızıl gülün adına "gül" demişlər.*

Beyt 6: **Görücək sünbülü, andım şikəni – kakilini,**
**Sünbüli giryəvü ah ilə pərişan etdim.**

Sözlük: Şikən – çin = zülfün qırılışı = məğlub olmaq; Kakil – kəkil; Girყə – ağlama

**Anlam: Mənim ahım olmasaydı sünbül pərişan olmazdı (hüsni təlil).**

**Qeyd:** *Yuxarıda şərh edilmiş beytlər ümumən:*

*A: Hər bir yaranmış, ilahi xəlifə olan insandan iz və əsər göstərmək istəyir.*

*B: İnsanın bütün kainatda təsərrüf etməyə qadir olan ürəyində yerləşmiş gizli qüvvəsini ona nişan vermək istəyir.*

Beyt 7: **Ey Füzuli, rəvişi - əql məlul etdi məni,**
**Səhv qıldım ki, cünun dərdinə dərman etdim.**

Sözlük: Rəveş = yol = təriqət, cünun = məcnunluq = divanəlik

**Nişanə** 1. "Cünun": Eşq qələbələrindən asılı məstlikdən ibarətdir.

**Anlam: Ötən altı beytdə qeyd olunmuş məzmunlar: A: Əqli anlayışa bağlı olduğuna görə tərk edilməlidir.**

**B: Təbiət aləmi ilə əlaqədar olduğuna görə tərk edilməlidir. Çünki həqiqət aləminə daxil olmağın şərti təbiət dünyasından qaib olmaqdır. Elə buna görə də Hafiz Şirazi maddədən üstün düzgün həqiqətlə tanış olmağı təbiət məhdudluğundan xilas olmağın şərti bilib buyurmuşdur:**

تو کز سرای طبیعت نمی روی بیرون
کجا به کوی حقیقت گذر توانی کرد[1]

[1] Müəllif bu beyti Ta Qafe-əndişe kitabının 2-ci cildində şərh etmişdir.

## Q Ə Z Ə L 185

(1) Hicran ilə yanar gecələr rişteyi – canım,
Rövşən ola, ey şəm`, sənə suzi – nihanım.

(2) Bir şəm`i – şəbistani – bəlayəm ki, degil kəm,
Ta mən diriyəm suzi – dilü əşki – rəvanım.

(3) Ey xəlvətimə şəm`i – rüxündən buraxan nur!
Didarinə müştaq idi çeşmi – nigəranım.

(4) Sənsiz gecələr ahü fəğanım məh eşitdi,
Ey məh, sənə həm yetdi ola ahü fəğanım.

(5) Cananə nə rəvadır ki, çəkib tiğ dəmadəm
Qəmzən sökə cismim, dələ bağrım, tökə qanım.

(6) Həmrəngi – ləbindir deyə, qət`i – nəzər etdi
Xuni – cigərimdən müjeyi - əşkfəşanım.

(7) Pünhani odum aləmə faş oldu, Füzuli,
Yarəb ki, mənim şəm` kimi yanə zəbanım.

Beyt 1: **Hicran ilə yanar gecələr rişteyi – canım,**
**Rövşən ola, ey şəm`, sənə suzi – nihanım.**

Sözlük: Riştə – rişmə = sap; Rövşən – aydın = nurani; Suz – hərarət = iztirab = iltihab; Nihan – gizli

**Nişanə** 1. “Birinci misra”: Dünyəvi bağlantıları qırıb – atmış aşiqi kamil bəndəlik məqamına hazırlayan iltihabdan nişanədir.

**Nişanə** 2. “Şəm`”: İlahi sirlərdən xəbərdar edən hüzur nurundan nişanədir.

**Anlam: Aşiq Ilahi hüzur məqamına hazırlaşmağını nişan vermək istəyir.**

Beyt 2: **Bir şəm`i – şəbistani – bəlayəm ki, degil kəm,**
**Ta mən diriyəm suzi – dilü əşki – rəvanım.**

Sözlük: Şəbistan – hərəmxana = yatacaq; Suzi-del – ürək iltihabı; Əşk – göz yaşı

**Nişanə** 1. “Şəmi-şəbistani-bəla”: Gizli müqəddəsliklər tələbində alovlanan ürəkdən nişanədir.

**Nişanə** 2. “Suzi-del”: Ürəyi maddi atmosferdən üstün seyr etdirən özəl hərarətdən ibarətdir.

**Nişanə** 3. “Əşki-rəvan”: Bu beytdə qürb (yaxınlıq) qarşısında duran maneələri yuyub – məhv edən nişanədən ibarətdir.

**Anlam: Suzi-del və əşki-rəvana qürb sərmayəsini dəmbədəm əlavə edirəm.**

Beyt 3: **Ey xəlvətimə şəm`i – rüxündən buraxan nur!**
**Didarinə müştaq idi çeşmi – nigəranım.**

Sözlük: Rüx – üz = camal; Didar – görüş; Müştaq – şövqlü

**Nişanə** 1. “Birinci misra”: Kəsrət hacətindən ayırıb vəhdət nailiyyəti bağışlayan “mükaşifə” ünvanlı irfani özəl aləmdən nişanədir.

**Nişanə** 2. “Didar”: İlahi parlamaları, yaxud həqiqət səmasını “fuad” ünvanlı ürək gözü ilə görməkdən ibarətdir.

**Nişanə** 3. “Müştaq”: Öz pərişanlıq və heyranlığını nəhayətə çatdırmış aşiqə “müştaq” demişlər.

**Anlam: Beyt mükaşifə halında heyran olmuş aşiqin əhvali-ruhiyyəsini təlqin etmək istəyir.**

Beyt 4: **Sənsiz gecələr ahü fəğanım məh eşitdi,**
**Ey məh, sənə həm yetdi ola ahü fəğanım.**

**Nişanə** 1. "Ahi-fəğan": Bu beytdə içəri əhvali-ruhiyyənin üzə çıxmağından nişanədir.

**Nişanə** 2. "İkinci məh": Qara sayaq maddəni mənəvi cəlalarla işıqlandıran ilahi camaldan ibarətdir.

**Anlam: Gizli ehtiyacımı açıqlayan ürək münacatımı göy əhlinə (birinci məh) çatdırdım. Ancaq hələ də canan ərəfəsinə (ikinci məh) çatdıra bilməyirəm.**

**Qeyd:** *Birinci məh "hal məhəl əlaqəsi"* [1] *ünvanlı ədəbi sənət rüxsətilə həm göy, həm də göy əhlini ifadə edir.*

Beyt 5: **Cana, nə rəvadır ki, çəkib tiğ dəmadəm**
**Qəmzən sökə cismim, dələ bağrım, tökə qanım.**

Sözlük: Dəmadəm = dəmbədəm

**Nişanə** 1. "Qəmzə": Bu beytdə həkim olan məhbubun rəıhmətinə bağlı qəzəbindən nişanədir.

**Anlam: Aşiq məcnunluq və məğlubiyyət vəziyyətində mütəal məhbubun tərbiyəvi qəhrlərinin daha şiddətli olduğundan giley və etirazlar edir.**

Beyt 6: **Həmrəngi – ləbindir deyə, qət`i – nəzər etdi**
**Xuni – cigərimdən müjeyi - əşkfəşanım.**

Sözlük: Xun – qan; Müjə – kiprik; Əşkəfşan – göz yaşını yağdıran

**Nişanə** 1. "Ləb": A: Qırmıəzı olduğundan məcazi varlığı batil edən nişanədir.

B: Nəfəs üfürmək münasibətilə yoxu var edən ilahm – işarədən nişanədir.

**Anlam: A: Cigərim istedad qazanmaqdan əvvəl özünü canan ləbinə oxşatdığına görə tənbeh olunur.**

**B: Göz yaşım cıgər qanıma qatışmaqla canan ləbinə həmrəng olmaq istəyir.**

---

[1] Qəzəl 162, beyt 2

Beyt 7: **Pünhani odum aləmə faş oldu, Füzuli,**
**Yarəb ki, mənim şəm` kimi yanə zəbanım.**

**Nişanə** 1: “Pünhan od”: Ürək burunduran ilahi eşq havasından ibarətdir.

**Anlam: Füzuli müqəddəs qanun tanımış baş verər sirr verməz[1] sözünü icra edə bilməzliyini etiraf etməklə özünü məzəmmət edir.**

---

[1] Qəzəl 114, beyt 1

## Q Ə Z Ə L 186

(1) Tutuşdu qəm oduna şad gördüyün könlüm,
Müqəyyəd oldu ol azad gördüyün könlüm.

(2) Diyari – hicrdə seyli – sitəmdən oldu xərab,
Fəzayi – eşqdə abad gördüyün könlüm.

(3) Nə gördü badədə bilmən ki, oldu badəpərəst,
Mürid məşrəbü zöhhad gördüyün könlüm.

(4) Fəraqın odunu gördükcə mum tək əridi,
Səbatü səbrdə fulad gördüyün könlüm.

(5) Gətirdi əcz, görüb eşq müşkül olduğunu,
Qamu hünərlərə ustad gördüyün könlüm.

(6) Degildi böylə, dəmində bir əhli – işrət idi,
Bu qanlar işməgə mö`tad gördüyün könlüm.

(7) Füzuli eylədi ahəngi – eyşxaneyi – Rum,
Əsiri – möhnəti – Bəğdad gördüyün könlüm.

Beyt 1: **Tutuşdu qəm oduna şad gördüyün könlüm,**
**Müqəyyəd oldu ol azad gördüyün könlüm.**

**Nişanə** 1. “Qəm odu”: Bu beytdə vücudun iç üzünü alovlayan “nari-məhəbbəti”[1] onun çöl üzündə əks etdirilmiş nişanədən ibarətdir.

**Nişanə** 2. “Şad”: Mənəvi məqamlardan xəbərsiz insanın dünyəvi nailiyyətlərə razılıq göstərməyindən nişanədir.

**Anlam: Ulu peyğəmbərin bəndə (əbd) olduğunu təlqin edən “** اشهد ان محمد عبده و رسوله**” sözü, arifin bəndəlik həsrətini aydın şəkildə dəlilləşdirir.**

**Qeyd** 1: *Müqəyyəd olmaq (bəndəlik) azadlığın əksi olduğundan, qəmin şadlıqdan üstün olduğu məlum olur.*

**Qeyd** 2: *Mütəal məbudun mütləq malik olduğunu düşünmüş aşiq öz ixtiyarsız olduğunu (azad olmamaq), yaxud öz məmlüklüyüni etiraf etməlidir.*

Beyt 2: **Diyari – hicrdə seyli – sitəmdən oldu xərab,**
**Fəzayi – eşqdə abad gördüyün könlüm.**

**Anlam: A: Beyt bəşəri əql və ixtiyar ilə bağlı əməllər və sifətlər faniliyini, yaxud vəhdət ərəfəsinə daxil olmaq istedadını təlqin etmək istəyir.**

**B: Beyt qəbz vəziyyətinə çevrilmiş bəst mərtəbəsini təlqin edir.**

Beyt 3: **Nə gördü badədə bilmən ki, oldu badəpərəst,**
**Mürid məşrəbü zöhhad gördüyün könlüm.**

Sözlük: Mürid – tələb edən = bəşəri əql və ixtiyar ilə müəyyən bir rəhbər tabeliyini qəbul etmiş şəxs; Məşrəb – su başı = özəl məzhəb = dini yol = fəlsəfi yol; Zöhhad – zahidlər

**Nişanə** 1. “Badə”: Bu beytdə mürşid həzrətinin ürək silkələyən təlimatından nişanədir.

**Nişanə** 2. “İkinci misra”: Əql və məntiq tabeliyini, yaxud dünyəvi məlamətlərdən çəkinməyi təlqin edən nişanədir.

**Anlam: Bu beyt də “inkari sual” ünavnlı əbədi sənət rüxsətilə eşqin əqldən üstün olduğunu təlqin edir.**

---

[1] Qəzəl 54, beyt 7

Beyt 4: **Fəraqın odunu gördükcə mum tək əridi,**
**Səbatü səbrdə fulad gördüyün könlüm.**

Sözlük: Fulad – polad

**Nişanə** 1. "Birinci misra": Aşiqin fiziki mahiyyətilə bulaşmış həqiqi vücudunu paka çıxarmaqla onu vəhdət mərkəzinə istiqamətləndirən mərtəbədən nişanədir.

**Qeyd:** *Atəş də su kimi paka çıxaran bir maddədir*.

**Nişanə** 2. "İkinci misra": Başda yerləşmiş məaş əqlinə[1] bağlı təcrübələr və mərifətlərə tərəfdar durmaqdan nişanədir.

**Anlam: Beyt fəraq atəşində fiziki mahiyyət maneəsindən, yaxud özlüyündən paka çıxmış aşiqin yaxud "zövqi-didar ilə dildarın yox etdim varımı" buyurduğu məqama nail olmuş arifin fanilik ərəfəsində vəhdət rayihəsindən bəhrələnməyini təlqin edir.**

Beyt 5: **Gətirdi əcz, görüb eşq müşkül olduğunu,**
**Qamu hünərlərə ustad gördüyün könlüm.**

Sözlük: Əcz – acizlik

**Nişanə** 1. "Gətirdi əcz": Bəşəri məhdud vücudun ilahi məhdudsuz eşq önündə acizliyini, yaxud iradəsiz – ixtiyarsız qul kimi olduğunu etiraf etməkdən nişanədir.

**Nişanə** 2. "Eşq müşkül olduğu": Təkcə bir baxışla asanca peyda olmuş bəşəri, yaxud məcazi eşq get – gedə atəş coşğunluğu, tələb biqərarlığı, hicran atəşi, camaat məzəmməti, əqlsizlik və məcnunluq ittihamı və digər beləcə təcrübəyə sığmaz çətin hadisələrlə qarşılaşır. Hətta vüsal nailiyyətində eşq ilə bağlı müşküllər sona çıxmayır və məaş təklifi, ailə nigəranlığı, övlad tərbiyəsi və digər beləcə öhdəliklər kimi yeni müşküllər baş qaldırır. "لا اله الا الله" kimi xırda bir ayə ilə asanca başlanmış mənəvi eşq sahəsində zaman keçdikcə, ibadət öhdəlikləri, cihad vəzifəsi, şəhadət təklifi kimi çətinliklər peyda olur. Elə buna görə də lisanülqeyb Hafiz "که عشق نمود اول ولی افتاد مشکلها" buyurmuşdur.[2]

**Nişanə** 3. "Hünər": Bu beytdə əql və məntiq ilə bağlı təcrübə və tədbirdən ibarətdir.

---

[1] Qəzəl 108, beyt 2
[2] Müəllifin Ta Qafe-əndişe kitabından (qəzəl 1, beyt 1)

**Anlam: Bu beyt dünyəvi tədbir və təcrübələri həqir və dəyərsiz bildirməklə aşiqin mərifət zərrəsindən xəbərdar olduğunu təlqin edir.**

Beyt 6: **Degildi böylə, dəmində bir əhli – işrət idi,**
**Bu qanlar işməgə mö`tad gördüyün könlüm.**

Sözlük: Motad = adətkərdə

**Anlam: Təbiət aləmində şad yaşayanlar həqiqət mülkündən xəbərsizdirlər.**

Beyt 7: **Füzuli eylədi ahəngi – eyşxaneyi – Rum,**
**Əsiri – möhnəti – Bəğdad gördüyün könlüm.**

**Nişanə** 1. "Eyş": Ariflər, batini ləzzətləndirən mərifətə "eyş" demişlər.

**Nişanə** 2. "Rum": "Hal – məhəl əlaqəsi[1]" münasibətilə Mövlana Cəlaləddin Rumiyə işarə etməklə eşq mülkündən, yaxud mürşüd hüzurundan nişanədir

**Nişanə** 3. "Bağdad": Qəbzlər sınaq – sıxıntısına işarə edən nişanədir.

**Anlam: Beyt, bəşəri əndişə və elm ilə əlaqədar "mərifət" ünvanlı mülkdən ilahi cazibələr ilə əlaqədar "məruf" adlı mülkə səfər etməkdən nişanədir[2].**

---

[1] Qəzəl 122, beyt 5, nişanə 1
[2] Qəzəl 162, beyt 2

## Q Ə Z Ə L 187

(1) Qaçan kim, qamətindən ayrı seyri – busitan etdim,
Qoparıb əşk seylabilə min sərvi rəvan etdim.

(2) Götürdüm, girdibadi – ah ilə xurşidə tapşırdım,
Qübari – rəhgüzarın cövhərin gözdən nihan etdim.

(3) Nişani – surəti – xubin verib, bütlər sücudində
Fəsadi – etiqadın kafərin xatirnişan etdim.

(4) Olub sərməst, qıldım nəş`eyi – zövqi – ləbin fikrin,
Meyə rağib olanlar küfrünü xəlqə əyan etdim.

(5) Görüb divarlərdə Kuhkən nəqşin, demin aşiq,
Mənəm aşiq ki, tutdum dəşt, tərki – xaniman etdim.

(6) Rəhi – eşqində ol gülrüx cigər qan etdigim bilmiş,
Çəkər hər dəm mənə tiği – siyasət, sanki qan etdim.

(7) Füzuli, şahibazi – övci – istiğna ikən, bilmən,
Nə səhv etdim ki, bu viranə deyri aşiyan etdim?

Beyt 1: **Qaçan kim, qamətindən ayrı seyri – busitan etdim,**
**Qoparıb əşk seylabilə min sərvi rəvan etdim.**

Sözlük: Əşk – göz yaşı; Sılab – sel; Rəvan – hərəkətli = rəvan

**Nişanə** 1. "Qamət": Bu beytdə davam etdirilmiş ilahi maraq – müşahidədən, yaxud iç aləmin mütəal məhbub ilə məşğul olmağından nişanədir.

**Nişanə** 2. "Bustan": Ürəyə yatan məcazi lütflər və dünyəvi hüsnlər mərtəbəsindən nişanədir.

**Nişanə** 3. "Əşk silabi": Şühud tələbində bitablıq və biqərarlıq etməkdən nişanədir.

**Nişanə** 4. "Sərv": Dünyəvi hüsnlər uzantısından nişanədir.

**Anlam: Qamət həsrətində etdiyim biqərarlıq maddi mövcudları da mənəvi əhaval – ruhiyyəmdən xəbərdar etdi.**

**Qeyd:** *Sərvi hərəkətə gətirmək (rəvan etmək) aşiq və arif olan insanların imam və peyğəmbər kimi bir çox kainatda təsərrüf etməyə qadir olduğundan istiarədir.*

Beyt 2: **Götürdüm, girdibadi – ah ilə xurşidə tapşırdım,**
**Qübari – rəhgüzarın cövhərin gözdən nihan etdim.**

Sözlük: Girdibad – üz-üzə gəlməklə tozanaq qoparan yellər, xurşid = günəş, rəhgüzər = yol; Nihan – pünhan = gizli

**Qeyd:** *Aşiq həzrəti-məbud ilə əlaqə saxlamağa və o həzrətə ürək sözünü bəyan etməyə, "cəmali-vilayət" ünvanlı mərtəbədə bənzətmə məcburiyyətində "qübari-rəhgüzarın" kimi məcazi tərkiblərdən istifadə edir*[1].

**Nişanə** 1. "Girdibadi-ah": Tələb atəşində asılı iqtidardan nişanədir

**Anlam: Sənin astanının torpağıyla günəşə varlıq bağışlayan vasitə mənim ahimdən ibarətdir.**

Beyt 3: **Nişani – surəti – xubin verib, bütlər sücudində**
**Fəsadi – etiqadın kafərin xatirnişan etdim.**

Sözlük: Xub – gözəl = yaxşı = qəşəng; Sücud – səcdə = pərəstiş = ibadət = bəndəlik; Xatirnişan – zehndə yerləşmək = xatırlamaq

---

[1] Qəzəl 21, beyt 3

**Nişanə** 1. “Surət”: Mütəal məbudun şüalar saçan “vəch” ünvanlı camalından ibarətdir[1]. İlahi camal şüalarını həzrəti-mürşüdün vücudunda, yaxud bəşəri gözəl simada tanıtdırmaq məqsədilə həzrəti-Cəlaləddin Məhəmməd Mövləvi buyurmuşdur:

نیست صورت چشم را نیکو بمال
تابینی شعشعه ی نور جمال[2]

**Anlam: Ey gözəl məbud, sənin “vəch” ünvanlı surətində parlayan şüalara yaxud kəsrət güzgüsündə əks etdirilmiş vəhdət nuruna istinad etməklə bütlərə pərəstiş etməyin batil olduğunu sübut etdim.**

Beyt 4: **Olub sərməst, qıldım nəş`eyi – zövqi – ləbin fikrin,**
**Meyə rağib olanlar küfrünü xəlqə əyan etdim.**

Sözlük: Sərməst = Varlığı büsbütün mütəal məhbub eşqində məğlub etməklə ilahi istiğnadan bəhrələnmiş mürşüddən, salikdən və aşiqdən ibarətdir.

**Nişanə** 2. “Zövqi-ləb”: İlahi ilham və işarələr xəyalı ilə ürəyə həyat vermək nişanəsidir.

**Nişanə** 3. “Mey”: Bu beytdə dünyəvi əngəllərə müvəqqəti qələbə çalan məcazi meydən, yaxud dünyəvi sərxoşluqdan nişanədir. Bu meyi etibarsız tanıtdırmaq məqsədilə həzrət Mövləvi buyurmuşdur:

آن باده بجز یک دم دل را نکند بی غم
هرگز نبود غم را، هرگز نکشد کین را
یک جرعه از این ساغر کار تو کند چون زر
جانم بفدا باشد باشد این ساغر زرین را[3]

**Nişanə** 4: “Küfr”: Məcazi meyi qəbul etmək həqiqi mey ünvanlı ilahi eşq qələbələrinin üstünü örtək olduğundan küfr hesaba alınır. Çünki küfr sözünün bir mənası da örtücüdür.

**Anlam: Yoxu var edən ilahi ilhamlardan (ləb) sərxoş olmaqla məcazi məstliklərin küfr olduğunu sübut etdim.**

---

[1] Qəzəl 99, beyt 3
[2] Məsnəvi, 6-cı dəftər, 4591-ci beyt
[3] Mövləvi, Divani-Şəms, Əli Dəşti nəşri, 81-ci qəzəl

Beyt 5: **Görüb divarlərdə Kuhkən nəqşin, demin aşiq,**
**Mənəm aşiq ki, tutdum dəşt, tərki – xaniman etdim.**

Sözlük: Kuhkən = dağ qoparan (Fərhadın ləqəbi), dəşt = çöl = səhra

**Anlam: Beyt Bisutun dağı[1] kimi maneəni aradan qaldırmağa aciz olan məcazi eşq iqtidarını təhqir etməklə dağlara qalib gəlib səhralara yol tutmuş mənəvi eşq əzəmətini təbliğ edir.**

Beyt 6: **Rəhi – eşqində ol gülrüx cigər qan etdigim bilmiş,**
**Çəkər hər dəm mənə tiği – siyasət, sanki qan etdim.**

Sözlük: Gülrüx – gül üzlü

**Nişanə** 1. “Gülrüx”: Ürək açan şühud nurunu ehsan etmiş mütəal məhbubdan nişanədir. Ancaq gül sözü qırmızı mənanı da ifadə etməklə istiğna qələbələrini də işarə edir.

**Nişanə** 2. “Cigər qan etmək”: Yetkinlik müqəddiməsi hazırlamaq məqsədilə müxtəlif sınaq – sıxıntıya dözməkdən ibarətdir.

**Nişanə** 3. “Tiği-siyasət çəkmək”: Siyasət qılıncını çəkmək, aşiqi özlüyündən ayırmağa hazırlayan mənəvi cazibələrdən asılı tənbehlərdən ibarətdir.

**Anlam: Qəhr və qəbz tənbehlərinin davam etdirilməsi yetkinlik əlamətidir.**

Beyt 7: **Füzuli, şahibazi – övci – istiğna ikən, bilmən,**
**Nə səhv etdim ki, bu viranə deyri aşiyan etdim?**

Sözlük: Övc – yüksəklik = yüksək dərəcə = “Üşşaq” avazının bir şöbəsi; İstiğna = toxluq = özünü tox tutmaq = naz = ehtiyacsız olmaq = qeydsizlik; Aşiyan = yuva = məskən = yer

**Nişanə** 1. “Şahbaz”: İnsanın ülvi yüksək aləmdə yaşamış qeyri maddi və həqiqi vücuduna “şahbaz” demişlər.

**Nişanə** 2. “İstiğna”: İstiğna bu beytdə təbiət dünyasına süqut etməzdən əvvəl həqiqət aləmində, yaxud mücərrəd mövcudlar fəzasında maddi əngəllər və bulaşıqlardan kənar yaşamaqdan nişanədir.

**Nişanə** 3. “Viranə deyr”: Lisanülqeyb Hafiz “من ملک بودم و فردوس برین جایم بود آدم آورد درین دیر خراب آبادم[2]” buyurduğu kimi maddi dünyaya

---

[1] Qəzəl 92, beyt 6
[2] Müəllif bu beyti “Ta Qafe-əndişe” kitabının 3-cü cildində şərh etmişdir.

“viranə deyr” demişlər. Çünki: A: Hər bir yerdə tikinti həmin yerin viran olması ilə başlanır.

B: Maddi dünyanın təzad (əzdad)[1] qanunu tabeliyi abadlıq arxasında olan viranlığı sübut edir.

C: İslamın ulu peyğəmbərinin buyurduğu “موتو قبل ان تموتو” kimi iç vücudun abadlığı çöl vücudun xarablığı ilə bağlıdır.

**Anlam: A: Füzuli, vəhdət aləmindən kəsrət dünyasına aparan sirri bilmək istəyir.**

**B: Füzuli behiştin intəhasız fəzasında ömür sürməyə layiq insanı darısqal yer aləminə intiqal etdirən həzrəti-Adəmin yediyi buğda hikmətini bilmək istəyir[2].**

---

[1] Qəzəl 3, beyt 2

[2] و قلنا يا آدم سكن انت و زوجک الجنه و کلا منها رغدا حيث شيتما و لا تقربا هذا الشجره فتكونا من الظالمين. فازلهما الشيطان عنها فاخرجهما،...، (və sonra dedik ki: Ya Adəm! Sən və zövcən ilə cənnətdə sakin ol, istədiyiniz kimi onun (nemətlərindən) bol – bol yeyin, təkcə bu ağaca yaxın düşməyin! Yoxsa zülmkarlardanolarsınız”. Şeytan onları azdırdı və olduqları məqamdan çıxartdı., ...: Quran, Bəqərə surəsi 35 ci və 36 cı ayə)

**Q Ə Z Ə L 188**

**(1) Müxalif dövrdən, gülgün şərabı qanə dəgşirdim,**
**Sürudin çəngü udun naləvü əfğanə dəgşərdim.**

**(2) Dəxi zövqi – vüsali – dust şövqün istəmin məndən**
**Ki, mən zövqi – vüsali möhnəti – hicranə dəgşərdim.**

**(3) Məni, ey bağiban, məzur tut gülzar seyrindən**
**Ki, mən gülzar seyrin külbeyi - əhzanə dəgşərdim.**

**(4) Könül verdim fənavü fəqrə, tərki – etibar etdim,**
**Bihəmdillah ki, axir küfrümü imanə dəgşərdim.**

**(5) Könüldən zövq bulmazdım, çıxardım çaki – köksümdən,**
**Qaşı yaylar xədəngilə gələn peykanə dəgşirdim.**

**(6) Niqabi – surəti – hal eylədim xuni – cigər seylin,**
**Əyan rüsvalığı dərdü qəmi – pünhanə dəgşirdim.**

**(7) Füzuli, məndə zövqi – afiyət az istə kim, çoxdan,**
**Mən onu aruziyi – tələti – cananə dəgşirdim.**

Beyt 1: **Müxalif dövrdən, gülgün şərabı qanə dəgşirdim,**
**Sürudin çəngü udun naləvü əfğanə dəgşərdim.**

Sözlük: Gülgün – qırmızı gülə oxşar = qırmızıya çalan; Sürud = nəğmə = mahnı = milli vətənpərvərlik mənasını ifadə edən bir musiqi ahəngi

**Nişanə** 1. "Şərabi-gülgün": A: Dünyəvi sərxoşluq səbəbindən nişanədir.

B: Təcəlli mərtəbəsinə yüksəldən cazibədən nişanədir.

**Nişanə** 2. "Qan": Bu beytdə əzab çəkməkdən istiarə olduğuna görə sınağa çəkilmək çətinliyini, tərbiyə görməyi və nəhayət qurbanlıq məqamına hazırlaşmağı, yaxud "Qan içər oldum ayağın çəkdi bəzimdən şərab" mənasını ifadə edən nişanədən ibarətdir.

**Qeyd:** *Qan içər mərtəbəsini yaxud tərbiyəvi sınaqlar əzəmətini təlqin etmək məqsədilə şairlər sultanı Xaqani* "من خون خورم نه باده من غم كشم نه ساغر" *buyurmuşdur.*

**Nişanə** 3. "Sürud, çəng, ud": Bu beytdə: A: Ürək açan dünyəvi şadlıqlardan nişanədir.

B: Müşahidə və vüsal şadlıqlarından nişanədir.

**Nişanə** 4. "Naləvü əfğan": Ürək münacatı ünvanlı tələb biqərarlığından ibarətdir.

**Anlam: Bu amansız ruzgarda bəstlərlə arxa – arxaya gəzən qəbzlər və vüsal dalını yerə vuran hicranlar məni dünyəvi və mənəvi sərxoşluqdan məhrum etdilər.**

Beyt 2: **Dəxi zövqi – vüsali – dust şövqün istəmin məndən**
**Ki, mən zövqi – vüsali möhnəti – hicranə dəgşərdim.**

**Nişanə** 1. "Zövqi-vüsal": Bu beytdə bəst mərtəbəsilə bağlı özəl bir ləzzətdir. Ancaq qəbz mərhələsində də aşiqi tərk etməz.

**Nişanə** 2. "Dust": Dünya və axirət nemətlərini unutmuş aşiqin mütəal məbud ilə vasitəsiz əlaqə saxlamağına "dostluq" demişlər.

**Nişanə** 3. "Möhnəti-hicran": Aşiqin nöqsanını, yaxud kamalını üzə çıxaran, canı və ürəyi sınaqlara çəkən qəbzlərdən nişanədir.

**Anlam: Aşiq öz nöqsanından xəbərdar olduğunu etiraf etməklə ilahi üstün bir mərifətə nail olduğunu da bildirir.**

Beyt 3: **Məni, ey bağiban, məzur tut gülzar seyrindən**
**Ki, mən gülzar seyrin külbeyi - əhzanə dəgşərdim.**

Sözlük: Məzur – üzrxahlıq etmək; Külbeyi-əhzan – pərişan daxma = qəmlər daxması

**Nişanə** 1. “Bağiban”: Bağiban bu beytdə: A: Dünyəvi gözəllikləri, mərifət ilə mühafizə edən insandan ibarətdir.

B:Mənəvi ürək açan nailiyyətlərə istiqamətləndirən rəhbərdən nişanədir.

**Nişanə** 2. “Gülzar”: A: Ruh üçün genişlik şəraiti törədən bəstdən nişanədir.

B: Ürək açan dünyəvi vəziyyətdən nişanədir.

**Nişanə** 3. “Külbeyi-əhzan”: Öz tərbiyəvi ehtiyacını etiraf etmiş aşiqin hicran qüssəsi ilə daşqın qəlbindən ibarətdir.

**Anlam: A: Beyt mənəvi pərişanlığın dünyəvi sərxoşluqdan üstün olduğunu bildirmək istəyir.**

**B: Külbeyi-əhzan tərbiyəvi hicran pərişanlığı ilə əlaqədar olduğuna görə müvəqqəti vüsal sərxoşluğundan yaxud istedadsız bəhrələnməklərdən üstündür.**

**C: Vüsalda hicran qorxusu və hicranda ümid olduğundan hicran qüssəsi (külbeyi-əhsan) vüsal şadlığından yaxşıdır.**

Beyt 4: **Könül verdim fənavü fəqrə, tərki – etibar etdim,**
**Bihəmdillah ki, axir küfrümü imanə dəgşərdim.**

Sözlük: Fəqr – fağırlıq; Bihəmdillah – şükr Allaha

**Nişanə** 1. “Fəna”: Dünyəvi ilgilərdən, yaxud bəşəri sifətlərdən ayrılmaq nişanəsidir.

**Nişanə** 2. “Fəqr”: Öz məmlüklüyünü etiraf etmiş aşiqin bəndəlik məqamına yüksəlməyindən ibarətdir[1]

**Nişanə** 3. “Etibar”: A: Bəşəri sifət olduğundan fəna məqamının ilk nişanəsi etibarsız olmaqdır.

B: Bəşəri vücuda bağlı olduğundan, özü vücudunu fani etmiş aşiqin ilk əlaməti etibarsızdır. Çünki fani olmuş vücudun etibarı da fani olmalıdır.

C: Etibar varlıq, fəqr yoxluq olduğuna görə fəqir aşiqin etibarsız olmağı aydın bir sözdür.

**Qeyd:** *Etibarsızlıq “əzdad” (əkslər) mövzusunda izah etdiyimiz*

---

[1] Qəzəl 21, beyt 1, nişanə 1

*kimi*[1] *əks nəticə verərkən yer kürəsində etibarını tərk etmiş fağıra "istiğna" ünvanlı səmavi etibarlar nailiyyəti bağışlayar. Beləliklə yerdən əlini üzmüş fəqir adam əl çatmaz göylərə əl qaldırmaqla, buludlara fərman vermək, ölünü danışdırmaq və habelə bir dua ilə aləmə təkan vermək etibar və iqtidarına nail olmaq imkanı tapır.*

**Nişanə** 4. "Küfr": Bu beytdə mənəvi etibarın üstünü örtən dünyəvi etibardan ibarətdir.

**Nişanə** 5. "İman": Bu beytdə aşiqə mənəvi etibar bağışlayan hidayətdən nişanədir.

**Anlam: Dünyəvi həqir etibarları tərk etməklə mənəvi yüksək etibarlar əxz etməyə nail oldum.**

Beyt 5: **Könüldən zövq bulmazdım, çıxardım çaki – köksümdən,**
**Qaşı yaylar xədəngilə gələn peykanə dəgşirdim.**

Sözlük: Çak – rəxnə = para = paralanmaq; Xədəng – ox = süngü; Peykan – ox ucu (dəmir)

**Nişanə** 1. "Könül": Bu beytdə qəlbin dünyəvi məzələrdən dad alan bəşəri cəhətindən ibarətdir.

**Nişanə** 2. "Zövq": Bu beytdə qəlbin mənəvi məzələrdən dad alan ilahi cəhətinə bağlı özəl bir qüvvədən ibarətdir.

**Nişanə** 3. "Qaşı yaylar": Çöl vücudundan təsirlənmiş aşiqi dübarə bəstlənməyə hazırlayan ilahi lütflərdən asılı qəhrlərdən ibarətdir.

**Anlam: Mənəvi məzələrdən dad almağa qadir olmayan könlümü qaşı yaylar vasitəsilə tənbeh edərkən tərbiyələndirdim.**

Beyt 6: **Niqabi – surəti – hal eylədim xuni – cigər seylin,**
**Əyan rüsvalığı dərdü qəmi – pünhanə dəgşirdim.**

Sözlük: Xuni-cigər – cigər qanı; Əyan – əyani = aşkar

**Anlam: Rüsvaylıq əlaməti olan qəmlərdən saralıb – solmuş surətimi qan ağlayıb qızartmaqla, həm "aşiq baş verər sirr verməz[2]" hökmünü icra etdim, həm də bütün biqərarlıqlar və qəmləri batini vücudumda yerləşdirdim.**

**Qeyd:** *Bu beyt də ötən beyt kimi aşiqi məcazilik həbsindən azad*

---

[1] Qəzəl 114, beyt 1
[2] Qəzəl 114, beyt 1

*edən mərifət nailiyyətini təlqin edir.*

Beyt 7: **Füzuli, məndə zövqi – afiyət az istə kim, çoxdan,**
**Məm onu aruziyi – tələti – cananə dəgşirdim.**

Sözlük: Tələt = üz = tülu

**Nişanə** 1. “Afiyət”: Bu beytdə ictimai etibar qazanmaq və abır gözləməkdən nişanədir.

**Qeyd:** *Dünyəvi hörmət və etibar bəşəri vücud ilə bağlı olduğundan müxtəlif mərhələlərdən məlamət ünvanlı mərhələdə məhv olmalıdır*[1].

**Nişanə** 2. “Tələt”: Aşiqin daxili vücudunu canlandıran ilahi parlamalara “tələt” demişlər.

**Anlam: Bu beyt də dünyəvi etibarları fəda etməklə mənəvi etibarlar nailiyyətini mümkün hesab edir.**

---

[1] Qəzəl 1, beyt 5

## Q Ə Z Ə L 189

**(1) Qıldı ol sərv səhər naz ilə həmmamə xüram,**
**Şəm`i – rüxsarı ilə oldu münəvvər həmmam.**

**(2) Görünürdü bədəni çaki – giribanından,**
**Camədən çıxdı, yeni ayını göstərdi təmam.**

**(3) Nilgun futəyə sardı bədəni – üryanın,**
**San bənəfşə içinə düşdü müqəşşər badam.**

**(4) Oldu pabusi – şərifilə müşərrəf ləbi – hövz,**
**Buldu didari – lətifilə ziya dideyi – cam.**

**(5) Sandılar kim, satılır daneyi – dürri - ərəqi,**
**Urdu əl kisəyə çoxlar qılıb əndişeyi – xam.**

**(6) Kakilin şanə açıb, qıldı həvayi mişkin,**
**Tiğ muyin dağıdıb, etdi yeri ənbərfam.**

**(7) Tas əlin öpdü, həsəd qıldı qara bağrımı su,**
**Yetdi su cismin, rəşk aldı tənimdən aram.**

**(8) Çıxdı həmmamdən o, pərdeyi – çeşmim sarınıb,**
**Tutdu asayiş ilə guşeyi – çeşmimdə məqam.**

**(9) Mərdümi – çeşmim əyağinə rəvan su tökdü**
**Ki, gərək su tökülə sərvin əyağinə müdam.**

**(10) Müzdi – həmmam, Füzuli, verərəm can nəqdin,**
**Qılmasın sərf zər ol sərvqədü siməndam.**

**Qeyd:** *Dönə - dönə dediyimiz kimi, özünü eşq və irfan zirvəsinə qaldırmış insanların bir çoxu məcazi və təbii aləmə biganə olmayıblar, bəlkə onların bəzisi "المجاز قنطره الحقيقه": (Məcazı, həqiqət aləminə çatdıran yol körpü kimidir) deməklə təbii hüsn və cismani eşqi həqiqi və ilahi eşq tanışlığına müqəddimə kimi bilmişlər[1]. Demək səmavi seyr və mənəvi hüsnlər məşğulluğu həmişəlik olmadığından, aşiq yer sahəsində yaşadığı çağlarda da, bəşəri və dünyəvi tənasübləri alqışlamaqla, öz əhvali-ruhiyyəsinin lətifliyini mühafizə edir. Demək, "islami təsəvvüf ilahi ruhu bəşəri nəfəs ilə bir növ təşkilatçı vəhdət vasitəsilə qoşalıq halında vahidləşdirir. Beləliklə, təbiətdən yüksək əmrin bir təbii cəhəti olduğu kimi, təbii əmrin isə bir qeyri təbii cəhəti də olmalıdır. Habelə mədəni ənənələr seyrində mənəvi əmrlərdə maddi cilvələr, maddi əmrlərdə də mənəvi rayihələr idrak olunur. Bu dərketmə, yaxud bu qanun Söhrəverdi[2] fəlsəfəsindən Hafiz şerinə qədər, yaxud klassik musiqidən dini əməllərə qədər öz əhatəsini təsvir edir..., (beləliklə) maddi və cismani təsvirlər ruhaniyyət və mənəviyyət ilə müxalif yox, bəlkə də onları ilahi və ruhani mərtəbələrə istiqamətləndirən gərəkli əmrlərdirlər[3]. Buna görə də, bu qəzəldə vəsf olunmuş məcazi və cismi tənasüblər isə mənəvi vəsflər ilə müxalif yox, bəlkə də məvazidir.*

**Qeyd** 1: *5 – ci beytdə qeyd olunmuş "daneyi-dürri-ərəq" sözü səbəb olmuş ki, bəzi tədqiqatçılar bu qəzəli islamın ulu peyğəmbərinin vəsfində bilmişlər. Çünki irfani araşdırıcılar Məhəmməd (s) peyğəmbərin ilahi maarifi təzələndirən hüsnünə ərəq demişlər.*

**Qeyd** 2: *Batini vücudu duruldub paka çıxaran məcazi eşqi müqəddəs bilmişlər.*

**Qeyd** 3: *Məcazi eşqi müstəqil bilib mənəvi eşqi isə inkar etməyi batil bilib tənqid etmişlər.*

Beyt 1: **Qıldı ol sərv səhər naz ilə həmmamə xüram,**
**Şəm`i – rüxsarı ilə oldu münəvvər həmmam.**

Sözlük: Xüram – nazlana – nazlana addım atmaq = nazlanmaq; Rüxsar – sima = camal; Münəvvər – nurani = parlaq

[1] Qəzəl 114, beyt 6
[2] 6 – cı əsrdə (hicri qəməri) yaşamış Şeyx İşraq ləqəbli məşhur filosof
[3] Doktor Seyyid Hüseyn Nəsr, Sünnəti-əqlanie islami-dər İran, səh. 283

Beyt 2: **Görünürdü bədəni çaki – giribanından,**
**Camədən çıxdı, yeni ayını göstərdi təmam.**

Sözlük: Çaki giriban = açılmış yaxa, came = tikişsiz paltar = paltar

Beyt 3: **Nilgun futəyə sardı bədəni – üryanın,**
**San bənəfşə içinə düşdü müqəşşər badam.**

Sözlük: Nilgun – nil rəngində = abi-təhər; Futə – fitə; Müqəşşər – dəridən çıxmış

Beyt 4: **Oldu pabusi – şərifilə müşərrəf ləbi – hövz,**
**Buldu didari – lətifilə ziya dideyi – cam.**

Sözlük: Pabus – ayağını öpmək = xidmət göstərmək; Müşərrəf – şərəflənmiş; Didar – görüş; Dide – göz

Beyt 5: **Sandılar kim, satılır daneyi – dürri - ərəqi,**
**Urdu əl kisəyə çoxlar qılıb əndişeyi – xam.**

Sözlük: Ərəq – tər

Beyt 6: **Kakilin şanə açıb, qıldı həvayi mişkin,**
**Tiğ muyin dağıdıb, etdi yeri ənbərfam.**

Sözlük: Kakil – kəkil; Şanə – daraq; Mişgin – müşklü = ətirli; Muy – tük; Ənbər fam – ətirli

Beyt 7: **Tas əlin öpdü, həsəd qıldı qara bağrımı su,**
**Yetdi su cisminə, rəşk aldı tənimdən aram.**

Sözlük: Rəşk – qibtə = müsbət həsəd

Beyt 8: **Çıxdı həmmamdən o, pərdeyi – çeşmim sarınıb,**
**Tutdu asayiş ilə guşeyi – çeşmimdə məqam.**

Sözlük: Çeşm – göz

Beyt 9: **Mərdümi – çeşmim əyağinə rəvan su tökdü**
**Ki, gərək su tökülə sərvin əyağinə müdam.**

Sözlük: Mərdümi çeşm – göz bəbəyi; Müdam – daimi = həmişə = ardı-arası kəsilməyən = şərab

Beyt 10: **Müzdi – həmmam, Füzuli, verərəm can nəqdin,**
**Qılmasın sərf zər ol sərvqədü siməndam.**

Sözlük: Sim – gümüş; Siməndam – ağbədən

## Q Ə Z Ə L 190

**(1) Ey kəmanəbru, şəhidi – navəki – müjganınam,**
**Bulmuşam feyzi – nəzər səndən, sənin qurbanınam.**

**(2) Kakilin tarinə peyvənd etmişəm can riştəsin,**
**Başın üçün, bir tərəhhüm qıl ki, sərgərdanınam.**

**(3) Nola qılsam tərki – mey, minnət qılıb zahidlərə,**
**Neylərəm mey nəş`əsin, mən kim, sənin heyranınam.**

**(4) Şanəvəş yüz navəki – qəm sancılıbdır sinəmə,**
**Ta əsiri – həlqeyi – geysuyi – mişkəfşanınam.**

**(5) Əl çəkib, qət`i – nəzər qılmış əlacımdan təbib,**
**Bildi guya kim, xərabi – nərgisi – fəttanınam.**

**(6) Canə meylin var isə, hökm eylə, təslim eyləyim,**
**Padşahım! Mən sənin bir bəndeyi-fərmanınam.**

**(7) Qönçə qılmaz şad, gül açmaz tutulmuş könlümü,**
**Arizuməndi – rüxi –alü ləbi – xəndanınam.**

**(8) Qan edib bağrım, işim ah etmə hər dəm, ey fələk,**
**Hörmətim tut bir – iki gün kim, sənin mehmanınam.**

**(9) Ey Füzuli, atəşi – ah ilə yandırdın məni,**
**Qaliba sandın ki, şəm`i – külbeyi - əhzanınam.**

Beyt 1: **Ey kəmanəbru, şəhidi – navəki – müjganınam,**
**Bulmuşam feyzi – nəzər səndən, sənin qurbanınam.**

Sözlük: Kəmanəbru – kaman qaşlı; Navək – ox; Müjgan – kiprik

**Nişanə** 1. “Kəmanəbru”: Həzrəti-məhbubun həqiqətini gizlədən qəhr və qəzəbdən sifətlərinə işarə edən nişanədir.

**Nişanə** 2. “Şəhid”: Həzrəti məhbubun camalından parlayan ziyalar içində məğlub və məhv olmuş aşiqə “şəhid” demişlər.

**Nişanə** 3. “Navəki-müjgan”: Aşiqin bağrını yarıb onun ürək münacatını davam etdirən ilahi qəmzələrdən nişanədir.

**Nişanə** 4. “Feyzi-nəzər”: Müqəddəs eşq tanışlığı ilə yeni bir həyat tapmış aşiqin görünməz mənəvi mərtəbləri görən “bəsirət” adlı gözündən nişanədir.

**Nişanə** 5. “Qurban”: A: Özünü unutmaqla ikilik fasiləsini yox dərəcəsinə çatdıran aşiqdən nişanədir.

B: Dünyəvi həyatını məşuq həzrətinə fəda edən aşiqdən əlamətdir[1].

**Anlam: Ey həkimi-məhbub, bağır yarıb – can alan qəhr və qəmzələrini alqışlayıram.**

Beyt 2: **Kakilin tarinə peyvənd etmişəm can riştəsin,**
**Başın üçün, bir tərəhhüm qıl ki, sərgərdanınam.**

Sözlük: Kakil – kəkil; Tar – riştə; Tərəhhüm – rəhm etmək = mehribanlıq = bağışlamaq

**Nişanə** 1. “Kakil”: Mütəal məhbubun camal cilvələrindən nişanədir.

**Nişanə** 2. “Tərəhhüm”: Bu beytdə aşiqi müşahidə feyzi ilə tərbiyələndirən ilahi lütfdən nişanədir.

**Nişanə** 3. “Sərgərdan”: Mütəal məhbub camalını tüksüz görmüş aşiqin heyranlığından nişanədir.

**Anlam: Beyt dünyəvi və mənəvi yaşayışın, yaxud həqiqi həyatın mütəal canan camalından parlayan cilvələr ilə bağlı olduğunu təlqin edir (eşq ilə yaşamaq).**

Beyt 3: **Nola qılsam tərki – mey, minnət qılıb zahidlərə,**
**Neylərəm mey nəş`əsin, mən kim, sənin heyranınam.**

**Nişanə** 1. “Mey”: Bu beytdə dünyəvi və mənəvi sərxoşluqlar

[1] Qəzəl 7, beyt 2

vasitəsindən nişanədir.

**Nişanə** 2. “Heyran”: Heyranlıq bəşəri əql və məntiq acizliyini sübut etmiş fikir dayandıran sərgərdanlıqdan ibarətdir.

**Anlam:Heyranlıq bərəkətindən, zahiddin irad və inkar etdiyi sərxoşluqlardan də hacətsiz olmuşam.**

**Qeyd:** *Təkcə öz daxili aləmində yaşayan aşiq xarici aləm prinsiplərindən, o cümlədən zahidin irad – etirazından xilas olur.*

Beyt 4: **Şanəvəş yüz navəki – qəm sancılıbdır sinəmə,**
**Ta əsiri – həlqeyi – geysuyi – mişkəfşanınam.**

Sözlük: Şanəvəş – daraq kimi; Navək – ox; Geysu – saç = hörük, mişkəfşan = ətirli

**Nişanə** 1. “Navəki-qəm”: Aşiqin qəlbini ardıcıl yaralayan qəbzlər və qəmzələrdən nişanədir.

**Nişanə** 2. “Geysu”: A: Bu beytdə ilahilik uzantısından nişanədir.

B: Vəhdət nurunun kəsrət güzgüsündə ardıcıl təzahür etməyindən nişanədir.

**Anlam: Qəlbi ardıcıl yaralayan qəmzələr bərəkətindən cismi əlaqələri unutmaqla ilahilik uzantısından bəhrələnməyə hazırlaşmışam.**

Beyt 5: **Əl çəkib, qət`i – nəzər qılmış əlacımdan təbib,**
**Bildi guya kim, xərabi – nərgisi – fəttanınam.**

Sözlük: Nərgis – nərgiz = məşuqun gözü; Fəttan – daha fitnəkar = ən gözəl

**Nişanə** 1. “Təbib”: Bu beytdə aşiqi əql yoluna hidayət edən nəsihətçidən ibarətdir.

**Nişanə** 2. “Xərab”: Öz bəşəri sifətlərini unutmaqla ilahi sifətlərə yer açmış aşiqdən istiarədir.

**Nişanə** 3: “Nərgisi-fəttan”: İç aləmi fərəhləndirən ilahi şühud qələbələrindən istiarədir.

**Anlam: Şühud ləzzətindən, yaxud mənəvi maarifdən xəbərdar bir insanın zahidin nəsihətindən təsirlənməyi, yaxud dünyəvi hörmət – etibara diqqət etməyi mümkün deyil.**

Beyt 6: **Canə meylin var isə, hökm eylə, təslim eyləyim,**

**Padşahım! Mən sənin bir bəndeyi-fərmanınam.**

**Nişanə** 1. “Birinci misra”: Qurbanlıq nailiyyətinə yaxud vəhdət cövhərinə qatılmağa hazırlaşmağı eyham edir.

**Nişanə** 2. “Padşah”: A: Həsrət və arzu ətəşilə alovlanmış ürəkdə hökm sürən canandan ibarətdir.

B: Bütün varlığa malik və hakim olan mütəal məbudun özündən nişanədir.

**Nişanə** 3. “Bəndeyi-fərman”: Bəndeyi-fərman olmaq öz məmlüklü-yündən xəbərdar aşiqin islam peyğəmbərinin nail olduğu “əbdlik” ərə-fəsinə çatmağa tərbiyələnməyindən nişanədir[1].

**Anlam: Beyt “innəllah” nöqtəsindən, yaxud vəhdət mərkəzindən hərəkət edib maddi dünyaya yollanmış aşiqin dübarə həmin nöqtəyə müraciət etməyə hazırlaşmağını təlqin edir.**

Beyt 7: **Qönçə qılmaz şad, gül açmaz tutulmuş könlümü,**
**Arizuməndi – rüxi –alü ləbi – xəndanınam.**

Sözlük: Rüx – üz = surət; Rüxi-al – al yanaq

**Nişanə** 1. “Qönçə, gül”: Qönçə və gül bu beytdə ürək açan məcazi hüsnlərdən nişanədirlər.

**Nişanə** 2. “Rüxi-al”: Bəşəri sifətləri məğlub və batil edən ilahi lütflər ilə bağlı cilvələrdən nişanədir.

**Nişanə** 3. “Ləbi-xəndan”: Həkim Nizaminin

“زنده به جان خود همه حیوان بود          زنده به دل باش که جان آن بود”

buyurduğu kimi yeni həyat bağışlayan, yaxud ürək dirçəldən ilahi ilham – işarədən nişanədir.

**Anlam: Beyt mənəvi hüsnlər ilə tanış olmuş aşiqin nəzərincə dünyəvi hüsnlərin həqir olduğunu təlqin etmək istəyir.**

Beyt 8: **Qan edib bağrım, işim ah etmə hər dəm, ey fələk,**
**Hörmətim tut bir – iki gün kim, sənin mehmanınam.**

**Nişanə** 1. “Birinci misra”: Dünyəvi ömür möhlətində maneəsiz şühud yaxud daimi hüzur nailiyyətinin mümkünsüz olduğunu təlqin edən nişanədir.

---

[1] Əşhədu ənnə Məhəmmədən əbduhu və rəsuluhu

**Anlam: Beyt müqəddəratı təyin edən təbii qüvvələrdən üstün iqtidarın (fələk) şühud və hüzur önündə maneə törətməsindən narazılıq bildirir.**

Beyt 9: **Ey Füzuli, atəşi – ah ilə yandırdın məni,**
**Qaliba sandın ki, şəm`i – külbeyi - əhzanınam.**

Sözlük: Külbeyi-əhzan – pərişan daxma = qəmlər daxması

**Nişanə** 1: "Atəşi-ah": Ürəyin məcazi əngəl cəhətindən ləkəsini paklayan atəş və tələb hərarətindən nişanədir.

**Nişanə** 2: "Şəm`": A: Bu beytdə dünyəvi cəlalardan nişanədir.

B: Mənəvi mənzillərə istiqamətləndirən nurdan nişanədir.

**Nişanə** 3: "Külbeyi-əhzan": Bu beytdə tərbiyəvi hicran pərişanlığı ilə dolu olan ürəkdən, yaxud vəhdət ilə kəsrət arasında sərgərdan qalmış vücuddan nişanədir.

**Anlam: Beyt aşiqi özlüyündən kənar edən atəş və tələb hərarətini təlqin edir.**

## Q Ə Z Ə L 191

**(1) Səcdədir hər qanda bir büt görsəm, ayinim mənim,**
**Xah mö`min, xah kafər tut, budur dinim mənim.**

**(2) Bağiban, şümşadü nəsrinin mənə ərz etmə kim,**
**Ol qədü rüxsardir şümşadü nəsrinim mənim.**

**(3) Xaki – dərgahin nəzərdən sürmə, ey seylabi - əşk,**
**Qılma zaye` sürmeyi – çeşmi – cəhanbinim mənim.**

**(4) Əşk mövci gəzdirir hər yan tənim xaşakini,**
**Mümkün olmaz əşk təhrikilə təskinim mənim.**

**(5) Çarə umdum lə`li – şirinindən əşki – təlximə,**
**Təlx göftar ilə aldın cani – şirinim mənim.**

**(6) Məndə sakin oldu dərdi – eşq Məcnundan keçib,**
**Ondan artıqdır məgər eşq içrə təmkinim mənim?**

**(7) Ey Füzuli, hər yetən tə`n eylər oldu halimə,**
**Bu yetər əhli – məlamət içrə təhsinim mənim.**

Beyt 1: **Səcdədir hər qanda bir büt görsəm, ayinim mənim,**
**Xah mö`min, xah kafər tut, budur dinim mənim.**

Sözlük: Xah – istər

**Nişanə** 1. "Səcdə": Bu beytdə hörmət göstərmək, həm də başda olan məğrurluğu torpağa tapşırmaqdan nişanədir.

**Nişanə** 2. "Büt": Aşiqin dünyaşünas əqlini daş kimi qurudub onu heyran edən mürşüd həzrətindən, yaxud ilahi vasitədən, ya da mütəal məbudun camal cilvələrini əks etdirən "məzhər" və "güzgü" ünvanlı gözəl simadan nişanədir.

**Nişanə** 3. "Ayin": Ayin bu beyt də aşiqin "ələst" ünvanlı ülvi aləmdən gətirdiyi sağlam fitrəti ilə birlikdə məzhəb, sifət və təbiətindən ibarətdir.

**Anlam: Aşiq "məzhər" ünvanlı mərtəbədə[1] dünyəvi sifətlər və hörmətlərdən çəkinməklə mənəvi xarakterinin sağlam olduğunu, yaxud ülvi mərifət nailiyyətini sübut edir.**

Beyt 2: **Bağiban, şümşadü nəsrinin mənə ərz etmə kim,**
**Ol qədü rüxsardir şümşadü nəsrinim mənim.**

Sözlük: Nəsrin – vəhşi nərgiz = sarı nərgiz (nəsrin qışda qar içində həyatını davam etdirə bilir).

**Nişanə** 1. "Bağiban": Bu beytdə məcazi gözəlliklərlə tanış olmuş və onları istiqbal etmiş insandan nişanədir.

**Nişanə** 2. "Şümşadü nəsrin": Birinci misrada maddi hüsnlər və dünyəvi bəstlərdən nişanədir.

**Nişanə** 3. "Qəd": Maddə ilə məna arasındakı ilahilik uzantısından ibarətdir.

**Qeyd:** *Qəd, yaxud ilahilik uzantısı "قد قامت الصلوة" etibarı ilə eşq namazının, yaxud bəndəlik iftixarının başlanışını təlqin edən nişanədir.*

**Nişanə** 4. "Rüxsar": Bu beyt də aşiqi mənəvi mərifətdən bəhrələndirən və onun qəlbinə yeni həyat bağışlayan ilahi camal cilvələrindən nişanədir.

**Nişanə** 5. "Şümşadü nəsrin": İkinci misrada ürəyə həqiqi bəst bağışlayan mənəvi hüsnlər zühurundan nişanədir.

---

[1] Qəzəl 100, beyt 5

**Anlam: Bu beyt isə dünyəvi hüsnlərlə müqayisə olmaz mənəvi hüsnlər əzəmətini təlqin etmək istəyir.**

Beyt 3: **Xaki – dərgahin nəzərdən sürmə, ey seylabi - əşk,**
**Qılma zaye` sürmeyi – çeşmi – cəhanbinim mənim.**

Sözlük: Xak – torpaq; Dərgah – ərəfə = qapı = qəsr; Silab – sellənmək; Əşk – göz yaşı; Çəşmi cəhanbin – batin gözü

**Nişanə** 1. “Xaki-dərgah”: Xaki dərgah, dünya gözünü örtmək ilə mənaşünas gözü, qüvvətləndirən səbəbdən ibarətdir[1].

**Nişanə** 2. “Silabi-əşk”: Bu beytdə vücudun zahir və batinini iztiraba salan biqərarlıqdan nişanədir.

**Nişanə** 3. “Nəzər”: Nəzər bu beytdə əşyaların həqiqətinə, həm də ilahi əmrlərə diqqət yetirməkdən nişanədir.

**Nişanə** 4. “Sürmə”: Bax xaki-dərgah

**Nişanə** 5. “Çeşmi-cəhanbin”: Bu beytdə əşyaların həqiqətini müşahidə edən, yaxud mənəvi əmrlərlə tanış olan “bəsirət” ünvanlı, gözdən yaxud yeddi mərtəbli ürəyin “fuad” ünvanlı 4-cü mərtəbəsindəki şühud mərkəzindən nişanədir[2].

Anlam: Beyt bəndəlik ərəfəsində (xaki-dərgah) iztirabsız yaşamaq ləzzətini təlqin edir.

Beyt 4: **Əşk mövci gəzdirir hər yan tənim xaşakini,**
**Mümkün olmaz əşk təhrikilə təskinim mənim.**

Sözlük: Xaşak = kol – kos

**Nişanə** 1. “Əşk”: Bax beyt 3, nişanə 2

**Nişanə** 2. “Təni-xaşaki”: Kamil fanilik nailiyyətinə maneə törətmiş məcazi vücud törtöküntüsündən nişanədir.

**Nişanə** 3. “Təskin”: Ürəyin mənəvi haldan dünyəvi hala qayıtmaz şəraitindən ibarətdir. Beləliklə şərif ayənin “ هوالذى انزل السكينه في قلوب المومينين ليزدادو ايمانا مع ايمانهم،....،[3]” (“Möminlərin imanlarının üstünə iman artırmaq üçün onların qəlblərinə arxayınlıq nazil edən odur) buyurduğuna görə, salik olan[4] aşiqin qəlbini aram və arxayın etmiş

---

[1] Qəzəl 34, beyt 3, nişanə 1
[2] Qəzəl 13, beyt 1
[3] Quran, Fəth surəsi, 4-cü ayədən bir qismət
[4] Qəzəl 1, beyt 1

vasitəsiz ilahi əlaqə uzantısına "təskin", yaxud "səkinə" demişlər.

**Anlam: Təskin məqamına nail olmaqdan saxlaşdıran maneə məcazi vücud törtöküntüsü, yaxud fiziki mahiyyətə bağlı ürək iztirabından ibarətdir.**

Beyt 5: **Çarə umdum lə`li – şirinindən əşki – təlximə,**
**Təlx göftar ilə aldın cani – şirinim mənim.**

Sözlük: Əşki-təlx = dərd artıran göz yaşı, təlx göftar = acı söz

**Nişanə** 1. "Ləli-şirin": Bu beytdə "mühadisə"[1] ünvanlı mərtəbədə ürəyin mütəal məhbub ilə danışmasından və öz ətəşini – tələbini bəyan etməsindən istiarədir[2].

**Nişanə** 2. "Əşki-təlx": Dərd artıran biqərarlıqdan nişanədir.

**Nişanə** 3. "Təlx göftar": Mühadisə nailiyyətindən saxlaşdıran tərbiyəvi tənbihdən nişanədir.

**Nişanə** 4. "Cani-şirin": Bu beytdə mənəvi alqı – satqının dünyəvi sərmayəsindən ibarətdir.

**Anlam: Aşiq eşq bazarına hazırladığı sərmayənin həqir olduğunu, yaxud mühadisə nailiyyətinə layiqsizliyini etiraf edir.**

Beyt 6: **Məndə sakin oldu dərdi – eşq Məcnundan keçib,**
**Ondan artıqdır məgər eşq içrə təmkinim mənim?**

**Nişanə** 1. "Dərdi-eşq": Aşiqin batini vücudunda sultanlıq edən "İsa" ünvanlı gizli rəhbərdən nişanədir[3].

**Nişanə** 2. "Məgər": Bu beytdə "yəqinən" mənasını ifadə edən kinayəli sözdən ibarətdir

**Nişanə** 3. "Təmkin": İrfani məqamlar seyr yolunun mənzilgahlarından ibarətdirlər, lakin təmkin, o yolun nəhayətindən, yaxud ilahi ərəfədə qərar tutmaqdan nişanədir[4].

**Anlam: Məcnun seyr yolunun mənzilgahına çatmağı qənaətbəxş bildi, lakin mən o yolu nəhayətə qədər seyr etdim.**

Beyt 7: **Ey Füzuli, hər yetən tə`n eylər oldu halimə,**

---

[1] Mühadisə = danışmaq = danışıq
[2] Qəzəl 36, beyt 3
[3] Qəzəl 176, beyt 5
[4] Qəzəl 106, beyt 3

**Bu yetər əhli – məlamət içrə təhsinim mənim.**

Sözlük: Tə`n = tənə, təhsin = tərif = afərin əhsən

**Nişanə** 1. “Tə`n və məlamət”: Dünyəvi etibarların həqirliyini göstərmək məqsədilə aşiqi umumi hörmətlərdən çəkindirən mərhələdən ibarətdir[1].

**Anlam: Aşiq məlamət mərhələsində dünyəvi etibarlardan çəkinə bildiyini, beləliklə “mənəm –mənəmlik” ünvanlı ən böyük xətər mənşəyindən yaxud birinci hicabdan xilas olmağını özünə iftixar bilir.**

---

[1] Qəzəl 106, beyt 3

**Q Ə Z Ə L 192**

**(1) Zairi – meyxanəyəm, müğ səcdəsidir ta`ətim,**
**Eşq pirim, nəqdi – can nəzrim, təvəkkül niyyətim.**

**(2) Hər yanə baxsam, sürahi tək sücud etmək işim,**
**Qanda olsam, badə tək düşmək əyağə adətim.**

**(3) Tövrümə zahid əgər surətdə eylər e`tiraz,**
**İxtilat etsəm, onu şərməndə eylər sirətim.**

**(4) Bəs ki, cami – mey kimi xoşməşrəbü safidiləm,**
**Hörmətim vacib tutar, hər kim bilir keyfiyyətim.**

**(5) Mö`təbərlikdir qürur əsli, mən ondan fariqəm,**
**E`tibarə çün degil qabil mühəqqər hey`ətim.**

**(6) Eşq ərbabi – riyadan fariğ etmiş könlümü,**
**Fəqr əsbabi - əlayiqdən götürmüş rəğbətim.**

**(7) Ey Füzuli, fəqr torpağında dövlət istə kim,**
**Sayə ol torpağə salmışdır hümayi – himmətim.**

Beyt 1: **Zairi – meyxanəyəm, müğ səcdəsidir ta`ətim,**
**Eşq pirim, nəqdi – can nəzrim, təvəkkül niyyətim.**

Sözlük: Zair – ziyarətçi; Taət – itaət

**Nişanə** 1. “Meyxanə”: A: İç aləmini maddi küdurətlərdən saflaşdırmış həqiqətşünas dostlar məclisindən ibarətdir.

B: Qeyri maddi ülvi qovuşmaq şəraitindən ibarətdir.

C: Kamil arifin ilahi mərifətlərlə dolu ürəyindən ibarətdir.

D: Rəziəddin Ərtimani “ به میخانه آی و صفارا ببین مبین خویشتن را خدا را ببین” dediyi kimi, aşiqin özünə özündən nicat verməklə ona bütün kainatda ilahi camal cilvəsini göstərən mərtəbədən nişanədir.

**Nişanə** 2. “Arif”: Ürəyi ilahi tanışlıqlarla dolu insana “kamil müğ” demişlər.

**Nişanə** 3. “Səcdə”: Hörmət göstərməkdən, yaxud başda olan məğrurluğu müğ məktəbinin ərəfəsində torpağa tapşırmaqdan nişanədir.

**Nişanə** 4. “Eşq piri”: Bax “müğ”

**Nişanə** 5. “Nəqdi-can”: Aşiqin qurbanlıq, yaxud eşq bazarına hazırladığı sərmayədən ibarətdir.

**Nişanə** 6. “Təvəkkül”: Mütəal Allah hüzurundakı şeylərə ümid bağlamaq amma camaatın əlindəkilərə ümidsiz olmaq təvəkküldən ibarətdir[1].

**Qeyd** 1*: “Sufilərin nəzərincə “qürub” ünvanlı mənəvi yaxınlıq səmasının ən yüksək mərtəbəsinə çatdıran elm çərçivəsinə sığmaz təvəkkül məqamına nail olmaq daha çətindir”.*

**Qeyd** 2: *İrfani məqamları araşdıran mənəviyyatşünaslar təvəkkül məqamını üç dərəcədə izah etmişlər:*

*A: Mütəal məhbubu öz vücuduna hətta iradə - ixtiyarına həqiqi vəkil (malik) bilməklə, özünü ona təslim etmək təvəkkül məqamının birinci dərəcəsindən ibarətdir.*

*B: Təkcə öz anasına arxayın olub yalnız ondan kömək diləyən və ondan başqa heç bir şəxsi tanımayan uşaq kimi mütəal məhbuba bağlı olmaq təvəkkül məqamının ikinci dərəcəsindən ibarətdir.*

**Qeyd:** *Birinci təvəkkül, şüur və əql ilə bağlıdırsa, əksinə ikinci təvəkkül fitri və qeyri ixtiyaridir.*

*C: Vəkil ünvanlı mütəal məhbub eşqinə, əqlsiz və tədbirsiz bir ölü kimi təslim olmaq (məmlüklük) təvəkkül məqamının üçüncü yaxud yüksək*

---

[1] Doktor Qasim Qəni, Tarixi-təsəvvüf dər islam, cild 2, səh.642

*dərəcəsindən ibarətdir*[1]

**Anlam: Meyxanə mərtəbəsində maddi küdurətlərdən saflaşmaq, təvəkkül məqamına nail olmağın əsas şərtindən ibarətdir.**

Beyt 2: **Hər yanə baxsam, sürahi tək sücud etmək işim,**
**Qanda olsam, badə tək düşmək əyağə adətim.**

Sözlük: Sücud – səcdəyə düşmək

**Nişanə** 1. "Sürahi": Mənəvi seyrini nəhayət dərəcəyə çatdırmış aşiqin mütəal məhbub ilə isinişməyindən nişanədir. Ancaq şərab küpünün əlbəəl gəzdirilməyini təlqin etməklə, göz dolandırmağı yaxud baxmağa da işarə edir.

**Nişanə** 2. "Sücud": Sücud, öz qul və məmlük olduğunu etiraf etməklə mənəm – mənəmliyini, yaxud özünü torpağa tapşırmaq, nəhayət bəndəlik ərəfəsinə daxil olmaqdan nişanədir.

**Nişanə** 3. "Badə": İlahi parlamalar önündə qəlbi silkələyən eşq bolluğundan ibarətdir.

**Nişanə** 4. "Ayağa düşmək": İslamın ulu peyğəmbəri " وجودک ذنب لایقاس به ذنب" "([Ey insan] sənin vücudun [mənəm – mənəmliyin] heç bir günah ilə müqayisə olmayan bir günahdır[2])" buyurduğu kimi vücud sərhəddini sındırmaqdan, yaxud ən xətərli hicab ünvanlı özlüyünü təhqir etmək və torpağa tapşırmaqdan nişanədir.

**Qeyd:** *Badənin ayağa düşməyi: Müxtəlif qədim qəbilələr, xüsusilə Yunan xalqı içrə badəni torpağa tökmək müəyyən bir rəsm kimi qəbula keçmişdir. Onlar (Yunan xalqı) dünyadan köçmüş qohum – qardaşlarının qəbri üstünə şərab tökməklə onların bağışlanmağını rica edirmişlər və bu iş bir növ kərəm, igidlik və dünyasını dəyişmişlər haqqında bağışlanmaq istəmək kimi hesaba alınmışdır. İran və bəzi ərəb ölkələrinin igidləri kimi quru torpaq dodağını islatmaq və kərəm göstərmək məqsədilə bu rəsmi ibda` etmişdirlər*[3]*. Bu qədimi rəsm ilə bağlı kərəm və igidliyə işarə etmək məqsədilə şairlər sultanı Xaqani buyurmuş ki:*

دوستان تشنه لب را زیر خاک
از نسیم جرعه دان یاد اورید

*Həmçinin lisanülqeyb Hafiz buyurmuşdur:*

---

[1] Göstərilən kitab, səh 294-295
[2] Qəzəl 62, beyt 1
[3] Əli Nəzmi Təbrizi, Gülşəni-məna, səh. 119

اگر شراب خوری جرعه ای فشان برخاک
از آن گناه که نفعی رسد به غیر چه باک[1]

**Anlam: Aşiq, şərif ayə "فاینما تولو فتم وجه الله" "(Ey insanlar) hər hansı tərəfə üz tutsanız əslində Allaha tərəf üz tutbsunuz[2]) buyurduğu kimi, mütəal məbud cilvəsini hər tərəfdə müşahidə etməklə hər yana səcdə etməyi və xidmət göstərməyi (ayağa düşmək), yaxud hər tərəfin qiblə kimi olduğunu təlqin edir.**

Beyt 3: **Tövrümə zahid əgər surətdə eylər e`tiraz,**
**İxtilat etsəm, onu şərməndə eylər sirətim.**

Sözlük: Tövr – növ = keyfiyyət = heyət = iki şey arası; İxtilat – qarışıq = qatma = yalnız xas vasitələr ilə ayırd etməyi mümkün olan iki, ya neçə şey mürəkkəbliyi = məaşirət = divanəlikdən bir dərəcə aşağı pərişanlıq; Sirət – məzhəb = təriqət = adət = əxlaq= intizam

**Nişanə** 1. "Tövr": A:Salik olan aşiqin dünyəvi ömür yolunda seyr etdiyi yeddi çətin yolun hər birinə "tövr" demişlər.

B: Salik olan aşiqin içəri vücudunda, yaxud ürəyində yeddi sıra ədədli seyr yollarının, yaxud yeddi mənəvi və Qurani mədənin hər birinə tövr demişlər[3].

**Nişanə** 2. "İxtilat": Bu beytdə maddi aləmdə mənəvi xarakter ilə zahir olmaqdan nişanədir.

**Qeyd:** *Peyğəmbərlər, imamlar bir çox ariflər, mənəvi və həqiqi şəxsiyyətlərini "cism" adlı paltar, yaxud hicab içrə gizli saxlamasaydılar onda onları görmək heç bir göz üçün mümkün olmazdı və heç bir qulaq onların hidayət edici sözlərini dinləyə bilməzdi, nəhayət bütün insanlar onların nuru önündə Tur dağı kimi tikələnərdilər[4]. Bunun üçün də şərif ayə "[5]قل انما انا بشر مثلکم یوحی الی انما الحکم اله واحد" ("De: " Mən sizin kimi sadəcə bəşərəm, ancaq mənə vəhy olur ki, sizin Tanrınız vahid bir Allahdır") buyurmuşdur. Mövləvi,*

---

[1] Müəllif bu beyti "Ta Qafe-əndişe" kitabının 3-cü cildində şərh etmişdir
[2] Quran, Bəqərə surəsi, 115-ci ayə
[3] Qəzəl 13, nişanə 2
[4] Qəzəl 1, beyt 1, nişanə "nur"
[5] Quran, Füssilət surəsi, 6-cı ayədən bir qismət

نیست جنسیت به صورت لی ولک     عیسی آمد در بشر جنس ملک[1]

*deməklə fiziki bədən örtüyündə maddi dünyaya daxil olmuş İsa peyğəmbərin mələk cinsindən olduğunu dəlilləşdirmək istəyir.*

**Qeyd:** *Peyğəmbərin, imamların və bir çox arifin paltar, yaxud, hicab ya da bədən adlı xarici vücudu, "نور موتمن" ünvanlı daxili vücudu ilə həm ahəng və həm cins olduğundan, dünyəvi küdurətlər və bəşəri ləkələrdən paka çıxmaqla müqəddəsdir[2], bu mənanı təlqin etmək məqsədilə: Şair "Lütfdən hər necə baxsam təninə can görünür" buyurmuşdur.*

**Nişanə** 3. "Sirət": Arifin həqiqi, yaxud daxili xarakterindən ibarətdir.

**Anlam: Bədən adlı zahiri vücudum ilə bağlı işlərimə (təbii həyat əlamətlərimə) etiraz edən zahidə, "[3]نور موتمن" adlı içəri və həqiqi xarakterimdən bir cilvə zahir etsəm, onda onu həqiqətən şərməndə edərəm (utandıraram).**

Beyt 4: **Bəs ki, cami – mey kimi xoşməşrəbü safidiləm,**
**Hörmətim vacib tutar, hər kim bilir keyfiyyətim.**

Sözlük: Xoşməşrəb – xoş xasiyyət = xoş iddia; Safidil – saf ürəkli = batini saf

**Nişanə** 1. "Cami-mey": Salik mərtəbəli aşiqin maddi varlığına və bədən mənşəli mənən-mənəmliyinə qələbə çalmış ilahi cilvələr ilə daşqın ürəyindən nişanədir.

**Nişanə** 2. "Xoşməşrəb": Daxili vücud mənəviyyətindən təsirlənmiş xarici vücuddan nişanədir.

**Anlam: Beyt can ilə həmcins olmuş cismin, yaxud mənəvi tədavül – təcəssüm mərtəbəsinə nail olmuş maddi vücudun hörmətini təlqin etməklə peyğəmbərlər, imamlar, ariflər və digər mənəvi mərtəbəli insanlar cismini hətta Allah təala adına mənsub cansız minbəri, ələmi və məscid mühitini müqəddəs bildirmək istəyir.**

Beyt 5: **Mö`təbərlikdir qürur əsli, mən ondan fariqəm,**

---

[1] Mövləvi, Məsnəvi, 6-cı dəftər, beyt 2975
[2] Qəzəl 103, beyt 2
[3] Qəzəl 1, beyt 1 nişanə "nur"

**E`tibarə çün degil qabil mühəqqər hey`ətim.**

Sözlük: Fariğ – hacətsiz = xilas olmuş; Mühəqqər – həqir

**Nişanə** 1. "Mötəbərlik": Mötəbərlik bu beytdə mənəvi mərtəblər qarşısında bir maneə kimi dikəlmiş dünyəvi etibarlardan nişanədir.

**Qeyd:** *İmam və peyğəmbər, dünyəvi etibarlara da malikdirlər. Çünki onlar:*

*A: Daimi vüsal halında yaşamağa qadirdirlər.*

*B: Eşq ilə əqli vahidləşdirməyə qadirdirlər.*

*C: Qürur təsirindən azaddırlar.*

*D: Umumxalqı hidayət etmək dünyəvi etibarsız mümkün deyil.*

**Nişanə** 2. "Mühəqqər hey`ət": Bu beytdə dünyaşünas əql tanış olduğu etibarlardan kənar vücuddan nişanədir.

**Qeyd:** *Mühəqqər hey`ət aşiqin məşuq hüzurunda qul və məmlük olduğuna da işarə edir.*

**Anlam: Səcdə mərtəbəsilə təzadlı olan qürur mənşəli mötəbərlikdən azad olmuşam, çünki:**

**A: Öz məmlüklüyümü duyub – düşünmüşəm.**

**B: Camaat nəzərincə hey`ətim həqirdir.**

Beyt 6: **Eşq ərbabi – riyadan fariğ etmiş könlümü,**
**Fəqr əsbabi - əlayiqdən götürmüş rəğbətim.**

Sözlük: Fəqr – fağırlıq = yoxsulluq; Əsbab – səbəblər = vəsilələr; Əlayiq – bağlantılar = əlaqələr

**Nişanə** 1: "Riya": Xalis niyyət (ixlas) mənşəli olmayan əməllərə "riya" demişlər.

**Qeyd:** *Xeyir işlərin özünü batil edən, yaxud ruhunu – həqiqətini fasidləşdirən riyadan ibarətdir*[1].

**Nişanə** 2. "Fəqr": Bütün dünyəvi etibarlara, xüsusilə içəri və çöl vücuduna, yaxud batin və zahirinə, malına, canına, elminə, sənətinə mütəal məbudu həqiqi malik bilib, öz məmlüklüyünü düşünmüş aşiq sifətindən, yaxud həzrət məhbub qarşısında mütləq acizliyini etiraf etmək mərtəbəsindən nişanədir[2].

**Nişanə** 3: "Əlayiq": "Təfzid", yaxud fərdlik qarşısında maneə

---

[1] Qəzəl 59, beyt 1
[2] Qəzəl 21, beyt 1

törətməklə, ilahi hədəf nailiyyətindən saxlayan, dünyəvi ilgilərdən, yaxud ürəyə yatan məcazi şeylərdən nişanədir.

**Anlam: Riya imtiyazlar və imtiyazlar əql ilə bağlı olduğundan, əqli unutmuş aşiq riyadan azaddır. Həmçinin fəqr əlayiq ilə təzadlı olduğundan fağır şairin "Hər təllüqdən ola xurşid-tək aləmdə fərd" buyurduğu məqama nail olaraq əlayiqdən azaddır.**

Beyt 7: **Ey Füzuli, fəqr torpağında dövlət istə kim,**
**Sayə ol torpağə salmışdır hümayi – himmətim.**

Sözlük: Hüma = yalnız sümüklə qidalanan xüsusi qartal = şahin. Keşən vaxtlarda başına hüma quşunun kölgəsi salınmış şəxsin "xoşbəxt olmağı qətidir. Buna görə də hüma quşuna "xoşbəxtlik quşu" demişlər.

**Nişanə** 1. "Fəqr": Bax beyt 6, nişanə 2

**Nişanə** 2. "Dövlət": Bu beytdə əvvəli olmayan "əzəl" ünvanlı zamana bağlı bir ilahi ehsandan, yaxud ardında qəbz olmayan rəhmətdən nişanədir.

**Nişanə** 3. "Sayə": Arif insanlar, həqiqətin oxşarına yaxud qabığına "sayə" demişlər[1].

**Nişanə** 4. "Hüma": Öz vücudunun, yaxud şəxsiyyətinin yarı yer hissəsini yarı göy hissəsi ilə qovuşdurmuş inasana hüma demişlər[2].

**Nişanə** 5. "Himmət": Dünyəvi məşğulluqlardan azad edən bütün qəlb qüvvələri ilə bağlı diqqətə "himmət" demişlər.

**Anlam: Şairlər soltanı Xaqani:**

پس از سی سال روشن گشت بر خاقانی این مطلب
که سلطانیست درویشی و درویشیست سلطانی

buyurduğu kimi hər şey öz ziddi ilə bağlı olduğundan, həqiqi dövlət naliyyəti mütləq fəqir olmaqla mümkün olur[3].

---

[1] Doktor Seyid Cəfər Səccadi, Fərhənge-loğat və istilahat və təbirate-erfani
[2] Qəzəl 80, beyt 5
[3] Qəzəl 25, beyt 5 və qəzəl 54, beyt 2

## Q Ə Z Ə L 193

**(1) Qalmışam qürbətdə heyran, zarü – giryan neyləyim,**
**Xəstəvü – rəncurü bimarü pərişan, neyləyim.**

**(2) Olmuşam dərdə giriftarü qəmindən ağlaram,**
**Çünki etməz bu fələk dərdimə dərman neyləyim.**

**(3) Gərçi dövran dolanır hər ləhzə çoxlar rəyinə**
**Dönmədi hərgiz mənim rəyimcə dövran neyləyim.**

**(4) Ta ki vəslindən cüda düşdüm dəmi xoş olmadım,**
**Eylədi hicrin məni hər ləhzə giryan neyləyim**

**(5) Bilmişəm sübh vüsalın qədrini şami-fəraq,**
**Leyk, yandırdı məni dərdilə hicran neyləyim**

**(6) Gərçi pünhan eylədin mehrin Füzuli könlünə**
**Könlümün şəhri qəmindən olsa viran neyləyim.**

Beyt 1: **Qalmışam qürbətdə heyran, zarü – giryan neyləyim,**
**Xəstəvü – rəncurü bimarü pərişan, neyləyim.**

Sözlük: Xəstə – yorğun; Rəncur – qəmgin = dərdli = məlul

**Nişanə** 1. “Qürbət”: Mənəvi ölməz aləmdə, yaxud vəhdət mülkündə, ya da mütəal məhbub hüzurunda yaşamış insanın maddi qurğulu hicran dünyasına atılmağından ibarətdir[1].

**Nişanə** 2. “Heyran”: Heyranlıq vəhdət mərkəzinə, yaxud ülvi aləmə müraciət etmək ətəşi ilə bəşəri aciz elmləri unutmuş aşiqin maddə ilə məna arasındakı sərgərdanlığından ibarətdir.

**Nişanə** 3. “Zar, giryan, xəstə, rəncur, bimarü pərişan ünvanlı halların hər biri, aşiqin cismi bağlantılarından birini, yaxud bir neçəsini xaraktersiz etməklə onu, Hafizin “تو خود حجاب خودی حافظ از میان برخیز” buyurduğu fiziki mahiyyət adlı ən xətərli tanınmış hicabdan azad etməklə:

A: Bəzi görünməz mərtəbəni görməyə qadir edir.

B: Tanışlıq vasitələrinin daha güclüsü olan görüş səbəbilə mərifətini əlavə edir.

C: “Qürb” ünvanlı ilahi yaxınlığa nail edir. Beləliklə aşiq sadaladığımız zarlıqlardan şikayət yox, bəlkə də təşəəkkür etmək istəyir.

**Qeyd:** *“Firon padşah 400 il ömür möhlətində təkcə bir qızdırma, bir baş ağrı, yaxud bir xəstəliyə giriftar olsaydı heç vaxt Allahlıq iddia etməzdi..., belə bir baxımla 40 gün qəmsiz yaşamağı mömin olan bir şəxsin iman zəifliyindən əlamət bilmişlər.*[2]

**Anlam: Mərifəti əlavə edən bəlalara heyranlığıda əlavə edir.**

Beyt 2: **Olmuşam dərdə giriftarü qəmindən ağlaram,**
**Çünki etməz bu fələk dərdimə dərman neyləyim**

**Nişanə** 1. “Fələk”: Müqəddəratı təyin edən təbii qüvvələrdən üstün iqtidardan nişanədir.

**Nişanə** 2. “Dərdə dərman etməmək”: A: Fələkin aciz olduğundan nişanədir.

B: Aşiqin qabil olduğundan nişanədir.

C: İlahi lütf uzantısından nişanədir.

---

[1] Qəzəl 34, beyt 3

[2] İmam Məhəmməd Qəzzali, Kimyayi-səadət, səh. 899

**Anlam: A: Dərdsizlik layiqsizlik əlaməti olduğundan fələk dərdimə dərman etməyir.**

**B: Dərd çəkmək yaxud tərbiyələnmək, mütəal məbudun istəyi olduğundan fələk dərdimə dərman etməyir.**

Beyt 3: **Gərçi dövran dolanır hər ləhzə çoxlar rəyinə**
**Dönmədi hərgiz mənim rəyimcə dövran neyləyim**

**Nişanə** 1. “Çoxlar”: A: Nalayiq aşiqlərdən nişanədir.

B: Çoxlar, “məaş əqli” ünvanlı dünyaşünas əql tabelərindən nişanədir.

**Anlam: Bu beyt isə ötən beytin mənasını təkrar etməklə aşiqin qabil olduğunu təlqin etmək istəyir.**

**Qeyd:** *Bir ləhzə qəmsiz yaşamaq, o ləhzənin həqiqətindən qəflətdə olmaq nişanəsidir.*

Beyt 4: **Ta ki vəslindən cüda düşdüm dəmi xoş olmadım**
**Eylədi hicrin məni hər ləhzə giryan neyləyim**

Sözlük: Cüda – ayrı; Dəmi – bir dəm

**Nişanə** 1. “Vəslindən cüda düşdüm”: Bax beyt 1, qürbət

**Nişanə** 2. “Hicr”: Bu beytdə fasilədən dikəlmiş maneədən nişanədir.

**Nişanə** 3. “Giryan”: Maddi vücud küdurətini təmizləməklə, ürək güzgüsünü, yaxud müşahidə mərkəzini duruldan səbəbdən nişanədir.

**Anlam: Giryanlığı davam etdirməklə mənəvi vücudun, yaxud qəlbin maddi vücud ünvanlı ləkəsini silmək istəyirəm.**

Beyt 5: **Bilmişəm sübh vüsalın qədrini şami-fəraq,**
**Leyk, yandırdı məni dərdilə hicran neyləyim.**

Sözlük: Leyk – lakin

**Nişanə** 1. “Sübhi-vüsal”: Maddi dünyaya düşməzdən əvvəl mənəvi aləmdə mütəal məbud hüzurunda vüsal şərabı ilə məst olmuş insanın məcazi dünyada xumarlığını sındıran “sübbuh” ünvanlı mərtəbədə vəhdət günəşindən parlayan nurdan nişanədir.

**Nişanə** 2. “Şami-fəraq”: İlahi parlamalardan, yaxud sübh vüsalından məhrum olmaq nişanəsidir.

**Anlam: Hər şeyin öz ziddi (əksi) vasitəsilə tanınmaq imkanı kimi[1], sübh vüsal əzəmətini tanımaqla vəhdət mərkəzinə qayıtmaq sərmayəsini hazırlamaqda şami-fəraq əzabını təcrübə etməklə mümkün olur.**

Beyt 6: **Gərçi pünhan eylədin mehrin Füzuli könlünə**
**Könlümün şəhri qəmindən olsa viran neyləyim.**

Sözlük: Mehr – məhəbbət = günəş = dostluq

**Nişanə** 1. "Birinci misra": A: Mehrdən məhrum olmağı təlqin edən nişanədir.

**Qeyd:** *Saxlanmış, yaxud pünhan olmuş mehr məşuqun məsləhəti ilə bağlı olduğundan xüsusi, yaxud başqa bir mehr hesaba alınır.*

*B: Xəlvət şəraitində, yaxud əğyardan pünhan mənəvi mehrdən bəhrələnmək nişanəsidir.*

**Nişanə** 2. "Könül şəhri": Bu beytdə "mələkut aləmi" adlı təcrid mərtəbəsinə tərbiyələnmiş ürəkdən ibarətdir.

**Nişanə** 3. "Mehr": Aşiqin mənlik adlı eybini örtən ilahi lütf ilə bağlı mərifət nurundan ibarətdir.

**Nişanə** 4. "Qəm": Bu beytdə mehr pünhanlığından nişanədir.

**Nişanə** 5. "Viran": A: Maddi dünyaya rəğbətləndirən "imarət" ünvanlı əhvali-ruhiyyədən azad olmağa "viran" demişlər. Mövləvi xarici vücud, yaxud zahiri xarakter viranlığını[2], daxili aləm abadlığının müqəddiməsi göstərmək məqsədilə "بس خرابيها كه معمارى بو د[3]" buyurmuşdur.

B: Fiziki bədənə qeyri fiziki əhvali-ruhiyyə verən mövqeiyyətə "viran" demişlər.

C: Aşiqi özlüyündən xəbərsiz etməklə mütəal məhbubdan xəbərdar edən mərtəbəyə "viran" demişlər.

**Anlam: Aşiq təcrid aləmi ərəfəsinə lazım olan təkliflərdən xəbərdar olmaq istəyir.**

---

[1] Qəzəl 3, beyt 2
[2] Məlamət nişanələrinə rücu` olsun (qəzəl 1, beyt 5 və...)
[3] Mövləvi, Məsnəvi, dəftər 5, beyt 106

## Q Ə Z Ə L 194

**(1) Kərəm qıl, kəsmə, saqi, iltifatın binəvalardan,**
**Əlindən gəldiyi xeyri dəriğ etmə gədalardan.**

**(2) Əsiri – qürbətiz, bir səndən özgə aşinamız yox,**
**Ayağın kəsmə, başinçün, bizim möhnətsəralardan.**

**(3) Səba, kuyində dildarın nədir üftadələr hali?**
**Bizim yerdən gəlirsən, bir xəbər ver aşinalardan.**

**(4) Demə zahid ki, tərk et simbər bütlər təmaşasın,**
**Məni kim qurtarır Tanrı sataşdırmış bəlalardan.**

**(5) Girib məscidlərə, gər müqtədalar peyrəvi olman,**
**Budur vəchi ki, hərgiz görmədim üz müqtədalardan.**

**(6) Təbiba! Xaki – kuyi – yardəndir əşk təskini,**
**Bizə artırma zəhmət, göz yaşarar tutiyalardan.**

**(7) Fələkdir mehri zayil, yar qafil, ömr müstə`cil,**
**Nədir tədbir, bilmən, canə yetdim bivəfalardan.**

**(8) Vücudim ney kimi surax – surax olsa, ah etmən,**
**Məhəbbətdən dəm urdum, incimək olmaz cəfalardan.**

**(9) Füzuli, nazəninlər görsən, izhari – niyaz eylə,**
**Tərəhhüm umsa, eyb olmaz gədalar padişalardan.**

Beyt 1: **Kərəm qıl, kəsmə, saqi, iltifatın binəvalardan,**
**Əlindən gəldiyi xeyri dəriğ etmə gədalardan.**

Sözlük: Binəva – möhtac = adamsız = aciz; dəriğ – əsirgəmək; Gəda – dilənçi

**Nişanə** 1. "Saqi": Bu beytdə mütləq ilahi zat nurundan bəhrələndirən mənəvi vasitədən, yaxud mürşüd həzrətindən nişanədir.

**Nişanə** 2. "İltifat": Müşahidə ziyasından bəhrələndirən ilahi sifətə "iltifat" demişlər.

**Nişanə** 3. "Binəva": Dünyəvi cismi etibar – ixtiyarını təmamilə məhəbbət nəsiminə tapşırmış iddiasız aşiqdən nişanədir.

**Nişanə** 4. "Xeyr": irfan ədəbiyyatında salik dərəcəsinə nail olmuş aşiqin üzbəüz gəldiyi işlərə və hadisələrə ümumən xeyr demişlər. Çünki o (salik) özündən məbuda tərəf, yaxud kəsrət dünyasından vəhdət mərkəzinə istiqamət alaraq müstəqim olan yolda hərəkət edir[1]. Bu yolu tanıtdırmaq məqsədilə lisanülqeyb Hafiz buyurmuş ki:

در طریقت هرچه پیش سالک خیر اوست
در طریق مستقیم ای دل کسی گمراه نیست[2]

**Nişanə** 5. "Gəda": İlahi feyzlər və cazibələr dilənçisidir.

**Anlam: Süluk yolunda addım açmış aşiq mənəvi hadisələr ilə üzbəüz gəlməyi, yaxud ilahi rayihələrdən bəhrələnməyi tələb edir.**

Beyt 2: **Əsiri – qürbətiz, bir səndən özgə aşinamız yox,**
**Ayağın kəsmə, başinçün, bizim möhnətsəralardan.**

Sözlük: Möhnətsəra – möhnət evi = qəmxana

**Nişanə** 1. "Qürbət": Maddi qurğulu hicran dünyasını bildirir[3].

**Nişanə** 2. "Aşina": Özünü binəvalıq yaxud gədalıq dərəcəsinə çatdırmış aşiqi bəşəri səviyyədən ilahi mərtəbəyə yüksəldən mürşüd həzrətindən, yaxud digər ilahi vasitədən, yaxud mütəal məbudun vasitəsiz cazibəsindən ibarətdir.

**Nişanə** 3. "Möhnətsəra": Bu beytdə kəsrət bağlantılarından xilas etməklə vəhdət mülkünə istiqamətləndirən imtahanedici sıxıntılara giriftar olmuş qəlbdən nişanədir.

---

[1] Doktor Seyid Cəfər Səccadi, Fərhəngi-loğat və istilahat və təbirati-irfani
[2] Müəllif bu beyti "Ta Qafe-əndişe" kitabının 1-ci cildində şərh etmişdir.
[3] Qəzəl 193, beyt 1

**Anlam: Beyt dünyəvi həyat möhlətində mənəvi nailiyyətlər ətəşini və tələbini təlqin etmək istəyir.**

Beyt 3: **Səba, kuyində dildarın nədir üftadələr hali?**
**Bizim yerdən gəlirsən, bir xəbər ver aşinalardan.**

**Nişanə** 1. "Səba": Həzrət Cəbraila, yaxud digər ilahi feyz vasitəsinə "səba" demişlər.

**Nişanə** 2. "Kuyi-dildar": Bu beytdə vüsal ərəfəsindən, yaxud maddə ilə məna arasındakı sərhəddən nişanədir.

**Nişanə** 3. "Üftadə": İlahi cəlal, yaxud mənəvi əhval qələbələri ilə hətta öz bəndəliyini izhar etməkdən aciz olmuş aşiqə "üftadə" demişlər.

**Nişanə** 4. "Bizim yer": A: İnsanın maddi qurğulu hicran dünyasına atılmadan əvvəl yaşadığı zavalsız aləminə, yaxud vəhdət mülkünə, ya da mütəal məhbub hüzuruna işarə edən nişanədir.

B: Bizim yer "kuyi-dildar"ı təkrar edən nişanədir.

**Nişanə** 5.: "Xəbər": Bu beytdə elm və təcrübə vasitəsilə araşdırmağı mümkün olmayan mərifət ünvanlı mənəvi tanışlığa işarə edən nişanədir.

**Qeyd:** Mövləvi:

جان نباشد جز خبر در آزمون      هرکه را افزون خبر جانش فزون
جان ما از جان حیوان بیشتر      از چه؟ز انرو که فزون دارد خبر

*buyurmaqla insanın həqiqi həyat miqdarını onun xəbər (mərifət) miqdarı ilə bərabər bilmişdir. Beləliklə insanı şərif ayədə"* [1] *" و لقد کرمنا بنی آدم" ("Biz Adəm övladını şərəfli etdik"), buyurduğu məqama nail edən imtiyaz, yaxud onu digər şərif ayə "* [2] *فتبارک الله احسن الخالقین" ("Yaradanların ən gözəli Allaha afərinlər olsun") buyurduğu vəsfə layiq etməklə, onu yer kürəsində Allah-təala xəlifəsi olmağa nail edən etibar, xəbər ünvanlı mərifət ilə sıx bağlıdır.*

**Nişanə** 6. "Aşina": Bax: Üftadə

**Anlam: Aşiq, üftadələr halından xəbərdar olmağı nəhayət, maddə ilə məna sərhəddindən sovuşduran mərifətdən bəhrələnməyi tələb edir.**

Beyt 4: **Demə zahid ki, tərk et simbər bütlər təmaşasın,**
**Məni kim qurtarır Tanrı sataşdırmış bəlalardan.**

---

1Quran, Əl-isra surəsi, 70-ci ayədən bir qismət
[2] Quran, Mu`minun surəsi, 14-cü ayədən bir qismət

Sözlük: Simbər – ağ bədən = gənc

**Nişanə** 1. "Zahid": Eşq həqiqətini inkar edən nəsihətçidən ibarətdir.[1]

**Nişanə** 2. "Büt": Bəşəri əql və idrakı daş kimi qurudub karsız edən ilahi hüsnlər əks etdirmiş gözəl simadan, yaxud mənəvi gözəl vasitədən nişanədir.

**Nişanə** 3. "Bəlalar": A: Eşq aləmi ilə əlaqədar məlamət görməklər, qəbzlər, qəhrlər, həsrətlər və möhnətlər kimi imtahanedici və tərbiyəvi çətinliklərə "bəlalar" demişlər.

B: Bəşəri simada ilahi hüsnlər əks etdirmiş gözəllərə, yaxud əqli – idrakı karsız edən mənəvi vasitələrə "bəlalar" demişlər.

**Nişanə** 4. "Tanrı sataşdırmış": bu nişanə bəlaların ilahi mənşəli olduğunu təlqin edir.

**Qeyd:** *İnsanlar maddi dünyaya gəlməzdən əvvəl mənəvi aləmdə yaxud "ələst" ünvanlı mülkdə[2], Allah-təalanın hüzurunda əql və məntiq ilə bağlı (şəriət) əhd etməklər kimi, eşq və məhəbbət ilə əlaqədar təəhhüdnamələrə də qol çəkmişlər. Bu təəhhüdlər dünya və məna, yaxud əql və eşq qanunlarını təsdiq və qəbul etməkdən ibarətdir. Beləliklə, hər bir ürək "ələst" ölkəsindən, yaxud yuxarı aləmdən gətirdiyi xarakterini salim saxlayıbsa, onun aşiq olmağı və bəlalar çəkməyi mənəvi qanun tabeliyindən əlamətdir. Demək, sağlam ürək, yaxud ələst batinli şəxs aşiq olmağa məcburdur. Ancaq bu məcburiyyət ixtiyarsızlıq yox, sağlamlıq və qanunilikdir.*

**Anlam: Beyt eşq ilə bağlı bəlaların ilahi bir qanun kimi dəyişilməz və təğyirsiz olduğunu təlqin etməklə aşiqin yuxarı aləmdən gətirdiyi şəxsiyyətinin sağlamlığını da təsdiq edir.**

Beyt 5: **Girib məscidlərə, gər müqtədalar peyrəvi olman,**
**Budur vəchi ki, hərgiz görmədim üz müqtədalardan.**

Sözlük: Müqtəda – başçı = rəhbər = pişnamaz; Peyrəv – tabe`; Vəch – üz = sima = yol = niyyət = zat = illət = cəhət

**Nişanə** 1. "Məscid": İbadət – itaətin zahiri qaydalaında məğlub olmaqla batinindən xəbərsiz saxlayan şəraitdən nişanədir.

**Qeyd:** *Həkim Füzuli ulu və məşhur din alimi olduğuna görə namaza, məscidə, mehraba, zöhdə, ibadətə və itaətə həqiqətən aşiqdir.*

[1] Qəzəl 89, beyt 7
[2] Quran, Əraf surəsi, 172-ci ayədən bir qismət

*Demək o, mehrabı, məscidi, namazı və beləcə müqəddəs olan istiarələri məzəmmət etməklə, onların surətində dəqiqlik göstərməklə, mənasından qəflət etmiş insanları, yaxud onların zahiri adabına məşğul olmaqla batinindən xəbərsiz qalmış zahidləri məlamət edir. Elə buna görə də imamlara əql ilə bağlı ibadətdən əlavə gecə namazı kimi eşq ilə əlaqədar ibadət də vacib olmuşdur.*

**Nişanə** 2: "Üz": Bu beytdə eşq və ibadətin zatını tanımaqdan istiarədir. Ancaq üz çevirmək və rədd etməyi də təlqin edir.

**Anlam: İbadətin qabığını qənaətbəxş bilmiş müqtədanın təəssübkeşliyi məscidə rəğbətsiz olduğuma bais olmuş.**

Beyt 6: **Təbiba! Xaki – kuyi – yardəndir əşk təskini,**
**Bizə artırma zəhmət, göz yaşarar tutiyalardan.**

Sözlük: Xak – torpaq; Əşk = göz yaşı

**Nişanə** 1. "Təbib": Bu beytdə eşq dərdinə əql və elm ilə tədbir göstərən nəsihətçidən nişanədir.

**Nişanə** 2: "Xaki-kuy": Mütəal məhbub ərəfəsinin "tutiya" ünvanlı canın gözünü işıqlandıran torpağından ibarətdir.

**Qeyd:** *İrfan mədəniyyətində bütün etibarlar, dəyərlər və mənalar baş – ayağ olan kimi xaki-kuy, yaxud tutiya mərtəbəli torpaq da hər gözə dolsa, ona zərər-ziyan əvəzinə, qazanc- qüvvə bağışlamalıdır. Bunun üçündə 11-ci əsrin məşhur arif və şairi Fəxrəddin Əraqi yüz min günəş ziyafətində iştirak etmək istedadını və ləyaqətini eşq ərəfəsindən canın gözünə bir zərrə düşmüş torpağa şərt bilib buyurmuşdur:*

یک ذره گر از این خاک بر چشم جانت افتد
با صد هزار خورشید، افتد تو را ملاقات

**Nişanə** 3. "Əşk": Aşiqin fiziki əngəl mahiyyətini təmamilə yuyub məhv edən biqərarlıqdan asılı səbəbdən nişanədir.

**Anlam: Ey tədbir göstərən nəsihətçi, gözü şühud mərtəbəsinə çatdırıb əşkinə təskin verən yalnız mütəal məhbub ərəfəsinin torpağıdır. Demək gözün həqiqi həyatı, yaxud gözün fəaliyyət şərti həmin tutiya ünvanlı torpağa bağlıdır.**

Beyt 7: **Fələkdir mehri zayil, yar qafil, ömr müstə`cil,**
**Nədir tədbir, bilmən, canə yetdim bivəfalardan.**

Sözlük: Mehr – məhəbbət = günəş = dostluq; Zayil – zavala uğramış; Müstəcil = tələsik = təcili

**Nişanə** 1. “Bivəfa”: Mənəvi vasitələr, rayihələr və cazibələrin daimi olmadığına işarə edən nişanədir.

**Anlam: Beyt dünyəvi ömür möhlətində aid olmuş mənəvi imtiyazları da məcazi etibarlar kimi müvəqqəti və davamsız təlqin etməklə gəldiyi ülvi aləmə, yaxud zavalsız həqiqi vətəninə qayıtmaq istəyir.**

Beyt 8: **Vücudim ney kimi surax – surax olsa, ah etmən,**
**Məhəbbətdən dəm urdum, incimək olmaz cəfalardan.**

Sözlük: Surax – surax = dəlik-dəlik

**Nişanə** 1. Ney kimi surax – surax olmaq: öz bəşəri sifətlərini, yaxud mənliyini dəmbədəm boşaldan vücuddan nişanədir.

**Nişanə** 2. “Məhəbbət”: Aşiqin bəşəri sifətlərini, həm də cismi ixtiyar – iradəsini dəmbədəm məhv etməklə, onun boş vücudunu mənəvi qayğılar ilə dolduran məşuq xəyalına “məhəbbət” demişlər.

**Nişanə** 3. “İncimək”: Cəfalardan incimək cəfakardan inciməklə bərabər olduğundan böyük xətakarlıq hesaba alınmışdır. Çünki:

A: Cəfakar yardır və yardan incimək mənasızdır.

B: Cəfakar əğyardır. Əğyara diqqət göstərmək, “ixlas”[1] və vəhdət mərtəbələri ilə müxalifdir.

C: Həm cəfakara, həm də məşuqa fikir vermək ikiliyi sübut edən ünvanlı böyük bir günahdır (Vəhdət ilə müxaliflik günahı).

D: İnciklik “mənliyi” sübut edir və mənlik eşq baxımı ilə baş günah sayılır. Bunun üçün də islamın ulu peyğəmbəri “وجودک ذنب لایقاس به ذنب” (“Vücudun [mənəm-mənəmliyindən] heç bir günah ilə müqayisə olmayan bir günahdır”) buyurmuşdur. Bu mənanı təkrar və təlqin etmək məqsədilə Hafiz buyurmuşdur:

میان عاشق و معشوق هیچ حایل، نیست
تو خود حجاب خودی حافظ از میان برخیز [2]

**Anlam: Cəfa adlı acılıqdan incimiş bir aşiq aləminə biganədir.**

Beyt 9: **Füzuli, nazəninlər görsən izhari – niyaz eylə,**
**Tərəhhüm umsa, eyb olmaz, gədalar padişalardan.**

---

[1] Qəzəl 59, beyt 1
[2] Müəllif bu beyti “Ta Qafe-əndişe” kitabının 3-cü cildində şərh etmişdir

Sözlük: Tərəhhüm – rəhm etmək = mehribanlıq = bağış; Gəda – dilənçi

**Nişanə** 1. “Nazəninlər”: Bəşəri simada ilahi hüsnlər əks etdirmiş gözəllər, yaxud ilahi vasitələr, ya da mürşüdlərdən ibarətdir.

**Nişanə** 2. “İkinci misra”: Mənəvi və qeyri hissi əmri hissiləşdirmək istəyir. Ancaq gəda ünvanı ilə tanınmış ilahi cilvələr tələbəsini və padşah adıyla tanınmış bütün varlığa malik və hakim olan mütəal məhbuba da işarə edir.

**Anlam: Həkim olan mütəal məhbub nə qədər "istiğna"lı yaxud qəhrli – qəzəbli olsa, məmlük aşiq bir o qədər möhtaclığını göstərməli və etiraf etməlidir. Bunun üçün də Liasnülqeyb Hafiz buyurmuş ki:**

میان عاشق و معشوق فرق بسیار است
چو یار ناز نماید، شما نیاز کنید [1]

[1] Müəllif bu beyti “Ta Qafe-əndişe” kitabının 2-cü cildində şərh etmişdir

## Q Ə Z Ə L 195

**(1) Fələk ayırdı məni cövr ilə cananımdan,**
**Həzər etməzmi əcəb naləvü əfğanımdan?**

**(2) Oda yandırsam əgər şölə ilə noh fələgi,**
**Nə bitər atəşi-ahi-deli-suzanımdan.**

**(3) Qəmi-pünhan məni öldürdü, bu həm bir qəm kim**
**Gülrüxum olmadı agəh qəmi-pünhanımdan.**

**(4) Ah idi həmnəfəsim, ah ki ol həm axər**
**Çıxdı ikrah qılıb külbeyi-əhzanımdan.**

**(5) Mən nə hacət ki qılam daği-nihanım şərhin**
**Aqibət zahir olur çaki -giribanımdan.**

**(6) Həqq bilir yar degil canü – dilimdən qayib,**
**Nola gər qayib isə dideyi-giryanımdan**

**(7) Can əgər çıxsa tənimdən əsəri-mehri ilə,**
**Əsəri-mehrini sanma ki çıxar canımdan.**

**(8) Lütf edib sən məgər, ey bad bu gündən böylə**
**Verəsən bir xəbər ol sərvi-xuramanımdan**

**(9) Ey Füzuli-qəmi-hicr ilə pərişandır hal,**
**Kimsə agah degil hali-pərişanımdan.**

Beyt 1: **Fələk ayırdı məni cövr ilə cananımdan,**
**Həzər etməzmi əcəb naləvü əfğanımdan?**

**Nişanə** 1. “Fələk”: Bu beytdə maddi qurğulu dünya məhdudluğundan, yaxud batini vücudun zahiri vücud həbsində yaşayış məcburiyyətindən nişanədir.

**Anlam: Beyt dünyəvi ömür möhlətində, yaxud maddi qurğulu dünya məhdudluğunda “bəst” arxasındakı “qəbzdən”, yaxud daimi vüsal mümkünsüzlüyündən şikayət edir.**

Beyt 2: **Oda yandırsam əgər şölə ilə noh fələgi,**
**Nə bitər atəşi-ahi-deli-suzanımdan.**

Sözlük: Noh fələk – doqquz asiman; Deli-suzan – alovlu ürək

**Nişanə** 1. “Noh fələk”: Yer kürəsində tanınmış təbii qüvvələrdən üstün iqtidar mənşəyindən ibarətdir.

**Nişanə** 2. “Ah”: Ah bu beytdə “nari məhəbbət” [1] atəşində dünyəvi ilgiləri yandırmaq və maddi qanunlardan xilas olmaq nişanəsidir.

**Nişanə** 3. “Deli-suzan”: Bu beytdə peyğəmbərlər, imamlar və bəzi ariflərin oda – suya qalib gəlmiş ilahi iqtidarlı batinlərdən nişanədir.

**Anlam: “Bəşəri istiğna”[2] məqamına nail olmuş aşiq, öz batinindən təhsil etdiyi iqtidarı ilahi cilvələr önündə maneə törətmiş “noh fələk” ünvanlı iqtidardan üstün təlqin etməklə dünyəvi iqtidarı daimi hicab törətməkdən aciz bildirir. Bu mənanı təsdiq etmək məqsədilə Hafiz buyurmuş ki:**

چرخ، برهم زنم ار غیر مرادم گردد
من نه آنم که زبونی کشم از چرخ فلک[3]

**Qeyd:** *Yerə göyə qalib gələn iqtidar yalnız mütəal məbudun xəlifəsi olan inasnın batininə hədiyyə olunmuşdur.*

Beyt 3: **Qəmi-pünhan məni öldürdü, bu həm bir qəm kim,**
**Gülrüxum olmadı agəh qəmi-pünhanımdan.**

---

[1] Qəzəl 54, beyt 7

[2] A – Öz vücudunu bəşəri iradədən boşaldıb ilahi iradə ilə doldurmuş aşiq, öz əlini yədullah, gözünü eynullah və vücudunu ayətullah etməklə aşiq istiğnası ünvanlı məqama nail olaraq, Allah təaladan başqasından hacətsiz olur. (qəzəl 30, beyt 3)

B – Özünü mərifət zirvəsinə qaldırmış aşiq, Allah təaladan başqalarını həqir yaxud qeyri müstəqil görməklə onlardan hacətsiz olur.

[3] Müəllif bu beyti “Ta Qafe-əndişe” kitabının 3-cü cildində şərh etmişdir

Sözlük: Gülrüx – gül üzlü; Agəh – xəbərdar

**Nişanə** 1. "Qəmi-pünhan": Bu beytdə qəbz sıxıntıları ilə paralel həsrət çətinliyindən nişanədir.

**Nişanə** 2. "Gülrux": Aşiqi ürək açan şühud nurundan bəhrələndirən ilahi camaldan nişanədir.

**Nişanə** 3. "Agəh olmadı": Kamala çatdırmaq məqsədilə sınağa çəkilmiş aşiqin nalələrini qulaq ardına vurmağa "agəh olmadı", yaxud xəbərsizlik demişlər. Yoxsa şərif ayə "و ان الله علام الغيوب[1]": ("və Allah həqiqətən qeybləri daha yaxşı bilir") buyurduğu kimi həkim canan insanların sirlərini də bilir, onların gizlin danışıqlarını da.

**Qeyd:** *Həkim Füzuli mütəal məhbubun öz aşiqinə diqqətsizlik etməyini, yaxud "təğaful" ünvanlı xəbərsizliyini ("agəh olmadı") ilahi lütf nişanəsi bilib buyurmuşdur:*

**Ey Füzuli incimə səndən təğaful qılsa yar,**
**Rəsmdir kim göstərə əhbabə istiğna həbib.**

**Anlam: Qəbz sızıntıları ilə birləşmiş tərbiyəvi diqqətsizliklər imtahanından çıxmaq daha müşküldür.**

Beyt 4: **Ah idi həmnəfəsim, ah ki ol həm axər**
**Çıxdı ikrah qılıb külbeyi-əhzanımdan.**

Sözlük: Həmnəfəs – həmdəm = həm söhbət; Külbeyi-əhzan – pərişan daxma = qəmlər daxması

**Nişanə** 1. "Ah": Dərindən nəfəs almağa işarə edərək zahir ilə əlaqədar batini həyat və hərarətindən nişanədir.

**Nişanə** 2. "Külbeyi-əhzan": Hicran qüssəsi ilə dolu olan ürəkdən nişanədir.

**Anlam: Beyt zahir və batinini fəda etməyə hazırlaşmış, yaxud "ixlas"[2] mərtəbəsində mütəal məhbubdan başqalarını, hətta özünü və əməlini unutmuş aşiqi tanıtdırmaq istəyir.**

Beyt 5: **Mən nə hacət ki qılam daği-nihanım şərhin**
**Aqibət zahir olur çaki-giribanımdan.**

---

[1] Quran, Tövbə surəsi, 78-ci ayədən bir qismət
[2] Qəzəl 59, beyt 1, nişanə 2

Sözlük: Nihan – pünhan = gizli; Çaki-giriban = açılmış yaxa (yaxa açmaq)

**Nişanə** 1. "Daği-nihan": Yeddi mədənli ürəyin[1], təkcə mütəal məhbub məhəbbətini xəzinə etmiş "حبه القلوب" ünvanlı 5-ci mədənində alovlanan gizli atəşdən ibarətdir.

**Nişanə** 2. "Çaki-giriban": Qayğı çəkməklər və biqərarlıqlar əlamətidir.

**Anlam: Mən sərkilər qorxusundan, yaxud "aşiq baş verər sirr verməz[2]" hökmü ilə, eşq atəşini gizli saxlamağa çalışsam da, özümdən xəbərsizliyim onu xəlqə aşkar etməlidir.**

**Qeyd:** *Atəş, çöl aləmdə paka çıxaran bir maddə olduğu kimi iç aləmdə isə yuyucu və təmizləyicidir. Buna görə də alovlanmaq aşiq qəlbinin gərəkli şərti sayılmışdır. Ancaq alovun yandırıcı olduğu onun gizli qalmağını imkansız edən kimi eşq sirrini də ört-basdır etmək mümkünsüzdür. Elə buna görə də ulu Şeyx Sədi buyurmuş ki:*

در سوخته پنهان نتوان داشتن آتش
ما هیچ نگفتیم و حکایت بدر افتاد

Beyt 6: **Həqq bilir yar degil canü – dilimdən qayib,**
**Nola gər qayib isə dideyi-giryanımdan.**

Sözlük: Dide giryan – ağlar göz

**Nişanə** 1. "Yar": Bu beytdə müşahidə atəşindən yaxud özünü Tanrıya çatdırmaq istəyən yer adamını göylərə qaldıran ilahi xəyaldan nişanədir.

**Nişanə** 2. "Canü dil ": Bu beytdə mütəal məbud mənzili olmuş cahana sığmaz həqiqi ürəkdən nişanədir. Mövləvi bu ürəyi tanıtdırmaq məqsədilə buyurmuşdur:

گفت پیغمبر که حق فرموده است
من نگنجم در خم بالا و پست
در دل مون بگنجم ای عجب
گر مرا جویی در آن دل ها طلب [3]

**Anlam: Aşiq bədən gözünü nümunə göstərməklə fiziki mahiyyətdən hacətsiz olduğunu təlqin edir.**

---

[1] Qəzəl 13, beyt 1
[2] Qəzəl 114, beyt 1
[3] Mövləvi, Məsnəvi, birinci dəftər, 2715, 2716, 2717 beytlər

**Qeyd:** *Dönə - dönə dediyimiz kimi aşiq istədiyi, yaxud tələb etdiyi məşuqu təmamilə öz batinində (canü dilində), yaxud özündə tapmalıdır. Çünki məşuqu qıraqdan gəzmək ikilik nişanəsi olduğuna görə vəhdət ilə müxalif olmaq deməkdir. Buna görə də Füzuli islamın ulu peyğəmbəri “من عرف نفسه فقد عرف ربه*[1] *” (“Mütəal məbudu tanımağın əsas şərti özünü tanımaqdır”) buyurduğu fərmayişin əsas etibarı ilə “ yar deyil canü dilimdən qayib” buyurmuş və bunun üçün də bir çox filosoflar, o cümlədən “Hanri Berikson” can, yaxud batin, ya da “iste`layi-mən”*[2] *ünvanı ilə həqiqi idrak yaxud idrak edən ilə idrak olanın birləşməsi barədə izahlar etmişdir*[3].

Beyt 7: **Can əgər çıxsa tənimdən əsəri-mehri ilə**
**Əsəri-mehrini sanma ki çıxar canımdan.**

Sözlük: Mehr – məhəbbət = günəş = dostluq

**Nişanə** 1. “Mehr”: Bu beytdə ilahi məqsədə yönəldən tovhid günəşindən, yaxud mərifət nurundan nişanədir.

**Nişanə** 2. “Can”: A: Birinci misrada bədənin hər yerinə yayılmış fiziki mahiyyət bağışlayan gizli qüvvədən ibarətdir.

B: İkinci misrada insanın batinində yerləşmiş ilahi lütfdən, yaxud onun “kulli nəfs” adlı həqiqi zatından ibarətdir.

**Anlam: Ətəş və tələb atəşilə alovlanmış batini vücud, dünyəvi ömür möhləti sona çıxandan sonra da aşiqanə həyatını davam etdirir. Demək eşq atəşi qiyamətə qədər şölələnir.**

Beyt 8: **Lütf edib sən məgər, ey bad, bu gündən böylə**
**Verəsən bir xəbər ol sərvi-xuramanımdan.**

Sözlük: Xuraman = naz və təkəbbürlə addım atan

**Nişanə** 1. “Bad”: Bu beytdə səba ünvanlı feyz vasitəsindən nişanədir.

**Nişanə** 2. “Xəbər”: Xəbər, elm və təcrübəyə sığmayan mərifət adlı mənəvi tanışlıqdan ibarətdir. [4]

---

[1] Əllamə Məclisi, Biharül-ənvar, cild 2, səh. 32 (bu ibarə “Qürərül-hikəm”kitabında Həzrəti Əli adı ilə qeyd olunmuşdur)

[2] Ülvi aləm ilə əlaqədar vücuda “iste`layi-mən” demişlər.

[3] Məhəmməd Əli Furuği, Seyre hekmət dər Orupa c.3. səh 296 və 297

[4] Qəzəl 194, beyt 3

**Nişanə** 3. “Sərvi-xuraman”: İlahi cazibələr uzantısına sərvi xuraman demişlər.

**Anlam: İlahi əlaqələrin vasitəsiz mümkün olmadığını düşünmüş aşiq bad ünvanlı vasitə, yardımını deyimini tələb edir.**

Beyt 9: **Ey Füzuli-qəmi-hicr ilə pərişandır hal,**
**Kimsə agah degil hali-pərişanımdan.**

Sözlük: Agah – xəbərdar

**Nişanə** 1. “Qəmi-hicr”: Canan cazibələrini qəlbində mühafizə etdiyi halda müşahidə nurundan məhrum olmuş aşiqin həsrətdə qalmağından nişanədir.

**Nişanə** 2. “Hali-pərişan”: Qəmi-hicr mərhələsindən xilas olmaq məqsədilə mütəal məhbubdan başqasını, o cümlədən ibadəti, itaəti, mürşüd həzrətini, həmçinin digər ilahi vasitəni yardımçı bilib hacət diləmək “təfriqə” ünvanlı pərişanlıqdan ibarətdir.

**Anlam: Bu beyt ötən beytdə qeyd olunmuş “bad” ünvanlı vasitə ilə dərdi-dil etməyi tənqid edir.**

**Qeyd:** *İki beyt, hətta iki misra arasındakı təzadlı məfhum aşiqin hər dəm yeni bir halda olduğunu təlqin edir. Beləliklə, aşiqanə təcrübələri əks etdirən qəzəl adlı şerdə məfhumun təzadlı olduğu qanunu tanıyıb və qəbula keçmişdir.*

## **Q Ə Z Ə L 196**

**(1) Yaxma canım, naleyi – biixtiyarımdan saqın!**
**Tökmə qanım, abi – çeşmi - əşkbarımdan saqın!**

**(2) Su verir hər sübhdəm göz yaşı tiği - ahimə,**
**Çox məni incitmə, tiği – abidarımdan saqın!**

**(3) Cövr odu yaxdı məni, yanımda durma, ey könül!**
**Bir tutuşmuş atəşəm, qürbü civarımdan saqın!**

**(4) Tən evindən rəxtini, cəhd eylə, ey can, dışra çək,**
**Afəti – seyli – sirişki – biqərarımdan saqın!**

**(5) Gərçi bir xaki – rəhəm, kimsə məni almaz gözə,**
**Çox həqarətlə nəzər qılma, qubarımdan saqın!**

**(6) Gəlmə qəbrim üzrə, ey eşq içrə mən tək olmayan!**
**Tənə daşidir sənə, səngi – məzarımdan saqın!**

**(7) Şahi – mülki – möhnətəm, xeylü sipahim dərdü qəm,**
**Xeyli – bihəddü sipahi – bişümarımdan saqın!**

**(8) Ey Füzuli, hansı məhbubi ki, sevsən rəhmi var,**
**Qıl həzər, ancaq mənim birəhm yarımdan saqın!**

Beyt 1: **Yaxma canım, naleyi – biixtiyarımdan saqın!**
**Tökmə qanım, abi – çeşmi - əşkbarımdan saqın!**

Sözlük: Ab – su; Çəşmi əşkbar – ağlar göz

**Qeyd:** *Bu qəzəl təmamilə bəşəri simada ilahi hüsnlər əks etdirmiş gözəl dilbəri, yaxud aşiqi mənəvi təlimatdan məhrum saxlamış mürşüd həzrətinə, ya da "şəth"[1] vəziyyətində mütəal məhbubun özünə xitab edir.*

**Nişanə** 1. "Can yaxmaq və qan tökmək": Bu beytdə həkim məhbubun "istiğna" sifətilə bağlı etinasızlığından ibarətdir.

**Nişanə** 2. "Naleyi bi ixtiyar": Bi ixtiyar nalə ilahi iradəyə məğlub olmuş aşiqin ürək münacatından ibarətdir.

**Qeyd:** *Öz ixtiyarını unutmuş aşiqin mütəal məhbubdan şikayət etməsi küfr danışmaq hesaba alınmaz. Çünki ixtiyarsız aşiq dini təkliflərdən azaddır. Buna görə də Mövləvi, dırnaqsız və çəngsiz (əqlsiz və ixtiyarsız) bir insan kimi olmağı arzu edərək belə buyurur:*

مر بشر را پنجه و ناخن مباد   كه نه دين انديشد آنگه نه سداد [2]

**Anlam: Mənəvi iqtidara malik olmaq dünyəvi ixtiyarı unutmaqla şərtlənir.**

Beyt 2: **Su verir hər sübhdəm göz yaşı tiği - ahimə,**
**Çox məni incitmə, tiği – abidarımdan saqın!**

Sözlük: Sübhdəm = səhər çağı, abdar = su verilmiş = sulu

**Nişanə** 1. "Sübhdəm": Aşiqin dünyəvi, yaxud mənəvi mücərrədlik şərtliyi yaradan (təcrid) xəlvətindən nişanədir.[3]

**Anlam: Bu beyt də ötən beyt kimi xalis batin (sübhdəm) ilə bağlı əhvali-ruhiyyənin (ah) qət`i və qalib təsirini təlqin edir.**

Beyt 3: **Cövr odu yaxdı məni, yanımda durma ey könül!**
**Bir tutuşmuş atəşəm, qürbü civarımdan saqın!**

Sözlük: Qürb – yaxınlıq = yaxın durmaq

**Nişanə** 1. "Könül": Bu beytdə təbii sağlamlığını, yaxud cismi həyatını qorumuş qəlbdən nişanədir.

---

[1] Qəzəl 24, beyt 1
[2] Məsnəvi Mövləvi, 6-cı dəftər, beyt 4798
[3] Qəzəl 12, beyt 1, nişanə 1

**Anlam: Təbii sağlamlığa bağlı qəlb ilə maddədən üstün düzgün həqiqət tanışlığı mümkünsüzdür. Buna görə də Hafiz buyurmuş ki:**

تو کز سرای طبیعت نمی روی بیرون
کجا به کوی حقیقت گذر توانی کرد [1]

Beyt 4: **Tən evindən rəxtini, cəhd eylə, ey can, dışra çək,**
**Afəti – seyli – sirişki – biqərarımdan saqın!**

Sözlük: Rəxt – paltar; Sirişk – göz yaşı

**Nişanə** 1. "Can": Bu beytdə cismani ürək arasını boşaldan, qəlb hərarətilə peyda olmuş buxar vasitəsilə, yaxud bədənin hər yerinə yayılmış "heyvani ruh" ünvanlı gizli qüvvə səbəbi ilə peyda olan cismani həyatdan ibarətdir.

**Anlam: Aşiq ötən beytdə öz könlünə xitab etdiyi sözü canına da xitab edir.**

Beyt 5: **Gərçi bir xaki – rəhəm, kimsə məni almaz gözə,**
**Çox həqarətlə nəzər qılma, qubarımdan saqın!**

Sözlük: Xak – torpaq; Rəh – yol

**Anlam: Beyt müqəddəs eşq sahəsində öz həqirliyini etiraf etmiş aşiqin əziz olduğuna işarə etməklə zəifliyə bağlı iqtidarı və yoxluqdan asılı varlığı təlqin edərək fədakarlığa, qurbanlığa və şəhid olmağa bağlı əl çatmaz mərtəbələrdən etibar qazanmağa da işarə edir.**

Beyt 6: **Gəlmə qəbrim üzrə, ey eşq içrə mən tək olmayan!**
**Tənə daşidir sənə, səngi – məzarımdan saqın!**

Sözlük: Səng – daş

**Anlam: İnsana layiq olan eşq ünvanlı mərifəti, yaxud həqiqi həyatı tərk etmiş insanları bütün kainat (canlı - cansız) məlamət edir.**

Beyt 7: **Şahi – mülki – möhnətəm, xeylü sipahim dərdü qəm,**

---

[1] Müəllif bu beyti "Ta Qafe-əndişe" kitabının 2-cü cildində şərh etmişdir

**Xeyli – bihəddü sipahi – bişümarımdan saqın!**

Sözlük: Xeyl – qoşun = qəbilə; Sipah – qoşun; Bihədd – hədsiz = həddən artıq; Bişümar – saysız

**Nişanə** 1. "Şah": Bu beytdə nəbz vurmağa və nəfəs çəkməyə ehtiyacı olmayan ilahi eşq ilə bağlı bəlalar vasitəsilə ayaq tutub – həyat sürən kamil aşiqdən ibarətdir.

**Anlam: Füzuli bütün bəlaları öz batininə həsr etməklə başqa aşiqlərdən üstün olduğuna işarə edir. Çünki insanın kamal miqdarı onun çəkdiyi bəlaların miqdarı ilə bərabərdir.**

Beyt 8: **Ey Füzuli, hansı məhbubi ki, sevsən rəhmi var,**
**Qıl həzər, ancaq mənim birəhm yarımdan saqın!**

**Nişanə** 1. "Birəhm": A: Rəhmsizlik kamala çatdırmaq məqsədilə sınağa çəkilmiş aşiqin nalələrini qulaq ardına vurmaqdan nişanədir.

B: Rəhmsizlik aşiqin "şəth" vəziyyətində etdiyi giley və etirazından nişanədir[1].

C: Məşuqun aşiq haqqında rəhmsiz olduğu "sünnət" ünvanlı ilahi qanundan nişanədir.

**Anlam: Aşiq ilə məşuq arasındakı maneələri təmamilə aradan qaldırmaqla, vasitəsiz vüsal nailiyyətini mümkün edən "müflisluk"[2] ünvanlı mərtəbə ilahi təğafül yaxud birəhmliklə sıx bağlıdır.**

---

[1] Qəzəl 24, beyt 1, nişanə 4, qeyd 1
[2] Qəzəl 24, beyt 7, nişanə 2

## **Q Ə Z Ə L 197**

**(1) Ey geyib gülgun dəmadəm əzmi – cövlan eyləyən,**
**Hər tərəf cövlan edib döndükcə yüz qan eyləyən.**

**(2) Ey məni məhrum edib bəzmi – vüsalindən müdam,**
**Qeyri xani – iltifati üzrə mehman eyləyən.**

**(3) Ey dəmadəm rəşk tiğilə mənim qanım töküb,**
**Mey içib, əğyar ilə seyri – gülüstan eyləyən.**

**(4) Bunca kim, əfğanımı, ey məh, eşitdin gecələr,**
**Demədin bir gecə kimdir bunca əfğan eyləyən?**

**(5) Nola gər cəm`iyyəti – xatirdən olsam naümid,**
**Cəm` olurmu xublər zülfi pərişan eyləyən?**

**(6) Yar dün çəkmişdi qətlim qəsdinə tiği – cəfa,**
**Yetməsin məqsudinə, ya rəb, pəşiman eyləyən.**

**(7) Eşq dərdilə olur aşiq mizaci müstəqim,**
**Düşmənimdir, dustlər, bu dərdə dərman eyləyən.**

**(8) Zahidin tə`n ilə döndərdim üzün mehrabdən,**
**Necə bulmaz əcr min kafir müsəlman eyləyən?**

**(9) Dərdi – hicran natəvan etmiş Füzuli xəstəni,**
**Yoxmudur, yarəb, dəvayi – dərdi – hicran eyləyən.**

Beyt 1, 2, 3, 4: **Ey geyib gülgun dəmadəm əzmi – cövlan eyləyən,**
**Hər tərəf cövaln edib döndükcə yüz qan eyləyən.**

**Ey məni məhrum edib bəzmi – vüsalindən müdam,**
**Qeyri xani – iltifati üzrə mehman eyləyən.**

**Ey dəmadəm rəşk tiğilə mənim qanım töküb,**
**Mey içib, əğyar ilə seyri – gülüstan eyləyən.**

**Bunca kim, əfğanmı, ey məh, eşitdin gecələr,**
**Demədin bir gecə kimdir bunca əfğan eyləyən?**

Sözlük: Gülgun – qırmızı gülə oxşar = qırmızıya çalan = gülə mayil; Dəmadəm – dəmbədəm; Bəzm – ziyafət məclisi = xeymə; Müdam – daimi = şərab =ardı-arası kəsilməyən = həmişə; Xan – süfrə = qida; Rəşk – qısqanma = qısqanclıq; Əfğan – fəğan = fəryad

**Nişanə** 1. "Gülgun": Aşiqin fiziki mahiyyətini batil, yaxud karsız edən həzrəti-mürşüd təlimatından, yaxud ilahi cilvələr əks etdirmiş bəşəri camaldan, ya da şühud nurundan nişanədir.

**Nişanə** 2. "Dəmadəm cövlan etmək": Hər ləhzə yeni bir cilvə ilə aşiqin xarici və daxili vücudunu zəbt etməkdən, yaxud ona hər an təzə bir mərifət bağışlamaqdan nişanədir.

**Nişanə** 3. "Qan eyləmək": Bu beytdə fiziki mahiyyətləri batil etməkdən nişanədir, ancaq layiq aşiqi qətl məqamına nail etməyə də işarə edir[1].

**Nişanə** 4. "Qeyrə iltifat etmək": Onun (qeyrin) imtahan ayağında yaxud qəbz sınağında tutarsız olduğunua işarə edir. Çünki məhrumluq sınağından sağlam çıxmaq (qəbul olmaq) daha çətin bir işdir.

**Nişanə** 5. "Rəşk": Bu beytdə başqa bir şəxsin xeyrxahlıqla yararlı halını arzulayan "qibtə" ünvanlı ilgidən ibarətdir (müsbət həsəd).

**Nişanə** 6. "Qanım töküb": Bu beytdə tərbiyəvi məhrumluq çətinliyindən nişanədir.

**Nişanə** 7. "Mey içib seyri-gülüstan etmək": Əğyarı ilahi cazibələrdən, yaxud bəst rayihəsindən bəhrələndirmək nişanəsidir.

**Nişanə** 8. "Əfğan": Sınağa çəkilmiş aşiqin ürək münacatından nişanədir.

**Nişanə** 9. "Mah": Qara maddədən ağ nurunu təzahür etdirən canan camalından nişanədir.

---

[1] Qəzəl 7, beyt 2, nişanə 1

**Nişanə** 10. “Gecə”: Bu beytdə dünyəvi bağlantılarını qırıb – tökmüş vücudun xəlvət şəraitindən nişanədir[1].

**Nişanə** 11. “Demədin bir gecə kimdir bunca əfğan eyləyən”: Bu misra, ilahi “istiğna” sifətilə bağlı təğaful ünvanlı mərhələdən, yaxud kamala çatdırmaq məqsədilə sınağa çəkilmiş aşiqin nalələrini qulaq ardına vurmaqdan nişanədir.

**Anlam: Aşiq tərbiyəvi sınaqların sona çıxmağını arzu edir.**

Beyt 5: **Nola gər cəm`iyyəti – xatirdən olsam naümid,**
**Cəm` olurmu xublər zülfi pərişan eyləyən?**

Sözlük: Xub – gözəl = yaxşı = qəşəng

**Nişanə** 1. “Birinci misra”: Həsrət və tələb ilə bağlı iztirablar tükənməzliyini təlqin edən nişanədir.

**Nişanə** 2. “Cəm”: Ürəyin iztirabsız toxtaqlığından nişanədir.

**Nişanə** 3. “Xublar”: A: Bəşəri simada ilahi hüsnlər əks etdirmiş gözəllərdən nişanədir.

**Nişanə** 4. “Zülfü pərişan etmək”: Bu beytdə zəhmətə salmaq mənasını ifadə edən nişanədir.

**Anlam: Kəsrət ünvanlı gözəllərdə vəhdət cilvələrini dərk etmiş aşiqin iztirabsız yaşamağı mümkünsüzdür.**

**Qeyd:** *İztirab, çox vaxt özünü təmamilə unutmayan aşiqi tənbeh və tərbiyə etməyə gərəklidir.*

Beyt 6: **Yar dün çəkmişdi qətlim qəsdinə tiği – cəfa,**
**Yetməsin məqsudinə, ya rəb, pəşiman eyləyən.**

**Nişanə** 1. “Tiği-cəfa”: Aşiqi qətl məqamına nail edən səbəbdən nişanədir.

**Anlam: A : Zavala uğrayan dünyəvi həyatını mütəal məhbubuna qurban edən bir aşiq (qətl nailiyyətini) zavalsız və əbədi bir həyata, yaxud vüsal məqamına nail olur. Bunun üçün də hamı qətlə yetişməkdən qorxursa, aşiq də qətlə yetişməməkdən qorxur[2]. Aşiqlər sultanı Həzrəti İmam Hüseyn əleyhissəlamı aşura günü nigəran edən hadisə**

---

[1] Qəzəl 20, beyt 1, nişanə 1 (şəb)
[2] Bax beyt 1, nişanə 3 (həmin qəzəl)

**yalnız şəhid olmamaq (qətlə yetişməmək) təsəvvüründən ibarətdi. Bu əhvali-ruhiyyəni təlqin etmək məqsədilə tacüş-şüəra Yəhyəvi belə buyurur:**

**Həzrət nigəran idi təğyiri-məşiyyətdən ,**
**Fərman kəfi gəlsin, zati-əhədiyyətdən,**
**Rəyi dolana həqqin itmami şəhadətdən ,**
**Vazehdi çıxanmazdı hökmi-səmədiyyətdən**
**Müştaq idi can versin canan həman yerdə**[1]

**Anlam: A : Beyt qətl məqamından məhrum olmaq nigəranlığını (iztirab) təlqin edir.**

Beyt 7: **Eşq dərdilə olur aşiq mizaci müstəqim,**
**Düşmənimdir, dustlər, bu dərdə dərman eyləyən.**

**Nişanə** 1. "Eşq dərdi": Eşq dərdi, aşiqin batini vücudunda soltanlıq etməyə layiq, İsa adlı gizli rəhbəri üzə çıxaran bəlalardan nişanədir[2]. Buna görə də "Vəhşi Bafuqi" buyurmuşdur:

کرامت کن درونی درد پرورد     دلی دروی درون در دوبرون درد[3]

**Nişanə** 2. "Məzaci müstəqim": Məzaci müstəqim, aşiqin qəlbinə mötədillik bağışlamaqla onu, "səkinə" ünvanlı toxtaqlıq məqamına hazırlayan nişanədən ibarətdir4.

**Anlam: Həkim məhbubdan dərdü – bəla təmənna etmək, mərifət zirvəsinə çatmaqdan nişanədir.**

Beyt 8: **Zahidin tə`n ilə döndərdim üzün mehrabdən,**
**Necə bulmaz əcr min kafir müsəlman eyləyən?**

Sözlük: Tə`n – tənə; Mehrab – imam camaatın məsciddə namaz qıldığı yer = məclisin yuxarı başı; Əcr = əcir = müzd = mükafat

**Nişanə** 1. "Zahid": Aşiqin hidayətilə camal ləzzətinin behişt ləzzətindən üstün olduğunu dərk və qəbul etmiş şəxsdən ibarətdir (aşiq olmuş zahid).

**Nişanə** 2. "Mehrab": Dini əməllərin, xüsusilə namazın zahiri qaydalarında məhdud qalmaqla batini həqiqətindən xəbərsiz qalmaq

---

[1] Tacüş-şüəra Yəhyəvi, Əsrari-aşura, səh. 299
[2] Qəzəl 193, beyt 1, nişanə 3
[3] Vəhşi, Şerlər divanı, Fərhad və Şirin mənzuməsi
[4] Qəzəl 154, beyt 1, nişanə 3

mövqeiyyətindən nişanədir.

**Anlam: Zahidin, ürəyində yerləşmiş "məad əqli" ünvanlı həqiqətşünas, yaxud camalşünas gizli əqldən xəbərdar etməklə minnətdar edim.**

**Qeyd** 1: *Mənəvi əqldən xəbərdar olmuş zahid dünyəvi əqlini məlamət edir. Tənə etmək, yaxud başqa bir şəxsə tənə vurmaq arif üçün böyük günah sayılır.*

**Qeyd** 2: *İkinci misra: A: Məaş əqlini məad əqlinə hicab etmiş zahidləri tənqid edir. Çünki "kafir" sözünün bir mənası da "örtücüdür".*

*B: Bir çox (min) kafiri müsəlmanlığa nail etmək iddiasının gülünc olduğuna işarə edir.*

*C: Əcr, yaxud mükafat sözü behişt nailiyyətini, yaxud axirət qazancını nəzərə alıb hidayət etməyi, yaxud şərti hidayətə işarə edir. Aydındır ki, şərti bir iş xalis ola bilməz, hər bir şeydən kənar və yalnız məhbubun eşqi ilə əlaqədar hidayət xalis hidayətdir. Başqa hidayət "mənfi müamilə* [1] *" bəhsinə daxil olmuş və qazancı (əcr) məhbubu özündən üstün tutmağa bərabərdir.*

*D: Hidayət əzəmətini düşündürmək istəyir.*

Beyt 9: **Dərdi – hicran natəvan etmiş Füzuli xəstəni,**
**Yoxmudur, yarəb, dəvayi – dərdi – hicran eyləyən.**

**Nişanə** 1. "Dərdi-hicran": Bu beytdə canan cazibələrini qəlbində mühafizə etdiyi halda müşahidə nurundan məhrumluq nişanəsidir.

**Nişanə** 2. "Xəstə": Xəstəlik fiziki əngəl mahiyyət məğlubluğunu təlqin edən nişanədir.

**Nişanə** 3. "Natəvan": Bax xəstə

**Anlam: Beyt fiziki mahiyyətinə qalib gəlmiş aşiqin ilahi vasitələrdən bəhrələnməyə hazırlaşmasını təlqin edir.**

---

[1] Qəzəl 3, beyt 3

## Q Ə Z Ə L 198

**(1) Nola zahid bilsə küfri – zülfün iman olduğun,**
**Şimdi görmüşlərmidir kafir müsəlman olduğun.**

**(2) Mən əgər aşiq olub, din verməsəydim qarətə,**
**Kim bilirdi eşq mülkün kafiristan olduğun.**

**(3) Qıl səvab, ey göz, töküb qan, vaqif et qafilləri,**
**Meyl edənlər eşqə bilsinlər cigər qan olduğun.**

**(4) Daşə bənzər qanlı hər pərkalə kim, gözdən çıxar,**
**Ondan etdim fəhm, könlüm şəhri viran olduğun.**

**(5) Və`deyi – vəslinə ol gündən ki, verdim könlümü,**
**Mən onun bilməzmidim axir pəşiman olduğun.**

**(6) Eşqini asan görüb oldum əsiri tifl ikən,**
**Bilmədim gəldikcə bir aşubi – dövran olduğun.**

**(7) Ey Füzuli, xublar vəslinə eylərsən həvəs,**
**Guiya, bilməzsən ol vəsl içrə hicran olduğun.**

Beyt 1: **Nola zahid bilsə küfri – zülfün iman olduğun,**
**Şimdi görmüşlərmidir kafir müsəlman olduğun.**

**Nişanə** 1. "Küfri-zülf": Bu beytdə kəsrət güzgüsündə təzahür etdirilmiş vəhdət nurundan nişanədir.

**Qeyd:** *Küfr sözünün bir mənası "örtücü" olduğundan, küfri-zülf:*

*A: Dünyəvi əqlin vəhdət nurunda itib – batmağına işarə edir.*

*B: Zühur aydınlığında məxfi olmuş ilahi zatı eyham edir*[1].

**Anlam: Kafiri müsəlman edən umumi hidayət olursa əql əhlini də eşq əhli edən xüsusi hidayətdir.**

Beyt 2: **Mən əgər aşiq olub, din verməsəydim qarətə,**
**Kim bilirdi eşq mülkün kafiristan olduğun.**

Sözlük: Kafiristan – kafirlər ölkəsi

**Nişanə** 1. "Din qarətə vermək": A: Bu nişanə dini əməllərin batinindən xəbərdar və sərxoş olmaqla zahiri adətləri unutmaqdan ibarətdir. Bu iş əgər bəşəri əql və ixtiyara bağlı olarsa, xətakarlıq hesaba alınır. Ancaq, aşiq ixtiyarsız və əqlsiz olduğundan belə bir xətakarlıq günahı ilə cəzalanmaqdan azaddır.

**Qeyd:** *İmamlar və peyğəmbərlər dini əməllərin zahiri adətlərini mühafizə edərək batin ilə əlaqə saxlamağa da qadirdirlər. Lakin aşiq bu iqtidardan məhrumdur.*

*B: Dini imtiyaz, dünyəvi mötəbərlik mənşəyi olduğundan qarət olmalıdır*[2].

*C: Dini imtiyazı hiss etmək mənlik hissi ilə bağlı olduğundan qarət olmalıdır.*

**Qeyd** 1: *Mənlik ikilik nişanəsi olduğundan (bir mən, bir məşuq) qarət olmalıdır.*

**Qeyd** 2: *Mənlik qürur mənşəyi olduğundan eşq məhkəməsində ilk günah sayılır.*

*D: Dini imtiyazları hiss etmək "ixlas" mərtəbəsinə müxalifdir*[3].

**Nişanə** 2. "Kafiristan": Bu beytdə bəşəri idrak və dünyəvi etibarın üstünü örtən mövqeiyyətdən nişanədir.

---

[1] Qəzəl 138, beyt 4, qeyd 1
[2] Qəzəl 192, beyt 5. nişanə 1
[3] Qəzəl 59, beyt 1, nişanə 2

**Anlam: Mənəvi qanunların dünyəvi qanunlarla müqayisədə baş – ayaq olduğunu ilk dəfə tanıtdıran mən oldum.**

Beyt 3: **Qıl səvab, ey göz, töküb qan, vaqif et qafilləri,**
**Meyl edənlər eşqə bilsinlər cigər qan olduğun.**

**Nişanə** 1. “Qan tökmək”: Fiziki əngəl mahiyyəti yaxud mənəm – mənəmliyi batil etməkdən nişanədir.

**Nişanə** 2. “Bağrı qan olmaq”: Tərbiyəvi sınaqlar çətinliyindən, yaxud qəbzlər və iztirablar əzabından nişanədir.

**Anlam: Beyt fiziki əngəl mahiyyətini tam unutmayan bir aşiqin imtahan ayağına qədəm basmağını yararlı bilməyir.**

Beyt 4: **Daşə bənzər qanlı hər pərkalə kim, gözdən çıxar,**
**Ondan etdim fəhm, könlüm şəhri viran olduğun.**

Sözlük: Pərkalə – tikə = parça = hissə

**Nişanə** 1. “Birinci misra”: Göz yaşının təsirsiz olduğunu təlqin edir.

**Qeyd:** *Göz yaşının, yaxud qan tökməyin təsirsiz olması fiziki əngəl vücudun batil olduğunu sübut edir.*

**Nişanə** 2. “Viran könül”: Viran könül bu beytdə təbii sağlamlığını yaxud cismi həyatını fəda etmiş ürəkdən nişanədir.

**Anlam: Fiziki mahiyyət batilliyi, yaxud cismi həyatın karsız olduğu (birinci misra) “heyvani ürəyin” viran olduğunu sübut edir.**

**Qeyd** 1: *Qəlbin nəfəs almaq və nəbz vurmaqla canlanmış hissəsinə “heyvani ürək” demişlər.*

**Qeyd** 2: *Heyvani ürəyin viran olmağı, “insani ürəyin” abadlıq (fəaliyyət) müqəddiməsidir.*

Beyt 5: **Və`deyi – vəslinə ol gündən ki, verdim könlümü,**
**Mən onun bilməzmidim axir pəşiman olduğun.**

**Nişanə** 1. “Vəsl”: Aşiq ilə məşuq arasındakı fasilənin yox dərəcəsinə çatmağından, yaxud vasitəsiz şühud nailiyyətindən nişanədir.

**Nişanə** 2. “Peşiman olmaq”: Məşuqun vədə xilaf çıxmağı (peşiman olmaq):

A: Aşiqin qabiliyyətli olduğuna işarə edir. Çünki vəsldən məhrum edən peşimanlıq əlavə bəlalar ilə əlaqədardır və bəlalar, mənəvi səmalar yüksəldən qanad kimidirlər.

B: Aşiqin tərbiyəvi sınaqlara möhtac olduğunu təlqin etməklə onun qabiliyyətsiz olduğuna işarə edir.

**Anlam: Beyt aşiqin dəmbədəm əlavə olan mərifətini anladır.**

Beyt 6: **Eşqini asan görüb oldum əsiri tifl ikən,**
**Bilmədim gəldikcə bir aşubi – dövran olduğun.**

Sözlük: Aşub – hay – küy = fitnə = inqilab

**Nişanə** 1. “Tifl”: A: Tifl, zəif mərifətə nail olmuş aşiqdən istiarədir.

B: Tifl zəif cazibələri, eşq başlanışıyla münasib görmüş məşuqdan istiarədir.

**Anlam: Beyt get-gedə genişlənən mərifət ilə paralel ətəş və tələb çətinliklərinə işarə edir**[1]

Beyt 7: **Ey Füzuli, xublar vəslinə eylərsən həvəs,**
**Guiya, bilməzsən ol vəsl içrə hicran olduğun.**

Sözlük: Xublar – gözəllər = bəyənilmişlər; Guiya – guya

**Nişanə** 1. “Xublar”: Bəşəri simada ilahi hüsnlər əks etdirmiş gözəllərdən yaxud digər ilahi vasitələrdən nişanədir.

**Anlam: Beyt hər şeyin öz ziddi ilə (əksi ilə) bağlı olduğu kimi, vüsal nailiyyətinin hicran arxasına söykənməyini, yaxud dünyəvi ömür möhlətində hicransız vüsalın mümkünsüz olduğunu təlqin edir.**

---

[1] Qəzəl 184, beyt 5, nişanə 2

## Q Ə Z Ə L 199

(1) Sipehrin fariğəm vəslində mahü afitabindən,
Qərəz eydi – vüsalındır bu ayü gün hesabindən.

(2) Təmaşayi – rüxün əzminə çıxdı afitab, əmma,
Gəlirkən sür`ətilən düşdü yüz yerdə şitabindən.

(3) Fələk məhcubdur, şəm`i – rüxündən yandırıb çərxi,
Çıxarmaq istər ani şö`leyi – ahim hicabindən.

(4) Fələk eşqində ol qayətdə, ey məh, müztərib olmuş
Ki, hər nə eyləsə bilməz nə eylər iztirabindən.

(5) Günəş lövhi degil gögdə şüa` üstündə zərrinxət,
Fələk almış əlinə bir vərəq hüsn kitabindən.

(6) Dəgirmən danə için çizginür, bihudə dövr etməz,
Mücərrədsən, könül, vəhm etmə çərxin inqilabindən!

(7) Kimi hüşyar görsən sən, ona ver cami – mey, saqi,
Bihəmdillah, Füzuli məstdir vəhdət şərabindən.

Beyt 1: **Sipehrin fariğəm vəslində mahü afitabindən,**
**Qərəz eydi – vüsalındır bu ayü gün hesabindən.**

Sözlük: Sipehr – asiman = səma = fələk; Afitab – günəş; Eyd – bayram = şadlıq günü = mübarək gün

**Nişanə** 1. "Birinci misra": Keçmişdə ay – ulduz seyrini insanların alın yazısına təsir edici bilmişlər[1]. Beləliklə birinci misra ay – ulduz seyrindən, yaxud yer kürəsində tanınmış qüvvələrdən üstün asimanı iqtidardan hicabsız olmağı təlqin edir.

**Nişanə** 2. "Eyd": A: İlahi cəlal, yaxud camal cilvələri aid olmuş qəlbin halına "eyd" demişlər.

B: Yarı mələk hissəsindən, yarı bəşəri hissəsinə bir şeyi bir fayda müraciət (ovdət) etdirilmiş aşiq halına "eyd" demişlər[2].

**Anlam: Göylərdə və yerdə olan hər şey (kainat) ilahi mərifətə nail edən güzgülərdir. Ancaq, bu güzgülərdə təzahür etdirilmiş təcəlli nurunu[3] dərk etmək ürəyi durulaşdırmaqla, yaxud "fuad" və "bəsirət" ünvanlı batini gözdən bəhrələnməklə mümkün olur[4].**

**Qeyd** 1: *İlahi calal və camal cilvələrindən bəhrələnməyən bir insan dünyəvi ömür möhlətində heç nə istifadə edə bilməyibdir. Demək o, həyat adlı qiymətli gövhərini zay edibdir.*

**Qeyd** 2: *Səmavi kürələr həm də yer üzərində yaranmış canlı – cansız mövcudlar və onlarla əlaqədar nailiyyətlər insanı mənəvi məqamlara yönəldən vəsilələrdirlər. Beləliklə dünyaya məşğul olmaqla mənadan (eşqdən) xəbərsiz qalmış insanlar həmin vəsilələri alqışlayıb hədəfdən qafil olublar.*

Beyt 2: **Təmaşayi – rüxün əzminə çıxdı afitab, əmma,**
**Gəlirkən sür`ətilən düşdü yüz yerdə şitabindən.**

Sözlük: Rüx – camal = sima = üz; Şitab – sürət = ulduzların seyr sürəti

**Nişanə** 1. "Rüx": Özəl təcəllilər ehsan etmiş ilahi camaldan nişanədir.

**Nişanə** 2. "Düşdü yüz yerdə şitabidən": Bu nişanə vəhdət günəşindən, yaxud ilahi camaldan parlayan nur qarşısında etiraf etməyi təlqin edir. Ancaq, günəşin müxtəlif məşriqlər və məğriblərdə (şərq –qərb) doğub – batmağına da işarə etməklə ilahi iqtidarı yada salmaq istəyir. Bu kamal

---

[1] Qəzəl 71, beyt 4
[2] Qəzəl 80, beyt 5
[3] Qəzəl 1, səh. 29, haşiyə
[4] Qəzəl 13, beyt 1

tərəfə istiqamətləndirən iqtidarı xatırlamaq məqsədilə şərif ayədə belə buyurur: “فلا اقسم برب المشارق و المغارب انا القادرون” (“Məşriqlərin və məğriblərin Rəbbinə and içirəm ki, biz (rəbb) qadirik).

**Anlam: Quran icmalçılarından bəzisi, həmçinin bəzi filosoflar bir çox cansız olan fenomenlərin insan kimi – ibarətlə (məxsus dil) təsbih, yaxud zikr deməsi barədə izahlar aparmaqla, onların zəif can sahibi olduğuna işarə ediblər[1]. Beləliklə beyt hər bir canlı mövcudun, o cümlədən günəşin təcəlli və mükaşifə ehsanından pay istəyini məntiqi və təbii bildirir.**

Beyt 3: **Fələk məhcubdur, şəm`i – rüxündən yandırıb çərxi,**
**Çıxarmaq istər ani şö`leyi – ahim hicabindən.**

Sözlük: Məhcub – pərdələnmiş = həqiqət dərkindən saxlanılmış = xəyali = xəcil

**Nişanə** 1. “Şəm`i-rüx”: İlahi camaldan parlayan təcəlli nurundan ibarətdir.

**Nişanə** 2. “Yandırıb çərxi”: Çərxi yandırmaq, günəş nurunu yaxud bir çox dünyəvi yüksəlişləri kifayətedici və müstəqil bilməkdən nişanədir.

**Nişanə** 3. “Şö`leyi-ah”: Təbii qanunlara qələbə çalan “nari-məhəbbət”[2] atəşindən, yaxud aşiqin oda-suya qalib gəlmiş möcüzəyə bənzər batini iqtidarından nişanədir.

**Anlam: Parlaq günəş mənəvi ziyalar bərabərində öz qarşısındakı nursuz şam kimi zəif və həqirdir.**

**Qeyd:** *Bu beyt yaxud bu anlam: A: Dünyəvi imtiyazların qeyri müstəqil olduğunu təlqin edir.*

*B: Dünyəvi imtiyazlara məşğul və məğrur olmuş şəxsləri tənqid edir.*

*C: İnsanın heç bir yüksəliş ilə müqayisə edilməz əl çatmaz mərtəbəsini təlqin edir.*

Beyt 4: **Fələk eşqində ol qayətdə, ey məh, müztərib olmuş**
**Ki, hər nə eyləsə bilməz nə eylər iztirabindən.**

Sözlük: Qayət – nəhayət = axır = çox

[1] Qəzəl 4, beyt 1, səh 51, haşiyə
[2] Qəzəl 54, beyt 7

**Nişanə** 1. “Fələk”: “Hal məhəl”[1] ünvanlı ədəbi sənət rüxsətilə göy sakinlərinə işarə edir.

**Nişanə** 2. “Məh”: Qara maddədə ağ nurunu təzahür etdirən canan camalından nişanədir.

**Nişanə** 3. “Müztərib”: Arxa-arxaya vermiş xəbərsizlik və xəbərdarlıqdan, yaxud əkslər birləşməsindən nişanədir.

**Anlam: İlahi camal cəlaları bütün göy sakinlərini, hətta ay və ulduz kimi səmavi cansız kürələri də müztərib etmişdir.**

Beyt 5: **Günəş lövhi degil gögdə şüa` üstündə zərrinxət,**
**Fələk almış əlinə bir vərəq hüsn kitabindən.**

Sözlük: Lövh – lövhə; Zərrin – zərli

**Nişanə** 1. “Günəş lövhü”: Bu beytdə dünyəvi parlaq hüsnlərdən nişanədir.

**Nişanə** 2. “Hüsn”: Bu beytdə ilahi camal gözəlliklərindən nişanədir.

**Nişanə** 3. “Kitab”: İrfan ədəbiyyatında mütləq vücuda “kitab” demişlər.

**Qeyd:** *Lövh və kitab sözü bu beytdə “mühafizə olunmuş lövh kitabı” ünvanlı kamil insana da işarə edir.*

**Anlam: Günəş öz cəlalarını yaradıcı məhbubun bəşəri idraka sığmaz “vəch” ünvanlı bərk bərq vuran camalından borc almışdır.**

**Qeyd:** *Beyt dünyəvi imtiyazların qeyri müstəqil olduğuna işarə edir*[2].

Beyt 6: **Dəgirmən danə için çizginür, bihudə dövr etməz,**
**Mücərrədsən, könül, vəhm etmə çərxin inqilabindən!**

Sözlük: Bihudə – hədər = batil = faydasız

**Anlam: Dəni üyüdüb kamala çatdırmaq məqsədilə dolanan dəyirman kimi göylər də (səyyarələr, ulduzlar) insanın mənliyini xırdalayıb onun içəri gizli obrazını üzə çıxarmaq məqsədilə fırlanırlar (inqilab). Beləliklə, insanı müstəqil “mən” sahibi (mücərrəd) bilmək batil xəyaldan başqa bir şeyi ola bilməz.**

**Qeyd:** *Ulu Şeyx Sədi:*

ابر و بادو مه و خورشید و فلک درکارند   تاتو نانی به کف اری و به غفلت تخوری

*demişkən bütün yaranmışlar həm tək-tək, həm də birlikdə iş aparmaqla,*

---

[1] Qəzəl 162, beyt 2
[2] Qəzəl 40, beyt 5, qeyd

*həyata və nəhayət insanlara xidmətçi olduqlarını sübut edirlər. Beləliklə xidmətçi olub xeyr yetirmək, din, fəlsəfə və irfan baxımı ilə bir çox nəhəng bəhslər, o cümlədən "tərbiyəvi məhrumluq", "şükür", "ibrət", "vəhdət", "təklif" və "hidayət" ünvanlı bəhslər yaranmasına bais olmuşdur.*[1]

**Qeyd** 2: *Dəmir halqaların yalnız biri maqnit mərkəzinə söykənərkən digər halqaların maqnitləşməyinə səbəb olduğu kimi silsiləvi kainat da bir birindən təsirlənir. Şeyx Sədi bu təsirin ən önəmli olduğunu təlqin etmək məqsədilə buyurmuş ki:*

بنی آدم اعضای یک پیکرند    که در آفرینش زیک گوهرند
چو عضوی به درد آورد روزگار    دگر عضوها را نماند قرار
تو کز محنت دیگران بی غمی    نشاید که نامت نهند آدمی [2]

*Sədi bu beytlərlə: A: Qurani Kərimin şərif ayəsini təlqin edir ki buyurur:* " يا ايها الناس تقو ربكم الذى خلقكم من نفس واحده و خلق منا زوجها و بثً منهما رجالً كثير و نساءً و تقوالله الذى تساءلون به والارحام اِنَّ الله كان عليكم رقيباً [3] *" ("Ey insanlar! Sizi tək bir nəfsdən (Adəmdən) yaradan, ondan zövcəsini (Həvvanı) yaradan və onlardan bir çox kişilər və qadınlar törədib yayan Rəbbinizdən qorxun! Qorxun o Allahdan ki, bir-birinizdən hər ehtiyacınızı onun adı ilə istərsiniz və qohumlardan (sileyi-rəhmi kəsməkdən) qorxun! Şübhəsiz ki, Allah sizə nəzarət edəndir).*

*B: İslam peyğəmbərinin fərmayişinə əsaslanır ki buyurmuş:* " مثل المومنين فى توادهم وتراحمهم و تعاطفهم مثل الجسد بالسهور والحمى [4] *" ("Təkcə bir üzvü xəstələnmiş bədənin digər üzvləri qızdırma tutub, yuxusuz qalıb, xəstə üzvü ilə həmdərd olan kimi, mömin və mehriban dostlar da bir-birinə qayğıkeş və ortaqdırlar.)*

**Qeyd** 3: *Fəlsəfə də ədəbiyyat və irfan kimi, kainatın bir- birinə bağlı olduğu barədə dərin mübahisələrə girişmiş, bir çox filosoflar o cümlədən Dekart zənn etmiş ki: Bütün kainat dairəvi (müstədir) hərəkət məşğulluğunda* [5] *birlikdə əlaqədar olaraq hərəkət miqdarlarını da birlikdə bərabərləşdirirlər. Beləliklə, kainatın hər birini yeni alət kimi işlənən aləmi bütövlüyündə bir karxana kimi təmsil etmişlər*[6].

**Qeyd** 4: *Peyğəmbərlər, imamlar və düzgün rəhbərlərin söylədikləri ictimai islah işləri kainatın silsiləvi olması fikri ilə sıx bağlıdır.*

---

[1] Qəzəl 64, beyt 6, nişanə3
[2] Sədi, Gülüstan, 10-cu hekayə, 1 ci bab
[3] Quran, Nisa surəsi. Birinci ayə
[4] Doktor Məhəmməd Xəzaili, Şərhi-Gülüstan səh.255
[5] Qəzəl 1, beyt 1, nişanə "salik"
[6] Məhəmmədəli Furuği, Seyre-hikmət də Orupa, c.1, səh. 193

Beyt 7: **Kimi hüşyar görsən sən, ona ver cami – mey, saqi,**
**Bihəmdillah, Füzuli məstdir vəhdət şərabindən.**

Sözlük: Huşyar – huşlu

**Nişanə** 1. “Huşyar”: Qarşıya çıxmış təzə vəziyyət ilə saziş etmək istedadından bəhrələnmiş insana “huşyar” demişlər. Beləliklə “huş” bu beytdə geniş mənasını yox bəlkə məhdud mənasını ifadə edir[1].

**Nişanə** 2. “Cami-mey”: Bu beytdə ürək mülkündə qalmağa qadir olan mənəvi təlimatdan nişanədir.

**Nişanə** 3. “Saqi”: Bu beytdə mürşüd həzrətindən yaxud digər mənəvi vasitədən nişanədir.

**Nişanə** 4. “Məst”: Bu beytdə maddi mahiyyətini məğlub etmiş aşiqdən nişanədir.

**Nişanə** 5: “Şərabi-vəhdət”: Aşiqi özlüyündən, yaxud ikilik hicabından azad edən mərtəbədən nişanədir.

**Qeyd** 1: *Mənlik, yaxud ikilik vəhdət ilə müxalif olduğundan, islamın ulu peyğəmbəri “موتو قبل ان تموتو” (ölümdən əvvəl özünüzü öldürünüz) buyurduğu əsasda, “suğra qiyamət” ünvanlı mərtəbədə[2] ixtiyari ölüm nailiyyəti gərəkli olur. Çünki:*

*“Onun (mütəal məbudun) hüzurunda ikiliyi sığışdırmaq mümkünsüzdür. Məsələn, həm sən “mən” deyirsən, həm o “mən” deyir? Ya sən özünü onun qarşısında həlak et, ya da sənin qarşında o özünü öldürsün. Yoxsa, ikiliyi aradan qaldırmaq imkansız olar. Lakin onun ölməyi həm xaricdə həm də zehndə mümkün deyil. Çünki o “هو الحى الذى لايموت” buyurulduğu kimi ölümsüz diridir. Əgər mümkün olsaydı o sənin haqqında lütfkarlıq edib ikiliyi aradan qaldırmaq məqsədilə özünü öldürərdi. İndi ki onun ölməyi mümkünsüzdür, sən ikiliyi aradan qaldırıb onu özündə əks etdirmək məqsədilə özünü öldür (ixtiyari ölüm)[3].*

**Qeyd** 2: *“Bir-birinə bağlanılmış iki quş dörd qanadlı olsa da uçmaqdan acizdir. Çünki onlara ikilik qalibdir. Lakin iki quşdan biri ölü olursa uçmaq mümkün olur. Çünkidaha ikilik qalmayıbdır[4].*

**Anlam: Füzuli kimi “ixtiyari ölüm” məqamına nail olmuş bir aşiq hətta mənəvi vasitələr yardımından da hacətsizdir.**

---

[1] Doktor Məhəmməd Moin, Fərhənge-Moin
[2] Qəzəl 70, beyt 1, nişanə 2, qeyd
[3] Mövləvi, “fih ma fih”, səh. 37, 38
[4] Göstərilən kitab

## Q Ə Z Ə L 200

**(1) Dust bipərva, fələk birəhm, dövran bisükun,**
**Dərd çox, həmdərd yox, düşmən qəvi, tale zəbun.**

**(2) Sayeyi – ümmid zail, afitabi – şövq gərm,**
**Rütbeyi – idbar ali, payeyi – tədbir dun.**

**(3) Əql dunhimmət, sədayi – tənə yer – yerdən bülənd,**
**Bəxt kəmşəfqət, bəlayi – eşq gün – gündən füzun.**

**(4) Mən qəribi – mülkü rahi – vəsl pürtəşvişü məkr,**
**Mən hərifi – sadəlövhü dəhr pürnəqşü – füsun .**

**(5) Hər səhiqəd cilvəsi, bir seyli – tufani – bəla,**
**Hər hilaləbru qaşı bir sərxəti – məşqi – cünun.**

**(6) Yeldə bərqi – lalə tək, təmkini – danış bisəbat,**
**Suda əksi – sərv tək, təsiri – dövlət vajigun.**

**(7) Sərhədi – mətlubə pür möhnət təriqi – imtəhan,**
**Mənzili – məqsudə pürasib, rah – azimun.**

**(8) Şahidi – məqsəd nəvayi – çəng tək pərdənişin,**
**Sağəri – işrət hübabi – safi – səhba tək nigun.**

**(9) Təfriqə hasil, təriqi – mülki – cəmiyyət məxuf,**
**Ah, bilmən neyləyim, yox bir müvafiq rəhnümun.**

**(10) Çöhreyi – zərdin Füzulinin tutubdur əşki – al,**
**Gör ona nə rənglər keçmiş sipehri – nilgun.**

Beyt 1: **Dust bipərva, fələk birəhm, dövran bisükun,**
**Dərd çox, həmdərd yox, düşmən qəvi, tale zəbun.**

Sözlük: Pərva – qorxu = taqət = fürsət = rəğbət = əndişə = qəsd = aram = saliklik; Sükun – sakinlik; Zəbun – zəif = həqir = xar = məğlub

**Nişanə** 1. “Dust bipərva = bi pərva dust, “istiğna”, yaxud “səmədiyyət”[1] sifətini təzahür etdirməklə aşiqi mənlik ərəfəsindən, yaxud mənfi sağlamlıqdan ayıran həkim məhbubdan ibarətdir.

**Nişanə** 2. “Fələk birəhm”: Fələk, yaxud dünya maddi qurğulu olduğuna görə rəhmsiz kimi tanınmışdır. Çünki:

A: Maddə qara sifətlərdən (küdurətdən) ayrılmaz olduğuna görə məna qarşısında qabaran hər bir maneə qalın bir hicabdır.

B: İnkişaf və müşahidə (şühud) mərtəbəsində nura bağlı olduğusübut edir ki, küdurət (maddə) şühud mərtəbəsində mane olur, çünki küdurət nurunun ziddidir.

**Nişanə** 3. “Dövran bisükun”: Şair “Fələkdə mehr zail, yar qafil, ömr müstəcil” buyurduğu kimi bütövlüyü, həmçinin təfərrüatı dayanmaz hərəkət (bisükun) məcburluğunda olan dünyanın xidmətləri və nemətləri özü kimi dayanmaz (vəfasız) və etibarsızdır.

**Nişanə** 4. “Dərd çox”: Dünyəvi ömür möhlətində bipərva dust, birəhm fələk və bisükun dövranla əlaqədar müşküllər ilə qarşı çıxmaq çətinliyindən nişanədir. Ancaq təbii ömür boyu aşiqi biqərar etmiş tələb qürbətinə də işarə edir[2].

**Nişanə** 5. “Həmdərd yox”: Bir aşiq, bir məşuq, bir də həmdərd üçlük (kəsrət) əlaməti olduğundan şair “həmdərd yox” buyurmuşdur.

**Nişanə** 6. “Düşmən”: A: Düşmən birinci misrada sadaladığı nişanələr, yaxud maneələrdən ibarətdir.

B: Düşmən aşiqin fiziki vücud və şəxsi qatmacalarından ibarətdir.[3]

**Nişanə** 7. “Tale”: A: İnsanın alın yazısına təsir etməklə onun dualarını qəbula keçirən bəxtə “tale” demişlər.

B: Zəhmətsiz nailiyyəytə “tale” demişlər.

**Anlam: Beyt “gətirdi əcz görüb eşq müşkül olduğunu” buyurduğu misradan nümunələr göstərməklə yaranış dairəsinin mənəvi hissəsinə çatmaq məqsədilə dünyəvi hissəsini seyr edən**

[1] Qəzəl 30, beyt 3, nişanə 2
[2] Qəzəl 34, beyt 3
[3] Qəzəl 146, beyt 1, nişanə 2

**salikin yüzlərlə fırtınalar və təhlükələrə qarşı çıxmaq çətinliyini təlqin edir[1].**

Beyt 2, 3,4:

**Sayeyi – ümmid zail, afitabi – şövq gərm,**
**Rütbeyi – idbar ali, payeyi – tədbir dun.**
**Əql dunhimmət, sədayi – tənə yer – yerdən bülənd,**
**Bəxt kəmşəfqət, bəlayi – eşq gün – gündən füzun.**
**Mən qəribi – mülki rahi – vəsl pürtəşvişü məkr,**
**Mən hərifi – sadəlövhü dəhr pürnəqşü – füsun .**

Sözlük: Zail – zavala uğramış; Afitab – günəş; Gərm – isti = rövnəqli; İdbar – bəxtsizlik = qara günə qalmaq = qara yazılı olmaq; Payə – paya; Dun – həqir = alçaq; Füzun – artıq = əlavə; Rah – yol; Por – dolu; Dəhr – ruzgar = zəmanə; Pornəqş – rəngin = güclü = hiyləbaz; Füsun – əfsun

**Anlam: Bu beytlər də maddi qurğulu hicran dünyasında, yaxud vəhdət mərkəzinə müraciət etdirən seyr yolunda dikəlmiş müşküllərdən nümunə göstərmək istəyir. Ancaq aşiqin ətəşini – iztirabını dəmbədəm əlavə edən ilahi cilvələr və cazibələr uzantısına da işarə edir.**

Beyt 5: **Hər səhiqəd cilvəsi, bir seyli – tufani – bəla,**
**Hər hilaləbru qaşı bir sərxəti – məşqi – cünun.**

Sözlük: Səhiqəd – qamətli = uca qamət; Tufan – fırtına; Əbru – qaş; Sərxəti – ünvan = fərman = sərlövhə; Cünun – məcnunluq

**Nişanə** 1. “Səhiqəd. Hilal əbru”: Bu nişanələr aşiqin ürəyindəki səbr və qərarı boşaldıb yerini tələb və ətəş atəşilə dolduran ilahi cazibələr, yaxud ilahi vasitələr, ya da bəşəri simada ilahi hüsnlər əks etdirmiş gözəllərdən ibarətdir. Bu nişanələrin heybətini göstərmək məqsədilə lisanülqeyb Hafiz buyurmuşdur:

فغان کاین لولیان شوخ و شیرین کار و شهر اشوب
چنان بردند صبر از دل که ترکان خوان یغما را [2]

**Nişanə** 2: “Seyli-tufan-bəla”: A: Aşiqin mənliyini yuyub məhv edən ilahi lütflərə bağlı sınaqlar və sıxıntılardan nişanədir.

---

[1] Qəzəl 1, beyt 2, nişanə 2
[2] Müəllif bu beyti “Ta Qafe-əndişe” kitabının 1-ci cildində şərh etmişdir

**Nişanə** 3. "Cünun": Bu beytdə dünyaşünas əql tədbirini arxada buraxmış aşiqin, sərki – danlaqlara giriftar olmağına işarə edən nişanədir.

**Anlam: Bu beyt də ötən beytlərdə qeyd olunmuş mənaları (müşkülləri) təkrar edir.**

Beyt 6: **Yeldə bərqi – lalə tək, təmkini – danış bisəbat,**
**Suda əksi – sərv tək, təsiri – dövlət vajigun.**

Sözlük: Bərg – yarpaq; Bisəbat – səbatsız; Vajgun = tərsə çevrilmiş = vurulmuş = yıxılmış

**Anlam: Beyt bəşəri əql və təcrübə ilə bağlı elmi (dünyəvi elm) külək qarşısındakı zəif bir yarpaq kimi məğlub və səbatsız təlqin edib, dünyəvi bəxtəvərliyi (dövlət) su içində əks etdirilmiş sərv kimi baş – ayaq göstərməklə, ötən beytlərdə qeyd olunmuş eşq müşküllərinə elm və əql ilə tədbir etməyin mümkünsüz olduğunu bildirir. Beləliklə, yalnız mənəvi elm və dövlət ilə bağlı müvəffəqiyyətlərin həqiqi və zavalsız olduğuna işarə edir.**

Beyt 7: **Sərhədi – mətlubə pür möhnət təriqi – imtəhan,**
**Mənzili – məqsudə pürasib, rah – azimun.**

Sözlük: Mətlub – tələb edilmiş = həqq = ürəyə yatan; Por – dolu; Təriqət – yol = tərz; Asib – afət = sədəmə = məşəqqət = bəla; Rah azmun – imtahan yolu = imtahan tərzi

**Nişanə** 1. "Sərhədi-mətlub": Hicransız vüsal mərtəbəsində "səkinə"[1] ünvanlı daimi toxtamaqdan nişanədir.

**Nişanə** 2: "Por möhnət təriqi-imtahan": İlahi sifətlərə nail etmək məqsədilə bəşəri sifətlərdən ayıran şıdırğı bəlalardan nişanədir.

**Nişanə** 3: "Mənzili-məqsud": Bax nişanə 1 (sərhəd mətlub)

**Nişanə** 4: "Pürasib, rahi azmun": Bax nişanə 2 (por möhnət təriqi-imtahan)

**Anlam: Bax beyt 1, anlam.**

Beyt 8: **Şahidi – məqsəd nəvayi – çəng tək pərdənişin,**
**Sağəri – işrət hübabi – safi – səhba tək nigun.**

---

[1] Qəzəl 154, beyt 1

Sözlük: Şahed – şahid = məşuq = mütəal məbud = təcəlli; Pərdə neşin – pərdə arxasında oturan = xəlvət etmiş = bürünmüş; Sağər – cam = piyalə = arif qəlbi; Hübab – köpük; Səhba – qırmızı rəngli şərab; Nigun – tərsə = baş aşağı

**Nişanə** 1. "Şahidi-məqsəd": "Sərhəd mətlub" mərtəbəsinə nail edən ilahi camal cilvələrindən, yaxud zühur uzantısından nişanədir.

**Nişanə** 2. "Sağəri-işrət": Mütəal məhbubla isinişmək ləzzətindən ibarətdir.[1]

**Nişanə** 3. "Hübabi-safi-səhba tək nigun": Bu nişanə məcazi müsəlla mənəvi əmri hasilləşdirir, ancaq təcəlli nurunun kəsilməsinə də işarə edir.

**Anlam: Bu beyt də ötən beytlər kimi tərbiyəvi müşküllərdən nümunələr göstərməklə aşiqi seyr yolunun təhlükələrinə qarşı çıxmağa hazırlamaq istəyir.**

Beyt 9: **Təfriqə hasil, təriqi – mülki – cəmiyyət məxuf,**
**Ah, bilmən neyləyim, yox bir müvafiq rəhnümun.**

Sözlük: Məxuf – qorxulu; Rəhnümün – rəhbər = dəlil

**Nişanə** 1. "Təfriqə": Bu beytdə məhz vüsaldan məhrum edən həm dünyəvi, həm də mənəvi vasitələrdən ibarətdir.[2]

**Nişanə** 2. "Cəmiyyət": Şühud mərtəbəsində mütəal məhbubun lütfilə məşğul olmuş aşiqin toxtaqlığından ibarətdir.

**Nişanə** 3. "Məxuf": Həkim məhbubun lütf ünvanlı sifətinə tam aşiq olmaqla digər sifətlərindən qafil qalmaq və tənbih olmaq qorxusundan nişanədir.

**Anlam: İrfani nailiyyətlər üzüntüsilə də təklif, tələb və ətəş nigaranlığına son qoymaq mümkün olmayır.**

Beyt 10: **Çöhreyi – zərdin Füzulinin tutubdur əşki – al,**
**Gör ona nə rənglər keçmiş sipehri – nilgun.**

Sözlük: Əşk – göz yaşı; Sipehr – səma asiman = fələk; Nilgun – abi təhər = abıya çalan

**Nişanə** 1. "Çöhreyi – zərd": Seyr yolunda yorğun – arğın durmaq-

---

[1] Qəzəl 92, beyt 7 "ey"
[2] Qəzəl 89, beyt 4

dan nişanədir.

**Nişanə** 2. “Əşki – al”: Yorğun salikin seyrini yenidən davam etdirən istiqamətləndirici lütf cilvələrindən nişanədir.

**Anlam: Bu beyt ötən beytlərdəki müşküllərin təsirini, nəhayət aşiqin özlüyündən xilas edən məqsədini təlqin edir.**

MÜNDƏRİCAT

